..

# سُنَنُ النَّسَائِي

أَبُو عَبْدِ الرَّحْمَنِ أَحْمَدَ بْنِ شُعَيْبٍ النَّسَائِيّ

# Sunən ən-Nəsəi

**(ən-Nəsəinin "əs-Sunən" əsəri)**

**Əbu Abdur-Rahmən Əhməd ibn Şueyb ən-Nəsəi**

(215-303 hicri / 830-915 miladi)

اسرا

# III

**CİLD**

(2090-3195-cü hədislər)

## Kitabda olan simvolların izahı

عز وجل işarəsi “azzə və cəllə” oxunur və “izzət və cəlal sahibi” mənasını verir;

صلى الله عليه وسلم işarəsi “sallallahu aleyhi və səlləm” oxunur və “ona Allahın salavatı və salamı olsun!” mənasını verir;

رضي الله عنه işarəsi “radiyallahu anhu” oxunur və “Allah ondan razı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

رضي الله عنها işarəsi “radiyallahu anhə” oxunur və “Allah ondan razı olsun!” mənasını verir (qadın cinsinə aid edilir);

رضي الله عنهما işarəsi “radiyallahu anhumə” oxunur və “Allah onların ikisindən də razı olsun!” mənasını verir;

عليه السلام işarəsi “aleyhissəlam” oxunur və “ona Allahın salamı olsun!” mənasını verir (kişi cinsinə aid edilir);

رحمه الله işarəsi “rahiməhullah” oxunur və “Allah ona rəhmət etsin!” mənasını verir.

## Kitabın üçüncü cildində olan bablar
## (içində fəsillər olan kitablar)

## ٢٢ - كِتَابُ الصِّيَامِ
## 22. Oruc kitabı

### ١ - بَابُ وُجُوبِ الصِّيَامِ
### 1-ci fəsil: Orucun vacib olması

٢٠٩٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا أَبُو سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ طَلْحَةَ بْنِ عُبَيْدِ اللهِ ، أَنَّ أَعْرَابِيًّا جَاءَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثَائِرَ الرَّأْسِ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَخْبِرْنِي مَاذَا فَرَضَ اللَّهُ عَلَيَّ مِنَ الصَّلاَةِ ؟ قَالَ : الصَّلَوَاتُ الْخَمْسُ إِلاَّ أَنْ تَطَوَّعَ شَيْئًا ، قَالَ : أَخْبِرْنِي بِمَا افْتَرَضَ اللَّهُ عَلَيَّ مِنَ الصِّيَامِ ؟ قَالَ : صِيَامُ شَهْرِ رَمَضَانَ إِلاَّ أَنْ تَطَوَّعَ شَيْئًا ، قَالَ : أَخْبِرْنِي بِمَا افْتَرَضَ اللَّهُ عَلَيَّ مِنَ الزَّكَاةِ ؟ فَأَخْبَرَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِشَرَائِعِ الإِسْلاَمِ ، فَقَالَ : وَالَّذِي أَكْرَمَكَ ، لاَ أَتَطَوَّعُ شَيْئًا لاَ أَنْقُصُ مِمَّا فَرَضَ اللَّهُ عَلَيَّ شَيْئًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْلَحَ إِنْ صَدَقَ أَوْ دَخَلَ الْجَنَّةَ إِنْ صَدَقَ.

2090. ...Təlhə ibn Ubeydullah ﵁ rəvayət edir ki, saçları dağınıq bir bədəvi ərəb Allah Elçisinin ﷺ yanına gəldi və dedi: “Ey Allahın Elçisi, Allahın mənim üzərimə namazlardan nəyi vacib etdiyini xəbər ver”. Peyğəmbər ﷺ buyurdu: “Könüllü olaraq qıldığından başqa, beş namazı vacib etmişdir”. Bədəvi dedi: “Allahın mənim üzərimə oruclardan nəyi vacib etdiyini xəbər ver”. Peyğəmbər ﷺ buyurdu: “Könüllü olaraq tutduğundan başqa, Ramazan orucunu vacib etmişdir”. O dedi: “Allahın mənim üzərimə zəkatdan nəyi vacib etdiyini xəbər ver”. Allah Elçisi ﷺ ona İslamın şüarlarını bildirdi. O da dedi: “Səni kəramətli Edənə and olsun! Mən buna heç nə artırmayacağam və heç nə əskiltməyəcəyəm”. Allah Elçisi ﷺ buyurdu: “Əgər doğru deyirsə, nicat tapacaq” və ya “doğru deyirsə, Cənnətə girəcək”.

٢٠٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَامِرٍ الْعَقَدِيُّ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ الْمُغِيرَةِ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : نُهِينَا فِي الْقُرْآنِ أَنْ نَسْأَلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ شَيْءٍ ، فَكَانَ يُعْجِبُنَا أَنْ يَجِيءَ الرَّجُلُ الْعَاقِلُ مِنْ أَهْلِ الْبَادِيَةِ فَيَسْأَلَهُ ، فَجَاءَ رَجُلٌ مِنْ أَهْلِ الْبَادِيَةِ فَقَالَ : يَا مُحَمَّدُ ، أَتَانَا رَسُولُكَ فَأَخْبَرَنَا أَنَّكَ تَزْعُمُ أَنَّ اللهَ عَزَّ وَجَلَّ أَرْسَلَكَ ، قَالَ : صَدَقَ ، قَالَ : فَمَنْ خَلَقَ السَّمَاءَ ؟ قَالَ : اللَّهُ ، قَالَ : فَمَنْ خَلَقَ الأَرْضَ ؟ قَالَ : اللَّهُ ، قَالَ : فَمَنْ نَصَبَ فِيهَا الْجِبَالَ ؟ قَالَ : اللَّهُ ، قَالَ : فَمَنْ جَعَلَ فِيهَا الْمَنَافِعَ ؟ قَالَ : اللَّهُ ، قَالَ : فَبِالَّذِي خَلَقَ السَّمَاءَ وَالأَرْضَ ، وَنَصَبَ فِيهَا الْجِبَالَ ، وَجَعَلَ فِيهَا الْمَنَافِعَ آللَّهُ أَرْسَلَكَ ؟ قَالَ : نَعَمْ ، قَالَ : وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا خَمْسَ صَلَوَاتٍ فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ ، قَالَ : صَدَقَ ، قَالَ : فَبِالَّذِي أَرْسَلَكَ آللَّهُ أَمَرَكَ بِهَذَا ؟ قَالَ : نَعَمْ ، قَالَ : وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا زَكَاةَ أَمْوَالِنَا ، قَالَ : صَدَقَ ، قَالَ : فَبِالَّذِي أَرْسَلَكَ آللَّهُ أَمَرَكَ بِهَذَا ؟ قَالَ : نَعَمْ ، قَالَ : وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا صَوْمَ شَهْرِ رَمَضَانَ فِي كُلِّ سَنَةٍ ، قَالَ : صَدَقَ ، قَالَ : فَبِالَّذِي أَرْسَلَكَ آللَّهُ أَمَرَكَ بِهَذَا ؟ قَالَ : نَعَمْ ، قَالَ : وَزَعَمَ رَسُولُكَ أَنَّ عَلَيْنَا الْحَجَّ مَنِ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلاً ؟ قَالَ : صَدَقَ ، قَالَ : فَبِالَّذِي أَرْسَلَكَ آللَّهُ أَمَرَكَ بِهَذَا ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَوَالَّذِي بَعَثَكَ بِالْحَقِّ لاَ أَزِيدَنَّ عَلَيْهِنَّ شَيْئًا وَلاَ أَنْقُصُ ، فَلَمَّا وَلَّى قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَئِنْ صَدَقَ لَيَدْخُلَنَّ الْجَنَّةَ.

2091. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Bizə Peyğəmbərdən ﷺ Quran haqda nə isə soruşmaq qadağan edilmişdi, ona görə də biz çöldə yaşayanlardan ağıllı birinin gəlib Peyğəmbərdən ﷺ nə isə soruşmağını gözləyərdik. Beləliklə, çöldə yaşayan bir kişi gəlib dedi: “Ey Muhəmməd, sənin bizə göndərdiyin bir adam sənin Allahın Elçisi olduğunu dedi”. Allah Elçisi ﷺ dedi: “O, doğru söyləmişdir”. O dedi: “Səmanı kim yaradıb?” Allah Elçisi ﷺ dedi: “Allah!” O dedi: “Yeri kim yaradıb?” Allah Elçisi ﷺ dedi: “Allah!” O dedi: “Yer üzünə bu dağları kim qoydu?” Allah Elçisi ﷺ dedi: “Allah!” O dedi: “Yer üzündə faydalı şeyləri kim yarattdı?” Allah Elçisi ﷺ dedi: “Allah!” O dedi: “Səmanı və yeri yaradan, yer üzündə olan dağları düzəldən və faydalı şeyləri yaradan Allah xatirinə de, səni Allahmı göndərib?” Allah Elçisi ﷺ dedi: “Bəli!” O dedi: “Sənin göndərdiyin adam gecə və gündüz beş vaxt namaz qılmağımızın lazım olduğunu dedi”. Allah Elçisi ﷺ buyurdu: “O, doğru söyləmişdir”. O dedi: “Səni Göndərənin xatirinə de, bunu sənə Allahmı əmr edib?” Allah Elçisi ﷺ dedi: “Bəli!” O dedi: “Sənin göndərdiyin adam malımızdan zəkat verməyimizin lazım olduğunu dedi”. Allah Elçisi ﷺ buyurdu: “O, doğru söyləmişdir”. O dedi: “Səni Göndərənin xatirinə de, bunu sənə Allahmı əmr edib?” Allah Elçisi ﷺ dedi: “Bəli!” O dedi: “Sənin göndərdiyin adam hər il Ramazan ayında oruc tutmağımızın lazım olduğunu dedi”. Allah Elçisi ﷺ buyurdu: “O, doğru söyləmişdir”. O dedi: “Səni Göndərənin xatirinə de, bunu sənə Allahmı əmr edib?” Allah Elçisi ﷺ dedi: “Bəli!” O dedi: “Sənin göndərdiyin adam imkanı çatanın həcc etməsinin lazım olduğunu dedi”. Allah Elçisi ﷺ buyurdu: “O, doğru söyləmişdir”. O dedi: “Səni Göndərənin xatirinə de, bunu sənə Allahmı əmr edib?” Allah Elçisi ﷺ dedi: “Bəli!” Bədəvi dedi: “Səni haqq ilə Göndərənə and olsun! Mən buna nə bir şey artıracağam, nə də bundan bir şey əskildəcəyəm”. O dönüb getdikdə Peyğəmbər ﷺ buyurdu: “Əgər doğru deyirsə, mütləq Cənnətə girəcək”.

٢٠٩٢ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، عَنِ اللَّيْثِ ، عَنْ سَعِيدٍ ، عَنْ شَرِيكِ بْنِ أَبِي نَمِرٍ ، أَنَّهُ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : بَيْنَا نَحْنُ جُلُوسٌ فِي الْمَسْجِدِ جَاءَ رَجُلٌ عَلَى جَمَلٍ فَأَنَاخَهُ فِي الْمَسْجِدِ ، ثُمَّ عَقَلَهُ ، فَقَالَ لَهُمْ : أَيُّكُمْ مُحَمَّدٌ ؟ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُتَّكِئٌ بَيْنَ ظَهْرَانَيْهِمْ ، قُلْنَا لَهُ : هَذَا الرَّجُلُ الأَبْيَضُ الْمُتَّكِئُ ، فَقَالَ لَهُ الرَّجُلُ : يَا ابْنَ عَبْدِ الْمُطَّلِبِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ أَجَبْتُكَ ، فَقَالَ الرَّجُلُ : إِنِّي سَائِلُكَ يَا مُحَمَّدُ ، فَمُشَدِّدٌ عَلَيْكَ فِي الْمَسْأَلَةِ ، فَلاَ تَجِدَنَّ فِي نَفْسِكَ ، قَالَ : سَلْ مَا بَدَا لَكَ ، فَقَالَ الرَّجُلُ : نَشَدْتُكَ بِرَبِّكَ ، وَرَبِّ مَنْ قَبْلَكَ ، آللَّهُ أَرْسَلَكَ إِلَى النَّاسِ كُلِّهِمْ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ اللَّهَ ، آللَّهُ أَمَرَكَ أَنْ تُصَلِّيَ الصَّلَوَاتِ الْخَمْسَ فِي الْيَوْمِ وَاللَّيْلَةِ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ اللَّهَ ، آللَّهُ أَمَرَكَ أَنْ تَصُومَ هَذَا الشَّهْرَ مِنَ السَّنَةِ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ اللَّهَ ، آللَّهُ

أَمَرَكَ أَنْ تَأْخُذَ هَذِهِ الصَّدَقَةَ مِنْ أَغْنِيَائِنَا فَتَقْسِمَهَا عَلَى فُقَرَائِنَا ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، فَقَالَ الرَّجُلُ : آمَنْتُ بِمَا جِئْتَ بِهِ ، وَأَنَا رَسُولُ مَنْ وَرَائِي مِنْ قَوْمِي ، وَأَنَا ضِمَامُ بْنُ ثَعْلَبَةَ ، أَخُو بَنِي سَعْدِ بْنِ بَكْرٍ. خَالَفَهُ يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ.

2092. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Biz məsciddə oturduğumuz zaman bir kişi dəvənin üstündə oraya yaxınlaşdı. Kişi dəvəni məsciddə dizi üstə çökdürdükdən sonra onu buxovladı, sonra da: “Hansınız Muhəmməddir?”– deyə soruşdu. Bu vaxt Allah Elçisi ﷺ səhabələrin arasında söykənib oturmuşdu. Biz: “(Axtardığın adam) söykənib oturan bu ağbəniz kişidir”– dedik. Kişi: “Ey Abdul-Muttalibin oğlu!”– deyə müraciət etdi. Allah Elçisi ﷺ: “Səni eşidirəm”– deyə buyurdu. Kişi dedi: “Mən səndən bəzi şeylər soruşacağam, ey Muhəmməd! Sənə çox çətin suallar verəcəyəm. Odur ki, mənə acığın tutmasın”. Allah Elçisi ﷺ ona: “İstədiyini soruş”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm sənin və səndən əvvəlkilərin Rəbbinə, de görüm səni bütün insanlara Allahmı elçi göndərdi?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm) gecə və gündüz beş vaxt namaz qılmağımızı sənə Allahmı əmr etdi?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm ilin bu bəlli ayında oruc tutmağımızı sənə Allahmı əmr etdi?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm varlılarımızdan sədəqə alıb kasıblarımıza paylaşdırmağı sənə Allahmı əmr etdi?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Mən sənin gətirdiyinə iman gətirdim, mən qövmümün sənin yanına göndərdiyi elçisiyəm, mən Səd ibn Bəkr oğullarının qardaşı – Dimam ibn Sələbəyəm”.

٢٠٩٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، مِنْ كِتَابِهِ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَجْلَانَ ، وَغَيْرُهُ مِنْ إِخْوَانِنَا ، عَنْ سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ شَرِيكِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي نَمِرٍ ، أَنَّهُ سَمِعَ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : بَيْنَمَا نَحْنُ عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جُلُوسٌ فِي الْمَسْجِدِ ، دَخَلَ رَجُلٌ عَلَى جَمَلٍ فَأَنَاخَهُ فِي الْمَسْجِدِ ، ثُمَّ عَقَلَهُ ، ثُمَّ قَالَ : أَيُّكُمْ مُحَمَّدٌ ؟ وَهُوَ مُتَّكِئٌ بَيْنَ ظَهْرَانَيْهِمْ ، فَقُلْنَا لَهُ : هَذَا الرَّجُلُ الأَبْيَضُ الْمُتَّكِئُ ، فَقَالَ لَهُ الرَّجُلُ : يَا ابْنَ عَبْدِ الْمُطَّلِبِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ أَجَبْتُكَ ، قَالَ الرَّجُلُ : يَا مُحَمَّدُ ، إِنِّي سَائِلُكَ فَمُشَدِّدٌ عَلَيْكَ فِي الْمَسْأَلَةِ ، قَالَ : سَلْ عَمَّا بَدَا لَكَ ، قَالَ : أَنْشُدُكَ بِرَبِّكَ وَرَبِّ مَنْ قَبْلَكَ ، آللَّهُ أَرْسَلَكَ إِلَى النَّاسِ كُلِّهِمْ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ اللَّهَ ، آللَّهُ أَمَرَكَ أَنْ تَصُومَ هَذَا الشَّهْرَ مِنَ السَّنَةِ ؟ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ اللَّهَ ، آللَّهُ أَمَرَكَ أَنْ تَأْخُذَ هَذِهِ الصَّدَقَةَ مِنْ أَغْنِيَائِنَا فَتَقْسِمَهَا عَلَى فُقَرَائِنَا ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ نَعَمْ ، فَقَالَ الرَّجُلُ : إِنِّي آمَنْتُ بِمَا جِئْتَ بِهِ ، وَأَنَا رَسُولُ مَنْ وَرَائِي مِنْ قَوْمِي ، وَأَنَا ضِمَامُ بْنُ ثَعْلَبَةَ ، أَخُو بَنِي سَعْدِ بْنِ بَكْرٍ. خَالَفَهُ عُبَيْدُ اللهِ بْنُ عُمَرَ.

2093. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birgə məsciddə oturduğumuz zaman bir kişi dəvənin üstündə oraya yaxınlaşdı. Kişi dəvəni məsciddə dizi üstə çökdürdükdən sonra onu buxovladı, sonra da: "Hansınız Muhəmməddir?"– deyə soruşdu. Bu vaxt Peyğəmbər ﷺ səhabələrin arasında söykənib oturmuşdu. Biz: "Axtardığın adam söykənib oturan bu ağbəniz kişidir"– dedik. Kişi: "Ey Abdul-Muttalibin oğlu!"– deyə müraciət etdi. Allah Elçisi ﷺ: "Səni eşidirəm"– deyə buyurdu. Kişi dedi: "Mən səndən bəzi şeylər soruşacağam və sənə çox çətin suallar verəcəyəm". Allah Elçisi ﷺ ona: "İstədiyini soruş"– deyə buyurdu. Kişi dedi: "Səni and verirəm sənin və səndən əvvəlkilərin Rəbbinə, de görüm səni bütün insanlara Allahmı elçi göndərdi?" Allah Elçisi ﷺ: "Allah şahiddir ki, belədir!"– deyə buyurdu. Kişi dedi: "Səni and verirəm Allaha, de görüm gecə və gündüz beş vaxt namaz qılmağımızı sənə Allahmı əmr etdi?" Allah Elçisi ﷺ: "Allah şahiddir ki, belədir!"– deyə buyurdu. Kişi dedi: "Səni and verirəm Allaha, de görüm ilin bu bəlli ayında oruc tutmağımızı sənə Allahmı əmr etdi?" Allah Elçisi ﷺ: "Allah şahiddir ki, belədir!"– deyə buyurdu. Kişi dedi: "Səni and verirəm Allaha, de görüm varlılarımızdan sədəqə alıb kasıblarımıza paylaşdırmağı sənə Allahmı əmr etdi?" Allah Elçisi ﷺ: "Allah şahiddir ki, belədir!"– deyə buyurdu. Kişi dedi: "Mən sənin gətirdiyinə iman gətirdim, mən qövmümün sənin yanına göndərdiyi elçisiyəm, mən Səd ibn Bəkr oğullarının qardaşı – Dimam ibn Sələbəyəm".

٢٠٩٤ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ ، قَالَ : حَدَّثَنَا أَبُو عُمَارَةَ حَمْزَةُ بْنُ الْحَارِثِ بْنِ عُمَيْرٍ ، قَالَ : سَمِعْتُ أَبِي ، يَذْكُرُ عَنْ عُبَيْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : بَيْنَمَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَعَ أَصْحَابِهِ جَاءَ رَجُلٌ مِنْ أَهْلِ الْبَادِيَةِ قَالَ : أَيُّكُمُ ابْنُ عَبْدِ الْمُطَّلِبِ ؟ قَالُوا : هَذَا الأَمْغَرُ الْمُرْتَفِقُ – قَالَ حَمْزَةُ – : الأَمْغَرُ الأَبْيَضُ مُشْرَبٌ حُمْرَةً ، فَقَالَ : إِنِّي سَائِلُكَ فَمُشْتَدٌّ عَلَيْكَ فِي الْمَسْأَلَةِ ، قَالَ : سَلْ عَمَّا بَدَا لَكَ ، قَالَ : أَسْأَلُكَ بِرَبِّكَ ، وَرَبِّ مَنْ قَبْلَكَ ، وَرَبِّ مَنْ بَعْدَكَ ، آللَّهُ أَرْسَلَكَ ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ بِهِ آللَّهُ أَمَرَكَ أَنْ تُصَلِّيَ خَمْسَ صَلَوَاتٍ فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ بِهِ ، آللَّهُ أَمَرَكَ أَنْ تَأْخُذَ مِنْ أَمْوَالِ أَغْنِيَائِنَا فَتَرُدَّهُ عَلَى فُقَرَائِنَا ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ بِهِ ، آللَّهُ أَمَرَكَ أَنْ تَصُومَ هَذَا الشَّهْرَ مِنَ اثْنَيْ عَشَرَ شَهْرًا ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَأَنْشُدُكَ بِهِ ، آللَّهُ أَمَرَكَ أَنْ يَحُجَّ هَذَا الْبَيْتَ مَنِ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلاً ؟ قَالَ : اللَّهُمَّ نَعَمْ ، قَالَ : فَإِنِّي آمَنْتُ وَصَدَّقْتُ وَأَنَا ضِمَامُ بْنُ ثَعْلَبَةَ.

2094. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Peyğəmbər ﷺ səhabələri ilə bir yerdə oturmuşdu. Bu vaxt bir bədəvi gəlib dedi: "Hansınız Abdul-Muttalibin oğludur?" Səhabələr dedilər: "Bu dirsəklənmiş qırmızı alyanaqlı kimsədir". (Ravi Həmzə deyir: "Bu kəlmə qırmızıya çalan ağ

deməkdir”). Kişi dedi: “Mən səndən bəzi şeylər soruşacağam və sənə çox çətin suallar verəcəyəm. Odur ki, mənə acığın tutmasın”. Allah Elçisi ﷺ ona: “İstədiyini soruş”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm sənin və səndən əvvəlkilərin və sonrakıların Rəbbinə, de görüm səni Allahmı göndərmişdir?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm gecə və gündüz beş vaxt namaz qılmağımızı sənə Allahmı əmr etmişdir?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm varlılarımızdan sədəqə alıb kasıblarımıza paylaşdırmağı sənə Allahmı əmr etmişdir?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm ilin on iki ayından biri olan bu ayı (Ramazan ayını) oruc tutmağımızı sənə Allahmı əmr etmişdir?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Səni and verirəm Allaha, de görüm imkanı olana Kəbəni həcc etməyi sənə Allahmı əmr etmişdir?” Allah Elçisi ﷺ: “Allah şahiddir ki, belədir!”– deyə buyurdu. Kişi dedi: “Həqiqətən, mən sənə iman gətirdim və səni təsdiqlədim. Mən Dimam ibn Sələbəyəm”.

## ٢ - بَابُ الْفَضْلِ وَالْجُودِ فِي شَهْرِ رَمَضَانَ

## 2-ci fəsil: Ramazan ayının dəyəri və bu ayda əliaçıqlıq

٢٠٩٥ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَبَّاسٍ كَانَ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَجْوَدَ النَّاسِ ، وَكَانَ أَجْوَدَ مَا يَكُونُ فِي رَمَضَانَ حِينَ يَلْقَاهُ جِبْرِيلُ ، وَكَانَ جِبْرِيلُ يَلْقَاهُ فِي كُلِّ لَيْلَةٍ مِنْ شَهْرِ رَمَضَانَ فَيُدَارِسُهُ الْقُرْآنَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ يَلْقَاهُ جِبْرِيلُ عَلَيْهِ السَّلَامُ أَجْوَدَ بِالْخَيْرِ مِنَ الرِّيحِ الْمُرْسَلَةِ.

2095. ...Rəvayət edilir ki, Abdullah ibn Abbas رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ insanların ən səxavətlisi idi. Ramazan ayında, Cəbrail ilə görüşdüyü zaman isə daha səxavətli olardı. Cəbrail Ramazan ayının hər gecəsində Peyğəmbərlə ﷺ görüşər, ona Quranı öyrədərdi. Odur ki, Allah Elçisi ﷺ Cəbraillə عليه السلام görüşdüyünə görə xeyirxah işlər görməkdə sərbəst əsən küləkdən daha comərd olardı”.

٢٠٩٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ الْبُخَارِيُّ ، قَالَ : حَدَّثَنِي حَفْصُ بْنُ عُمَرَ بْنِ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، وَالنُّعْمَانُ بْنُ رَاشِدٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : مَا لَعَنَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ لَعْنَةٍ تُذْكَرُ ، كَانَ إِذَا كَانَ

قَرِيبَ عَهْدٍ بِجِبْرِيلَ عَلَيْهِ السَّلَامُ يُدَارِسُهُ ، كَانَ أَجْوَدَ بِالْخَيْرِ مِنَ الرِّيحِ الْمُرْسَلَةِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ وَالصَّوَابُ حَدِيثُ يُونُسَ بْنِ يَزِيدَ ، وَأَدْخَلَ هَذَا حَدِيثًا فِي حَدِيثٍ.

2096. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ lənət etməzdi. Quranı öyrənmək üçün Cəbrail ﵇ ilə görüş yaxınlaşdıqda xeyirxah işlər görməkdə sərbəst əsən küləkdən daha comərd olardı”.

### ٣ - بَابُ فَضْلِ شَهْرِ رَمَضَانَ

### 3-cü fəsil: Ramazan ayının fəziləti

٢٠٩٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا أَبُو سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا دَخَلَ شَهْرُ رَمَضَانَ فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ النَّارِ ، وَصُفِّدَتِ الشَّيَاطِينُ.

2097. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayı daxil olduqda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢٠٩٨ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ الْجُوْزَجَانِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي مَرْيَمَ ، قَالَ : أَنْبَأَنَا نَافِعُ بْنُ يَزِيدَ ، عَنْ عُقَيْلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا دَخَلَ رَمَضَانُ فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ النَّارِ ، وَصُفِّدَتِ الشَّيَاطِينُ.

2098. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayı daxil olduqda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

### ٤ - بَابُ ذِكْرِ الِاخْتِلَافِ عَلَى الزُّهْرِيِّ فِيهِ

### 4-cü fəsil: əz-Zuhrinin bu hədis haqda ixtilafı

٢٠٩٩ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي نَافِعُ بْنُ أَبِي أَنَسٍ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا دَخَلَ رَمَضَانُ ، فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ جَهَنَّمَ ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ.

2099. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayı daxil olduqda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنِي ابْنُ أَبِي أَنَسٍ ، مَوْلَى التَّيْمِيِّينَ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا جَاءَ رَمَضَانُ فُتِّحَتْ أَبْوَابُ الرَّحْمَةِ ، وَغُلِّقَتْ أَبْوَابُ جَهَنَّمَ ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ.

2100. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayı gəldiyi zaman rəhmət qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠١ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، فِي حَدِيثِهِ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابنِ شِهَابٍ ، عَنْ ابْنِ أَبِي أَنَسٍ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانَ رَمَضَانُ فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ جَهَنَّمَ ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ ، رَوَاهُ ابْنُ إِسْحَاقَ ، عَنِ الزُّهْرِيِّ.

2101. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayında Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ ابْنِ إِسْحَاقَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ ابْنِ أَبِي أَنَسٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا دَخَلَ شَهْرُ رَمَضَانَ ، فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ النَّارِ ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا يَعْنِي حَدِيثَ ابْنِ إِسْحَاقَ خَطَأٌ ، وَلَمْ يَسْمَعْهُ ابْنُ إِسْحَاقَ مِنَ الزُّهْرِيِّ ، وَالصَّوَابُ مَا تَقَدَّمَ ذِكْرُنَا لَهُ.

2102. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayı daxil olduqda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ ابْنِ إِسْحَاقَ ، قَالَ : وَذَكَرَ مُحَمَّدَ بْنَ مُسْلِمٍ ، عَنْ أُوَيْسِ بْنِ أَبِي أُوَيْسٍ ، عَدِيدِ بَنِي تَيْمٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : هَذَا رَمَضَانُ قَدْ جَاءَكُمْ تُفَتَّحُ فِيهِ أَبْوَابُ الْجَنَّةِ ، وَتُغَلَّقُ فِيهِ أَبْوَابُ النَّارِ ، وَتُسَلْسَلُ فِيهِ الشَّيَاطِينُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا الْحَدِيثُ خَطَأٌ.

2103. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Bu, Ramazan ayıdır, artıq sizə gəlmişdir. Bu ayda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

## ٥ - ذِكْرُ الاخْتِلَافِ عَلَى مَعْمَرٍ فِيهِ

## 5-ci fəsil: Mə'mərin hədisi haqda ixtilaf

٢١٠٤ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ

أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُرَغِّبُ فِي قِيَامِ رَمَضَانَ مِنْ غَيْرِ عَزِيمَةٍ ، وَقَالَ : إِذَا دَخَلَ رَمَضَانُ فُتِّحَتْ أَبْوَابُ الْجَنَّةِ ، وَغُلِّقَتْ أَبْوَابُ الْجَحِيمِ ، وَسُلْسِلَتْ فِيهِ الشَّيَاطِينُ أَرْسَلَهُ ابْنُ الْمُبَارَكِ.

2104. ...Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ çətinləşdirmədən camaatı Ramazan gecələrini dəyərləndirməyə təşviq edər və buyurardı: “Ramazan ayı daxil olduqda Cənnətin qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : أَنْبَأَنَا حِبَّانُ بْنُ مُوسَى خُرَاسَانِيٌّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا دَخَلَ رَمَضَانُ ، فُتِحَتْ أَبْوَابُ الرَّحْمَةِ ، وَغُلِّقَتْ أَبْوَابُ جَهَنَّمَ ، وَسُلْسِلَتِ الشَّيَاطِينُ.

2105. ...Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Ramazan ayı girdikdə rəhmət qapıları açılır, Cəhənnəm qapıları bağlanır və şeytanlar zəncirlənir”.

٢١٠٦ - أَخْبَرَنَا بِشْرُ بْنُ هِلَالٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلَابَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَتَاكُمْ رَمَضَانُ شَهْرٌ مُبَارَكٌ فَرَضَ اللهُ عَزَّ وَجَلَّ عَلَيْكُمْ صِيَامَهُ ، تُفْتَحُ فِيهِ أَبْوَابُ السَّمَاءِ ، وَتُغْلَقُ فِيهِ أَبْوَابُ الْجَحِيمِ ، وَتُغَلُّ فِيهِ مَرَدَةُ الشَّيَاطِينِ ، لِلَّهِ فِيهِ لَيْلَةٌ خَيْرٌ مِنْ أَلْفِ شَهْرٍ ، مَنْ حُرِمَ خَيْرَهَا فَقَدْ حُرِمَ.

2106. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizə mübarək Ramazan ayı gəlir. Allah ﷻ bu ayda sizə oruc tutmağı vacib etmişdir. Bu ayda səmanın qapıları açılır, Cəhənnəmin qapıları bağlanır və şeytanların azğınları zəncirlənir. Bu ayda Allahın elə bir gecəsi var ki, min aydan xeyirlidir. Kim həmin gecənin xeyrindən məhrum olarsa, artıq çox şeydən məhrum olar”.

٢١٠٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ عَرْفَجَةَ ، قَالَ : عُدْنَا عُتْبَةَ بْنَ فَرْقَدٍ ، فَتَذَاكَرْنَا شَهْرَ رَمَضَانَ ، فَقَالَ : مَا تَذْكُرُونَ ؟ قُلْنَا : شَهْرَ رَمَضَانَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تُفْتَحُ فِيهِ أَبْوَابُ الْجَنَّةِ ، وَتُغْلَقُ فِيهِ أَبْوَابُ النَّارِ ، وَتُغَلُّ فِيهِ الشَّيَاطِينُ ، وَيُنَادِي مُنَادٍ كُلَّ لَيْلَةٍ : يَا بَاغِيَ الْخَيْرِ هَلُمَّ ، وَيَا بَاغِيَ الشَّرِّ أَقْصِرْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ.

2107. ...Rəvayət edilir ki, Arfəcə ﷜ demişdir: “Biz Utbə ibn Fərqadı ziyarət etməyə getmişdik. Ramazan ayı haqda bəhs edirdik. O dedi: “Nə haqda danışırsız?” Biz dedik: “Ramazan ayı haqda”. O dedi: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Bu ayda Cənnətin qapıları açılır, Cəhən-

nəmin qapıları bağlanır, şeytanlar zəncirlənir və bir carçı hər gecə belə nida edir: "Ey xeyir istəyən, çalış! Ey şər istəyən, dayan!"

٢١٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ عَرْفَجَةَ ، قَالَ : كُنْتُ فِي بَيْتٍ فِيهِ عُتْبَةُ بْنُ فَرْقَدٍ ، فَأَرَدْتُ أَنْ أُحَدِّثَ بِحَدِيثٍ ، وَكَانَ رَجُلٌ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَأَنَّهُ أَوْلَى بِالْحَدِيثِ مِنِّي ، فَحَدَّثَ الرَّجُلُ عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : فِي رَمَضَانَ ، تُفْتَحُ فِيهِ أَبْوَابُ السَّمَاءِ ، وَتُغْلَقُ فِيهِ أَبْوَابُ النَّارِ ، وَيُصَفَّدُ فِيهِ كُلُّ شَيْطَانٍ مَرِيدٍ ، وَيُنَادِي مُنَادٍ كُلَّ لَيْلَةٍ : يَا طَالِبَ الْخَيْرِ هَلُمَّ ، وَيَا طَالِبَ الشَّرِّ أَمْسِكْ.

2108. ...Rəvayət edilir ki, Arfəcə ﷺ demişdir: "Bir dəfə Utbə ibn Fərqadın evində idim. Bir hədis danışmaq istədim. O, Peyğəmbərin ﷺ səhabələrindən idi. O, hədis danışmağa məndən daha haqlı idi. O, Peyğəmbərdən ﷺ belə bir hədis danışdı: "Ramazan ayında səmaların qapıları açılır, Cəhənnəm qapıları bağlanır, bütün azğın şeytanlar zəncirlənir və bir carçı hər gecə belə nida edir: "Ey xeyir istəyən, çalış! Ey şər istəyən, dayan!"

## ٦ - الرُّخْصَةُ فِي أَنْ يُقَالَ : لِشَهْرِ رَمَضَانَ رَمَضَانُ

## 6-cı fəsil: Ramazan ayına sadəcə "Ramazan" deməyin icazəli olması

٢١٠٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : أَنْبَأَنَا الْمُهَلَّبُ بْنُ أَبِي حَبِيبَةَ (ح) وَأَنْبَأَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ الْمُهَلَّبِ بْنِ أَبِي حَبِيبَةَ ، قَالَ : أَخْبَرَنِي الْحَسَنُ ، عَنْ أَبِي بَكْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَقُولَنَّ أَحَدُكُمْ صُمْتُ رَمَضَانَ ، وَلاَ قُمْتُهُ كُلَّهُ . وَلاَ أَدْرِي كَرِهَ التَّزْكِيَةَ ، أَوْ قَالَ . : لاَ بُدَّ مِنْ غَفْلَةٍ وَرَقْدَةٍ اللَّفْظُ لِعُبَيْدِ اللهِ.

2109. ...Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Heç biriniz "Ramazanda oruc tutdum və bütün gecələrini ibadətlə keçirdim" deməsin!" Ravi deyir: "Mən bilmədim Peyğəmbər ﷺ burada özünü təmizə çıxarmağı xoşlamadı, yoxsa başqa bir şeyi dedi, çünki onun bəzən yuxulu olması da olmuşdur".[1]

٢١١٠ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَطَاءٌ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ يُخْبِرُنَا قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاِمْرَأَةٍ مِنَ الأَنْصَارِ : إِذَا كَانَ رَمَضَانُ فَاعْتَمِرِي فِيهِ ، فَإِنَّ عُمْرَةً فِيهِ تَعْدِلُ حَجَّةً.

2110. ...Rəvayət edilir ki, Əta ﷺ demişdir: "Mən İbn Abbasın bizə belə dediyini eşitmişəm: "Allah Elçisi ﷺ ənsardan olan bir qadına buyurdu:

[1] Hədis zəifdir.

"Ramazan ayı gəldikdə ümrə et! Çünki bu ayda edilən ümrə həccə bərabərdir".

## ٧ - اخْتِلاَفُ أَهْلِ الآفَاقِ فِي الرُّؤْيَةِ

## 7-ci fəsil: Hilalı[1] izləyənlərin ixtilafı

٢١١١ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ وَهُوَ ابْنُ أَبِي حَرْمَلَةَ ، قَالَ : أَخْبَرَنِي كُرَيْبٌ ، أَنَّ أُمَّ الْفَضْلِ بَعَثَتْهُ إِلَى مُعَاوِيَةَ بِالشَّامِ ، قَالَ : فَقَدِمْتُ الشَّامَ ، فَقَضَيْتُ حَاجَتَهَا وَاسْتَهَلَّ عَلَيَّ هِلاَلُ رَمَضَانَ وَأَنَا بِالشَّامِ ، فَرَأَيْتُ الْهِلاَلَ لَيْلَةَ الْجُمُعَةِ ، ثُمَّ قَدِمْتُ الْمَدِينَةَ فِي آخِرِ الشَّهْرِ ، فَسَأَلَنِي عَبْدُ اللهِ بْنُ عَبَّاسٍ ، ثُمَّ ذَكَرَ الْهِلاَلَ ، فَقَالَ : مَتَى رَأَيْتُمْ ؟ فَقُلْتُ : رَأَيْنَاهُ لَيْلَةَ الْجُمُعَةِ ، قَالَ : أَنْتَ رَأَيْتَهُ لَيْلَةَ الْجُمُعَةِ ؟ قُلْتُ : نَعَمْ ، وَرَآهُ النَّاسُ فَصَامُوا وَصَامَ مُعَاوِيَةُ ، قَالَ : لَكِنْ رَأَيْنَاهُ لَيْلَةَ السَّبْتِ ، فَلاَ نَزَالُ نَصُومُ حَتَّى نُكْمِلَ ثَلاَثِينَ يَوْمًا أَوْ نَرَاهُ ، فَقُلْتُ : أَوَ لاَ تَكْتَفِي بِرُؤْيَةِ مُعَاوِيَةَ ، وَأَصْحَابِهِ ؟ قَالَ : لاَ هَكَذَا أَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2111. ...Kureyb ﵁ rəvayət edir ki, Ummul-Fadl onu Muaviyənin yanına Şama göndərmişdi. Kureyb deyir: "Şama gəlib Ummul-Fadlın dediklərini yerinə yetirdim. Şamda olanda Ramazan ayının hilalını Cümə gecəsi gördüm. Mədinəyə qayıtdıqda ayın axırı idi. Abdullah ibn Abbas məndən hilal haqda: "Nə vaxt görmüsən?" deyə soruşdu. Ona dedim: "Biz hilalı cümə gecəsi görmüşük". O dedi: "Sən hilalı cümə gecəsi görmüsən?" Mən: "Bəli, insanlar da gördülər. Onlar və Muaviyə oruc tutmağa başladılar", – dedim. O dedi: "Biz hilalı şənbə günü görmüşük, ona görə otuz gün tamam olana və ya yeni hilalı görənə qədər oruc tutacağıq". Mən dedim: "Sənə Muaviyə və yoldaşlarının ayı görməsi kifayət deyilmi?" O dedi: "Xeyr, Allah Elçisi ﷺ bizə belə əmr etmişdir".

## ٨ - بَابُ قَبُولِ شَهَادَةِ الرَّجُلِ الْوَاحِدِ عَلَى هِلاَلِ شَهْرِ رَمَضَانَ وَذِكْرِ الاِخْتِلاَفِ فِيهِ عَلَى سُفْيَانَ فِي حَدِيثِ سِمَاكٍ

## 8-ci fəsil: Bir kişinin Ramazan ayının hilalını görməsinin məqbul sayılması və Süfyanın hədisi ilə Siməkin hədisi haqda ixtilaf

٢١١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الْعَزِيزِ بْنِ أَبِي رِزْمَةَ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ سُفْيَانَ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : جَاءَ أَعْرَابِيٌّ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : رَأَيْتُ الْهِلاَلَ ، فَقَالَ : أَتَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ؟ قَالَ : نَعَمْ ، فَنَادَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنْ صُومُوا.

---

[1] Hilal - hicri qəməri aylarda ay tamamlandıqda göydə olan yeni ayın qövsünün nazik şəkildə görsənməsinə deyilir.

2112. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Mən hilalı görmüşəm”. Peyğəmbər ﷺ buyurdu: “Allahdan başqa ibadət olunan haqq məbudun olmadığına və Muhəmmədin Onun qulu və elçisi olduğuna şahidlik edirsənmi?” Bədəvi dedi: “Bəli”. Peyğəmbər ﷺ: “Oruc tutmağa başlayın!” deyə nida etdi”.[1]

٢١١٣ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : جَاءَ أَعْرَابِيٌّ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَبْصَرْتُ الْهِلاَلَ اللَّيْلَةَ ، قَالَ : أَتَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ؟ قَالَ : نَعَمْ ، قَالَ : يَا بِلاَلُ ، أَذِّنْ فِي النَّاسِ فَلْيَصُومُوا غَدًا

2113. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Bir bədəvi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Mən gecə vaxtı hilalı gördüm”. Peyğəmbər ﷺ dedi: “Allahdan başqa ibadətə layiq haqq məbudun olmadığına və Muhəmmədin Onun qulu və elçisi olduğuna şahidlik edirsənmi?” Bədəvi dedi: “Bəli”. Peyğəmbər ﷺ dedi: “Ey Bilal! İnsanların sabahdan oruc tutmağa başlamalarını elan et”[2]

٢١١٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، عَنْ أَبِي دَاوُدَ ، عَنْ سُفْيَانَ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ مُرْسَلٌ.

2114. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.[3]

٢١١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ نُعَيْمٍ مِصِّيصِيٌّ ، قَالَ : أَنْبَأَنَا حِبَّانُ بْنُ مُوسَى الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ مُرْسَلٌ.

2115. ... Yuxarıdakı hədisin mətni ilə eynidir.[4]

٢١١٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ شَبِيبٍ أَبُو عُثْمَانَ ، وَكَانَ شَيْخًا صَالِحًا بِطَرَسُوسَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ أَبِي زَائِدَةَ ، عَنْ حُسَيْنِ بْنِ الْحَارِثِ الْجَدَلِيِّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ زَيْدِ بْنِ الْخَطَّابِ ، أَنَّهُ خَطَبَ النَّاسَ فِي الْيَوْمِ الَّذِي يُشَكُّ فِيهِ ، فَقَالَ : أَلاَ إِنِّي جَالَسْتُ أَصْحَابَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَسَاءَلْتُهُمْ ، وَإِنَّهُمْ حَدَّثُونِي أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صُومُوا لِرُؤْيَتِهِ ، وَأَفْطِرُوا لِرُؤْيَتِهِ ، وَانْسُكُوا لَهَا فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَكْمِلُوا ثَلاَثِينَ ، فَإِنْ شَهِدَ شَاهِدَانِ فَصُومُوا ، وَأَفْطِرُوا.

2116. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Zeyd ibn əl-Xattab ﵀ (Ramazan ayımı yoxsa Şaban ayının) hansı gün olması haqda insanlara xütbə

---

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.
[3] Hədis zəifdir.
[4] Hədis zəifdir.

verərək dedi: “Bilin ki, mən Allah Elçisinin ﷺ səhabələri ilə oturub onlardan bu haqda soruşdum. Onlar mənə dedilər ki, Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutmağa başlayın! Yenidən hilalı gördükdə isə oruc tutmayın! Əgər hava tutqun olsa, ayı otuz günlə tamamlayın! İki nəfər hilalı gördüklərini söyləyərlərsə, oruc tutmağa başlayın və oruc tutmağı tərk edin!”

### ٩ - إِكْمَالُ شَعْبَانَ ثَلاَثِينَ إِذَا كَانَ غَيْمٌ وَذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ عَنْ أَبِي هُرَيْرَةَ

### 9-cu fəsil: Buludlu günlər olanda Şaban ayını otuz günə tatmamlamaq və Əbu Hureyradan ﵁ nəql edənlərin bu haqda ixtilafı

٢١١٧ - أَخْبَرَنَا مُؤَمَّلُ بْنُ هِشَامٍ ، عَنْ إِسْمَعِيلَ ، عَنْ شُعْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صُومُوا لِرُؤْيَتِهِ وَأَفْطِرُوا لِرُؤْيَتِهِ فَإِنْ غُمَّ عَلَيْكُمُ الشَّهْرُ فَعُدُّوا ثَلاَثِينَ.

2117. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutun və (yeni ayın) hilalını gördükdə oruc tutmayın. Əgər hava tutqun olarsa, ayı otuz gün olaraq tamamlayın!”

٢١١٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا وَرْقَاءُ ، عَنْ شُعْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ زِيَادٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صُومُوا لِرُؤْيَتِهِ ، وَأَفْطِرُوا لِرُؤْيَتِهِ ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَاقْدِرُوا ثَلاَثِينَ.

2118. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutun və (yeni ayın) hilalını gördükdə oruc tutmayın. Əgər hava tutqun olarsa, ayı otuz gün olaraq tamamlayın!”

### ١٠ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى الزُّهْرِيِّ فِي هَذَا الْحَدِيثِ

### 10-cu fəsil: əz-Zuhrinin hədisi haqda ixtilaf

٢١١٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ النَّيْسَابُورِيُّ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ ، عَنْ مُحَمَّدِ بْنِ مُسْلِمٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِذَا رَأَيْتُمُ الْهِلاَلَ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَصُومُوا ثَلاَثِينَ يَوْمًا.

2119. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə oruc tutmağı tərk edin. Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!”

٢١٢٠ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي سَالِمُ بْنُ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : إِذَا رَأَيْتُمُ الْهِلاَلَ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَاقْدِرُوا لَهُ.

2120. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Hilalı gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə oruc tutmağı tərk edin. Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!"

٢١٢١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَكَرَ رَمَضَانَ ، فَقَالَ : لاَ تَصُومُوا حَتَّى تَرَوُا الْهِلاَلَ ، وَلاَ تُفْطِرُوا حَتَّى تَرَوْهُ ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَاقْدِرُوا لَهُ.

2121. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ Ramazan ayı haqda danışdı və belə dedi: "Hilalı görməyənə qədər oruc tutmağa başlamayın! (Ayın axırında) da onu görməyənə qədər bayram etməyin! Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!"

### ١١ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى عُبَيْدِ اللهِ بْنِ عُمَرَ فِي هَذَا الْحَدِيثِ

### 11-ci fəsil: Ubeyullah ibn Ömərin رضي الله عنهما hədisi haqda ixtilafı

٢١٢٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : حَدَّثَنِي نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لاَ تَصُومُوا حَتَّى تَرَوْهُ ، وَلاَ تُفْطِرُوا حَتَّى تَرَوْهُ ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَاقْدِرُوا لَهُ.

2122. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Hilalı görməyənə qədər oruc tutmağa başlamayın! (Ayın axırında) da onu görməyənə qədər bayram etməyin! Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!"

٢١٢٣ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، صَاحِبِ حِمْصَ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ أَبِي شَيْبَةَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : ذَكَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْهِلاَلَ ، فَقَالَ : إِذَا رَأَيْتُمُوهُ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَعُدُّوا ثَلاَثِينَ.

2123. ...Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Allah Elçisi ﷺ hilal haqda danışdı və belə buyurdu: "Onu gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə bayram edin. Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!"

### ١٢ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى عَمْرِو بْنِ دِينَارٍ فِي حَدِيثِ ابْنِ عَبَّاسٍ فِيهِ

### 12-ci fəsil: İbn Abbasın ﵄ hədisi haqda Amr ibn Dinarın ixtilafı

٢١٢٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ أَبُو الْجَوْزَاءِ ، وَهُوَ ثِقَةٌ بَصْرِيٌّ ، أَخُو أَبِي الْعَالِيَةِ ، قَالَ : أَنْبَأَنَا حِبَّانُ بْنُ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صُومُوا لِرُؤْيَتِهِ وَأَفْطِرُوا لِرُؤْيَتِهِ ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَكْمِلُوا الْعِدَّةَ ثَلاَثِينَ.

2124. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Onu (ayı) gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə bayram edin. Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!”

٢١٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ مُحَمَّدِ بْنِ حُنَيْنٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : عَجِبْتُ مِمَّنْ يَتَقَدَّمُ الشَّهْرَ ، وَقَدْ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا رَأَيْتُمُ الْهِلاَلَ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَكْمِلُوا الْعِدَّةَ ثَلاَثِينَ.

2125. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Ramazan ayı girməmiş oruc tutana təəccüb edirəm, çünki Allah Elçisi ﷺ belə buyurmuşdur: “Hilalı gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə oruc tutmağı tərk edin. Əgər hava buludlu olarsa, ayı otuz günə tamamlayın!”

### ١٣ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى مَنْصُورٍ فِي حَدِيثِ رِبْعِيٍّ فِيهِ

### 13-cü fəsil: Ribinin hədisi haqda Mansurun ixtilafı

٢١٢٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ ، عَنْ حُذَيْفَةَ بْنِ الْيَمَانِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَقَدَّمُوا الشَّهْرَ حَتَّى تَرَوْا الْهِلاَلَ قَبْلَهُ أَوْ تُكْمِلُوا الْعِدَّةَ ، ثُمَّ صُومُوا حَتَّى تَرَوْا الْهِلاَلَ ، أَوْ تُكْمِلُوا الْعِدَّةَ قَبْلَهُ.

2126. ...Huzeyfə ibn əl-Yəmən ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı görməyənə qədər Ramazan ayının orucunu tutmağa başlamayın!” və ya “Ramazan ayından qabaqkı ayın sayını tamamlayın, sonra oruc tutmağa başlayın! Yeni ayın hilalını görənə qədər və ya əvvəlki ay kimi günləri sayaraq oruc tutmağa davam edin!”

٢١٢٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ رِبْعِيٍّ ، عَنْ بَعْضِ ، أَصْحَابِ

النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَقَدَّمُوا الشَّهْرَ حَتَّى تُكْمِلُوا الْعِدَّةَ أَوْ تَرَوْا الْهِلاَلَ ، ثُمَّ صُومُوا وَلاَ تُفْطِرُوا حَتَّى تَرَوْا الْهِلاَلَ أَوْ تُكْمِلُوا الْعِدَّةَ ثَلاَثِينَ أَرْسَلَهُ الْحَجَّاجُ بْنُ أَرْطَاةَ.

2127. ...Ribi ﵀ Peyğəmbərin ﷺ bəzi səhabələrindən rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurmuşdur: “Əvvəlki ayı otuz günə tamamlamayana və ya hilalı görməyənə qədər Ramazan ayının orucunu tutmağa başlamayın! Sonra oruc tutmağa başlayın! Yeni ayın hilalını görənə qədər oruc tutmağa davam edin!” və ya “Ayı otuz günə tamamlayın!”

٢١٢٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : حَدَّثَنَا حِبَّانُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنِ الْحَجَّاجِ بْنِ أَرْطَاةَ ، عَنْ مَنْصُورٍ ، عَنْ رِبْعِيٍّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا رَأَيْتُمُ الْهِلاَلَ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَتِمُّوا شَعْبَانَ ثَلاَثِينَ ، إِلاَّ أَنْ تَرَوْا الْهِلاَلَ قَبْلَ ذَلِكَ ، ثُمَّ صُومُوا رَمَضَانَ ثَلاَثِينَ إِلاَّ أَنْ تَرَوْا الْهِلاَلَ قَبْلَ ذَلِكَ.

2128. ...Rəvayət edilir ki, Ribi ﵀ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutmağa başlayın. (Ayın axırında) onu gördükdə bayram edin. Əgər hava buludlu olarsa, Şaban ayını otuz günə tamamlayın. Sonra Ramazan ayını otuz günə tamamlayın, amma hilalı görsəniz, əvvəlki kimi edin!”

٢١٢٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ أَبِي صَغِيرَةَ ، عَنْ سِمَاكِ بْنِ حَرْبٍ ، عَنْ عِكْرِمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَبَّاسٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : صُومُوا لِرُؤْيَتِهِ وَأَفْطِرُوا لِرُؤْيَتِهِ ، فَإِنْ حَالَ بَيْنَكُمْ وَبَيْنَهُ سَحَابٌ فَأَكْمِلُوا الْعِدَّةَ ، وَلاَ تَسْتَقْبِلُوا الشَّهْرَ اسْتِقْبَالاً.

2129. İbn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutmağa başlayın. Onu gördükdə bayram edin. Əgər ay ilə aranızda bulud olarsa, ayı otuz günə tamamlayın! Ramazan ayını qarşılamaq üçün bir-iki gün qabaqdan oruc tutmayın!”

٢١٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ سِمَاكٍ ، عَنْ عِكْرِمَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَصُومُوا قَبْلَ رَمَضَانَ ، صُومُوا لِلرُّؤْيَةِ ، وَأَفْطِرُوا لِلرُّؤْيَةِ ، فَإِنْ حَالَتْ دُونَهُ غَيَايَةٌ فَأَكْمِلُوا ثَلاَثِينَ.

2130. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ramazan ayını qarşılamaq üçün bir-iki gün qabaqdan oruc tutmayın! Hilalı gördükdə oruc tutmağa başlayın. Onu gördükdə bayram edin. Əgər ay ilə aranızda bulud olarsa, ayı otuz günə tamamlayın!”

١٤ - كَمِ الشَّهْرُ وَذِكْرُ الاِخْتِلاَفِ عَلَى الزُّهْرِيِّ فِي الْخَبَرِ عَنْ عَائِشَةَ

## 14-cü fəsil: Ay neçə gündür və əz-Zuhrinin Aişədən ﷺ gələn xəbər haqda ixtilafı

٢١٣١ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ الْجَهْضَمِيُّ ، عَنْ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : أَقْسَمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ لاَ يَدْخُلَ عَلَى نِسَائِهِ شَهْرًا ، فَلَبِثَ تِسْعًا وَعِشْرِينَ ، فَقُلْتُ : أَلَيْسَ قَدْ كُنْتَ آلَيْتَ شَهْرًا ؟ فَعَدَدْتُ الأَيَّامَ تِسْعًا وَعِشْرِينَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ.

2131. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ qadınlarının yanına bir ay girməyəcəyinə dair and içmişdi. İyirmi doqquzuncu gün olduqda yanıma gəldi. Mən ona dedim: "Sən bir ay bizim yanımıza gəlməməyə and içməmişdinmi? Mən iyirmi doqquz gün saydım". Allah Elçisi ﷺ buyurdu: "Ay iyirmi doqquz gündür".

٢١٣٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ عُبَيْدَ اللهِ بْنَ عَبْدِ اللهِ بْنِ أَبِي ثَوْرٍ ، حَدَّثَهُ ح وأَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا الْحَكَمُ بْنُ نَافِعٍ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ أَبِي ثَوْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : لَمْ أَزَلْ حَرِيصًا أَنْ أَسْأَلَ عُمَرَ بْنَ الْخَطَّابِ ، عَنِ الْمَرْأَتَيْنِ مِنْ أَزْوَاجِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اللَّتَيْنِ قَالَ اللَّهُ لَهُمَا : **{إِنْ تَتُوبَا إِلَى اللهِ فَقَدْ صَغَتْ قُلُوبُكُمَا}** وَسَاقَ الْحَدِيثَ ، وَقَالَ فِيهِ : فَاعْتَزَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نِسَاءَهُ مِنْ أَجْلِ ذَلِكَ الْحَدِيثِ حِينَ أَفْشَتْهُ حَفْصَةُ إِلَى عَائِشَةَ تِسْعًا وَعِشْرِينَ لَيْلَةً ، قَالَتْ عَائِشَةُ : وَكَانَ قَالَ : مَا أَنَا بِدَاخِلٍ عَلَيْهِنَّ شَهْرًا مِنْ شِدَّةِ مَوْجِدَتِهِ عَلَيْهِنَّ حِينَ حَدَّثَهُ اللَّهُ عَزَّ وَجَلَّ حَدِيثَهُنَّ ، فَلَمَّا مَضَتْ تِسْعٌ وَعِشْرُونَ لَيْلَةً دَخَلَ عَلَى عَائِشَةَ ، فَبَدَأَ بِهَا ، فَقَالَتْ لَهُ عَائِشَةُ : إِنَّكَ قَدْ كُنْتَ آلَيْتَ يَا رَسُولَ اللهِ أَنْ لاَ تَدْخُلَ عَلَيْنَا شَهْرًا ، وَإِنَّا أَصْبَحْنَا مِنْ تِسْعٍ وَعِشْرِينَ لَيْلَةً نَعُدُّهَا عَدَدًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ لَيْلَةً..

2132. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Mən Ömər ibn əl-Xattabdan Allah Elçisinin ﷺ zövcələrindən ikisi haqda hadisəni soruşmaq istəyirdim. Allah onlar haqda buyurur: **"Hər ikiniz Allaha tövbə etməlisiniz, çünki ikinizin də qəlbi günaha meyl etmişdir...".** (ət-Təhrim, 4). Ömər bu hadisəni mənə danışdı: "Peyğəmbər ﷺ öz sirrini Aişəyə, Aişə isə Həfsəyə dedikdə Allah Elçisi ﷺ zövcələrindən iyirmi doqquz gecə ayrı qaldı". Aişə deyir: "Allah ﷻ onların etdiklərini Elçisinə xəbər verdikdə, Peyğəmbər ﷺ qəzəblənərək: "Mən bir ay müddətində onlara yaxınlaşmayacağam!" dedi. İyirmi doqquz gün keçdikdən sonra Allah Elçisi ﷺ Aişənin yanına gəldi. Aişə ona dedi: "Ey Allahın Elçisi, sən bir ay bizim yanımıza gəlməməyə and içməmişdinmi? Mən iyirmi doqquz gecə saydım". Allah Elçisi ﷺ buyurdu: "Ay iyirmi doqquz gecədir".

١٥ - ذِكْرُ خَبَرِ ابْنِ عَبَّاسٍ فِيهِ

15-ci fəsil: İbn Abbasın ﷺ bu haqda dediyi

٢١٣٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ هُوَ أَبُو بُرَيْدٍ الْجَرْمِيُّ بَصْرِيٌّ ، عَنْ بَهْزٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَلَمَةَ ، عَنْ أَبِي الْحَكَمِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : أَتَانِي جِبْرِيلُ عَلَيْهِ السَّلَامُ ، فَقَالَ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ يَوْمًا.

2133. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Cəbrail ﷺ yanıma gəlib dedi: "Bir ay iyirmi doqquz gündür".

٢١٣٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، وَذَكَرَ كَلِمَةً مَعْنَاهَا ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَلَمَةَ ، قَالَ سَلَمَةُ : سَمِعْتُ أَبَا الْحَكَمِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ يَوْمًا.

2134. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ay iyirmi doqquz gündür".

١٦ - ذِكْرُ الاخْتِلَافِ عَلَى إِسْمَعِيلَ فِي خَبَرِ سَعْدِ بْنِ مَالِكٍ فِيهِ

16-cı fəsil: İsmailin Səd ibn Malikin ﷺ xəbəri haqda olan ixtilafı

٢١٣٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ ، عَنْ إِسْمَعِيلَ بْنِ أَبِي خَالِدٍ ، عَنْ مُحَمَّدِ بْنِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ ضَرَبَ بِيَدِهِ عَلَى الأُخْرَى ، وَقَالَ : الشَّهْرُ هَكَذَا وَهَكَذَا ، وَهَكَذَا وَنَقَصَ فِي الثَّالِثَةِ إِصْبَعًا.

2135. ...Muhəmməd ibn Səd ibn Əbu Vaqqas atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: "Bir ay belə, belə və belədir!" deyib əllərini bir-birinə vurdu, üçüncü dəfə isə barmaqlarından birini açmadı.

٢١٣٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ إِسْمَعِيلَ ، عَنْ مُحَمَّدِ بْنِ سَعْدٍ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الشَّهْرُ هَكَذَا ، وَهَكَذَا ، وَهَكَذَا يَعْنِي تِسْعَةً وَعِشْرِينَ رَوَاهُ يَحْيَى بْنُ سَعِيدٍ ، وَغَيْرُهُ عَنْ إِسْمَعِيلَ ، عَنْ مُحَمَّدِ بْنِ سَعْدٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2136. ...Muhəmməd ibn Səd atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ dedi: "Bir ay belə, belə və belədir!". Yəni iyirmi doqquz gündür".

٢١٣٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ مُحَمَّدِ بْنِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ هَكَذَا ، وَهَكَذَا ، وَهَكَذَا وَصَفَّقَ مُحَمَّدُ بْنُ عُبَيْدٍ بِيَدَيْهِ يَنْعَتُهَا ثَلَاثًا ، ثُمَّ قَبَضَ فِي الثَّالِثَةِ الإِبْهَامَ فِي الْيُسْرَى قَالَ يَحْيَى بْنُ سَعِيدٍ : قُلْتُ لِإِسْمَعِيلَ عَنْ أَبِيهِ ؟ قَالَ : لاَ.

2137. ...Rəvayət edilir ki, Muhəmməd ibn Səd ibn Əbu Vaqqas ﷺ demişdir: "Allah Elçisi ﷺ: "Bir ay belə, belə və belədir!" buyurdu. Muhəmməd ibn Ubeyd izah etmək üçün əlini üç dəfə açıb yumdu, üçüncü dəfə isə sol əlinin baş barmağını yumdu". Yəhyə ibn Səid dedi: "Mən İsmailə dedim: "O, atasından rəvayət edib?" O da: "Xeyr!" dedi".

١٧ - ذِكْرُ الاخْتِلاَفِ عَلَى يَحْيَى بْنِ أَبِي كَثِيرٍ فِي خَبَرِ أَبِي سَلَمَةَ فِيهِ

17-ci fəsil: Yəhyə ibn Əbu Kəsirin Əbu Sələmənin xəbəri haqda olan ixtilafı

٢١٣٨ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا هَارُونُ ، قَالَ : حَدَّثَنَا عَلِيٌّ هُوَ ابْنُ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ يَكُونُ تِسْعَةً وَعِشْرِينَ وَيَكُونُ ثَلاَثِينَ ، فَإِذَا رَأَيْتُمُوهُ فَصُومُوا ، وَإِذَا رَأَيْتُمُوهُ فَأَفْطِرُوا ، فَإِنْ غُمَّ عَلَيْكُمْ فَأَكْمِلُوا الْعِدَّةَ.

2138. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ay bəzən iyirmi doqquz, bəzən də otuz gün olur. Hilalı gördükdə oruc tutmağa başlayın, onu gördükdə də bayram edin. Əgər ay ilə aranızda bulud olarsa, ayı otuz günə tamamlayın!"

٢١٣٩ - أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ و أَخْبَرَنِي أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ سَعِيدٍ ، عَنْ مُعَاوِيَةَ ، وَاللَّفْظُ لَهُ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، أَنَّ أَبَا سَلَمَةَ ، أَخْبَرَهُ أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ وَهُوَ ابْنُ عُمَرَ ، يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ.

2139. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Ay iyirmi doqquz gündür".

٢١٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَسْوَدِ بْنِ قَيْسٍ ، عَنْ سَعِيدِ بْنِ عَمْرٍو ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّا أُمَّةٌ أُمِّيَّةٌ ، لاَ نَكْتُبُ وَلاَ نَحْسُبُ الشَّهْرُ هَكَذَا وَهَكَذَا وَهَكَذَا ثَلاَثًا حَتَّى ذَكَرَ تِسْعًا وَعِشْرِينَ.

2140. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ: "Biz yazıb-oxumağı bacarmayan bir ümmətik. Nə yazı yazarıq, nə hesab bilərik. Bir ay belə, belə və belədir!" deyərək bunu üç dəfə təkrarladı və iyirmi doqquz gün olduğunu bildirdi.

٢١٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، عَنْ شُعْبَةَ ، عَنِ الأَسْوَدِ بْنِ قَيْسٍ ، قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ عَمْرِو بْنِ سَعِيدِ بْنِ أَبِي الْعَاصِ ، أَنَّهُ سَمِعَ ابْنَ عُمَرَ ، يُحَدِّثُ عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّا أُمَّةٌ أُمِّيَّةٌ ، لاَ نَحْسُبُ وَلاَ نَكْتُبُ ، وَالشَّهْرُ هَكَذَا وَهَكَذَا وَهَكَذَا – وَعَقَدَ الإِبْهَامَ فِي الثَّالِثَةِ ، وَالشَّهْرُ هَكَذَا وَهَكَذَا وَهَكَذَا تَمَامَ الثَّلاَثِينَ.

2141. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Biz yazıb-oxumağı bacarmayan ümmətik. Nə hesab bilərik, nə də yazı yazarıq. Bir ay belə, belə və belədir!” deyərək üçüncü dəfə baş barmağını yumdu və “Ay belə, belə və belədir” deyərək otuz günü qeyd etdi.

٢١٤٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ جَبَلَةَ بْنِ سُحَيْمٍ ، عَنْ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : الشَّهْرُ هَكَذَا ، وَوَصَفَ شُعْبَةُ ، عَنْ صِفَةِ جَبَلَةَ ، عَنْ صِفَةِ ابْنِ عُمَرَ ، أَنَّهُ تِسْعٌ وَعِشْرُونَ ، فِيمَا حَكَى مِنْ صَنِيعِهِ مَرَّتَيْنِ بِأَصَابِعِ يَدَيْهِ ، وَنَقَصَ فِي الثَّالِثَةِ إِصْبَعًا مِنْ أَصَابِعِ يَدَيْهِ.

2142. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Ay belədir”. Şubə iki dəfə iki əlinin barmaqlarını göstərdi və “iyirmi doqquz gündür” dedi. İki dəfə iki əlinin barmaqlarını göstərdi, üçüncü dəfə isə bir barmağını əskiltdi.

٢١٤٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عُقْبَةَ ، يَعْنِي ابْنَ حُرَيْثٍ ، قَالَ : سَمِعْتُ ابْنَ عُمَرَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهْرُ تِسْعٌ وَعِشْرُونَ.

2143. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ay iyirmi doqquz gündür”.

### ١٨ - الْحَثُّ عَلَى السَّحُورِ

### 18-ci fəsil: Səhur[1] etməyə təşviq etmək

٢١٤٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ عَيَّاشٍ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً وَقَفَهُ عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ.

2144. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Səhur edin! Həqiqətən, səhurda bərəkət var”.

٢١٤٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَيَّاشٍ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : تَسَحَّرُوا قَالَ عُبَيْدُ اللهِ : لاَ أَدْرِي كَيْفَ لَفْظُهُ.

2145. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Səhur edin!”

---

[1] Səhur - Ramazan ayında oruc tutmaq üçün səhər yeməyinə deyilir.

٢١٤٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ قَتَادَةَ ، وَعَبْدِ الْعَزِيزِ ، عَنْ أَنَسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً.

2146. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Səhur edin! Həqiqətən, səhurda bərəkət var".

١٩ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ فِي هَذَا الْحَدِيثِ

19-cu fəsil: Abdul-Məlik ibn Əbu Süleymanın bu hədis haqda ixtilafı

٢١٤٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ سَعِيدِ بْنِ جَرِيرٍ نَسَائِيٌّ ، قَالَ : حَدَّثَنَا أَبُو الرَّبِيعِ ، قَالَ : حَدَّثَنَا مَنْصُورُ بْنُ أَبِي الأَسْوَدِ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً.

2147. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Səhur edin! Həqiqətən, səhurda bərəkət var".

٢١٤٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْمَلِكِ بْنُ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً رَفَعَهُ ابْنُ أَبِي لَيْلَى.

2148. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Səhur edin! Həqiqətən, səhurda bərəkət var".

٢١٤٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي لَيْلَى ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً.

2149. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Səhur edin! Həqiqətən, səhurda bərəkət var".

٢١٥٠ - أَخْبَرَنَا عَبْدُ الأَعْلَى بْنُ وَاصِلِ بْنِ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ سُفْيَانَ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنْ عَطَاءٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً.

2150. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Səhur edin! Həqiqətən, səhurda bərəkət var".

٢١٥١ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ خَلاَّدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ فُضَيْلٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَسَحَّرُوا فَإِنَّ فِي السَّحُورِ بَرَكَةً. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : حَدِيثُ يَحْيَى بْنِ سَعِيدٍ هَذَا إِسْنَادُهُ حَسَنٌ ، وَهُوَ مُنْكَرٌ وَأَخَافُ أَنْ يَكُونَ الْغَلَطُ مِنْ مُحَمَّدِ بْنِ فُضَيْلٍ.

2151. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Səhur edin! Həqiqətən, səhurda bərəkət var”.

٢٠ - تَأْخِيرُ السُّحُورِ وَذِكْرُ الاِخْتِلاَفِ عَلَى زِرٍّ فِيهِ

20-ci fəsil: Səhurun gecikdirilməsi və Zirin rəvayəti haqda olan ixtilaf

٢١٥٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، قَالَ : قُلْنَا لِحُذَيْفَةَ : أَيَّ سَاعَةٍ تَسَحَّرْتَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : هُوَ النَّهَارُ إِلاَّ أَنَّ الشَّمْسَ لَمْ تَطْلُعْ.

2152. ...Rəvayət edilir ki, Zirr ﵀ demişdir: “Biz Huzeyfəyə dedik: “Sən Allah Elçisi ﷺ ilə birlikdə səhura nə vaxt dururdun?” O dedi: “Gündüzə yaxın bir vaxt idi. Amma günəş hələ doğmamışdı”.

٢١٥٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَدِيٍّ ، قَالَ : سَمِعْتُ زِرَّ بْنَ حُبَيْشٍ ، قَالَ : تَسَحَّرْتُ مَعَ حُذَيْفَةَ ، ثُمَّ خَرَجْنَا إِلَى الصَّلاَةِ ، فَلَمَّا أَتَيْنَا الْمَسْجِدَ صَلَّيْنَا رَكْعَتَيْنِ ، وَأُقِيمَتِ الصَّلاَةُ وَلَيْسَ بَيْنَهُمَا إِلاَّ هُنَيْهَةٌ.

2153. ...Rəvayət edilir ki, Zirr ibn Hubeyş ﵀ demişdir: “Mən Huzeyfə ilə birlikdə səhur etdim, sonra namaz qılmaq üçün məscidə getdik. Məscidə çatdıqda iki rükət (sünnə namazını) qıldıq. Sonra iqamə verildi. Namazla iqamə arasında çox vaxt yox idi”.

٢١٥٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ فُضَيْلٍ ، قَالَ : حَدَّثَنَا أَبُو يَعْفُورٍ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، قَالَ : تَسَحَّرْتُ مَعَ حُذَيْفَةَ ، ثُمَّ خَرَجْنَا إِلَى الْمَسْجِدِ ، فَصَلَّيْنَا رَكْعَتَيِ الْفَجْرِ ، ثُمَّ أُقِيمَتِ الصَّلاَةُ فَصَلَّيْنَا.

2154. ...Rəvayət edilir ki, Sila ibn Zufər ﵀ demişdir: “Mən Huzeyfə ilə birlikdə səhur etdim, sonra məscidə getdik. Sonra Sübh namazının iki rükət sünnəsini qıldıq. Sonra iqamə verildi və biz fərz (vacib) namazını qıldıq”.

٢١ - قَدْرُ مَا بَيْنَ السُّحُورِ وَبَيْنَ صَلاَةِ الصُّبْحِ

21-ci fəsil: Səhur ilə Sübh namazının arasında olan vaxt

٢١٥٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ، قَالَ : تَسَحَّرْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ قُمْنَا إِلَى الصَّلاَةِ ، قُلْتُ : كَمْ كَانَ بَيْنَهُمَا ؟ قَالَ : قَدْرُ مَا يَقْرَأُ الرَّجُلُ خَمْسِينَ آيَةً.

2155. ...Rəvayət edilir ki, Zeyd ibn Sabit ﵁ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə səhur etdik, sonra namaz qılmaq üçün ayağa durduq”. Mən (yəni

rəvayət edən) dedim: "İkisinin arasında nə qədər vaxt var idi?" O dedi: "Bir kişinin əlli ayə oxuması qədər vaxt var idi".

٢٢ - ذِكْرُ اخْتِلاَفِ هِشَامٍ وَسَعِيدٍ عَلَى قَتَادَةَ فِيهِ

## 22-ci fəsil: Qatədənin hədisi haqda Hişam və Səidin ixtilafı

٢١٥٦ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ أَنَسٍ ، عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ، قَالَ : تَسَحَّرْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ قُمْنَا إِلَى الصَّلاَةِ ، قُلْتُ : – زُعِمَ أَنَّ أَنَسًا الْقَائِلُ – مَا كَانَ بَيْنَ ذَلِكَ ؟ قَالَ : قَدْرُ مَا يَقْرَأُ الرَّجُلُ خَمْسِينَ آيَةً.

2156. ...Ənəs ﷺ rəvayət edir ki, Zeyd ibn Sabit demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə səhur etdik, sonra namaz qılmaq üçün ayağa durduq". Mən Ənəsə dedim: "İkisinin arasında nə qədər vaxt var idi?" O dedi: "Bir kişinin əlli ayə oxuması qədər vaxt var idi".

٢١٥٧ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : تَسَحَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَزَيْدُ بْنُ ثَابِتٍ ، ثُمَّ قَامَا فَدَخَلاَ فِي صَلاَةِ الصُّبْحِ ، فَقُلْنَا لأَنَسٍ : كَمْ كَانَ بَيْنَ فَرَاغِهِمَا وَدُخُولِهِمَا فِي الصَّلاَةِ ؟ قَالَ : قَدْرُ مَا يَقْرَأُ الإِنْسَانُ خَمْسِينَ آيَةً.

2157. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Mən Zeyd ibn Sabit və Allah Elçisi ﷺ ilə birlikdə səhur etdim. Sonra onlar ikisi ayağa durub Sübh namazını qılmaq üçün (məscidə) daxil oldular". Biz Ənəsə dedik: "Sizin yemək yeməyinizlə namaz qılmağınız arasında nə qədər vaxt var idi?". Ənəs dedi: "O dedi: "Bir adamın əlli ayə oxuması qədər vaxt var idi".

٢٣ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى سُلَيْمَانَ بْنِ مِهْرَانَ فِي حَدِيثِ عَائِشَةَ فِي تَأْخِيرِ السُّحُورِ وَاخْتِلاَفِ أَلْفَاظِهِمْ

## 23-cü fəsil: Aişənin ﷺ səhurun gecikdirilməsi hədisi haqda Süleyman ibn Mihranın ixtilafı

٢١٥٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، عَنْ خَيْثَمَةَ ، عَنْ أَبِي عَطِيَّةَ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : فِينَا رَجُلاَنِ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَحَدُهُمَا يُعَجِّلُ الإِفْطَارَ وَيُؤَخِّرُ السُّحُورَ ، وَالآخَرُ يُؤَخِّرُ الإِفْطَارَ وَيُعَجِّلُ السُّحُورَ ، قَالَتْ : أَيُّهُمَا الَّذِي يُعَجِّلُ الإِفْطَارَ وَيُؤَخِّرُ السُّحُورَ ؟ ، قُلْتُ : عَبْدُ اللهِ بْنُ مَسْعُودٍ ، قَالَتْ : هَكَذَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ.

2158. ...Rəvayət edilir ki, Əbu Atiyyə ﷺ demişdir: "Mən Aişəyə dedim: "Aramızda Allah Elçisinin ﷺ səhabələrindən iki nəfər var ki, biri iftarı tez-

ləşdirib səhuru gecikdirir. Digəri isə iftarı gecikdirib səhuru tezləşdirir". Aişə dedi: "İftarı tezləşdirib səhuru gecikdirən hansıdır?" Mən dedim: "Abdullah ibn Məsud". Aişə dedi: "Allah Elçisi ﷺ də belə edərdi".

٢١٥٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ خَيْثَمَةَ ، عَنْ أَبِي عَطِيَّةَ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : فِينَا رَجُلاَنِ أَحَدُهُمَا يُعَجِّلُ الإِفْطَارَ وَيُؤَخِّرُ السُّحُورَ ، وَالآخَرُ يُؤَخِّرُ الْفِطْرَ وَيُعَجِّلُ السُّحُورَ ، قَالَتْ : أَيُّهُمَا الَّذِي يُعَجِّلُ الإِفْطَارَ وَيُؤَخِّرُ السُّحُورَ ؟ قُلْتُ : عَبْدُ اللهِ بْنُ مَسْعُودٍ ، قَالَتْ : هَكَذَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ.

2159. ...Rəvayət edilir ki, Əbu Atiyyə ﵁ demişdir: "Mən Aişəyə dedim: "Aramızda Allah Elçisinin ﷺ səhabələrindən iki nəfər var ki, biri, iftarı tezləşdirib səhuru gecikdirir. Digəri isə, iftarı gecikdirib səhuru tezləşdirir". Aişə dedi: "İftar tezləşdirib səhuru gecikdirən hansıdır?" Mən dedim: "Abdullah ibn Məsud". Aişə dedi: "Allah Elçisi ﷺ də belə edərdi".

٢١٦٠ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ أَبِي عَطِيَّةَ ، قَالَ : دَخَلْتُ أَنَا وَمَسْرُوقٌ عَلَى عَائِشَةَ ، فَقَالَ لَهَا مَسْرُوقٌ : رَجُلاَنِ مِنْ أَصْحَابِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كِلاَهُمَا لاَ يَأْلُو عَنِ الْخَيْرِ ، أَحَدُهُمَا يُؤَخِّرُ الصَّلاَةَ وَالْفِطْرَ ، وَالآخَرُ يُعَجِّلُ الصَّلاَةَ وَالْفِطْرَ ، قَالَتْ عَائِشَةُ : أَيُّهُمَا الَّذِي يُعَجِّلُ الصَّلاَةَ وَالْفِطْرَ ؟ قَالَ مَسْرُوقٌ : عَبْدُ اللهِ بْنُ مَسْعُودٍ ، فَقَالَتْ عَائِشَةُ : هَكَذَا كَانَ يَصْنَعُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2160. ...Rəvayət edilir ki, Əbu Atiyyə ﵁ demişdir: "Mən və Məsruq Aişənin yanına gəldik. Məsruq Aişəyə dedi: "Allah Elçisinin ﷺ səhabələrindən iki nəfər var ki, hər ikisi xeyirli adamlardır. Biri namazı və iftarı gecikdirir. Digəri isə namazı və iftarı tezləşdirir". Aişə dedi: "Namazı və iftarı tezləşdirən kimdir?" Məsruq dedi: "Abdullah ibn Məsud". Aişə dedi: "Allah Elçisi ﷺ də belə edərdi".

٢١٦١ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ أَبِي عَطِيَّةَ ، قَالَ : دَخَلْتُ أَنَا وَمَسْرُوقٌ عَلَى عَائِشَةَ ، فَقُلْنَا لَهَا : يَا أُمَّ الْمُؤْمِنِينَ ، رَجُلاَنِ مِنْ أَصْحَابِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَحَدُهُمَا يُعَجِّلُ الإِفْطَارَ وَيُعَجِّلُ الصَّلاَةَ ، وَالآخَرُ يُؤَخِّرُ الإِفْطَارَ وَيُؤَخِّرُ الصَّلاَةَ ، فَقَالَتْ : أَيُّهُمَا يُعَجِّلُ الإِفْطَارَ وَيُعَجِّلُ الصَّلاَةَ ؟ قُلْنَا : عَبْدُ اللهِ بْنُ مَسْعُودٍ ، قَالَتْ : هَكَذَا كَانَ يَصْنَعُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَالآخَرُ أَبُو مُوسَى رَضِيَ اللَّهُ عَنْهُمَا.

2161. ...Rəvayət edilir ki, Əbu Atiyyə ﵁ demişdir: "Mən və Məsruq Aişənin yanına gəldik. Biz Aişəyə dedik: "Ey möminlərin anası! Allah Elçisinin ﷺ səhabələrindən iki nəfər var ki, biri iftarı və namazı tezləşdirir. Digəri isə iftarı və namazı gecikdirir". Aişə dedi: "İftarı və namazı tezləş-

dirən kimdir?" Biz dedik: "Abdullah ibn Məsud". Aişə dedi: "Allah Elçisi ﷺ belə edərdi". O biri Əbu Musa idi".

٢٤ - فَضْلُ السُّحُورِ

## 24-cü fəsil: Səhur etməyin fəzləti

٢١٦٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الْحَمِيدِ ، صَاحِبِ الزِّيَادِيِّ ، قَالَ: سَمِعْتُ عَبْدَ اللهِ بْنَ الْحَارِثِ ، يُحَدِّثُ عَنْ رَجُلٍ ، مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : دَخَلْتُ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَتَسَحَّرُ ، فَقَالَ : إِنَّهَا بَرَكَةٌ أَعْطَاكُمُ اللَّهُ إِيَّاهَا فَلاَ تَدَعُوهُ.

2162. ...Abdullah ibn əl-Haris ﷺ Peyğəmbərin ﷺ səhabələrindən bir kişinin belə dediyini rəvayət etmişdir: "Mən Peyğəmbərin ﷺ yanına gəldim. O, səhur edirdi və belə buyurdu: "Səhur yeməyi Allahın sizə verdiyi bir bərəkətdir. Onu tərk etməyin!"

٢٥ - دَعْوَةُ السَّحُورِ

## 25-ci fəsil: Səhur etməyə dəvət

٢١٦٣ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ بَصْرِيٌّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ يُونُسَ بْنِ سَيْفٍ ، عَنِ الْحَارِثِ بْنِ زِيَادٍ ، عَنْ أَبِي رُهْمٍ ، عَنِ الْعِرْبَاضِ بْنِ سَارِيَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَدْعُو إِلَى السَّحُورِ فِي شَهْرِ رَمَضَانَ ، وَقَالَ : هَلُمُّوا إِلَى الْغَدَاءِ الْمُبَارَكِ.

2163. ...Rəvayət edilir ki, İrbad ibn Səriyə ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ Ramazan ayında bizi səhur yeməyinə dəvət edərək belə buyurduğunu eşitmişəm: "Mübarək səhur yeməyinə gəlin!"

٢٦ - تَسْمِيَةُ السَّحُورِ غَدَاءً

## 26-cı fəsil: Səhura "səhər yeməyi" demək

٢١٦٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ بَقِيَّةَ بْنِ الْوَلِيدِ ، قَالَ : أَخْبَرَنِي بَحِيرُ بْنُ سَعْدٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنِ الْمِقْدَامِ بْنِ مَعْدِ يكَرِبَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : عَلَيْكُمْ بِغَدَاءِ السُّحُورِ فَإِنَّهُ هُوَ الْغَدَاءُ الْمُبَارَكُ.

2164. ...Miqdad ibn Mə'dikərib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizə səhur (səhər) yeməyini tövsiyyə edirəm, çünki o, bərəkətli səhər yeməyidir".

٢١٦٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ثَوْرٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِرَجُلٍ : هَلُمَّ إِلَى الْغَدَاءِ الْمُبَارَكِ – يَعْنِي السَّحُورَ –.

2165. ...Rəvayət edilir ki, Xalid ibn Madən ﷺ demişdir: "Allah Elçisi ﷺ bir kişiyə belə dedi: "Mübarək səhər yeməyinə, yəni səhura gəlin!"

٢٧ - فَصْلُ مَا بَيْنَ صِيَامِنَا وَصِيَامِ أَهْلِ الْكِتَابِ

## 27-ci fəsil: Bizimlə Kitab əhlinin orucu arasında fərq

٢١٦٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ مُوسَى بْنِ عُلَيٍّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي قَيْسٍ ، عَنْ عَمْرِو بْنِ الْعَاصِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ فَصْلَ مَا بَيْنَ صِيَامِنَا وَصِيَامِ أَهْلِ الْكِتَابِ أَكْلَةُ السُّحُورِ.

2166. ...Rəvayət edilir ki, Amr ibn əl-As ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bizimlə Kitab əhlinin orucu arasında fərq səhur yeməyidir".

٢٨ - السَّحُورُ بِالسَّوِيقِ وَالتَّمْرِ

## 28-ci fəsil: Səviq[1] və xurma ilə səhur etmək

٢١٦٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَذَلِكَ عِنْدَ السُّحُورِ : يَا أَنَسُ إِنِّي أُرِيدُ الصِّيَامَ ، أَطْعِمْنِي شَيْئًا ، فَأَتَيْتُهُ بِتَمْرٍ وَإِنَاءٍ فِيهِ مَاءٌ ، وَذَلِكَ بَعْدَ مَا أَذَّنَ بِلَالٌ ، فَقَالَ : يَا أَنَسُ ، انْظُرْ رَجُلاً يَأْكُلْ مَعِي ، فَدَعَوْتُ زَيْدَ بْنَ ثَابِتٍ ، فَجَاءَ ، فَقَالَ : إِنِّي قَدْ شَرِبْتُ شَرْبَةَ سَوِيقٍ وَأَنَا أُرِيدُ الصِّيَامَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَأَنَا أُرِيدُ الصِّيَامَ ، فَتَسَحَّرَ مَعَهُ ، ثُمَّ قَامَ فَصَلَّى رَكْعَتَيْنِ ، ثُمَّ خَرَجَ إِلَى الصَّلَاةِ.

2167. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ səhur vaxtı belə dedi: "Ey Ənəs, mən oruc tutmaq istəyirəm, yeməyə bir şey ver!" Mən də bir az xurma və içində su olan bir qab gətirdim. Bu hadisə Bilalın azan oxumasından sonra idi. Allah Elçisi ﷺ dedi: "Ey Ənəs, bax gör bir adam tap, mənimlə birlikdə yemək yesin". Mən də Zeyd ibn Sabiti dəvət etdim. O gəlib dedi: "Mən artıq su içib buğda sıyığı yemişəm və oruc tutmaq istəyirəm". Allah Elçisi ﷺ dedi: "Mən də oruc tutmaq istəyirəm". O, Allah Elçisi ﷺ ilə birlikdə səhur etdi. Sonra Allah Elçisi ﷺ qalxıb iki rükət (Sübh namazının sünnəsini) qıldı. Sonra isə Sübh namazını qılmaq üçün evindən çıxdı".

---

[1] Səviq – buğda, arpa, çovdar və s. dənli bitkilərin unundan hazırlanan sıyığa deyilir.

٢٩ - تَأْوِيلُ قَوْلِ اللهِ تَعَالَى : **{وَكُلُوا وَاشْرَبُوا حَتَّى يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الأَبْيَضُ مِنَ الْخَيْطِ الأَسْوَدِ مِنَ الْفَجْرِ}**

29-cu fəsil: Uca Allahın bu kəlamının: **"Dan yeri söküləndə, ağ sapın qara sapdan seçildiyi sizə aydın olanadək yeyin-için"** (əl-Bəqərə, 187) izahı

٢١٦٨ - أَخْبَرَنِي هِلاَلُ بْنُ الْعَلاَءِ بْنِ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا حُسَيْنُ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ : أَنَّ أَحَدَهُمْ كَانَ إِذَا نَامَ قَبْلَ أَنْ يَتَعَشَّى لَمْ يَحِلَّ لَهُ أَنْ يَأْكُلَ شَيْئًا وَلاَ يَشْرَبَ لَيْلَتَهُ وَيَوْمَهُ ، مِنَ الْغَدِ حَتَّى تَغْرُبَ الشَّمْسُ ، حَتَّى نَزَلَتْ هَذِهِ الآيَةُ : **{وَكُلُوا وَاشْرَبُوا}** إِلَى **{الْخَيْطِ الأَسْوَدِ}** ، قَالَ : وَنَزَلَتْ فِي أَبِي قَيْسِ بْنِ عَمْرٍو ، أَتَى أَهْلَهُ وَهُوَ صَائِمٌ بَعْدَ الْمَغْرِبِ ، فَقَالَ : هَلْ مِنْ شَيْءٍ ؟ فَقَالَتِ امْرَأَتُهُ : مَا عِنْدَنَا شَيْءٌ وَلَكِنْ أَخْرُجُ أَلْتَمِسُ لَكَ عَشَاءً ، فَخَرَجَتْ وَوَضَعَ رَأْسَهُ فَنَامَ ، فَرَجَعَتْ إِلَيْهِ فَوَجَدَتْهُ نَائِمًا وَأَيْقَظَتْهُ ، فَلَمْ يَطْعَمْ شَيْئًا وَبَاتَ وَأَصْبَحَ صَائِمًا حَتَّى انْتَصَفَ النَّهَارُ فَغُشِيَ عَلَيْهِ ، وَذَلِكَ قَبْلَ أَنْ تَنْزِلَ هَذِهِ الآيَةُ فَأَنْزَلَ اللهُ فِيهِ.

2168. ...Bəra ibn Azib ﷺ rəvayət edir ki, onlardan biri oruc tutduqda iftar etməmiş yatsaydı, sonradan bütün gecəni və növbəti günü günəş batana qədər heç nə yeməzdi. Sonra bu ayə nazil oldu: **"...Dan yeri söküləndə ağ sap qara sapdan** (şəfəq gecənin qaranlığından) **seçilənə qədər yeyin için"**. (əl-Bəqərə, 187). Bu ayə Əbu Qeys ibn Amr haqda nazil oldu. O, Məğribdən qabaq oruclu halda ailəsinin yanına gəldi və dedi: "Yeməyə bir şey varmı?" Zövcəsi ona dedi: "Bir şey yoxdur, lakin evdən çıxıb bir şey taparam". Qadın evdən çıxandan sonra Əbu Qeys uzanıb yuxuya getdi. Zövcəsi gəlib onu bu halda gördü və yuxudan oyatdı, lakin Əbu Qeys heç nə yeməyib belə halda yatdı. Nəhayət, növbəti gün günorta oruclu halda huşunu itirdi. Bu hadisə Allahın bu ayəni nazil etməsindən qabaq idi".

٢١٦٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مُطَرِّفٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ، أَنَّهُ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ قَوْلِهِ تَعَالَى : **{حَتَّى يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الأَبْيَضُ مِنَ الْخَيْطِ الأَسْوَدِ}** ، قَالَ : هُوَ سَوَادُ اللَّيْلِ وَبَيَاضُ النَّهَارِ.

2169. ...Rəvayət edilir ki, Adiy ibn Hatim ﷺ Allah Elçisindən ﷺ Allahın bu ayəsi **"Ağ sap qara sapdan seçilənə qədər yeyin için"** haqda soruşdu. Allah Elçisi ﷺ buyurdu: "Bu, gecənin qaranlığı və gündüzün aydınlığıdır".

٣٠ - كَيْفَ الْفَجْرُ

30-cu fəsil: Sübh necə olur?

٢١٧٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا التَّيْمِيُّ ، عَنْ أَبِي عُثْمَانَ ، عَنِ ابْنِ مَسْعُودٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّ بِلاَلاً يُؤَذِّنُ بِلَيْلٍ لِيُنَبِّهَ نَائِمَكُمْ وَيُرْجِعَ قَائِمَكُمْ ، وَلَيْسَ الْفَجْرُ أَنْ يَقُولَ : هَكَذَا – وَأَشَارَ بِكَفِّهِ ، وَلَكِنِ الْفَجْرُ أَنْ يَقُولَ : هَكَذَا – وَأَشَارَ بِالسَّبَابَتَيْنِ –.

2170. …İbn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Bilal gecə vaxtı sizdən yatanların oyanması, oyaq olanların (gecə namazı qılanların) da öz yataqlarına qayıdıb yatması üçün azan verir". O, ovucu ilə işarə edərək "Bu, Sübh namazı üçün deyil". İki əlinin şəhadət barmağı ilə işarə edərək "Sübh budur!" dedi".

٢١٧١ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، أَنْبَأَنَا سَوَادَةُ بْنُ حَنْظَلَةَ ، قَالَ : سَمِعْتُ سَمُرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَغُرَّنَّكُمْ أَذَانُ بِلاَلٍ ، وَلاَ هَذَا الْبَيَاضُ حَتَّى يَنْفَجِرَ الْفَجْرُ هَكَذَا وَهَكَذَا – يَعْنِي مُعْتَرِضًا – قَالَ أَبُو دَاوُدَ : وَبَسَطَ بِيَدَيْهِ يَمِينًا وَشِمَالاً مَادًّا يَدَيْهِ.

2171. ...Rəvayət edilir ki, Səmura ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bilalın azanı sizi yanıltmasın. Bu, üfüqdəki ağartı olan dan yeri tam əmələ gələnə kimidir". Ravi Əbu Davud dedi: "Allah Elçisi ﷺ bunu göstərmək üçün əllərini sağa və sola uzadırdı".

## ٣١ - التَّقَدُّمُ قَبْلَ شَهْرِ رَمَضَانَ

## 31-ci fəsil: Ramazan ayını qarşılamaq üçün əvvəlcədən oruc tutmamaq

٢١٧٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لاَ تَقَدَّمُوا قَبْلَ الشَّهْرِ بِصِيَامٍ ، إِلاَّ رَجُلٌ كَانَ يَصُومُ صِيَامًا أَتَى ذَلِكَ الْيَوْمُ عَلَى صِيَامِهِ.

2172. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Ramazan ayını qarşılamaq üçün əvvəlcədən oruc tutmayın! Fəqət, əvvəllər oruc tutan adamın orucu həmin günə müvafiq olsa, həmişəki qaydada[1] orucunu tuta bilər".

## ٣٢ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى يَحْيَى بْنِ أَبِي كَثِيرٍ وَمُحَمَّدِ بْنِ عَمْرٍو عَلَى أَبِي سَلَمَةَ فِيهِ

## 32-ci fəsil: Yəhyə ibn Əbu Kəsir və Muhəmməd ibn Amrın Əbu Sələmənin hədisi haqda ixtilafı

٢١٧٣ - أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى ، قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ ، قَالَ : أَخْبَرَنِي أَبُو هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَتَقَدَّمَنَّ أَحَدٌ الشَّهْرَ بِيَوْمٍ وَلاَ يَوْمَيْنِ ، إِلاَّ أَحَدٌ كَانَ يَصُومُ صِيَامًا قَبْلَهُ فَلْيَصُمْهُ.

---

[1] Adam daim birinci və dördüncü günlər və ya günaşırı oruc tutursa, belə adam həmin günlərdə oruc tuta bilər.

2173. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Heç biriniz Ramazan ayını qarşılamaq üçün əvvəlcədən oruc tutmasın! Fəqət, əvvəllər oruc tutan adamın orucu həmin günə müvafiq olsa, həmişəki qaydada orucunu tuta bilər”.

٢١٧٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو خَالِدٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَتَقَدَّمُوا الشَّهْرَ بِصِيَامِ يَوْمٍ أَوْ يَوْمَيْنِ إِلاَّ أَنْ يُوَافِقَ ذَلِكَ يَوْمًا كَانَ يَصُومُهُ أَحَدُكُمْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ.

2174. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Heç biriniz Ramazan ayından bir və ya iki gün qabaq oruc tutmasın! Fəqət, əvvəllər oruc tutan adamın orucunun həmin günə müvafiq olması istisnadır”.

٣٣ - ذِكْرُ حَدِيثِ أَبِي سَلَمَةَ فِي ذَلِكَ

### 33-cü fəsil: Əbu Sələmənin bu haqda hədisi

٢١٧٥ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ إِلاَّ أَنَّهُ كَانَ يَصِلُ شَعْبَانَ بِرَمَضَانَ.

2175. ...Rəvayət edilir ki, Ummu Sələmə ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ iki ay ardıcıl oruc tutduğunu görmədim, yalnız Şaban ayını Ramazan ayına birləşdirərdi”.[1]

٣٤ - الاِخْتِلاَفُ عَلَى مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ فِيهِ

### 34-cü fəsil: Muhəmməd ibn İbrahimin bu haqda ixtilafı

٢١٧٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا النَّضْرُ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ تَوْبَةَ الْعَنْبَرِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصِلُ شَعْبَانَ بِرَمَضَانَ.

2176. ...Rəvayət edilir ki, Ummu Sələmə ﷺ demişdir: “Allah Elçisi ﷺ Şaban ayında oruc tutaraq orucunu Ramazan ayına birləşdirərdi”.

[1] Yəni Şaban ayının çoxunu oruc tutardı.

٢١٧٧ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي أُسَامَةُ بْنُ زَيْدٍ ، أَنَّ مُحَمَّدَ بْنَ إِبْرَاهِيمَ ، حَدَّثَهُ عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّهُ سَأَلَ عَائِشَةَ ، عَنْ صِيَامِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ حَتَّى نَقُولَ لاَ يُفْطِرُ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ لاَ يَصُومُ ، وَكَانَ يَصُومُ شَعْبَانَ أَوْ عَامَّةَ شَعْبَانَ.

2177. ...Rəvayət edilir ki, Əbu Sələmə ibn Abdur-Rahmən ﷺ Aişədən ﷺ Allah Elçisinin ﷺ orucu haqda soruşduqda, o dedi: "Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz bu ay tam şəkildə oruc tutacağını zənn edərdik. Oruc tutmadıqda isə bu ayı heç oruc tutmayacağını zənn edərdik. O, Şaban ayını və ya çox hissəsini oruc tutardı".

٢١٧٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سَعْدِ بْنِ الْحَكَمِ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا نَافِعُ بْنُ يَزِيدَ ، أَنَّ ابْنَ الْهَادِ ، حَدَّثَهُ أَنَّ مُحَمَّدَ بْنَ إِبْرَاهِيمَ ، حَدَّثَهُ عَنْ أَبِي سَلَمَةَ ، يَعْنِي ابْنَ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَقَدْ كَانَتْ إِحْدَانَا تُفْطِرُ فِي رَمَضَانَ فَمَا تَقْدِرُ عَلَى أَنْ تَقْضِيَ حَتَّى يَدْخُلَ شَعْبَانُ ، وَمَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ فِي شَهْرٍ مَا يَصُومُ فِي شَعْبَانَ ، كَانَ يَصُومُهُ كُلَّهُ إِلاَّ قَلِيلاً بَلْ كَانَ يَصُومُهُ كُلَّهُ.

2178. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Birimiz (heyz olanda) Ramazanda oruc tutmazdı. Şaban ayına qədər də bu orucun qəzasını tutmazdı. Allah Elçisi ﷺ heç bir ayda Şaban ayındakı qədər oruc tutmazdı. Şaban ayının çoxunu, bəzən də bütün ayı oruc tutardı".

### ٣٥ - ذِكْرُ اخْتِلاَفِ أَلْفَاظِ النَّاقِلِينَ لِخَبَرِ عَائِشَةَ فِيهِ

### 35-ci fəsil: Aişənin ﷺ bu xəbərini rəvayət edənlərin ixtilafı

٢١٧٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي لَبِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ ، فَقُلْتُ : أَخْبِرِينِي عَنْ صِيَامِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : كَانَ يَصُومُ حَتَّى نَقُولَ قَدْ صَامَ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ قَدْ أَفْطَرَ ، وَلَمْ يَكُنْ يَصُومُ شَهْرًا أَكْثَرَ مِنْ شَعْبَانَ كَانَ يَصُومُ شَعْبَانَ إِلاَّ قَلِيلاً ، كَانَ يَصُومُ شَعْبَانَ كُلَّهُ.

2179. ...Rəvayət edilir ki, Əbu Sələmə ﷺ demişdir: "Mən Aişədən soruşdum: "Mənə Allah Elçisinin ﷺ orucu haqda xəbər ver". Aişə dedi: "Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz onun həmişə oruc tutacağını güman edərdik. Həmçinin o qədər orucsuz günləri olardı ki, biz onun oruc tutmayacağını güman edərdik. Şaban ayından başqa heç bir ayda bu qədər oruc tutmazdı. Şaban ayının çoxunu, bəzən də hamısını oruc tutardı".

٢١٨٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَمْ يَكُنْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي شَهْرٍ مِنَ السَّنَةِ أَكْثَرَ صِيَامًا مِنْهُ فِي شَعْبَانَ ، كَانَ يَصُومُ شَعْبَانَ كُلَّهُ.

2180. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ (Ramazandan başqa) ilin heç bir ayında Şaban ayındakı qədər oruc tutmazdı. O, Şaban ayının hamısını oruc tutardı”.

٢١٨١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ خَالِدِ بْنِ سَعْدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ شَعْبَانَ.

2181. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ Şaban ayında oruclu olardı”.

٢١٨٢ - أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ ، عَنْ عَبْدَةَ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لاَ أَعْلَمُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ الْقُرْآنَ كُلَّهُ فِي لَيْلَةٍ ، وَلاَ قَامَ لَيْلَةً حَتَّى الصَّبَاحِ ، وَلاَ صَامَ شَهْرًا كَامِلاً قَطُّ غَيْرَ رَمَضَانَ.

2182. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Mən Allah Elçisinin ﷺ Quranın hamısını bir gecədə oxuduğunu, bir gecəni səhərə qədər ibadətdə keçirdiyini, Ramazan ayından başqa bir ayın hamısını oruc tutduğunu bilmirəm”.[1]

٢١٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ أَحْمَدَ بْنِ أَبِي يُوسُفَ الصَّيْدَلاَنِيُّ حَرَّانِيٌّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ هِشَامٍ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، عَنْ عَائِشَةَ ، قَالَ : سَأَلْتُهَا عَنْ صِيَامِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ حَتَّى نَقُولَ قَدْ صَامَ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ قَدْ أَفْطَرَ ، وَلَمْ يَصُمْ شَهْرًا تَامًّا مُنْذُ أَتَى الْمَدِينَةَ إِلاَّ أَنْ يَكُونَ رَمَضَانُ.

2183. ...Rəvayət edilir ki, Abdullah ibn Şəqiq رحمه الله demişdir: “Mən Aişədən Allah Elçisinin ﷺ orucu haqda soruşduqda o, belə dedi: “Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz onun həmişə oruc tutacağını güman edərdik. Həmçinin o qədər orucsuz günləri olardı ki, biz onun oruc tutmayacağını güman edərdik. Mədinəyə gəldikdən sonra Ramazan ayından başqa heç bir ayın hamısını oruc tutmazdı”.

٢١٨٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : أَنْبَأَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ ، عَنْ كَهْمَسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي صَلاَةَ الضُّحَى ؟ قَالَتْ : لاَ ، إِلاَّ أَنْ يَجِيءَ مِنْ مَغِيبِهِ ، قُلْتُ : هَلْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ شَهْرًا كُلَّهُ ؟ قَالَتْ : لاَ ، مَا عَلِمْتُ صَامَ شَهْرًا كُلَّهُ إِلاَّ رَمَضَانَ ، وَلاَ أَفْطَرَ حَتَّى يَصُومَ مِنْهُ حَتَّى مَضَى لِسَبِيلِهِ.

---

[1] Bu hədisdən görsənir ki, Peyğəmbər ﷺ Ramazan ayından başqa bütün ayı tutmamış, hədislərdə olan bu söz isə çoxluq mənasında deyilmişdir.

2184. ...Rəvayət edilir ki, Abdullah ibn Şəqiq رحمه الله demişdir: “Mən Aişədən soruşdum: “Allah Elçisi ﷺ Duha namazını[1] qılardımı?” O dedi: “Xeyr, yalnız səfərdən qayıdanda qılardı”. Mən dedim: “Allah Elçisi ﷺ hansı ayın hamısını oruc tutardı?” O dedi: “Ramazan ayından başqa heç bir ayın hamısını orucla keçirdiyini və hansısa ayı (bütöv şəkildə) orucsuz keçirdiyini də bilmirəm. Bəzən oruc tutar, bəzən də tutmazdı”.

٢١٨٥ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا الْجُرَيْرِيُّ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي صَلاَةَ الضُّحَى ؟ قَالَتْ : لاَ ، إِلاَّ أَنْ يَجِيءَ مِنْ مَغِيبِهِ ، قُلْتُ : هَلْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَهُ صَوْمٌ مَعْلُومٌ سِوَى رَمَضَانَ ؟ قَالَتْ : وَاللهِ إِنْ صَامَ شَهْرًا مَعْلُومًا سِوَى رَمَضَانَ حَتَّى مَضَى لِوَجْهِهِ وَلاَ أَفْطَرَ حَتَّى يَصُومَ مِنْهُ.

2185. ...Rəvayət edilir ki, Abdullah ibn Şəqiq رحمه الله demişdir: “Mən Aişəyə dedim: “Allah Elçisi ﷺ Duha namazını qılardımı?” O dedi: “Xeyr, yalnız səfərdən qayıdanda qılardı”. Mən dedim: “Allah Elçisi ﷺ Ramazandan başqa hansı ayın hamısını oruc tutardı?” O dedi: “Vallahi, Ramazan ayından başqa heç bir ayın hamısını orucla keçirməzdi. Allahın razılığı üçün bəzən oruc tutar, bəzən də tutmazdı”.

## ٣٦ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى خَالِدِ بْنِ مَعْدَانَ فِي هَذَا الْحَدِيثِ

## 36-cı fəsil: Xalid ibn Madənin bu hədis haqda ixtilafı

٢١٨٦ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، عَنْ بَقِيَّةَ ، قَالَ : حَدَّثَنَا بَحِيرٌ ، عَنْ خَالِدٍ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، أَنَّ رَجُلاً سَأَلَ عَائِشَةَ ، عَنِ الصِّيَامِ ، فَقَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَصُومُ شَعْبَانَ كُلَّهُ ، وَيَتَحَرَّى صِيَامَ الاِثْنَيْنِ وَالْخَمِيسِ.

2186. ...Cubeyr ibn Nufeyr رحمه الله rəvayət edir ki, bir dəfə bir kişi Aişədən رضي الله عنها Allah Elçisinin ﷺ orucu haqda soruşdu. Aişə dedi: “Allah Elçisi ﷺ Şaban ayının hamısını orucla keçirər, həmçinin (digər aylarda) bazar ertəsi və cümə axşamı olan orucları tutmağa çalışardı”.

٢١٨٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا ثَوْرٌ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ رَبِيعَةَ الْجُرَشِيِّ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ شَعْبَانَ وَرَمَضَانَ وَيَتَحَرَّى الاِثْنَيْنِ وَالْخَمِيسَ.

[1] Duha - səhər gündüzün başlanğıcına deyilir. Bu vaxt xüsusi namaz var ki, buna Duha namazı deyilir. Duha namazının vaxtı günəş üfüqdən bir nizə hündürlüyündə qalxdıqdan sonra - yəni təqribən günəş çıxdıqdan 15-20 dəqiqə sonra günəş səmanın ortasına - zenitə yüksəlməsindən bir az əvvələdək - təqribən 15-20 dəqiqə qabaq.

2187. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ Şaban və Ramazan aylarında oruc tutar, həmçinin bazar ertəsi və cümə axşamı olan orucları tutmağa çalışardı”.

٣٧ - صِيَامُ يَوْمِ الشَّكِّ

## 37-ci fəsil: Ramazanın başlanmasında olan şəkk günündə oruc tutmaq

٢١٨٨ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ سَعِيدٍ الأَشَجُّ ، عَنْ أَبِي خَالِدٍ ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ صِلَةَ ، قَالَ : كُنَّا عِنْدَ عَمَّارٍ فَأُتِيَ بِشَاةٍ مَصْلِيَّةٍ ، فَقَالَ : كُلُوا ، فَتَنَحَّى بَعْضُ الْقَوْمِ ، قَالَ : إِنِّي صَائِمٌ ، فَقَالَ عَمَّارٌ : مَنْ صَامَ الْيَوْمَ الَّذِي يُشَكُّ فِيهِ فَقَدْ عَصَى أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2188. ...Rəvayət edilir ki, Sila ﵀ demişdir: “Bir dəfə biz Əmmarın yanında oturmuşduq. Qarşımıza qızardılmış qoyun gətirdilər. Əmmar dedi: “Yeyin!” Oradakılardan bəziləri kənara çəkilərik dedilər: “Mən orucam”. Əmmar dedi: “Kim (Ramazan ayının girib-girməməsi haqda olan) şəkk günündə oruc tutarsa, Əbul-Qasimə (Peyğəmbərə) ﷺ asi olmuşdur”.

٢١٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ أَبِي يُونُسَ ، عَنْ سِمَاكٍ ، قَالَ : دَخَلْتُ عَلَى عِكْرِمَةَ فِي يَوْمٍ قَدْ أُشْكِلَ مِنْ رَمَضَانَ هُوَ أَمْ مِنْ شَعْبَانَ ، وَهُوَ يَأْكُلُ خُبْزًا وَبَقْلاً وَلَبَنًا ، فَقَالَ لِي : هَلُمَّ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، قَالَ وَحَلَفَ بِاللَّهِ : لَتُفْطِرَنَّ ، قُلْتُ : سُبْحَانَ اللهِ مَرَّتَيْنِ ، فَلَمَّا رَأَيْتُهُ يَحْلِفُ لاَ يَسْتَثْنِي تَقَدَّمْتُ قُلْتُ : هَاتِ الآنَ مَا عِنْدَكَ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صُومُوا لِرُؤْيَتِهِ ، وَأَفْطِرُوا لِرُؤْيَتِهِ ، فَإِنْ حَالَ بَيْنَكُمْ وَبَيْنَهُ سَحَابَةٌ أَوْ ظُلْمَةٌ ، فَأَكْمِلُوا الْعِدَّةَ عِدَّةَ شَعْبَانَ ، وَلاَ تَسْتَقْبِلُوا الشَّهْرَ اسْتِقْبَالاً ، وَلاَ تَصِلُوا رَمَضَانَ بِيَوْمٍ مِنْ شَعْبَانَ.

2189. ...Rəvayət edilir ki, Simak ﵀ demişdir: “Mən Ramazan və ya Şaban ayının olmasının şəkk edildiyi gün İkrimənin yanına gəldim. O, çörək və göyərti yeyir, süd içirdi. Mənə dedi: “Gəl ye!” Mən dedim: “Mən orucam”. O dedi: “Allaha and olsun ki, orucunu açmalısan!” Mən də iki dəfə “Subhən-Allah” dedim. Sonra and içib israr etdiyini anladıqda ona yaxınlaşıb dedim: “Sənin buna dəlilin nədir?” O dedi: “Mən İbn Abbasın belə dediyini eşitmişəm: “Allah Elçisi ﷺ belə buyurdu: “Hilalı gördükdə oruc tutmağa başlayın. (Ayın axırında olan hilalı) gördükdə orucu tərk edin. Əgər hava buludlu və ya kölgəli olarsa, Şaban ayını otuz günə tamamlayın. Ramazan ayını orucla qarşılamayın. Şabanın oruc günlərini Ramazan ayına birləşdirməyin”.

٣٨ - التَّسْهِيلُ فِي صِيَامِ يَوْمِ الشَّكِّ

## 38-ci fəsil: Şəkk günü oruc tutmağın asanlaşdırılması

٢١٩٠ - أَخْبَرَنَا عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ بْنِ سَعْدٍ ، قَالَ : أَخْبَرَنِي أَبِي ، عَنْ جَدِّي ، قَالَ : أَخْبَرَنِي شُعَيْبُ بْنُ إِسْحَاقَ ، عَنِ الأَوْزَاعِيِّ ، وَابْنُ أَبِي عَرُوبَةَ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ كَانَ يَقُولُ : أَلاَ لاَ تَقَدَّمُوا الشَّهْرَ بِيَوْمٍ أَوِ اثْنَيْنِ ، إِلاَّ رَجُلٌ كَانَ يَصُومُ صِيَامًا فَلْيَصُمْهُ.

2190. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Bilin ki, heç kim Ramazan ayından bir və ya iki gün qabaq oruc tutmasın! Yalnız əvvəllər oruc tutan adamın orucunun həmin günə müvafiq olması istisnadır”.

٣٩ - ثَوَابُ مَنْ قَامَ رَمَضَانَ وَصَامَهُ إِيمَانًا وَاحْتِسَابًا وَالاِخْتِلاَفُ عَلَى الزُّهْرِيِّ فِي الْخَبَرِ فِي ذَلِكَ

## 39-cu fəsil: Ramazan ayını imanla və mükafatını umaraq namaz və orucla keçirənin savabı

٢١٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، قَالَ : أَنْبَأَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

2191. ...Səid ibn Museyyib ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim Ramazan ayını imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar”.

٢١٩٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ جَبَلَةَ ، قَالَ : حَدَّثَنَا الْمُعَافَى ، قَالَ : حَدَّثَنَا مُوسَى ، عَنْ إِسْحَاقَ بْنِ رَاشِدٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ عَائِشَةَ ، زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَخْبَرَتْهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُرَغِّبُ النَّاسَ فِي قِيَامِ رَمَضَانَ مِنْ غَيْرِ أَنْ يَأْمُرَهُمْ بِعَزِيمَةِ أَمْرٍ فِيهِ ، فَيَقُولُ : مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

2192. ...Peyğəmbərin ﷺ zövcəsi Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ insanları çətinliyə salmamaq şərti ilə Ramazan ayını ibadətlə keçirməyə təşviq edərək buyurardı: “Kim Ramazan ayını imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar”.

٢١٩٣ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : أَنْبَأَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْحَارِثِ ، عَنْ يُونُسَ الأَيْلِيِّ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ عَائِشَةَ ، أَخْبَرَتْهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ فِي جَوْفِ اللَّيْلِ يُصَلِّي فِي الْمَسْجِدِ ، فَصَلَّى

بِالنَّاسِ – وَسَاقَ الْحَدِيثَ ، وَفِيهِ قَالَتْ – فَكَانَ يُرَغِّبُهُمْ فِي قِيَامِ رَمَضَانَ مِنْ غَيْرِ أَنْ يَأْمُرَهُمْ بِعَزِيمَةٍ ، وَيَقُولُ : مَنْ قَامَ لَيْلَةَ الْقَدْرِ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ قَالَ : فَتُوُفِّيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالأَمْرُ عَلَى ذَلِكَ.

2193. ...Aişə رضي الله عنها rəvayət edir ki, Allah Elçisi ﷺ gecənin ortasında çıxıb məscidə gəldi və insanlara namaz qıldırdı. "Aişə hədisi axıra kimi danışdı, sonra dedi: "O, insanları çətinliyə salmamaq şərti ilə Ramazan ayını ibadətlə keçirməyə təşviq edərək buyurardı: "Kim Qədr gecəsini imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar". Allah Elçisi ﷺ vəfat edənə qədər beləcə davam etdi".

٢١٩٤ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي رَمَضَانَ : مَنْ قَامَهُ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

2194. ...Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Allah Elçisinin ﷺ Ramazan ayı haqda belə buyurduğunu eşitmişəm: "Kim (Ramazan ayını) imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar".

٢١٩٥ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ عَائِشَةَ ، أَخْبَرَتْهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مِنْ جَوْفِ اللَّيْلِ ، فَصَلَّى فِي الْمَسْجِدِ – وَسَاقَ الْحَدِيثَ ، وَقَالَ فِيهِ – وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُرَغِّبُهُمْ فِي قِيَامِ رَمَضَانَ مِنْ غَيْرِ أَنْ يَأْمُرَهُمْ بِعَزِيمَةِ أَمْرٍ فِيهِ ، فَيَقُولُ : مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

2195. ...Aişə رضي الله عنها rəvayət edir ki, Allah Elçisi ﷺ gecənin ortasında çıxıb məsciddə namaz qıldı. "Aişə hədisi sona kimi danışdı və dedi: "O, insanları çətinliyə salmamaq şərti ilə Ramazan ayını ibadətlə keçirməyə təşviq edərək buyurardı: "Kim Ramazan ayını imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar".

٢١٩٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنَا أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : لِرَمَضَانَ مَنْ قَامَهُ إِيمَانًا وَاحْتِسَابًا ، غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

2196. ...Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Kim Ramazan ayını imanla və mükafatını (yalnız Allahdan) umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar".

الرَّحْمَنِ بْنِ ثَوْبَانَ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ رَضِيَ اللَّهُ عَنْهُمَا ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ مِنَ الْبِرِّ الصِّيَامُ فِي السَّفَرِ ، عَلَيْكُمْ بِرُخْصَةِ اللهِ عَزَّ وَجَلَّ فَاقْبَلُوهَا.

2260. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: "Səfərdə oruc tutmaq yaxşı əməllərdən deyil. Allahın sizin üçün müəyyən etdiyi rüsxətindən istifadə etməyi əmr edirəm".

٢٢٦١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ عُثْمَانَ بْنِ عُمَرَ ، قَالَ : أَنْبَأَنَا عَلِيُّ بْنُ الْمُبَارَكِ ، عَنْ يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ رَجُلٍ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ مِنَ الْبِرِّ الصِّيَامُ فِي السَّفَرِ.

2261. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: "Səfərdə oruc tutmaq yaxşı əməllərdən deyil".

## ٤٩ - ذِكْرُ اسْمِ الرَّجُلِ
## 49-cu fəsil: Kişinin adının qeyd edilməsi

٢٢٦٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، وَخَالِدُ بْنُ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَسَنٍ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى رَجُلاً قَدْ ظُلِّلَ عَلَيْهِ فِي السَّفَرِ ، فَقَالَ : لَيْسَ مِنَ الْبِرِّ الصِّيَامُ فِي السَّفَرِ.

2262. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, bir dəfə Allah Elçisi ﷺ səfər əsnasında kölgələndirilən bir kişini gördükdə belə buyurdu: "Səfərdə oruc tutmaq yaxşı əməllərdən deyil".

٢٢٦٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى مَكَّةَ عَامَ الْفَتْحِ فِي رَمَضَانَ ، فَصَامَ حَتَّى بَلَغَ كُرَاعَ الْغَمِيمِ فَصَامَ النَّاسُ ، فَبَلَغَهُ أَنَّ النَّاسَ قَدْ شَقَّ عَلَيْهِمُ الصِّيَامُ ، فَدَعَا بِقَدَحٍ مِنَ الْمَاءِ بَعْدَ الْعَصْرِ فَشَرِبَ وَالنَّاسُ يَنْظُرُونَ ، فَأَفْطَرَ بَعْضُ النَّاسِ وَصَامَ بَعْضٌ ، فَبَلَغَهُ أَنَّ نَاسًا صَامُوا ، فَقَالَ : أُولَئِكَ الْعُصَاةُ.

2263. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Fəth ili Ramazan ayında Allah Elçisi ﷺ Məkkəyə yola düşdü. O və insanlar "Kuraul-Ğamim" adlı yerə çatana qədər oruc tutmuşdular. İnsanların oruc tutduqlarına görə çox çətinlik çəkdikləri Peyğəmbərə ﷺ məlum oldu. Ona görə Əsr namazından sonra bir qab su istədi və içdi. İnsanlar da ona baxırdılar. Bəziləri oruclarını pozdular, bəziləri isə oruca davam etdilər. Peyğəmbər ﷺ bəzilərinin oruca davam etdiklərini biləndə dedi: "Onlar asi olanlardır".

٢٢٦٤ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبدِ اللهِ ، وَعَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالاَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : أُتِيَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِطَعَامٍ بِمَرِّ الظَّهْرَانِ ، فَقَالَ لأَبِي بَكْرٍ وَعُمَرَ : أَدْنِيَا فَكُلاَ ، فَقَالاَ : إِنَّا صَائِمَانِ ، فَقَالَ : ارْحَلُوا لِصَاحِبَيْكُمْ ، اعْمَلُوا لِصَاحِبَيْكُمْ

2264. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mərriz-Zahran" deyilən yerdə Allah Elçisinə ﷺ yemək gətirildi. Allah Elçisi ﷺ Əbu Bəkr və Ömərə buyurdu: "Gəlin yeyin!" Onlar dedilər: "Biz oruc tutmuşuq". Allah Elçisi ﷺ buyurdu: "Gedin dəvələrinizin yanına və onları səfərə hazırlayın!"

٢٢٦٥ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ شُعَيْبٍ ، قَالَ : أَخْبَرَنِي الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى ، أَنَّهُ حَدَّثَهُ عَنْ أَبِي سَلَمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : بَيْنَمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَغَدَّى بِمَرِّ الظَّهْرَانِ وَمَعَهُ أَبُو بَكْرٍ وَعُمَرُ ، فَقَالَ : الْغَدَاءَ مُرْسَلٌ

2265. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٢٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ عُمَرَ ، قَالَ : حَدَّثَنَا عَلِيٌّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبَا بَكْرٍ وَعُمَرَ ، كَانُوا بِمَرِّ الظَّهْرَانِ مُرْسَلٌ.

2266. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

## ٥٠ - ذِكْرُ وَضْعِ الصِّيَامِ عَنِ الْمُسَافِرِ ، وَالاِخْتِلاَفُ عَلَى الأَوْزَاعِيِّ فِي خَبَرِ عَمْرِو بْنِ أُمَيَّةَ فِيهِ

## 50-ci fəsil: Müsafirin üzərindən orucun götürülməsi və əl-Əvzainin Amr ibn Umeyyənin ﷺ xəbəri haqda ixtilafı

٢٢٦٧ - أَخْبَرَنِي عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ ، عَنْ مُحَمَّدِ بْنِ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ أُمَيَّةَ الضَّمْرِيُّ ، قَالَ : قَدِمْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ سَفَرٍ ، فَقَالَ : انْتَظِرِ الْغَدَاءَ يَا أَبَا أُمَيَّةَ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ : تَعَالَ ادْنُ مِنِّي حَتَّى أُخْبِرَكَ عَنِ الْمُسَافِرِ : إِنَّ اللهَ عَزَّ وَجَلَّ وَضَعَ عَنْهُ الصِّيَامَ وَنِصْفَ الصَّلاَةِ.

2267. ...Rəvayət edilir ki, Əbu Sələmə ﵀ demişdir: "Mənə Amr ibn Umeyyə əd-Damri belə demişdir: "Səfərdən Allah Elçisinin ﷺ yanına qayıtdım. O dedi: "Gözlə, yeməyi bizlə birlikdə yeyərik, ey Əbu Umeyyə!" Mən dedim: "Mən orucam!" Allah Elçisi ﷺ dedi: "Bir az mənə yaxınlaş, sənə müsafir haqda xəbər verim. Həqiqətən, Allah ﷻ müsafirin üzərindən oruc yükünü qaldırmış, namazı da yarıya endirmişdir".

٢٢٦٨ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي أَبُو قِلاَبَةَ ،

قَالَ : حَدَّثَنِي جَعْفَرُ بْنُ عَمْرِو بْنِ أُمَيَّةَ الضَّمْرِيُّ ، عَنْ أَبِيهِ ، قَالَ : قَدِمْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَلاَ تَنْتَظِرُ الْغَدَاءَ يَا أَبَا أُمَيَّةَ ؟ قُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ : تَعَالَ أُخْبِرْكَ عَنِ الْمُسَافِرِ : إِنَّ اللَّهَ وَضَعَ عَنْهُ الصِّيَامَ وَنِصْفَ الصَّلاَةِ.

2268. ...Rəvayət edilir ki, Əbu Umeyyə əd-Damri ﷺ demişdir: "Səfərdə Allah Elçisinin ﷺ yanına gəldim. O, mənə dedi: "Sən bizimlə yeməyi gözləmirsən, ey Əbu Umeyyə?" Mən dedim: "Mən orucam". Allah Elçisi ﷺ dedi: "Bir az yaxınlaş, sənə müsafir haqda xəbər verim. Həqiqətən, Allah müsafirin üzərindən oruc yükünü qaldırmış, namazı da yarıya endirmişdir".

٢٢٦٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا أَبُو الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَاجِرِ ، عَنْ أَبِي أُمَيَّةَ الضَّمْرِيِّ ، قَالَ : قَدِمْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ سَفَرٍ ، فَسَلَّمْتُ عَلَيْهِ ، فَلَمَّا ذَهَبْتُ لأَخْرُجَ ، قَالَ : انْتَظِرِ الْغَدَاءَ يَا أَبَا أُمَيَّةَ قُلْتُ : إِنِّي صَائِمٌ يَا نَبِيَّ اللهِ ، قَالَ : تَعَالَ أُخْبِرْكَ عَنِ الْمُسَافِرِ : إِنَّ اللَّهَ تَعَالَى وَضَعَ عَنْهُ الصِّيَامَ وَنِصْفَ الصَّلاَةِ

2269. ...Rəvayət edilir ki, Əbu Umeyyə əd-Damri ﷺ demişdir: "Mən səfərdən qayıtdıqda Allah Elçisinin ﷺ yanına gəldim və ona salam verdim. Mən qayıtmaq istədikdə o dedi: "Gözlə, bir az yemək yeyək, ey Əbu Umeyyə!" Mən dedim: "Mən orucam, ey Allahın Peyğəmbəri!" Allah Elçisi ﷺ dedi: "Bir az yaxınlaş, sənə müsafir haqda xəbər verim. Həqiqətən, Uca Allah müsafirin üzərindən oruc yükünü qaldırmış, namazı da yarıya endirmişdir".

٢٢٧٠ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ مَرْوَانَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الأَوْزَاعِيِّ ، قَالَ : أَخْبَرَنِي يَحْيَى ، قَالَ : حَدَّثَنِي أَبُو قِلاَبَةَ ، قَالَ : حَدَّثَنِي أَبُو الْمُهَاجِرِ ، قَالَ : حَدَّثَنِي أَبُو أُمَيَّةَ يَعْنِي الضَّمْرِيَّ ، أَنَّهُ قَدِمَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ نَحْوَهُ.

2270. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٢٧١ - أَخْبَرَنِي شُعَيْبُ بْنُ شُعَيْبِ بْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : حَدَّثَنِي الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنِي يَحْيَى ، قَالَ : حَدَّثَنِي أَبُو قِلاَبَةَ الْجَرْمِيُّ ، أَنَّ أَبَا أُمَيَّةَ الضَّمْرِيَّ ، حَدَّثَهُمْ أَنَّهُ قَدِمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ سَفَرٍ ، فَقَالَ : انْتَظِرِ الْغَدَاءَ يَا أَبَا أُمَيَّةَ ، قُلْتُ : إِنِّي صَائِمٌ ، قَالَ : ادْنُ أُخْبِرْكَ عَنِ الْمُسَافِرِ : إِنَّ اللَّهَ وَضَعَ عَنْهُ الصِّيَامَ وَنِصْفَ الصَّلاَةِ.

2271. ...Rəvayət edilir ki, Əbu Umeyyə əd-Damri ﷺ səfərdə Allah Elçisinin ﷺ yanına gəlmişdi. Allah Elçisi ﷺ ona dedi: "Bir az gözlə, yemək yeyək, ey

Əbu Umeyyə!" Mən dedim: "Mən orucam!" Allah Elçisi ﷺ dedi: "Yaxınlaş, sənə müsafir haqda xəbər verim. Həqiqətən, Allah müsafirin üzərindən oruc yükünü qaldırmış, namazı da yarıya endirmişdir".

### ٥١ - ذِكْرُ اخْتِلاَفِ مُعَاوِيَةَ بْنِ سَلاَّمٍ وَعَلِيِّ بْنِ الْمُبَارَكِ فِي هَذَا الْحَدِيثِ

### 51-ci fəsil: Bu hədis haqda Müaviyə ibn Səlləm və Əli ibn əl-Mubərakın ixtilafı

٢٢٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدِ اللهِ بْنِ يَزِيدَ بْنِ إِبْرَاهِيمَ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي قِلاَبَةَ ، أَنَّ أَبَا أُمَيَّةَ الضَّمْرِيَّ ، أَخْبَرَهُ أَنَّهُ أَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ سَفَرٍ وَهُوَ صَائِمٌ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَلاَ تَنْتَظِرِ الْغَدَاءَ ، قَالَ : إِنِّي صَائِمٌ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَعَالَ أُخْبِرْكَ عَنِ الصِّيَامِ : إِنَّ اللهَ عَزَّ وَجَلَّ وَضَعَ عَنِ الْمُسَافِرِ الصِّيَامَ وَنِصْفَ الصَّلاَةِ

2272. ...Rəvayət edilir ki, bir dəfə Əbu Umeyyə əd-Damri رضي الله عنه səfərdən oruclu halda Allah Elçisinin ﷺ yanına gəlmişdi. Allah Elçisi ﷺ ona dedi: "Sən yeməyi gözləmirsən?" Mən dedim: "Mən orucam!" Allah Elçisi ﷺ dedi: "Bir az yaxınlaş, sənə oruc haqda xəbər verim. Həqiqətən, Allah ﷻ müsafirin üzərindən oruc yükünü qaldırmış, namazı da yarıya endirmişdir".

٢٢٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ عُمَرَ ، قَالَ : أَنْبَأَنَا عَلِيٌّ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ رَجُلٍ ، أَنَّ أَبَا أُمَيَّةَ ، أَخْبَرَهُ أَنَّهُ أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ سَفَرٍ ، نَحْوَهُ.

2273. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٢٧٤ - أَخْبَرَنَا عُمَرُ بْنُ مُحَمَّدِ بْنِ الْحَسَنِ بْنِ التَّلِّ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ الثَّوْرِيُّ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَنَسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّ اللهَ وَضَعَ عَنِ الْمُسَافِرِ نِصْفَ الصَّلاَةِ وَالصَّوْمَ ، وَعَنِ الْحُبْلَى وَالْمُرْضِعِ.

2274. ...Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Həqiqətən, Allah müsafir üçün namazı yarıya endirmiş və oruc yükünü qaldırmışdır. Həmçinin hamilə və uşaq əmizdirən qadından da oruc yükünü qaldırmışdır".

٢٢٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : حَدَّثَنَا حِبَّانُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنِ ابْنِ عُيَيْنَةَ ، عَنْ أَيُّوبَ ، عَنْ شَيْخٍ ، مِنْ قُشَيْرٍ ، عَنْ عَمِّهِ ، – حَدَّثَنَا ثُمَّ أَلْفَيْنَاهُ فِي إِبِلٍ لَهُ ، فَقَالَ لَهُ أَبُو قِلاَبَةَ : حَدِّثْهُ ، فَقَالَ الشَّيْخُ : حَدَّثَنِي عَمِّي – أَنَّهُ ذَهَبَ فِي إِبِلٍ لَهُ ، فَانْتَهَى

إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ يَأْكُلُ – أَوْ قَالَ : يَطْعَمُ – فَقَالَ : ادْنُ فَكُلْ – أَوْ قَالَ : ادْنُ فَاطْعَمْ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ وَضَعَ عَنِ الْمُسَافِرِ شَطْرَ الصَّلاَةِ وَالصِّيَامَ ، وَعَنِ الْحَامِلِ وَالْمُرْضِعِ.

2275. ...Quşeyrdən olan yaşlı bir kişi əmisindən rəvayət edir ki, əmisi onu özünün dəvəsinin üzərində otuzdurdu. Əbu Qilabə ona dedi: "Mənə hədis danış!" Həmin yaşlı adam dedi: "Mənə əmim danışdı ki, o, öz dəvəsi ilə Peyğəmbərin ﷺ yanına gəlmişdi. Bu əsnada Peyğəmbər ﷺ yemək yeyirdi. Peyğəmbər ﷺ dedi: "Yaxınlaşıb sən də ye!" Mən dedim: "Mən orucam". Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, Allah ﷻ müsafir üçün namazı yarıya endirmiş və oruc yükünü qaldırmışdır. Həmçinin, hamilə və uşaq əmizdirən qadından da oruc yükünü qaldırmışdır".

٢٢٧٦ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا سُرَيْجٌ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ ، عَنْ أَيُّوبَ ، قَالَ : حَدَّثَنِي أَبُو قِلاَبَةَ ، هَذَا الْحَدِيثَ ، ثُمَّ قَالَ : هَلْ لَكَ فِي صَاحِبِ الْحَدِيثِ فَدَلَّنِي عَلَيْهِ فَلَقِيتُهُ ، فَقَالَ : حَدَّثَنِي قَرِيبٌ لِي يُقَالُ لَهُ أَنَسُ بْنُ مَالِكٍ ، قَالَ : أَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِبِلٍ كَانَتْ لِي أُخِذَتْ ، فَوَافَقْتُهُ وَهُوَ يَأْكُلُ ، فَدَعَانِي إِلَى طَعَامِهِ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ : ادْنُ أُخْبِرْكَ عَنْ ذَلِكَ ، إِنَّ اللَّهَ وَضَعَ عَنِ الْمُسَافِرِ الصَّوْمَ وَشَطْرَ الصَّلاَةِ.

2276. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ؓ demişdir: "Mənim üçün alınan dəvəyə minib Allah Elçisinin ﷺ yanına gəlmişdim. O, yemək yeyirdi və məni yemək yeməyə dəvət etdi. Mən dedim: "Mən orucam". Peyğəmbər ﷺ belə buyurdu: "Yaxınlaş, sənə bu haqda xəbər verim. Həqiqətən, Allah müsafirin üzərindən oruc yükünü qaldırmış və namazı yarıya endirmişdir".

٢٢٧٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ رَجُلٍ ، قَالَ : أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحَاجَةٍ فَإِذَا هُوَ يَتَغَدَّى ، قَالَ : هَلُمَّ إِلَى الْغَدَاءِ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، قَالَ : هَلُمَّ أُخْبِرْكَ عَنِ الصَّوْمِ : إِنَّ اللَّهَ وَضَعَ عَنِ الْمُسَافِرِ نِصْفَ الصَّلاَةِ وَالصَّوْمَ ، وَرَخَّصَ لِلْحُبْلَى وَالْمُرْضِعِ

2277. ...Əbu Qilabə ؒ bir kişinin belə dediyini rəvayət etmişdir: "Mən bir ehtiyacıma görə Peyğəmbərin ﷺ yanına gəldikdə o, nahar edirdi. O dedi: "Gəl, nahar et!" Mən: "Mən orucam"- dedim. Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, Allah müsafirin üzərindən namazın yarısını və oruc yükünü qaldırmışdır. Həmçinin hamilə və uşaq əmizdirən qadına da bu məsələdə rüsxət vermişdir".

٢٢٧٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ أَبِي الْعَلاَءِ بْنِ الشِّخِّيرِ ، عَنْ رَجُلٍ ، نَحْوَهُ.

2278. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٢٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ هَانِئِ بْنِ الشِّخِّيرِ ، عَنْ رَجُلٍ ، مِنْ بَلْحَرِيشٍ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنْتُ مُسَافِرًا فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا صَائِمٌ وَهُوَ يَأْكُلُ ، قَالَ : هَلُمَّ ، قُلْتُ : إِنِّي صَائِمٌ ، قَالَ : تَعَالَ ، أَلَمْ تَعْلَمْ مَا وَضَعَ اللَّهُ عَنِ الْمُسَافِرِ قُلْتُ : وَمَا وَضَعَ عَنِ الْمُسَافِرِ ؟ قَالَ : الصَّوْمَ وَنِصْفَ الصَّلاَةِ.

2279. ...Hani ibn əş-Şixxir ﷺ "Bəlhəriş" adlı yerdən olan bir kişinin öz atasından belə dediyini rəvayət etmişdir: "Bir dəfə mən müsafir idim və oruclu olduğum halda Peyğəmbərin ﷺ yanına gəldim. O dedi: "Gəl!" Mən dedim: "Mən orucam!" O dedi: "Gəl, məgər bilmirsən ki, Allah müsafirin üzərindən nələri götürmüşdür?" Mən dedim: "Müsafirin üzərindən nələri götürüb ki?" O dedi: "Orucu və namazın yarısını".

٢٢٨٠ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ هَانِئِ بْنِ عَبْدِ اللهِ بْنِ الشِّخِّيرِ ، عَنْ رَجُلٍ ، مِنْ بَلْحَرِيشٍ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنَّا نُسَافِرُ مَا شَاءَ اللَّهُ ، فَأَتَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَطْعَمُ ، فَقَالَ : هَلُمَّ ، فَاطْعَمْ ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُحَدِّثُكُمْ عَنِ الصِّيَامِ : إِنَّ اللَّهَ وَضَعَ عَنِ الْمُسَافِرِ الصَّوْمَ وَشَطْرَ الصَّلاَةِ.

2280. ...Hani ibn Abdullah ibn əş-Şixxir ﷺ "Bəlhəriş" adlı yerdən olan bir kişinin öz atasından belə dediyini rəvayət etmişdir: "Bir dəfə biz Allahın istədiyi müddətə müsafir idik və Allah Elçisinin ﷺ yanına gəldik. O, yemək yeyirdi və dedi: "Yaxınlaşın!" Mən dedim: "Mən orucam!" O dedi: "Mən sizə oruc haqda deyim. Həqiqətən, Allah müsafirin üzərindən oruc yükünü götürmüş və namazı yarıya endirmişdir".

٢٢٨١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ عَبْدِ الْكَرِيمِ ، قَالَ : حَدَّثَنَا سَهْلُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ هَانِئِ بْنِ عَبْدِ اللهِ بْنِ الشِّخِّيرِ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنْتُ مُسَافِرًا ، فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يَأْكُلُ وَأَنَا صَائِمٌ ، فَقَالَ : هَلُمَّ قُلْتُ : إِنِّي صَائِمٌ ، قَالَ : أَتَدْرِي مَا وَضَعَ اللَّهُ عَنِ الْمُسَافِرِ ، قُلْتُ : وَمَا وَضَعَ اللَّهُ عَنِ الْمُسَافِرِ ؟ قَالَ : الصَّوْمَ وَشَطْرَ الصَّلاَةِ.

2281. ...Hani ibn Abdullah ibn əş-Şixxir atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Bir dəfə mən müsafir idim və Peyğəmbərin ﷺ yanına gəlmişdim. O, yemək yeyirdi, mən isə oruc tutmuşdum. Peyğəmbər ﷺ dedi: "Gəl!" Mən dedim: "Mən orucam". O dedi: "Sən Allahın müsafirin üzərindən nəyi götürdüyünü bilirsənmi?" Mən dedim: "Allah müsafirin üzərindən nəyi götürüb ki?" Peyğəmbər ﷺ buyurdui: "Orucu və namazın yarısını".

٢٢٨٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : أَنْبَأَنَا إِسْرَائِيلُ ، عَنْ مُوسَى هُوَ ابْنُ أَبِي عَائِشَةَ ، عَنْ غَيْلاَنَ ، قَالَ : خَرَجْتُ مَعَ أَبِي قِلاَبَةَ فِي سَفَرٍ ، فَقَرَّبَ طَعَامًا ، فَقُلْتُ : إِنِّي صَائِمٌ ، فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ فِي سَفَرٍ ، فَقَرَّبَ طَعَامًا ، فَقَالَ لِرَجُلٍ : ادْنُ فَاطْعَمْ ، قَالَ : إِنِّي صَائِمٌ ، قَالَ : إِنَّ اللهَ وَضَعَ عَنِ الْمُسَافِرِ نِصْفَ الصَّلاَةِ وَالصِّيَامَ فِي السَّفَرِ ، فَادْنُ فَاطْعَمْ فَدَنَوْتُ فَطَعِمْتُ.

2282. ...Rəvayət edilir ki, Ğeylan ﵀ demişdir: “Mən Əbu Qilabə ilə birlikdə səfərə çıxmışdım. O, yemək gətirdikdə mən dedim: “Mən orucam”. O dedi: “Allah Elçisi ﷺ səfərə çıxmışdı. Yemək gətirdi və bir kişiyə: “Gəl, yemək ye!” dedi. Kişi dedi: “Mən orucam”. Peyğəmbər ﷺ buyurdu: “Həqiqətən, Allah müsafirin üzərindən namazın yarısını və oruc yükünü götürmüşdür”. Ğeylan deyir: “Mən də yaxınlaşaraq yemək yeməyə başladım”.

٥٢ - فَضْلُ الإِفْطَارِ فِي السَّفَرِ عَلَى الصِّيَامِ

## 52-ci fəsil: Səfərdə oruc tutmamağın otuc tutmaqdan üstün olması

٢٢٨٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا عَاصِمٌ الأَحْوَلُ ، عَنْ مُوَرِّقٍ الْعِجْلِيِّ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي السَّفَرِ ، فَمِنَّا الصَّائِمُ وَمِنَّا الْمُفْطِرُ ، فَنَزَلْنَا فِي يَوْمٍ حَارٍّ وَاتَّخَذْنَا ظِلاَلاً ، فَسَقَطَ الصُّوَّامُ ، وَقَامَ الْمُفْطِرُونَ فَسَقَوُا الرِّكَابَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ذَهَبَ الْمُفْطِرُونَ الْيَوْمَ بِالأَجْرِ.

2283. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Bir dəfə Allah Elçisi ﷺ ilə birlikdə səfərdə idik. Aramızda oruc tutan da, oruc tutmayan da var idi. İsti bir gün idi, biz də kölgələnmək üçün bir şey düzəldib orada kölgələndik. Oruc tutanlar huşlarını itirib yıxıldılar. Oruc tutmayanlar isə qalxıb onlara kömək etdilər və heyvanlarını suvardılar. Allah Elçisi ﷺ belə buyurdu: “Bu gün oruc tutmayanlar savab qazanmaqda önə keçdilər”.

٥٣ - ذِكْرُ قَوْلِهِ : الصَّائِمُ فِي السَّفَرِ كَالْمُفْطِرِ فِي الْحَضَرِ

## 53-cü fəsil: Səfərdə oruc tutanın öz evində iftar edən kimi olması[1]

٢٢٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ أَبَانَ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، عَنِ ابْنِ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، قَالَ : يُقَالُ : الصِّيَامُ فِي السَّفَرِ كَالإِفْطَارِ فِي الْحَضَرِ.

2284. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Auf ﵁ demişdir: “Səfərdə oruc tutan öz evində iftar edən kimidir”.[2]

---

[1] Yəni sanki oruc tutmamışdır.
[2] Hədis zəifdir.

٢٢٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ الْخَيَّاطِ ، وَأَبُو عَامِرٍ ، قَالاَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، قَالَ : الصَّائِمُ فِي السَّفَرِ كَالْمُفْطِرِ فِي الْحَضَرِ.

2285. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Auf ﷺ demişdir: “Səfərdə oruc tutan kimsə oruc tutmayan kimsə kimidir”.[1]

٢٢٨٦ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، عَنْ أَبِيهِ ، قَالَ : الصَّائِمُ فِي السَّفَرِ كَالْمُفْطِرِ فِي الْحَضَرِ.

2286. ...Humeyd ibn Abdur-Rahmən ibn Auf atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Səfərdə oruc tutan öz evində iftar edən kimidir”.[2]

## ٥٤ - الصِّيَامُ فِي السَّفَرِ وَذِكْرُ اخْتِلاَفِ خَبَرِ ابْنِ عَبَّاسٍ فِيهِ

## 54-cü fəsil: Səfərdə oruc tutmaq və İbn Abbasın ﷺ xəbərində olan ixtilaf

٢٢٨٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : أَنْبَأَنَا سُوَيْدٌ ، قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ مِقْسَمٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ فِي رَمَضَانَ فَصَامَ حَتَّى أَتَى قُدَيْدًا ، ثُمَّ أُتِيَ بِقَدَحٍ مِنْ لَبَنٍ فَشَرِبَ وَأَفْطَرَ هُوَ وَأَصْحَابُهُ.

2287. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Ramazan ayında oruclu halda səfərə çıxıb “Qudeydə” adlı yerə qədər gəldi. Sonra ona bir qədəhdə süd gətirdilər. O da bu südü içərək orucunu açdı və səhabələr də oruclarını açdılar.

٢٢٨٨ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، عَنِ الْعَلاَءِ بْنِ الْمُسَيَّبِ ، عَنِ الْحَكَمِ بْنِ عُتَيْبَةَ ، عَنْ مُجَاهِدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : صَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ حَتَّى أَتَى قُدَيْدًا ، ثُمَّ أَفْطَرَ حَتَّى أَتَى مَكَّةَ.

2288. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ oruclu halda Mədinədən çıxaraq “Qudeydə” deyilən yerə qədər gəldi. Sonra orucunu açdı və Məkkəyə gəldi[3]”.

٢٢٨٩ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : أَنْبَأَنَا الْحَسَنُ بْنُ عِيسَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ مِقْسَمٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَامَ فِي السَّفَرِ حَتَّى أَتَى قُدَيْدًا ، ثُمَّ دَعَا بِقَدَحٍ مِنْ لَبَنٍ فَشَرِبَ ، فَأَفْطَرَ هُوَ وَأَصْحَابُهُ.

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.
[3] Yəni Məkkəyə qədər olan bir neçə günlük yol əsnasında oruc tutmadı.

2289. ...İbn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ oruclu halda səfərə çıxaraq "Qudeydə" adlı yerə qədər gəldi. Sonra bir qədəhdə süd istədi və bu südü içdi. O da, səhabələri də oruclarını açdılar.

٥٥ - ذِكْرُ الِاخْتِلَافِ عَلَى مَنْصُورٍ

55-ci fəsil: Mənsurun hədisi haqda ixtilaf

٢٢٩٠ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى مَكَّةَ فَصَامَ حَتَّى أَتَى عُسْفَانَ ، فَدَعَا بِقَدَحٍ فَشَرِبَ - قَالَ شُعْبَةُ - فِي رَمَضَانَ فَكَانَ ابْنُ عَبَّاسٍ ، يَقُولُ : مَنْ شَاءَ صَامَ وَمَنْ شَاءَ أَفْطَرَ.

2290. ... Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ oruclu halda Məkkəyə doğru səfərə çıxdı və "Usfan" deyilən yerə qədər gəldi. Sonra içmək üçün bir qədəh istədi və qədəhdəkini içdi". Ravi Şubə deyir: "Bu, Ramazan ayında idi". İbn Abbas deyir: "Kim istəsə, oruc tutar, kim istəsə, orucunu açar".

٢٢٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، عَنْ جَرِيرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَافَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي رَمَضَانَ ، فَصَامَ حَتَّى بَلَغَ عُسْفَانَ ، ثُمَّ دَعَا بِإِنَاءٍ فَشَرِبَ نَهَارًا ، يَرَاهُ النَّاسُ ثُمَّ أَفْطَرَ.

2291. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ oruclu halda səfərə çıxdı və "Usfan" deyilən yerə qədər gəldi. Sonra bir qabda içməyə bir şey istədi və insanların gözü qarşısında bunu içdi, sonra da iftar etdi".

٢٢٩٢ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الْعَوَّامِ بْنِ حَوْشَبٍ ، قَالَ : قُلْتُ لِمُجَاهِدٍ : الصَّوْمُ فِي السَّفَرِ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ وَيُفْطِرُ.

2292. ...Rəvayət edilir ki, əl-Avvam ibn Həvşəb ﵀ demişdir: "Mən Mucahiddən səfərdə oruc tutmaq haqda soruşdum. O dedi: "Allah Elçisi ﷺ səfərdə bəzən oruc tutar, bəzən də tutmazdı".

٢٢٩٣ - أَخْبَرَنِي هِلَالُ بْنُ الْعَلَاءِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، قَالَ : أَخْبَرَنِي مُجَاهِدٌ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَامَ فِي شَهْرِ رَمَضَانَ ، وَأَفْطَرَ فِي السَّفَرِ.

2293. ...Mucahid ﵀ rəvayət edir ki, Allah Elçisi ﷺ Ramazan ayında oruc tutar, səfərə çıxanda isə oruc tutmazdı.

٥٦ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى سُلَيْمَانَ بْنِ يَسَارٍ فِي حَدِيثِ حَمْزَةَ بْنِ عَمْرٍو فِيهِ

## 56-cı fəsil: Süleyman ibn Yəsərin Həmzə ibn Amrın ﷺ hədisi haqda ixtilafı

٢٢٩٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا أَزْهَرُ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ قَتَادَةَ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو الأَسْلَمِيِّ ، أَنَّهُ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّوْمِ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ – ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا – إِنْ شِئْتَ صُمْتَ ، وَإِنْ شِئْتَ أَفْطَرْتَ

2294. ...Rəvayət edilir ki, Həmzə ibn Amr əl-Əsləmi ﷺ Allah Elçisinə ﷺ səfərdə oruc tutmaq haqda sual verdi. Allah Elçisi ﷺ "İstəsən, oruc tut, istəsən, tutma" mənalı kəlmələr söylədi.

٢٢٩٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ بُكَيْرٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، أَنَّ حَمْزَةَ بْنَ عَمْرٍو ، قَالَ : يَا رَسُولَ اللهِ ، مِثْلَهُ مُرْسَلٌ.

2295. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٢٩٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنِ جَعْفَرٍ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ حَمْزَةَ ، قَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّوْمِ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ شِئْتَ أَنْ تَصُومَ فَصُمْ ، وَإِنْ شِئْتَ أَنْ تُفْطِرَ فَأَفْطِرْ.

2296. ...Rəvayət edilir ki, Həmzə ﷺ demişdir: "Mən Allah Elçisindən ﷺ səfərdə oruc tutmaq haqda soruşdum. O dedi: "Oruc tutmaq istəsən, oruc tut, tutmaq istəməsən, tutma".

٢٢٩٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو ، قَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّوْمِ فِي السَّفَرِ ؟ فَقَالَ : إِنْ شِئْتَ أَنْ تَصُومَ فَصُمْ ، وَإِنْ شِئْتَ أَنْ تُفْطِرَ فَأَفْطِرْ.

2297. ...Rəvayət edilir ki, Həmzə ibn Amr ﷺ demişdir: "Mən Allah Elçisindən ﷺ səfərdə oruc tutmaq haqda soruşdum. O dedi: "Oruc tutmaq istəsən, tut, tutmaq istəməsən, tutma".

٢٢٩٨ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، وَاللَّيْثُ ، فَذَكَرَ آخَرَ عَنْ بُكَيْرٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو الأَسْلَمِيِّ ، قَالَ : يَا رَسُولَ اللهِ ، إِنِّي أَجِدُ قُوَّةً عَلَى الصِّيَامِ فِي السَّفَرِ ، قَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2298. ...Rəvayət edilir ki, Həmzə ibn Amr əl-Əsləmi ؓ demişdir: “Ey Allahın Elçisi, mənim səfərdə oruc tutmağa qüvvəm çatır”. Peyğəmbər ﷺ buyurdu: “İstəsən, oruc tut, istəməsən, tutma”.

٢٢٩٩ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ بَكْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : أَخْبَرَنِي عِمْرَانُ بْنُ أَبِي أَنَسٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو ، أَنَّهُ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّوْمِ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ شِئْتَ أَنْ تَصُومَ فَصُمْ ، وَإِنْ شِئْتَ أَنْ تُفْطِرَ فَأَفْطِرْ.

2299. ...Rəvayət edilir ki, Həmzə ibn Amr ؓ Allah Elçisindən ﷺ səfərdə oruc tutmaq haqda soruşdu. Allah Elçisi ﷺ buyurdu: “Oruc tutmaq istəsən, tut, tutmaq istəməsən, tutma”.

٢٣٠٠ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، وَحَنْظَلَةَ بْنِ عَلِيٍّ ، قَالَ : حَدَّثَانِي جَمِيعًا عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو ، قَالَ : كُنْتُ أَسْرُدُ الصِّيَامَ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنِّي أَسْرُدُ الصِّيَامَ فِي السَّفَرِ ، فَقَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2300. ...Rəvayət edilir ki, Həmzə ibn Amr ؓ demişdir: “Mən Allah Elçisinin ﷺ dövründə ardıcıl oruc tutan idim. Mən dedim: “Ey Allahın Elçisi, mən səfərdə orucu ardıcıl tuta bilirəm”. Peyğəmbər ﷺ buyurdu: “İstəsən, tut, istəməsən, tutma”.

٢٣٠١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ ابْنِ إِسْحَاقَ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنْ حَنْظَلَةَ بْنِ عَلِيٍّ ، عَنْ حَمْزَةَ ، قَالَ : قُلْتُ : يَا نَبِيَّ اللهِ ، إِنِّي رَجُلٌ أَسْرُدُ الصِّيَامَ أَفَأَصُومُ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2301. ...Rəvayət edilir ki, Həmzə ؓ demişdir: “Mən dedim: “Ey Allahın Peyğəmbəri, mən ardıcıl oruc tutan adamam. Səfərdə oruc tuta bilərəm-mi?” Peyğəmbər ﷺ buyurdu: “İstəsən, tut, istəməsən, tutma”.

٢٣٠٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ ابْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي عِمْرَانُ بْنُ أَبِي أَنَسٍ ، أَنَّ سُلَيْمَانَ بْنَ يَسَارٍ ، حَدَّثَهُ أَنَّ أَبَا مُرَاوِحٍ ، حَدَّثَهُ أَنَّ حَمْزَةَ بْنَ عَمْرٍو ، حَدَّثَهُ أَنَّهُ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَكَانَ رَجُلاً يَصُومُ فِي السَّفَرِ ، فَقَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2302. ...Rəvayət edilir ki, Həmzə ibn Amr ؓ səfərdə oruc tutan adam olduğuna görə bu haqda Allah Elçisindən ﷺ soruşdu. Allah Elçisi ﷺ buyurdu: “İstəsən. tut, istəməsən, tutma”.

٥٧ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى عُرْوَةَ فِي حَدِيثِ حَمْزَةَ فِيهِ

## 57-ci fəsil: Həmzənin ﷺ rəvayət etdiyi hədis haqda Urvanın ixtilafı

٢٣٠٣ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا عَمْرٌو ، وَذَكَرَ آخَرَ عَنْ أَبِي الأَسْوَدِ ، عَنْ عُرْوَةَ ، عَنْ أَبِي مُرَاوِحٍ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو ، أَنَّهُ قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَجِدُ فِيَّ قُوَّةً عَلَى الصِّيَامِ فِي السَّفَرِ ، فَهَلْ عَلَيَّ جُنَاحٌ ؟ قَالَ : هِيَ رُخْصَةٌ مِنَ اللهِ عَزَّ وَجَلَّ ، فَمَنْ أَخَذَ بِهَا فَحَسَنٌ ، وَمَنْ أَحَبَّ أَنْ يَصُومَ فَلاَ جُنَاحَ عَلَيْهِ.

2303. ...Rəvayət edilir ki, Həmzə ibn Amr ﷺ Allah Elçisinə ﷺ dedi: "Mənim səfərdə oruc tutmağa qüvvəm çatır. Oruc tutsam, günaha girmiş olarammı?" Allah Elçisi ﷺ buyurdu: "Səfərdə oruc tutmamaq Allahdan ﷻ verilmiş bir rüsxətdir. Kim bu rüsxətdən istifadə edərsə, yaxşı bir iş etmişdir. Kim oruc tutarsa, ona günah yoxdur".

٥٨ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى هِشَامِ بْنِ عُرْوَةَ فِيهِ

## 58-ci fəsil: Hişam ibn Urvanın hədisi haqda ixtilaf

٢٣٠٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، عَنْ مُحَمَّدِ بْنِ بِشْرٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو الأَسْلَمِيِّ ، أَنَّهُ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَصُومُ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2304. ...Rəvayət edilir ki, Həmzə ibn Amr əl-Əsləmi ﷺ Allah Elçisindən ﷺ səfərdə oruc tutmaq haqda soruşdu. Peyğəmbər ﷺ buyurdu: "İstəsən, tut, istəməsən, tutma!"

٢٣٠٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ الْحَسَنِ اللاَّنِيُّ ، بِالْكُوفَةِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحِيمِ الرَّازِيُّ ، عَنْ هِشَامٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، عَنْ حَمْزَةَ بْنِ عَمْرٍو ، أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ ، إِنِّي رَجُلٌ أَصُومُ ، أَفَأَصُومُ فِي السَّفَرِ ؟ قَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2305. ...Rəvayət edilir ki, Həmzə ibn Amr əl-Əsləmi ﷺ Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi, mən tez-tez oruc tutan adamam. Səfərdə oruc tuta bilərəmmi?" Allah Elçisi ﷺ buyurdu: "İstəsən, tut, istəməsən, tutma!"

٢٣٠٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنَّ حَمْزَةَ ، قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا رَسُولَ اللهِ ، أَصُومُ فِي السَّفَرِ ؟ وَكَانَ كَثِيرَ الصِّيَامِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2306. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Həmzə Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi, mən səfərdə oruc tuta bilərəmmi?" O, tez-tez oruc tutan adam idi. Allah Elçisi ﷺ buyurdu: "İstəsən, tut, istəməsən, tutma!"

٢٣٠٧ - أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنَّ حَمْزَةَ سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَصُومُ فِي السَّفَرِ ؟ فَقَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2307. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Həmzə Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi, mən səfərdə oruc tuta bilərəmmi?" Allah Elçisi ﷺ buyurdu: "İstəsən, tut, istəməsən, tutma!"

٢٣٠٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ حَمْزَةَ الأَسْلَمِيَّ ، سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الصَّوْمِ فِي السَّفَرِ ، وَكَانَ رَجُلاً يَسْرُدُ الصِّيَامَ ، فَقَالَ : إِنْ شِئْتَ فَصُمْ ، وَإِنْ شِئْتَ فَأَفْطِرْ.

2308. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Həmzə əl-Əsləmi Allah Elçisindən ﷺ səfərdə oruc tutmaq haqda soruşdu. O, çoxlu oruc tutan adam idi. Allah Elçisi ﷺ buyurdu: "İstəsən, tut, istəməsən, tutma!"

٥٩ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى أَبِي نَضْرَةَ الْمُنْذِرِ بْنِ مَالِكِ بْنِ قُطَعَةَ فِيهِ

## 59-cu fəsil: Əbu Nadra əl-Munziri ibn Malik ibn Qutaənın hədisi haqda ixtilaf

٢٣٠٩ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ سَعِيدٍ الْجُرَيْرِيِّ ، عَنْ أَبِي نَضْرَةَ ، قَالَ : حَدَّثَنَا أَبُو سَعِيدٍ ، قَالَ : كُنَّا نُسَافِرُ فِي رَمَضَانَ فَمِنَّا الصَّائِمُ ، وَمِنَّا الْمُفْطِرُ لاَ يَعِيبُ الصَّائِمُ عَلَى الْمُفْطِرِ ، وَلاَ يَعِيبُ الْمُفْطِرُ عَلَى الصَّائِمِ.

2309. ...Rəvayət edilir ki, Əbu Səid ﵁ demişdir: "Biz Ramazan ayında səfərdə idik. Kimimiz oruc tuturduq, kimimiz oruc tutmurduq. Oruc tutan tutmayanı, tutmayan da tutanı qınamazdı".

٢٣١٠ - أَخْبَرَنَا سَعِيدُ بْنُ يَعْقُوبَ الطَّالْقَانِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ عَبْدِ اللهِ الْوَاسِطِيُّ ، عَنْ أَبِي مَسْلَمَةَ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ ، قَالَ : كُنَّا نُسَافِرُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَمِنَّا الصَّائِمُ وَمِنَّا الْمُفْطِرُ ، وَلاَ يَعِيبُ الصَّائِمُ عَلَى الْمُفْطِرِ ، وَلاَ يَعِيبُ الْمُفْطِرُ عَلَى الصَّائِمِ.

2310. ...Rəvayət edilir ki, Əbu Səid ﵁ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə Ramazan ayında səfərdə idik. Kimimiz oruc tuturduq, kimimiz oruc tutmurduq. Oruc tutan oruc tutmayanı, oruc tutmayan da oruc tutanı qınamazdı".

٢٣١١ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا الْقَوَارِيرِيُّ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ مَنْصُورٍ ، عَنْ عَاصِمٍ الأَحْوَلِ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ جَابِرٍ ، قَالَ : سَافَرْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَامَ بَعْضُنَا وَأَفْطَرَ بَعْضُنَا.

2311. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə səfər edərdik. Kimimiz oruc tuturduq, kimimiz də tutmurduq".

٢٣١٢ - أَخْبَرَنِي أَيُّوبُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ ، قَالَ : حَدَّثَنَا عَاصِمٌ ، عَنْ أَبِي نَضْرَةَ الْمُنْذِرِ ، عَنْ أَبِي سَعِيدٍ ، وَجَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّهُمَا سَافَرَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَيَصُومُ الصَّائِمُ وَيُفْطِرُ الْمُفْطِرُ ، وَلاَ يَعِيبُ الصَّائِمُ عَلَى الْمُفْطِرِ وَلاَ الْمُفْطِرُ عَلَى الصَّائِمِ.

2312. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, onlar Allah Elçisi ﷺ ilə birlikdə səfər edərdilər. Kimisi oruc tutar, kimisi isə oruc tutmazdı. Oruc tutan oruc tutmayanı, oruc tutmayan da tutanı qınamazdı.

٦٠ - الرُّخْصَةُ لِلْمُسَافِرِ أَنْ يَصُومَ بَعْضًا وَيُفْطِرَ بَعْضًا

## 60-cı fəsil: Müsafirin bəzən oruc tutması, bəzən də tutmaması

٢٣١٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ الْفَتْحِ صَائِمًا فِي رَمَضَانَ ، حَتَّى إِذَا كَانَ بِالْكَدِيدِ أَفْطَرَ.

2313. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Fəth ilinin Ramazan ayında oruclu halda səfərə çıxdı. "əl-Kədid" deyilən yerə çatdıqda orucunu pozdu".

٦١ - الرُّخْصَةُ فِي الإِفْطَارِ لِمَنْ حَضَرَ شَهْرَ رَمَضَانَ فَصَامَ ثُمَّ سَافَرَ

## 61-ci fəsil: Ramazan ayında orucunu pozub sonra səfərə çıxmağın icazəli olması

٢٣١٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَافَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَامَ حَتَّى بَلَغَ عُسْفَانَ ، ثُمَّ دَعَا بِإِنَاءٍ فَشَرِبَ نَهَارًا لِيَرَاهُ النَّاسُ ، ثُمَّ أَفْطَرَ حَتَّى دَخَلَ مَكَّةَ ، فَافْتَتَحَ مَكَّةَ فِي رَمَضَانَ ، قَالَ ابْنُ عَبَّاسٍ : فَصَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي السَّفَرِ وَأَفْطَرَ ، فَمَنْ شَاءَ صَامَ وَمَنْ شَاءَ أَفْطَرَ.

2314. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ oruclu halda "Usfan" adlı yerə qədər gəldi. Sonra bir qab istədi və günorta vaxtı insanlar görsünlər deyə bu qabdakını içdi. Məkkəyə gələnə qədər oruc

tutmadı. O, Məkkəni Ramazan ayında fəth etdi". İbn Abbas deyir: "Allah Elçisi ﷺ səfərdə bəzən oruc tutar, bəzən tutmazdı. Kim istəsə, oruc tutar, kim də istəsə, oruc tutmazdı".

٦٢ - وَضْعُ الصِّيَامِ عَنِ الْحُبْلَى وَالْمُرْضِعِ

62-ci fəsil: Hamilə və südverən qadınların oruc tutmaması

٢٣١٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا مُسْلِمُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ وُهَيْبِ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ سَوَادَةَ الْقُشَيْرِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، رَجُلٌ مِنْهُمْ أَنَّهُ أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْمَدِينَةِ وَهُوَ يَتَغَدَّى ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هَلُمَّ إِلَى الْغَدَاءِ ، فَقَالَ : إِنِّي صَائِمٌ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللهَ عَزَّ وَجَلَّ وَضَعَ لِلْمُسَافِرِ الصَّوْمَ وَشَطْرَ الصَّلاَةِ ، وَعَنِ الْحُبْلَى وَالْمُرْضِعِ.

2315. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, onlardan olan bir kişi Mədinəyə Peyğəmbərin ﷺ yanına gəldi. Bu vaxt Peyğəmbər ﷺ yemək yeyirdi və ona dedi: "Gəl, yemək ye!" Kişi dedi: "Mən orucam". Peyğəmbər ﷺ ona dedi: "Həqiqətən, Allah ﷻ müsafirin üzərindən oruc yükünü götürmüş və namazı yarıya endirmişdir. Həmçinin hamilədən və südverəndən də oruc yükünü götürmüşdür".

٦٣ - تَأْوِيلُ قَوْلِ اللهِ عَزَّ وَجَلَّ : **{وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ}**

63-cü fəsil: Allahın ﷻ **"Buna taqəti olanlar isə buraxdığı hər gününün əvəzinə bir kasıbı yedirtməklə fidyə verməlidirlər"** (əl-Bəqərə, 184) ayəsinin izahı

٢٣١٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : أَنْبَأَنَا بَكْرٌ وَهُوَ ابْنُ مُضَرَ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ بُكَيْرٍ ، عَنْ يَزِيدَ ، مَوْلَى سَلَمَةَ بْنِ الأَكْوَعِ ، عَنْ سَلَمَةَ بْنِ الأَكْوَعِ ، قَالَ : لَمَّا نَزَلَتْ هَذِهِ الآيَةُ **{وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ}** كَانَ مَنْ أَرَادَ مِنَّا أَنْ يُفْطِرَ وَيَفْتَدِيَ ، حَتَّى نَزَلَتِ الآيَةُ الَّتِي بَعْدَهَا ، فَنَسَخَتْهَا.

2316. ...Rəvayət edilir ki, Sələmə ibn əl-Əkva ﷺ demişdir: "Bu ayə **"Buna taqəti olanlar isə buraxdığı hər gününün əvəzinə bir kasıbı yedirtməklə fidyə verməlidirlər"** (əl-Bəqərə, 184) nazil olduqda bizdən bəzilərimiz oruc tutmaq istəmədikdə fidyə verərdilər. Daha sonra növbəti ayə nazil oldu və bu ayənin hökmünü ləğv etdi".

٢٣١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا وَرْقَاءُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، فِي قَوْلِهِ عَزَّ وَجَلَّ : **{وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ}** يُطِيقُونَهُ : يُكَلَّفُونَهُ ، فِدْيَةٌ : طَعَامُ مِسْكِينٍ وَاحِدٍ ، فَمَنْ

تَطَوَّعَ خَيْرًا طَعَامُ مِسْكِينٍ آخَرَ لَيْسَتْ بِمَنْسُوخَةٍ فَهُوَ خَيْرٌ لَهُ ، وَأَنْ تَصُومُوا خَيْرٌ لَكُمْ ، لاَ يُرَخَّصُ فِي هَذَا إِلاَّ لِلَّذِي لاَ يُطِيقُ الصِّيَامَ أَوْ مَرِيضٍ لاَ يُشْفَى.

2317. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ Allahın ﷻ bu kəlmələri **"Buna taqəti olanlar isə buraxdığı hər gününün əvəzinə bir kasıbı yedirtməklə fidyə verməlidirlər"** (əl-Bəqərə, 184) haqda demişdir: "Ayədə "**taqəti olanlar**" kəlməsi "oruc tutmaqda çətinlik çəkənlər" deməkdir. "**Bir kasıbı yedirtməklə fidyə verməlidirlər**" kəlməsi isə bir yoxsulu doyduracaq fidyə miqdarıdır. **"Kim könüllü olaraq yaxşılıq etsə, bu onun üçün daha xeyirli olar"** kəlməsi isə kasıb və yoxsulu doydurmaq məsələsində, "kim istəyərsə, yaxşılığı artıra bilər" deməkdir. Bu ayə nəsx (hökmü ləğv) edilməyib. "Bu onun üçün daha xeyirlidir", yəni "oruc tutması daha xeyirlidir". Bu ayədə oruc tuta bilməyən və sağalmayan xəstələrə rüsxət var".

## ٦٤ - وَضْعُ الصِّيَامِ عَنِ الْحَائِضِ

## 64-cü fəsil: Heyzli qadının oruc tutmaması

٢٣١٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا عَلِيٌّ ، يَعْنِي ابْنَ مُسْهِرٍ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ مُعَاذَةَ الْعَدَوِيَّةِ ، أَنَّ امْرَأَةً سَأَلَتْ عَائِشَةَ : أَتَقْضِي الْحَائِضُ الصَّلاَةَ إِذَا طَهُرَتْ ؟ قَالَتْ : أَحَرُورِيَّةٌ أَنْتِ ، كُنَّا نَحِيضُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثُمَّ نَطْهُرُ فَيَأْمُرُنَا بِقَضَاءِ الصَّوْمِ ، وَلاَ يَأْمُرُنَا بِقَضَاءِ الصَّلاَةِ.

2318. ...Muazə əl-Adəvi ﵂ rəvayət edir ki, bir qadın Aişədən soruşdu: "Heyzli qadın təmizləndikdən sonra namazları qəza edirmi?" Aişə dedi: "Sən Hərurisən (Xavaricsən)? Biz Allah Elçisinin ﷺ dövründə heyz olar, sonra təmizlənərdik. O isə bizə orucu qəza etməyi, namazı isə qəza etməməyi əmr edərdi".

٢٣١٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : سَمِعْتُ أَبَا سَلَمَةَ ، يُحَدِّثُ عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنْ كَانَ لَيَكُونُ عَلَيَّ الصِّيَامُ مِنْ رَمَضَانَ فَمَا أَقْضِيهِ حَتَّى يَجِيءَ شَعْبَانُ.

2319. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Əgər Ramazan ayında heyz olduğuma görə oruc tutmurdumsa, oruclarımın qəzasını Şaban ayı olanda (yəni on aydan sonra) tutardım".

٦٥ - إِذَا طَهُرَتِ الْحَائِضُ أَوْ قَدِمَ الْمُسَافِرُ فِي رَمَضَانَ هَلْ يَصُومُ بَقِيَّةَ يَوْمِهِ

## 65-ci fəsil: Ramazan ayında heyzdən təmizləndikdə və ya səfərdən qayıtdıqda həmin günü orucla davam etmək olarmı?

٢٣٢٠ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ أَحْمَدَ بْنِ عَبْدِ اللهِ بْنِ يُونُسَ أَبُو حَصِينٍ ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، قَالَ : حَدَّثَنَا حُصَيْنٌ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ صَيْفِيٍّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ عَاشُورَاءَ : أَمِنْكُمْ أَحَدٌ أَكَلَ الْيَوْمَ ؟ فَقَالُوا : مِنَّا مَنْ صَامَ ، وَمِنَّا مَنْ لَمْ يَصُمْ ، قَالَ : فَأَتِمُّوا بَقِيَّةَ يَوْمِكُمْ ، وَابْعَثُوا إِلَى أَهْلِ الْعَرُوضِ ، فَلْيُتِمُّوا بَقِيَّةَ يَوْمِهِمْ.

2320. ...Rəvayət edilir ki, Muhəmməd ibn Sayfi ﷺ demişdir: "Allah Elçisi ﷺ Aşura günü buyurdu: "Aranızda bu gün yemək yeyən varmı?" Səhabələr dedilər: "Bizdən oruc tutan da var, tutmayan da". Allah Elçisi ﷺ buyurdu: "Gününüzün qalan hissəsini oruclu olaraq tamamlayın. Ətrafınızdakı yerlərə də xəbər göndərin ki, onlar günlərinin qalan hissəsini orucla tamamlasınlar".

٦٦ - إِذَا لَمْ يُجْمِعْ مِنَ اللَّيْلِ هَلْ يَصُومُ ذَلِكَ الْيَوْمَ مِنَ التَّطَوُّعِ

## 66-cı fəsil: Gecə niyyət etməyən gündüz nafilə oruc tuta bilərmi?

٢٣٢١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سَلَمَةُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لِرَجُلٍ أَذِّنْ يَوْمَ عَاشُورَاءَ : مَنْ كَانَ أَكَلَ فَلْيُتِمَّ بَقِيَّةَ يَوْمِهِ ، وَمَنْ لَمْ يَكُنْ أَكَلَ فَلْيَصُمْ.

2321. ...Sələmə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişiyə belə elan etməyi buyurdu: "Kim Aşura günü yemək yeməyibsə, günün qalan qismini oruc tutsun. Digər kimsələr də günün qalan qismini orucla tamamlasın".[1]

٦٧ - النِّيَّةُ فِي الصِّيَامِ وَالِاخْتِلَافُ عَلَى طَلْحَةَ بْنِ يَحْيَى بْنِ طَلْحَةَ فِي خَبَرِ عَائِشَةَ فِيهِ

## 67-ci fəsil: Oruc tutmaq üçün niyyət və Təlhə ibn Yəhyə ibn Təlhənin Aişənin xəbəri haqda ixtilafı

٢٣٢٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَاصِمُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى بْنِ طَلْحَةَ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : دَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا ، فَقَالَ : هَلْ عِنْدَكُمْ شَيْءٌ ؟ ، فَقُلْتُ : لاَ ، قَالَ : فَإِنِّي صَائِمٌ ، ثُمَّ مَرَّ بِي بَعْدَ ذَلِكَ الْيَوْمِ وَقَدْ أُهْدِيَ إِلَيَّ حَيْسٌ فَخَبَأْتُ لَهُ مِنْهُ ، وَكَانَ يُحِبُّ الْحَيْسَ ، قَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنَّهُ أُهْدِيَ لَنَا حَيْسٌ فَخَبَأْتُ لَكَ مِنْهُ ، قَالَ : أَدْنِيهِ أَمَا إِنِّي قَدْ أَصْبَحْتُ وَأَنَا صَائِمٌ فَأَكَلَ مِنْهُ ، ثُمَّ قَالَ : إِنَّمَا مَثَلُ صَوْمِ الْمُتَطَوِّعِ مَثَلُ الرَّجُلِ يُخْرِجُ مِنْ مَالِهِ الصَّدَقَةَ ، فَإِنْ شَاءَ أَمْضَاهَا ، وَإِنْ شَاءَ حَبَسَهَا.

[1] Bu, ilk dəfə Aşura günü oruc tutulanda olan hadisədir.

2322. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bir gün Allah Elçisi ﷺ yanıma gəldi və dedi: “Sizin yanınızda yeməyə bir şey varmı?” Mən dedim: “Xeyr”. O dedi: “Elə isə mən oruc tuturam!” Sonra bizə xurma halvası gətirmişdilər. Mən bu halvadan ona saxladım. Allah Elçisi ﷺ xurma halvasını xoşlayırdı. Mən ona dedim: “Ey Allahın Elçisi, bizə xurma halvası hədiyyə olunub. Onun bir hissəsini sənə saxlamışam”. O dedi: “Onu mənə gətir! Mən səhər oruc tutmaq niyyətində idim”. Sonra o halvadan yedi və dedi: “Nafilə orucların misalı öz malından sədəqə verən bir kişinin misalına bənzəyir. İstəsə, verər, istəsə, özündə saxlayar”.

٢٣٢٣ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى بْنِ طَلْحَةَ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : دَارَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَوْرَةً ، قَالَ : أَعِنْدَكِ شَيْءٌ ؟ ، قَالَتْ : لَيْسَ عِنْدِي شَيْءٌ ، قَالَ : فَأَنَا صَائِمٌ ، قَالَتْ : ثُمَّ دَارَ عَلَيَّ الثَّانِيَةَ ، وَقَدْ أُهْدِيَ لَنَا حَيْسٌ ، فَجِئْتُ بِهِ ، فَأَكَلَ فَعَجِبْتُ مِنْهُ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، دَخَلْتَ عَلَيَّ وَأَنْتَ صَائِمٌ ، ثُمَّ أَكَلْتَ حَيْسًا ، قَالَ : نَعَمْ يَا عَائِشَةُ ، إِنَّمَا مَنْزِلَةُ مَنْ صَامَ فِي غَيْرِ رَمَضَانَ ، أَوْ غَيْرِ قَضَاءِ رَمَضَانَ ، أَوْ فِي التَّطَوُّعِ بِمَنْزِلَةِ رَجُلٍ أَخْرَجَ صَدَقَةَ مَالِهِ فَجَادَ مِنْهَا بِمَا شَاءَ فَأَمْضَاهُ ، وَبَخِلَ مِنْهَا بِمَا بَقِيَ فَأَمْسَكَهُ.

2323. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bir gün Allah Elçisi ﷺ yanıma gəldi və dedi: “Sənin yanında yeməyə bir şey varmı?” Mən dedim: “Mənim yanımda heç nə yoxdur”. O dedi: “Elə isə mən oruc tuturam!” Sonra mənim yanıma yenə gəldikdə, bizə xurma halvası gətirmişdilər deyə halvanı ona gətirdim. Allah Elçisi ﷺ də xurmadan yedi. Mən təəccüb-lənərək dedim: “Ey Allahın Elçisi, sən mənim yanıma gələndə oruc idin, lakin sonra xurma halvasından yedin”. O dedi: “Bəli, ey Aişə! Ramazan orucu və ya Ramazan orucunun qəzasından başqa orucların misalı öz malından sədəqə verən kişinin misalına bənzəyir. İstəsə, səxavətli olub verər, istəsə də, paxıllıq edərək bəzi hissəsini özündə saxlayar”.

٢٣٢٤ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ الْهَيْثَمِ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرٍ الْحَنَفِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَجِيءُ ، وَيَقُولُ : هَلْ عِنْدَكُمْ غَدَاءٌ ؟ فَنَقُولُ : لاَ ، فَيَقُولُ : إِنِّي صَائِمٌ ، فَأَتَانَا يَوْمًا وَقَدْ أُهْدِيَ لَنَا حَيْسٌ ، فَقَالَ : هَلْ عِنْدَكُمْ شَيْءٌ ؟ قُلْنَا : نَعَمْ ، أُهْدِيَ لَنَا حَيْسٌ ، قَالَ : أَمَا إِنِّي قَدْ أَصْبَحْتُ أُرِيدُ الصَّوْمَ فَأَكَلَ. خَالَفَهُ قَاسِمُ بْنُ يَزِيدَ.

2324. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ yanıma gələr və deyərdi: “Sizdə yeməyə bir şey varmı?” Mən: “Xeyr” deyərdim. O: “Elə isə mən oruc tuturam!” deyərdi. Bir gün bizə hədiyyə olaraq xurma halvası gətirmişdilər. Peyğəmbər ﷺ: “Sizdə yeməyə bir şey varmı?”, - dedikdə biz:

“Bəli”, - dedik. Peyğəmbər ﷺ: “O ki qaldı mənə, mən sabahladıqda oruc tutmaq istəyirdim” dedi və xurma halvasından yedi”.

٢٣٢٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا قَاسِمٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى ، عَنْ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، عَنْ عَائِشَةَ ، أُمِّ الْمُؤْمِنِينَ قَالَتْ : أَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا ، فَقُلْنَا : أُهْدِيَ لَنَا حَيْسٌ قَدْ جَعَلْنَا لَكَ مِنْهُ نَصِيبًا ، فَقَالَ : إِنِّي صَائِمٌ فَأَفْطَرَ.

2325. ...Rəvayət edilir ki, möminlərin anası Aişə رضي الله عنها demişdir: “Bir gün Allah Elçisi ﷺ bizə gəldi və biz ona dedik: “Bizə xurma halvası hədiyyə ediblər və sənə ondan saxlamışıq”. Allah Elçisi ﷺ: “Mən oruc tutmuşam” dedi və orucunu pozdu”.

٢٣٢٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا طَلْحَةُ بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَتْنِي عَائِشَةُ بِنْتُ طَلْحَةَ ، عَنْ عَائِشَةَ ، أُمِّ الْمُؤْمِنِينَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَأْتِيهَا وَهُوَ صَائِمٌ ، فَقَالَ : أَصْبَحَ عِنْدَكُمْ شَيْءٌ تُطْعِمِينِيهِ ؟ فَنَقُولُ : لاَ ، فَيَقُولُ : إِنِّي صَائِمٌ ، ثُمَّ جَاءَهَا بَعْدَ ذَلِكَ ، فَقَالَتْ : أُهْدِيَتْ لَنَا هَدِيَّةٌ ، فَقَالَ : مَا هِيَ ؟ قَالَتْ : حَيْسٌ ، قَالَ : قَدْ أَصْبَحْتُ صَائِمًا فَأَكَلَ.

2326. ...Rəvayət edilir ki, möminlərin anası Aişə رضي الله عنها demişdir: “Bir gün Peyğəmbər ﷺ oruclu halda yanıma gəldi və dedi: “Yanınızda yeməyə bir şey varmı?” Biz: “Xeyr” dedik. Peyğəmbər ﷺ dedi: “Elə isə mən oruc tuturam”. Sonra yenidən yanımıza gəldikdə biz ona dedik: “Bizə hədiyyə yemək gətiriblər”. O dedi: “O nədir?” Biz: “Xurma halvası” dedik. O: “Səhərdən oruc idim” dedi və xurma halvasını yedi”.

٢٣٢٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا طَلْحَةُ بْنُ يَحْيَى ، عَنْ عَمَّتِهِ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، عَنْ عَائِشَةَ ، أُمِّ الْمُؤْمِنِينَ قَالَتْ : دَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ يَوْمٍ ، فَقَالَ : هَلْ عِنْدَكُمْ شَيْءٌ ؟ قُلْنَا : لاَ ، قَالَ : فَإِنِّي صَائِمٌ.

2327. ...Rəvayət edilir ki, möminlərin anası Aişə رضي الله عنها demişdir: “Bir gün Allah Elçisi ﷺ yanıma gəldi və dedi: “Yanınızda yeməyə bir şey varmı?” Biz: “Xeyr” dedik. Allah Elçisi ﷺ buyurdu: “Elə isə mən oruc tuturam”.

٢٣٢٨ - أَخْبَرَنِي أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، قَالَ : أَخْبَرَنِي أَبِي ، عَنِ الْقَاسِمِ بْنِ مَعْنٍ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى ، عَنْ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، وَمُجَاهِدٍ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَتَاهَا ، فَقَالَ : هَلْ عِنْدَكُمْ طَعَامٌ ؟ فَقُلْتُ : لاَ ، قَالَ : إِنِّي صَائِمٌ ، ثُمَّ جَاءَ يَوْمًا آخَرَ ، فَقَالَتْ عَائِشَةُ : يَا رَسُولَ اللهِ ، إِنَّا قَدْ أُهْدِيَ لَنَا حَيْسٌ ، فَدَعَا بِهِ ، فَقَالَ : أَمَا إِنِّي قَدْ أَصْبَحْتُ صَائِمًا فَأَكَلَ.

2328. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ onun yanına gəldi və dedi: "Yanınızda yeməyə bir şey varmı?" Mən: "Xeyr" dedim. Allah Elçisi ﷺ buyurdu: "Elə isə mən oruc tuturam". Sonra başqa bir gün yanımıza gəldikdə Aişə dedi: "Ey Allahın Elçisi, bizə hədiyyə olaraq xurma halvası gətiriblər". Allah Elçisi ﷺ xurma halvasının ona gətirilməsini istədi, "Mən səhərdən oruc idim" dedi və xurma halvasını yedi".

٢٣٢٩ - أَخْبَرَنِي عَمْرُو بْنُ يَحْيَى بْنِ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا الْمُعَافَى بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا الْقَاسِمُ ، عَنْ طَلْحَةَ بْنِ يَحْيَى ، عَنْ مُجَاهِدٍ ، وَأُمِّ كُلْثُومٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ عَلَى عَائِشَةَ ، فَقَالَ : هَلْ عِنْدَكُمْ طَعَامٌ نَحْوَهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَقَدْ رَوَاهُ سِمَاكُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنِي رَجُلٌ ، عَنْ عَائِشَةَ بِنْتِ طَلْحَةَ.

2329. ...Mucahid və Ummu Kulsum ﵄ rəvayət edirlər ki, Allah Elçisi ﷺ Aişənin yanına gəldi və dedi: "Yanınızda yeməyə bir şey varmı?" Sonra yuxarıdakı hədis qeyd edilmişdir.

٢٣٣٠ - أَخْبَرَنِي صَفْوَانُ بْنُ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، عَنْ سِمَاكِ بْنِ حَرْبٍ ، قَالَ : حَدَّثَنِي رَجُلٌ ، عَنْ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، عَنْ عَائِشَةَ ، أُمِّ الْمُؤْمِنِينَ قَالَتْ : جَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا ، فَقَالَ : هَلْ عِنْدَكُمْ مِنْ طَعَامٍ ؟ قُلْتُ : لاَ ، قَالَ : إِذًا أَصُومُ ، قَالَتْ : وَدَخَلَ عَلَيَّ مَرَّةً أُخْرَى ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، قَدْ أُهْدِيَ لَنَا حَيْسٌ ، فَقَالَ : إِذًا أُفْطِرُ الْيَوْمَ وَقَدْ فَرَضْتُ الصَّوْمَ.

2330. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﵂ demişdir: "Bir gün Allah Elçisi ﷺ gəldi və dedi: "Yanınızda yeməyə bir şey varmı?" Mən: "Xeyr" dedim. Allah Elçisi ﷺ buyurdu: "Elə isə mən oruc tuturam". Sonra başqa bir vaxt gəldi və mən dedim: "Ey Allahın Elçisi, bizə hədiyyə olaraq xurma halvası gətiriblər". Allah Elçisi ﷺ: "Bu gün oruc tutmaq istəyirdim, amma tutmayacam".

## ٦٨ - ذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ لِخَبَرِ حَفْصَةَ فِي ذَلِكَ

## 68-ci fəsil: Həfsanın ﵂ hədisi haqda ixtilaf

٢٣٣١ - أَخْبَرَنِي الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ شُرَحْبِيلَ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنْ يَحْيَى بْنِ أَيُّوبَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ لَمْ يُبَيِّتِ الصِّيَامَ قَبْلَ الْفَجْرِ ، فَلاَ صِيَامَ لَهُ.

2331. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Kim sübhdən qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٢ - أَخْبَرَنَا عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ جَدِّي ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَيُّوبَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنْ حَفْصَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ لَمْ يُبَيِّتِ الصِّيَامَ قَبْلَ الْفَجْرِ ، فَلاَ صِيَامَ لَهُ.

2332. ...Həfsa ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim sübhdən qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٣ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ أَشْهَبَ ، قَالَ : أَخْبَرَنِي يَحْيَى بْنُ أَيُّوبَ ، وَذَكَرَ آخَرَ ، أَنَّ عَبْدَ اللهِ بْنَ أَبِي بَكْرِ بْنِ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، حَدَّثَهُمَا عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، عَنْ حَفْصَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ لَمْ يُجْمِعِ الصِّيَامَ قَبْلَ طُلُوعِ الْفَجْرِ ، فَلاَ يَصُومُ.

2333. ...Həfsa ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim sübh açılmamışdan qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ الأَزْهَرِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنِ ابْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ لَمْ يُبَيِّتِ الصِّيَامَ مِنَ اللَّيْلِ ، فَلاَ صِيَامَ لَهُ.

2334. ...Həfsa ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim gecədən oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنْ حَفْصَةَ ، أَنَّهَا كَانَتْ تَقُولُ : مَنْ لَمْ يُجْمِعِ الصِّيَامَ مِنَ اللَّيْلِ فَلاَ يَصُومُ.

2335. ...Həfsa ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim gecədən oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٦ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي حَمْزَةُ بْنُ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَتْ حَفْصَةُ ، زَوْجُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ صِيَامَ لِمَنْ لَمْ يُجْمِعْ قَبْلَ الْفَجْرِ.

2336. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Həfsa ﵂ demişdir: "Kim sübhdən qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır".

٢٣٣٧ - أَخْبَرَنِي زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ عِيسَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حَمْزَةَ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : لاَ صِيَامَ لِمَنْ لَمْ يُجْمِعْ قَبْلَ الْفَجْرِ.

2337. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: “Kim sübhdən qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır”.

٢٣٣٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : أَنْبَأَنَا حَبَّانُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ بْنِ عُيَيْنَةَ ، وَمَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حَمْزَةَ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : لاَ صِيَامَ لِمَنْ لَمْ يُجْمِعِ الصِّيَامَ قَبْلَ الْفَجْرِ.

2338. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: “Kim sübhdən qabaq oruca niyyət etməzsə, onun orucu yoxdur”.

٢٣٣٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حَمْزَةَ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : لاَ صِيَامَ لِمَنْ لَمْ يُجْمِعِ الصِّيَامَ قَبْلَ الْفَجْرِ.

2339. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: “Kim sübhdən qabaq oruca niyyət etməzsə, onun orucu yoxdur”.

٢٣٤٠ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حَمْزَةَ بْنِ عَبْدِ اللهِ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : لاَ صِيَامَ لِمَنْ لَمْ يُجْمِعِ الصِّيَامَ قَبْلَ الْفَجْرِ أَرْسَلَهُ مَالِكُ بْنُ أَنَسٍ.

2340. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: “Kim sübhdən qabaq oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır”.

٢٣٤١ - قَالَ الْحَارِثُ بْنُ مِسْكِينٍ : ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَائِشَةَ ، وَحَفْصَةَ ، مِثْلَهُ لاَ يَصُومُ إِلاَّ مَنْ أَجْمَعَ الصِّيَامَ قَبْلَ الْفَجْرِ.

2341. ...Aişə və Həfsa ﵄ rəvayət etmişlər: “Sübhdən qabaq oruc tutmağa niyyət etməyənin orucu sayılmır”.

٢٣٤٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : إِذَا لَمْ يُجْمِعِ الرَّجُلُ الصَّوْمَ مِنَ اللَّيْلِ فَلاَ يَصُمْ.

2342. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Adam gecədən oruc tutmağa niyyət etməzsə, onun orucu sayılmır”.

٢٣٤٣ - قَالَ : الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّهُ كَانَ يَقُولُ : لاَ يَصُومُ إِلاَّ مَنْ أَجْمَعَ الصِّيَامَ قَبْلَ الْفَجْرِ.

2343. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ deyərdi: "Sübhdən qabaq oruc tutmağa niyyət etməyənin orucu sayılmır".

٦٩ - صَوْمُ نَبِيِّ اللهِ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ

## 69-cu fəsil: Allahın Peyğəmbəri Davudun ﵇ orucu

٢٣٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَمْرِو بْنِ أَوْسٍ ، أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحَبُّ الصِّيَامِ إِلَى اللهِ عَزَّ وَجَلَّ صِيَامُ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، كَانَ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا ، وَأَحَبُّ الصَّلاَةِ إِلَى اللهِ عَزَّ وَجَلَّ صَلاَةُ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، كَانَ يَنَامُ نِصْفَ اللَّيْلِ ، وَيَقُومُ ثُلُثَهُ ، وَيَنَامُ سُدُسَهُ.

2344. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-As ﵄ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allaha ﷻ ən sevimli oruc Davudun ﵇ tutduğu orucdur. O, orucu günaşırı tutardı. Həmçinin Allaha ﷻ ən sevimli namaz Davudun ﵇ qıldığı namazdır. Davud gecənin yarısını yatar, sonra qalxıb onun üçdəbirini namaz qılar, sonra da yerdə qalan altıdabirini yatardı".

٧٠ - صَوْمُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِأَبِي هُوَ وَأُمِّي ، وَذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ لِلْخَبَرِ فِي ذَلِكَ

## 70-ci fəsil: Peyğəmbərin ﷺ - atam-anam ona fəda olsun - orucu və bu haqda xəbəri rəvayət edənlərin ixtilafı

٢٣٤٥ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، عَنْ جَعْفَرٍ ، عَنْ سَعِيدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يُفْطِرُ أَيَّامَ الْبِيضِ فِي حَضَرٍ وَلاَ سَفَرٍ.

2345. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ həm daim yaşadığı yerdə, həm də səfərdə olduqda "ağ günlər"də[1] həmişə oruc tutardı".[2]

٢٣٤٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ حَتَّى نَقُولَ لاَ يُفْطِرُ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ مَا يُرِيدُ أَنْ يَصُومَ ، وَمَا صَامَ شَهْرًا مُتَتَابِعًا غَيْرَ رَمَضَانَ مُنْذُ قَدِمَ الْمَدِينَةَ.

2346. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz onun həmişə oruc tutacağını zənn edərdik. Həmçinin o qədər oruc tutmazdı ki, biz onun oruc tutmaq istəmədiyini zənn edərdik.

[1] Ağ günlər (əyyə:mul-biyd)- hicri ayının 13, 14 və 15-ci günlərinə deyilir.
[2] Hədisin isnadı zəifdir.

O, Mədinəyə gəldikdən sonra Ramazan ayından başqa heç vaxt bütün ayı oruc tutmadı”.

٢٣٤٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ النَّضْرِ بْنِ مُسَاوِرٍ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ مَرْوَانَ أَبِي لُبَابَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ حَتَّى نَقُولَ مَا يُرِيدُ أَنْ يُفْطِرَ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ مَا يُرِيدُ أَنْ يَصُومَ.

2347. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz “artıq o, həmişə oruc tutacaq” deyərdik. Həmçinin o qədər oruc tutmazdı ki, biz “artıq o, oruc tutmaq istəmir” deyərdik”.

٢٣٤٨ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لاَ أَعْلَمُ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ الْقُرْآنَ كُلَّهُ فِي لَيْلَةٍ ، وَلاَ قَامَ لَيْلَةً حَتَّى الصَّبَاحِ ، وَلاَ صَامَ شَهْرًا قَطُّ كَامِلاً غَيْرَ رَمَضَانَ.

2348. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allahın Peyğəmbərinin ﷺ bir gecədə bütün Quranı oxuduğunu, gecəni səhərə qədər namazla keçirdiyini və Ramazan ayından başqa hansısa bir ayı bütünlüklə oruc tutduğunu bilmirəm”.

٢٣٤٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ ، عَنْ صِيَامِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ كَانَ يَصُومُ حَتَّى نَقُولَ قَدْ صَامَ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ قَدْ أَفْطَرَ ، وَمَا صَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَهْرًا كَامِلاً مُنْذُ قَدِمَ الْمَدِينَةَ إِلاَّ رَمَضَانَ.

2349. ...Rəvayət edilir ki, Abdullah ibn Şəqiq ﵀ demişdir: “Mən Aişədən Peyğəmbərin ﷺ orucu haqda soruşdum. O dedi: “Peyğəmbər ﷺ o qədər oruc tutardı ki, biz “artıq o, həmişə oruc tutacaq” deyərdik. Həmçinin o qədər oruc tutmazdı ki, biz “artıq o, heç vaxt oruc tutmayacaq” deyərdik. Allah Elçisi ﷺ Mədinəyə gəldikdən sonra Ramazan ayından başqa heç bir ayı bütünlüklə oruc tutmazdı”.

٢٣٥٠ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ أَبِي قَيْسٍ ، حَدَّثَهُ أَنَّهُ سَمِعَ عَائِشَةَ ، تَقُولُ : كَانَ أَحَبَّ الشُّهُورِ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَصُومَهُ شَعْبَانُ ، بَلْ كَانَ يَصِلُهُ بِرَمَضَانَ.

2350. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ oruc tutmağı ən çox sevdiyi ay Şaban ayı idi. O, Şaban ayının çoxunu oruc tutub Ramazan ayına birləşdirərdi”.

٢٣٥١ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي مَالِكٌ ، وَعَمْرُو بْنُ الْحَارِثِ ، وَذَكَرَ آخَرَ قَبْلَهُمَا ، أَنَّ أَبَا النَّضْرِ ، حَدَّثَهُمْ عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ حَتَّى نَقُولَ مَا يُفْطِرُ ، وَيُفْطِرُ حَتَّى نَقُولَ مَا يَصُومُ ، وَمَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي شَهْرٍ أَكْثَرَ صِيَامًا مِنْهُ فِي شَعْبَانَ.

2351. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ o qədər oruc tutardı ki, biz “artıq o, həmişə oruc tutacaq” deyərdik. Həmçinin o qədər oruc tutmazdı ki, biz “artıq o, heç vaxt oruc tutmayacaq” deyərdik. Mən Allah Elçisinin ﷺ başqa hansısa ayda Şaban ayından daha çox oruc tutduğunu görmədim”.

٢٣٥٢ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : سَمِعْتُ سَالِمَ بْنَ أَبِي الْجَعْدِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ لاَ يَصُومُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ إِلاَّ شَعْبَانَ وَرَمَضَانَ.

2352. ...Ummu Sələmə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Şaban və Ramazan ayından başqa heç bir ayda ard-arda oruc tutmazdı.

٢٣٥٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ تَوْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ لَمْ يَكُنْ يَصُومُ مِنَ السَّنَةِ شَهْرًا تَامًّا إِلاَّ شَعْبَانَ ، وَيَصِلُ بِهِ رَمَضَانَ.

2353. ...Ummu Sələmə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ il boyu Şaban ayından başqa heç bir ayı tam oruc tutmazdı. Şabanın orucunu da Ramazan ayına birləşdirərdi.

٢٣٥٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ ابْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَمْ يَكُنْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِشَهْرٍ أَكْثَرَ صِيَامًا مِنْهُ لِشَعْبَانَ ، كَانَ يَصُومُهُ أَوْ عَامَّتَهُ.

2354. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ heç bir ayda Şaban ayında olan qədər oruc tutmazdı. O, Şaban ayının çoxunu və ya hamısını orucla keçirərdi”.

٢٣٥٥ - أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنِ ابْنِ إِسْحَاقَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ شَعْبَانَ إِلاَّ قَلِيلاً.

2355. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ Şaban ayının az bir qismi istisna olmaqla bütün ayı oruc tutardı”.

٢٣٥٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنَا بَحِيرٌ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، أَنَّ عَائِشَةَ ، قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَصُومُ شَعْبَانَ كُلَّهُ.

2356. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ Şaban ayını bütünlüklə oruc tutardı”.

٢٣٥٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا ثَابِتُ بْنُ قَيْسٍ أَبُو الْغُصْنِ ، شَيْخٌ مِنْ أَهْلِ الْمَدِينَةِ ، قَالَ : حَدَّثَنِي أَبُو سَعِيدٍ الْمَقْبُرِيُّ ، قَالَ : حَدَّثَنِي أُسَامَةُ بْنُ زَيْدٍ ، قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ ، لَمْ أَرَكَ تَصُومُ شَهْرًا مِنَ الشُّهُورِ مَا تَصُومُ مِنْ شَعْبَانَ ، قَالَ : ذَلِكَ شَهْرٌ يَغْفُلُ النَّاسُ عَنْهُ بَيْنَ رَجَبٍ وَرَمَضَانَ ، وَهُوَ شَهْرٌ تُرْفَعُ فِيهِ الأَعْمَالُ إِلَى رَبِّ الْعَالَمِينَ ، فَأُحِبُّ أَنْ يُرْفَعَ عَمَلِي وَأَنَا صَائِمٌ.

2357. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵄ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi! Mən sənin heç bir ayda Şaban ayında olduğu kimi çox oruc tutduğunu görməmişəm”. O dedi: “Bu ay Rəcəb və Ramazan ayları arasında olan və insanların qafil (xəbərsiz) olduqları aydır. O ayda əməllər aləmlərin Rəbbinə yüksəlir. Mən isə əməlimin oruc olduğum halda yüksəlməsini sevirəm”.

٢٣٥٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا ثَابِتُ بْنُ قَيْسٍ أَبُو الْغُصْنِ ، شَيْخٌ مِنْ أَهْلِ الْمَدِينَةِ ، قَالَ : حَدَّثَنِي أَبُو سَعِيدٍ الْمَقْبُرِيُّ ، قَالَ : حَدَّثَنِي أُسَامَةُ بْنُ زَيْدٍ ، قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّكَ تَصُومُ حَتَّى لاَ تَكَادَ تُفْطِرُ ، وَتُفْطِرُ حَتَّى لاَ تَكَادَ أَنْ تَصُومَ ، إِلاَّ يَوْمَيْنِ إِنْ دَخَلاَ فِي صِيَامِكَ وَإِلاَّ صُمْتَهُمَا ، قَالَ : أَيُّ يَوْمَيْنِ ؟ قُلْتُ : يَوْمَ الاِثْنَيْنِ وَيَوْمَ الْخَمِيسِ ، قَالَ : ذَانِكَ يَوْمَانِ تُعْرَضُ فِيهِمَا الأَعْمَالُ عَلَى رَبِّ الْعَالَمِينَ ، فَأُحِبُّ أَنْ يُعْرَضَ عَمَلِي وَأَنَا صَائِمٌ.

2358. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵄ demişdir: “Mən dedim: “Ey Allahın Elçisi! Sən bəzən heç vaxt tərk etməyəcəkmişsən kimi oruc tutursan, bəzən də heç vaxt oruc tutmayacaqmışsan kimi oruc tutmursan. Bu iki gündən başqa”. O dedi: “O hansı iki gündür?” Mən dedim: “Bazar ertəsi və cümə axşamı”. O dedi: “Bu iki gündə əməllər aləmlərin Rəbbinə ərz olunur. Mən də əməlimin oruc olduğum halda ərz olunmasını istəyirəm”.

٢٣٥٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : أَخْبَرَنِي ثَابِتُ بْنُ قَيْسٍ الْغِفَارِيُّ ، قَالَ : حَدَّثَنِي أَبُو سَعِيدٍ الْمَقْبُرِيُّ ، قَالَ : حَدَّثَنِي أَبُو هُرَيْرَةَ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَسْرُدُ الصَّوْمَ ، فَيُقَالُ : لاَ يُفْطِرُ ، وَيُفْطِرُ ، فَيُقَالُ : لاَ يَصُومُ.

2359. Usamə ibn Zeyd ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ oruclu günlərini o

qədər uzadardı ki, "o, həmişə oruc tutacaq" deyilərdi. Bəzən də o qədər orucsuz olardı ki, "o, heç vaxt oruc tutmayacaq" deyilərdi".

٢٣٦٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، عَنْ بَقِيَّةَ ، قَالَ : حَدَّثَنَا بَحِيرٌ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، أَنَّ عَائِشَةَ ، قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَتَحَرَّى صِيَامَ الِاثْنَيْنِ وَالْخَمِيسِ.

2360. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ bazar ertəsi və cümə axşamı oruc tutmağa çalışardı".

٢٣٦١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ دَاوُدَ ، قَالَ : أَخْبَرَنِي ثَوْرٌ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ رَبِيعَةَ الْجُرَشِيِّ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَحَرَّى يَوْمَ الِاثْنَيْنِ وَالْخَمِيسِ.

2361. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ bazar ertəsi və cümə axşamı oruc tutmağa çalışardı".

٢٣٦٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ الأُمَوِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ثَوْرٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَحَرَّى الِاثْنَيْنِ وَالْخَمِيسَ.

2362. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ bazar ertəsi və cümə axşamı oruc tutmağa çalışardı".

٢٣٦٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ خَالِدِ بْنِ سَعْدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَحَرَّى يَوْمَ الِاثْنَيْنِ وَالْخَمِيسِ.

2363. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ bazar ertəsi və cümə axşamı oruc tutmağa çalışardı".

٢٣٦٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ بْنِ حَبِيبِ بْنِ الشَّهِيدِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ يَمَانٍ ، عَنْ سُفْيَانَ ، عَنْ عَاصِمٍ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، عَنْ سَوَاءٍ الْخُزَاعِيِّ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ الِاثْنَيْنِ وَالْخَمِيسَ.

2364. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ bazar ertəsi və cümə axşamı oruc tutardı".

٢٣٦٥ - أَخْبَرَنِي أَبُو بَكْرِ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو نَصْرٍ التَّمَّارُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ عَاصِمٍ ، عَنْ سَوَاءٍ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ مِنْ كُلِّ شَهْرٍ ثَلاثَةَ أَيَّامٍ : الِاثْنَيْنِ وَالْخَمِيسَ مِنْ هَذِهِ الْجُمُعَةِ ، وَالِاثْنَيْنِ مِنَ الْمُقْبِلَةِ.

2365. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: "Allah Elçisi ﷺ hər ayın üç gününü oruc tutardı: bir həftə bazar ertəsini və cümə axşamını, növbəti həftə isə bazar ertəsini orucla keçirərdi".

٢٣٦٦ - أَخْبَرَنِي زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا النَّضْرُ ، قَالَ : أَنْبَأَنَا حَمَّادٌ ، عَنْ عَاصِمِ بْنِ أَبِي النَّجُودِ ، عَنْ سَوَاءٍ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ مِنْ كُلِّ شَهْرٍ يَوْمَ الْخَمِيسِ ، وَيَوْمَ الاِثْنَيْنِ ، وَمِنَ الْجُمُعَةِ الثَّانِيَةِ يَوْمَ الاِثْنَيْنِ.

2366. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: "Allah Elçisi ﷺ hər ayın ilk həftəsinin bazar ertəsini və cümə axşamını, növbəti həftənin bazar ertəsini orucla keçirərdi".

٢٣٦٧ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، عَنْ عَاصِمٍ ، عَنِ الْمُسَيَّبِ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَخَذَ مَضْجَعَهُ جَعَلَ كَفَّهُ الْيُمْنَى تَحْتَ خَدِّهِ الأَيْمَنِ ، وَكَانَ يَصُومُ الاِثْنَيْنِ وَالْخَمِيسَ.

2367. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: "Allah Elçisi ﷺ yatağına uzandıqda sağ əlinin ovucunu sağ yanağının altına qoyardı. Həmçinin bazar ertəsi və cümə axşamları oruc tutardı".

٢٣٦٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ أَبِي ، أَنْبَأَنَا أَبُو حَمْزَةَ ، عَنْ عَاصِمٍ ، عَنْ زِرٍّ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصُومُ ثَلاَثَةَ أَيَّامٍ مِنْ غُرَّةِ كُلِّ شَهْرٍ ، وَقَلَّمَا يُفْطِرُ يَوْمَ الْجُمُعَةِ.

2368. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: "Allah Elçisi ﷺ hər ayın üç gününü oruc tutardı. Bəzən cümə günü də oruc tutardı".

٢٣٦٩ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا أَبُو كَامِلٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ عَاصِمِ بْنِ بَهْدَلَةَ ، عَنْ رَجُلٍ ، عَنِ الأَسْوَدِ بْنِ هِلاَلٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : أَمَرَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِرَكْعَتَيِ الضُّحَى ، وَأَنْ لاَ أَنَامَ إِلاَّ عَلَى وِتْرٍ ، وَصِيَامِ ثَلاَثَةِ أَيَّامٍ مِنَ الشَّهْرِ.

2369. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ mənə iki rükət Duha namazını qılmağı, yatmamış Vitr namazını qılmağı və hər aydan üç gün oruc tutmağı əmr etdi".

٢٣٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُبَيْدِ اللهِ ، أَنَّهُ سَمِعَ ابْنَ عَبَّاسٍ ، وَسُئِلَ عَنْ صِيَامِ عَاشُورَاءَ ، قَالَ : مَا عَلِمْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَامَ يَوْمًا يَتَحَرَّى فَضْلَهُ عَلَى الأَيَّامِ ، إِلاَّ هَذَا الْيَوْمَ يَعْنِي شَهْرَ رَمَضَانَ ، وَيَوْمَ عَاشُورَاءَ.

2370. ...Rəvayət edilir ki, İbn Abbasa ﵄ Aşura orucu haqda sual verildikdə o dedi: “Mən Allah Elçisinin digər günlərin orucuna qarşı ﷺ Aşura gününün və Ramazan ayının orucundan daha diqqətli olduğunu bilmirəm”.

٢٣٧١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، قَالَ : سَمِعْتُ مُعَاوِيَةَ ، يَوْمَ عَاشُورَاءَ وَهُوَ عَلَى الْمِنْبَرِ ، يَقُولُ : يَا أَهْلَ الْمَدِينَةِ ، أَيْنَ عُلَمَاؤُكُمْ ؟ سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ فِي هَذَا الْيَوْمِ : إِنِّي صَائِمٌ ، فَمَنْ شَاءَ أَنْ يَصُومَ فَلْيَصُمْ.

2371. ...Rəvayət edilir ki, Humeyd ibn Abdur-Rahmən ibn Auf ﵁ demişdir: “Mən Aşura günü minbərdə Muaviyənin belə dediyini eşitdim: “Ey Mədinə əhli! Alimləriniz haradadır? Mən Allah Elçisinin ﷺ Aşura günü haqda belə dediyini eşitdim: “Mən bu gün oruc tutmuşam, kim istəsə, oruc tutsun”.

٢٣٧٢ - أَخْبَرَنِي زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا شَيْبَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنِ الْحُرِّ بْنِ صَيَّاحٍ ، عَنْ هُنَيْدَةَ بْنِ خَالِدٍ ، عَنْ امْرَأَتِهِ ، قَالَتْ : حَدَّثَتْنِي بَعْضُ نِسَاءِ النَّبِيِّ ، صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَصُومُ يَوْمَ عَاشُورَاءَ ، وَتِسْعًا مِنْ ذِي الْحِجَّةِ ، وَثَلاَثَةَ أَيَّامٍ مِنَ الشَّهْرِ أَوَّلَ اثْنَيْنِ مِنَ الشَّهْرِ وَخَمِيسَيْنِ.

2372. ...Huneydə ibn Xalid ﵁ zövcəsinin belə dediyini rəvayət etmişdir: “Peyğəmbərin ﷺ qadınlarından biri belə buyurdu: “Allah Elçisi ﷺ Aşura günü, Zil-Hiccənin doqquz gününü və hər aydan üç günü oruc tutardı. Bu üç gün həmin ayın ilk bazar ertəsi ilə iki cümə axşamı idi”.

٧١ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى عَطَاءٍ فِي الْخَبَرِ فِيهِ

### 71-ci fəsil: Ətanın hədisi haqda ixtilaf

٢٣٧٣ - أَخْبَرَنِي حَاجِبُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا الْحَارِثُ بْنُ عَطِيَّةَ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَامَ الأَبَدَ فَلاَ صَامَ.

2373. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim həmişə oruc tutarsa, oruc tutmamış kimidir”.

٢٣٧٤ - حَدَّثَنَا عِيسَى بْنُ مُسَاوِرٍ ، عَنِ الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : أَخْبَرَنِي عَطَاءٌ ، عَنْ عَبْدِ اللهِ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنِي الْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، قَالَ : حَدَّثَنَا عَطَاءٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَامَ الأَبَدَ فَلاَ صَامَ وَلاَ أَفْطَرَ.

2374. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim həmişə oruc tutarsa, nə oruc tutmuş kimi oruc tutub, nə də yemək yemiş kimi yemək yeyib”.

٢٣٧٥ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا أَبِي وَعُقْبَةُ ، عَنِ الأَوْزَاعِيِّ ، قَالَ : حَدَّثَنِي عَطَاءٌ ، قَالَ : حَدَّثَنِي مَنْ ، سَمِعَ ابْنَ عُمَرَ ، يَقُولُ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَامَ الأَبَدَ فَلاَ صَامَ.

2375. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Peyğəmbər ﷺ belə buyurdu: “Kim həmişə oruc tutarsa, oruc tutmamış kimidir”.

٢٣٧٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ عَطَاءٍ ، قَالَ : حَدَّثَنِي مَنْ ، سَمِعَ ابْنَ عُمَرَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ صَامَ الأَبَدَ فَلاَ صَامَ.

2376. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Kim həmişə oruc tutarsa, oruc tutmamış kimidir”.

٢٣٧٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَائِذٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ عَطَاءٍ ، أَنَّهُ حَدَّثَهُ ، قَالَ : حَدَّثَنِي مَنْ ، سَمِعَ عَبْدَ اللهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَامَ الأَبَدَ فَلاَ صَامَ ، وَلاَ أَفْطَرَ

2377. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-As ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim həmişə oruc tutarsa, nə oruc tutmuş, nə də yemək yemiş kimidir”.

٢٣٧٨ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجُ بْنُ مُحَمَّدٍ ، قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ : سَمِعْتُ عَطَاءً ، أَنَّ أَبَا الْعَبَّاسِ الشَّاعِرَ ، أَخْبَرَهُ أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ ، قَالَ : بَلَغَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنِّي أَصُومُ أَسْرُدُ الصَّوْمَ ، وَسَاقَ الْحَدِيثَ ، قَالَ : قَالَ عَطَاءٌ : لاَ أَدْرِي كَيْفَ ذَكَرَ صِيَامَ الأَبَدِ لاَ صَامَ مَنْ صَامَ الأَبَدَ.

2378. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-As ﷺ demişdir: “Peyğəmbərə ﷺ mənim ardıcıl oruc tutmağım xəbəri çatdı”. Sonra hədisi qeyd etdi. Ravi Əta dedi: “Onun həmişə tutulan oruc haqda nə dediyini bilmədim. Kim həmişə oruc tutarsa, oruc tutmamış kimidir”.

## ٧٢ - النَّهْيُ عَنْ صِيَامِ الدَّهْرِ ، وَذِكْرُ الاِخْتِلاَفِ عَلَى مُطَرِّفِ بْنِ عَبْدِ اللهِ فِي الْخَبَرِ فِيهِ

## 72-ci fəsil: Həmişə oruc tutmağın qadağası və Mutarrif ibn Abdullahın bu xəbər haqda ixtilafı

٢٣٧٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، عَنِ الْجُرَيْرِيِّ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ بْنِ الشِّخِّيرِ ، عَنْ أَخِيهِ مُطَرِّفٍ ، عَنْ عِمْرَانَ ، قَالَ : قِيلَ : يَا رَسُولَ اللهِ ، إِنَّ فُلاَنًا لاَ يُفْطِرُ نَهَارًا الدَّهْرَ ، قَالَ : لاَ صَامَ وَلاَ أَفْطَرَ.

2379. ...Rəvayət edilir ki, İmran رضي الله عنه demişdir: "Peyğəmbərə ﷺ belə deyildi: "Ey Allahın Elçisi, filankəs həmişə oruc tutur". Peyğəmbər ﷺ buyurdu: "O, nə oruc tutmuş, nə də yemək yemiş kimidir".

٢٣٨٠ - أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ قَتَادَةَ ، عَنْ مُطَرِّفِ بْنِ عَبْدِ اللهِ بْنِ الشِّخِّيرِ ، أَخْبَرَنِي أَبِي ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَذُكِرَ عِنْدَهُ رَجُلٌ يَصُومُ الدَّهْرَ ، قَالَ : لاَ صَامَ وَلاَ أَفْطَرَ.

2380. ...Mutarrif ibn Abdullah ibn əş-Şixxir رحمه الله rəvayət edir ki, Allah Elçisinə ﷺ il boyu oruc tutan adam haqda danışıldıqda Allah Elçisi ﷺ buyurdu: "O, nə oruc tutmuş, nə də yemək yemiş kimidir".

٢٣٨١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ مُطَرِّفَ بْنَ عَبْدِ اللهِ بْنِ الشِّخِّيرِ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ فِي صَوْمِ الدَّهْرِ : لاَ صَامَ وَلاَ أَفْطَرَ.

2381. ...Mutarrif ibn Abdullah ibn əş-Şixxir atasından رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ il boyu oruc tutan haqda belə buyurdu: "O, nə oruc tutmuş, nə də yemək yemiş kimidir".

## ٧٣ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى غَيْلاَنَ بْنِ جَرِيرٍ فِيهِ

## 73-cü fəsil: Ğaylən ibn Cəririn hədisi haqda ixtilaf

٢٣٨٢ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ مُوسَى ، قَالَ : أَنْبَأَنَا أَبُو هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا غَيْلاَنُ وَهُوَ ابْنُ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ وَهُوَ ابْنُ مَعْبَدٍ الزِّمَّانِيُّ ، عَنْ أَبِي قَتَادَةَ ، عَنْ عُمَرَ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَمَرَرْنَا بِرَجُلٍ ، فَقَالُوا : يَا نَبِيَّ اللهِ ، هَذَا لاَ يُفْطِرُ مُنْذُ كَذَا وَكَذَا ، فَقَالَ : لاَ صَامَ وَلاَ أَفْطَرَ.

2382. ...Rəvayət edilir ki, Ömər رضي الله عنه demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə idik. Bir kişinin yanından keçdikdə səhabələr dedilər: "Ey Allahın Peyğəmbəri, bu kişi filan vaxtdan bəri oruc olduğuna görə yemək yemir". Allah Elçisi ﷺ buyurdu: "O, nə oruc tutmuş, nə də yemək yemişdir".

٢٣٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ غَيْلاَنَ ، أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ مَعْبَدٍ الزِّمَّانِيَّ ، عَنْ أَبِي قَتَادَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُئِلَ عَنْ صَوْمِهِ فَغَضِبَ ، فَقَالَ عُمَرُ : رَضِينَا بِاللَّهِ رَبًّا ، وَبِالإِسْلاَمِ دِينًا ، وَبِمُحَمَّدٍ رَسُولاً ، وَسُئِلَ عَمَّنْ صَامَ الدَّهْرَ ، فَقَالَ : لاَ صَامَ وَلاَ أَفْطَرَ أَوْ مَا صَامَ وَمَا أَفْطَرَ.

2383. ...Əbu Qatədə رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ öz orucu haqda soruşulduqda qəzəbləndi. Ömər dedi: "Biz Allahdan Rəbb, İslamdan din

və Muhəmməddən də elçi olaraq razıyıq". Sonra il boyu oruc tutmaq haqda soruşulduqda Allah Elçisi ﷺ buyurdu: "O, nə oruc tutmuş, nə də yemək yemişdir".

٧٤ - سَرْدُ الصِّيَامِ

## 74-cü fəsil: Orucu davamlı tutmaq

٢٣٨٤ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ حَمْزَةَ بْنَ عَمْرٍو الأَسْلَمِيَّ ، سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، إِنِّي رَجُلٌ أَسْرُدُ الصَّوْمَ ، أَفَأَصُومُ فِي السَّفَرِ ؟ قَالَ : صُمْ إِنْ شِئْتَ ، أَوْ أَفْطِرْ إِنْ شِئْتَ.

2384. ...Həmzə ibn Amr əl-Əsləmi ﷺ rəvayət edir ki, Allah Elçisindən ﷺ soruşdular: "Ey Allahın Elçisi, mən davamlı oruc tutan adamam, səfərdə oruc tuta bilərəmmi?" Allah Elçisi ﷺ buyurdu: "İstəsən, tut, istəsən tutma!"

٧٥ - صَوْمُ ثُلُثَيِ الدَّهْرِ وَذِكْرُ اخْتِلاَفِ النَّاقِلِينَ لِلْخَبَرِ فِي ذَلِكَ

## 75-ci fəsil: İlin üçdəbirini oruc tutmaq və bu barədə gələn xəbərlər haqda ixtilaf

٢٣٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ أَبِي عَمَّارٍ ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ ، عَنْ رَجُلٍ ، مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : قِيلَ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : رَجُلٌ يَصُومُ الدَّهْرَ ، قَالَ : وَدِدْتُ أَنَّهُ لَمْ يَطْعَمِ الدَّهْرَ ، قَالُوا : فَثُلُثَيْهِ ، قَالَ : أَكْثَرَ ، قَالُوا : فَنِصْفَهُ ، قَالَ : أَكْثَرَ ، ثُمَّ قَالَ : أَلاَ أُخْبِرُكُمْ بِمَا يُذْهِبُ وَحَرَ الصَّدْرِ ؟ صَوْمُ ثَلاَثَةِ أَيَّامٍ مِنْ كُلِّ شَهْرٍ.

2385. ...Amr ibn Şurahbil ﷺ Peyğəmbərin ﷺ səhabəsi olan bir kişinin belə dediyini rəvayət etmişdir: "Peyğəmbərə ﷺ belə deyildi: "Bir kişi il boyu oruc tutur". O dedi: "O, il boyu heç nə yeməmiş kimidir". Dedilər: "Üçdəbirini tutsa, necə?" O dedi: "O da çoxdur". Dedilər: "Bəs yarısını tutsa necə?" O dedi: "O da çoxdur". Sonra buyurdu: "Mən sizə xoş gələn ən rahat orucu deyimmi? Bu, hər aydan üç gün oruc tutmaqdır".

٢٣٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ أَبِي عَمَّارٍ ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ ، قَالَ : أَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلٌ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، مَا تَقُولُ فِي رَجُلٍ صَامَ الدَّهْرَ كُلَّهُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَدِدْتُ أَنَّهُ لَمْ يَطْعَمِ الدَّهْرَ شَيْئًا ، قَالَ : فَثُلُثَيْهِ ، قَالَ : أَكْثَرَ ، قَالَ : فَنِصْفَهُ ، قَالَ : أَكْثَرَ ، قَالَ : أَفَلاَ أُخْبِرُكُمْ بِمَا يُذْهِبُ وَحَرَ الصَّدْرِ ؟ قَالُوا : بَلَى ، قَالَ : صِيَامُ ثَلاَثَةِ أَيَّامٍ مِنْ كُلِّ شَهْرٍ.

2386. ...Rəvayət edilir ki, Amr ibn Şurahbil ﷺ demişdir: “Bir kişi Allah Elçisinin ﷺ yanına gəlib dedi: “Ey Allahın Elçisi, bir kişinin bütün ili oruc tutmasına nə deyirsən?” Allah Elçisi ﷺ buyurdu: “O, il boyu heç nə yeməmiş kimidir”. O dedi: “Üçdəbirini tutsa, necə?” Peyğəmbər ﷺ buyurdu: “O da çoxdur”. O dedi: “Bəs yarısını tutsa, necə?” Peyğəmbər ﷺ buyurdu: “O da çoxdur”. Sonra buyurdu: “Mən sizə xoş gələn ən rahat orucu deyimmi?” Dedilər: “Bəli”. Peyğəmbər ﷺ buyurdu: “Bu, hər aydan üç gün oruc tutmaqdır”.

٢٣٨٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ غَيْلاَنَ بْنِ جَرِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَعْبَدٍ الزِّمَّانِيِّ ، عَنْ أَبِي قَتَادَةَ ، قَالَ قَالَ عُمَرُ : يَا رَسُولَ اللهِ ، كَيْفَ بِمَنْ يَصُومُ الدَّهْرَ كُلَّهُ ، قَالَ : لاَ صَامَ وَلاَ أَفْطَرَ أَوْ لَمْ يَصُمْ وَلَمْ يُفْطِرْ ، قَالَ : يَا رَسُولَ اللهِ ، كَيْفَ بِمَنْ يَصُومُ يَوْمَيْنِ وَيُفْطِرُ يَوْمًا ؟ قَالَ : أَوَ يُطِيقُ ذَلِكَ أَحَدٌ ؟ ، قَالَ : فَكَيْفَ بِمَنْ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا ؟ قَالَ : ذَلِكَ صَوْمُ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، قَالَ : فَكَيْفَ بِمَنْ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمَيْنِ ؟ قَالَ : وَدِدْتُ أَنِّي أُطِيقُ ذَلِكَ ، قَالَ : ثُمَّ قَالَ : ثَلاَثٌ مِنْ كُلِّ شَهْرٍ ، وَرَمَضَانُ إِلَى رَمَضَانَ ، هَذَا صِيَامُ الدَّهْرِ كُلِّهِ.

2387. ...Rəvayət edilir ki, Əbu Qatədə ﷺ demişdir: “Ömər dedi: “Ey Allahın Elçisi, bütün ili oruc tutan haqda nə deyirsən?” Allah Elçisi ﷺ dedi: “O, nə oruc tutmuş, nə də iftar etmişdir”. Ömər dedi: “İki gün oruc tutub, bir gün tutmayan haqda nə deyirsən?” O dedi: “Buna kimin gücü çatar?” Ömər dedi: “Bəs bir gün oruc tutub, bir gün tutmayan haqda nə deyirsən?” Peyğəmbər ﷺ dedi: “Bu, Davudun ﷺ orucudur”. Ömər dedi: “Bir gün oruc tutub, iki gün tutmayan haqda nə deyirsən?” O dedi: “Buna gücünün çatacağına ümid edirəm”. Sonra Peyğəmbər ﷺ buyurdu: “Hər aydan üç gün oruc tutmaq, Ramazandan Ramazana oruc tutmaq il boyu oruc tutmaq kimidir”.

٧٦ - صَوْمُ يَوْمٍ وَإِفْطَارُ يَوْمٍ وَذِكْرُ اخْتِلاَفِ أَلْفَاظِ النَّاقِلِينَ فِي ذَلِكَ لِخَبَرِ عَبْدِ اللهِ بْنِ عَمْرٍو فِيهِ

## 76-cı fəsil: Günaşırı oruc tutmaq və rəvayət edənlərin Abdullah ibn Amrın hədisi haqda ixtilafı

٢٣٨٨ - قَالَ : وَفِيمَا قَرَأَ عَلَيْنَا أَحْمَدُ بْنُ مَنِيعٍ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا حُصَيْنٌ ، وَمُغِيرَةُ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْضَلُ الصِّيَامِ صِيَامُ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، كَانَ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا.

2388. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ən fəzilətli oruc Davudun orucudur. O, günaşırı oruc tutardı”.

٢٣٨٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ مُغِيرَةَ ، عَنْ مُجَاهِدٍ ، قَالَ : قَالَ لِي عَبْدُ اللهِ بْنُ عَمْرٍو : أَنْكَحَنِي أَبِي امْرَأَةً ذَاتَ حَسَبٍ ، فَكَانَ يَأْتِيهَا فَيَسْأَلُهَا عَنْ بَعْلِهَا ، فَقَالَتْ : نِعْمَ الرَّجُلُ مِنْ رَجُلٍ لَمْ يَطَأْ لَنَا فِرَاشًا ، وَلَمْ يُفَتِّشْ لَنَا كَنَفًا مُنْذُ أَتَيْنَاهُ ، فَذَكَرَ ذَلِكَ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : ائْتِنِي بِهِ ، فَأَتَيْتُهُ مَعَهُ ، فَقَالَ : كَيْفَ تَصُومُ ؟ قُلْتُ : كُلَّ يَوْمٍ ، قَالَ : صُمْ مِنْ كُلِّ جُمُعَةٍ ثَلاَثَةَ أَيَّامٍ ، قُلْتُ : إِنِّي أُطِيقُ أَفْضَلَ مِنْ ذَلِكَ ، قَالَ : صُمْ يَوْمَيْنِ وَأَفْطِرْ يَوْمًا ، قَالَ : إِنِّي أُطِيقُ أَفْضَلَ مِنْ ذَلِكَ ، قَالَ : صُمْ أَفْضَلَ الصِّيَامِ ، صِيَامَ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، صَوْمُ يَوْمٍ وَفِطْرُ يَوْمٍ.

2389. ...Rəvayət edilir ki, Mucahid ﷺ demişdir: “Abdullah ibn Amr mənə dedi: “Atam məni bir imkanlı qadınla evləndirmişdi. Atam onun yanına gedib mənim haqqımda soruşduqda o dedi: “Çox gözəl adamdır. Evləndikdən bu yana nə yatağıma gəldi, nə də gizli yerlərimi araşdırdı”. Belə olduqda atam hadisəni Peyğəmbərə ﷺ danışdı. Peyğəmbər ﷺ buyurdu: “Onu mənim yanıma gətirin!” Atamla birlikdə Peyğəmbərin ﷺ yanına getdik. Peyğəmbər ﷺ dedi: “Orucu necə tutursan?” Mən: “Hər gün” dedim. Peyğəmbər ﷺ dedi: “Həftədə üç gün oruc tut!” Mən dedim: “Bundan daha çox tuta bilərəm”. O dedi: “İki gün tut, bir gün tutma”. Mən dedim: “Bundan daha çox tuta bilərəm”. O buyurdu: “Ən fəzilətli olan orucu – Davudun ﷺ orucunu tut! (Yəni) günaşırı tut!”

٢٣٩٠ - أَخْبَرَنَا أَبُو حَصِينٍ عَبْدُ اللهِ بْنُ أَحْمَدَ بْنِ عَبْدِ اللهِ بْنِ يُونُسَ ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، قَالَ : حَدَّثَنَا حُصَيْنٌ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : زَوَّجَنِي أَبِي امْرَأَةً فَجَاءَ يَزُورُهَا ، فَقَالَ : كَيْفَ تَرَيْنَ بَعْلَكِ ؟ فَقَالَتْ : نِعْمَ الرَّجُلُ مِنْ رَجُلٍ لاَ يَنَامُ اللَّيْلَ ، وَلاَ يُفْطِرُ النَّهَارَ فَوَقَعَ بِي ، وَقَالَ : زَوَّجْتُكَ امْرَأَةً مِنَ الْمُسْلِمِينَ فَعَضَلْتَهَا ، قَالَ : فَجَعَلْتُ لاَ أَلْتَفِتُ إِلَى قَوْلِهِ مِمَّا أَرَى عِنْدِي مِنَ الْقُوَّةِ وَالاِجْتِهَادِ ، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : لَكِنِّي أَنَا أَقُومُ وَأَنَامُ ، وَأَصُومُ وَأُفْطِرُ ، فَقُمْ وَنَمْ ، وَصُمْ وَأَفْطِرْ قَالَ : صُمْ مِنْ كُلِّ شَهْرٍ ثَلاَثَةَ أَيَّامٍ ، فَقُلْتُ : أَنَا أَقْوَى مِنْ ذَلِكَ ، قَالَ : صُمْ صَوْمَ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، صُمْ يَوْمًا وَأَفْطِرْ يَوْمًا ، قُلْتُ : أَنَا أَقْوَى مِنْ ذَلِكَ ، قَالَ : اقْرَأِ الْقُرْآنَ فِي كُلِّ شَهْرٍ ، ثُمَّ انْتَهَى إِلَى خَمْسَ عَشْرَةَ وَأَنَا أَقُولُ : أَنَا أَقْوَى مِنْ ذَلِكَ.

2390. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: “Atam məni bir qadınla evləndirmişdi. Atam onu ziyarət edərək dedi: “Ərin necədir?” O da: “Çox yaxşı kişidir, gecələr yatmayıb namaz qılır, gündüzlər isə oruc tutur”. Belə olduqda atam məni danladı və dedi: “Səni müsəlman qadınla evləndirmişəm, sən isə ondan üz çevirirsən”. Qüvvəmə arxayın olduğum üçün atamın sözlərinə qulaq asmadım, lakin hadisə Peyğəmbərə ﷺ çatdıqda dedi: “Mən həm yatıram, həm də namaz qılıram. Həm oruc tutduğum gün olur, həm də tutmadığım. Sən də qalx, namaz qıl, sonra yat. Həm oruc tut, həm də tutmadığın gün olsun. Hər ayın üç gününü oruc tut!” Mən dedim: “Bundan daha çox tuta bilərəm”. O dedi: “Onda Davudun ﷺ tutduğu kimi oruc tut – bir gün tut, bir gün tutma!” Mən

dedim: “Bundan daha çoxuna gücüm çatar”. O dedi: “Hər ay Quranı bir dəfə xətm et!” Sonra o bu məsələni on beş günə endirdi. Mən də “Daha qısa müddət ərzində xətm edə bilərəm” deyirdim”.

٢٣٩١ - أَخْبَرَنَا يَحْيَى بْنُ دُرُسْتَ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، أَنَّ أَبَا سَلَمَةَ ، حَدَّثَهُ أَنَّ عَبْدَ اللهِ ، قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حُجْرَتِي ، فَقَالَ : أَلَمْ أُخْبَرْ أَنَّكَ تَقُومُ اللَّيْلَ وَتَصُومُ النَّهَارَ ، قَالَ : بَلَى ، قَالَ : فَلاَ تَفْعَلَنَّ ، نَمْ وَقُمْ ، وَصُمْ وَأَفْطِرْ ، فَإِنَّ لِعَيْنِكَ عَلَيْكَ حَقًّا ، وَإِنَّ لِجَسَدِكَ عَلَيْكَ حَقًّا ، وَإِنَّ لِزَوْجَتِكَ عَلَيْكَ حَقًّا ، وَإِنَّ لِضَيْفِكَ عَلَيْكَ حَقًّا ، وَإِنَّ لِصَدِيقِكَ عَلَيْكَ حَقًّا ، وَإِنَّهُ عَسَى أَنْ يَطُولَ بِكَ عُمُرٌ ، وَإِنَّهُ حَسْبُكَ أَنْ تَصُومَ مِنْ كُلِّ شَهْرٍ ثَلاَثًا ، فَذَلِكَ صِيَامُ الدَّهْرِ كُلِّهِ ، وَالْحَسَنَةُ بِعَشْرِ أَمْثَالِهَا ، قُلْتُ : إِنِّي أَجِدُ قُوَّةً ، فَشَدَّدْتُ ، فَشُدِّدَ عَلَيَّ ، قَالَ : صُمْ مِنْ كُلِّ جُمُعَةٍ ثَلاَثَةَ أَيَّامٍ ، قُلْتُ : إِنِّي أُطِيقُ أَكْثَرَ مِنْ ذَلِكَ ، فَشَدَّدْتُ ، فَشُدِّدَ عَلَيَّ ، قَالَ : صُمْ صَوْمَ نَبِيِّ اللهِ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، قُلْتُ : وَمَا كَانَ صَوْمُ دَاوُدَ ، قَالَ : نِصْفُ الدَّهْرِ.

2391. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ mənim otağıma gəlib dedi: “Mənə sənin gecələr namaz qılmağın, gündüzlər isə oruc tutmağın xəbəri gəlib çatıb” Mən dedim: “Bəli”. O dedi: “Belə etmə. Gecələr həm yat, həm də namaz qıl, həm oruc tutduğun gün olsun, həm də tutmadığın. Çünki gözünün sənin üzərində haqqı var. Bədəninin sənin üzərində haqqı var. Zövcənin sənin üzərində haqqı var. Qonağının sənin üzərində haqqı var. Dostunun sənin üzərində haqqı var. Ola bilər ki, ömrün uzun olsun, hər ayın üç gününü oruc tutmaq sənə kifayət edər. Bu, ilboyu oruc tutmaq kimidir, çünki savabın əvəzi on qatdır”. Mən dedim: “Bundan daha çoxuna gücüm çatar”. O dedi: “Onda hər həftənin üç gününü oruc tut!” Mən dedim: “Bundan daha çoxuna gücüm çatar”. O dedi: “Allahın peyğəmbəri Davudun ﵇ tutduğu kimi oruc tut!” Mən dedim: “Davudun orucu necədir?” O dedi: “O, ilin yarısını oruc tutardı”.

٢٣٩٢ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، وَأَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ ، قَالَ : ذُكِرَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ يَقُولُ : لأَقُومَنَّ اللَّيْلَ وَلأَصُومَنَّ النَّهَارَ مَا عِشْتُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنْتَ الَّذِي تَقُولُ ذَلِكَ ؟ فَقُلْتُ لَهُ : قَدْ قُلْتُهُ يَا رَسُولَ اللهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَإِنَّكَ لاَ تَسْتَطِيعُ ذَلِكَ ، فَصُمْ وَأَفْطِرْ ، وَنَمْ وَقُمْ ، وَصُمْ مِنَ الشَّهْرِ ثَلاَثَةَ أَيَّامٍ ، فَإِنَّ الْحَسَنَةَ بِعَشْرِ أَمْثَالِهَا وَذَلِكَ مِثْلُ صِيَامِ الدَّهْرِ ، قُلْتُ : فَإِنِّي أُطِيقُ أَفْضَلَ مِنْ ذَلِكَ ، قَالَ : صُمْ يَوْمًا وَأَفْطِرْ يَوْمَيْنِ ، فَقُلْتُ : إِنِّي أُطِيقُ أَفْضَلَ مِنْ ذَلِكَ يَا رَسُولَ اللهِ ، قَالَ : فَصُمْ يَوْمًا وَأَفْطِرْ يَوْمًا ، وَذَلِكَ صِيَامُ دَاوُدَ ، وَهُوَ أَعْدَلُ الصِّيَامِ ، قُلْتُ : فَإِنِّي أُطِيقُ أَفْضَلَ مِنْ ذَلِكَ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ أَفْضَلَ مِنْ ذَلِكَ قَالَ عَبْدُ اللهِ بْنُ عَمْرٍو : لأَنْ أَكُونَ قَبِلْتُ الثَّلاَثَةَ الأَيَّامَ الَّتِي قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَحَبُّ إِلَيَّ مِنْ أَهْلِي وَمَالِي.

2392. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ibn əl-As ﵄ demişdir: “Mənim “Yaşadığım müddətdə gecələri namaz qılıb gündüzlər oruc tuta-

olarsa (çox namaz qılarsa), namaz qapısından çağırılar. Kim cihad əhlindən olarsa, cihad qapısından çağırılar. Kim sədəqə əhlindən olarsa, sədəqə qapısından çağırılar. Kim çox oruc tutan olarsa, Rəyyan adlı qapıdan çağırılar". Bu vaxt Əbu Bəkr əs-Siddiq dedi: "Hər qapıdan çağırılanın heç bir sıxıntı keçirməyəcəyi aydındır. Bəs bu qapıların hamısından çağırılan bir kimsə olacaqmı, ey Allahın Elçisi!?" Allah Elçisi ﷺ buyurdu: "Bəli və mən ümid edirəm ki, sən onlardan olacaqsan". Yəni Əbu Bəkr".

## ٢- بَابُ : التَّغْلِيظِ فِي حَبْسِ الزَّكَاةِ

## 2-ci fəsil: Zəkat verməmək haqda

٢٤٤٠- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، فِي حَدِيثِهِ عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنِ الْمَعْرُورِ بْنِ سُوَيْدٍ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : جِئْتُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ جَالِسٌ فِي ظِلِّ الْكَعْبَةِ ، فَلَمَّا رَآنِي مُقْبِلاً ، قَالَ : هُمُ الأَخْسَرُونَ وَرَبِّ الْكَعْبَةِ ، فَقُلْتُ : مَا لِي لَعَلِّي أُنْزِلَ فِيَّ شَيْءٌ ، قُلْتُ : مَنْ هُمْ فِدَاكَ أَبِي وَأُمِّي ، قَالَ : الأَكْثَرُونَ أَمْوَالاً ، إِلاَّ مَنْ قَالَ : هَكَذَا وَهَكَذَا وَهَكَذَا حَتَّى بَيْنَ يَدَيْهِ ، وَعَنْ يَمِينِهِ ، وَعَنْ شِمَالِهِ ، ثُمَّ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ ، لاَ يَمُوتُ رَجُلٌ فَيَدَعُ إِبِلاً أَوْ بَقَرًا لَمْ يُؤَدِّ زَكَاتَهَا ، إِلاَّ جَاءَتْ يَوْمَ الْقِيَامَةِ أَعْظَمَ مَا كَانَتْ وَأَسْمَنَهُ تَطَؤُهُ بِأَخْفَافِهَا ، وَتَنْطَحُهُ بِقُرُونِهَا ، كُلَّمَا نَفِدَتْ أُخْرَاهَا أُعِيدَتْ أُولاَهَا حَتَّى يُقْضَى بَيْنَ النَّاسِ.

2440. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "Bir dəfə Peyğəmbər ﷺ Kəbənin kölgəsində oturduğu vaxt mən onun yanına gəldim. Məni gördükdə çevrilib belə dedi: "Kəbənin Rəbbinə and olsun ki, onlar ziyana uğrayanlardır". Öz-özümə: "Görəsən, mənimlə əlaqəli bir şeymi nazil oldu?" deyərək, "Anam-atam sənə fəda olsun, onlar kimdir, ey Allahın Elçisi?" dedim. O belə buyurdu: "Var-dövləti çox olanların, mallarını xeyirli şeylərə və yaxşılıqlara, sağına və soluna paylayanlardan başqa hamısı ziyan içində olacaqlar". Sonra dedi: "Canım Əlində Olana and olsun! Dəvə və inəklərin zəkatını verməyən adam Qiyamət günü gətiriləcək və həmin heyvanlar daha sağlam olduqları halda onu tapdalayacaq və buynuzları ilə vuracaqlar. Sonra yenidən onu tadalayıb buynuzları ilə vuracaqlar. Bu, insanların haqq-hesabı qurtarana qədər belə davam edəcək".

٢٤٤١- أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا ابْنُ عُيَيْنَةَ ، عَنْ جَامِعِ بْنِ أَبِي رَاشِدٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ رَجُلٍ لَهُ مَالٌ لاَ يُؤَدِّي حَقَّ مَالِهِ إِلاَّ جُعِلَ لَهُ طَوْقًا فِي عُنُقِهِ ، شُجَاعٌ أَقْرَعُ وَهُوَ يَفِرُّ مِنْهُ وَهُوَ يَتْبَعُهُ ، ثُمَّ قَرَأَ مِصْدَاقَهُ مِنْ كِتَابِ اللهِ عَزَّ وَجَلَّ : {**وَلاَ تَحْسَبَنَّ الَّذِينَ يَبْخَلُونَ بِمَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ هُوَ خَيْرًا لَهُمْ بَلْ هُوَ شَرٌّ لَهُمْ سَيُطَوَّقُونَ مَا بَخِلُوا بِهِ يَوْمَ الْقِيَامَةِ**} الآيَةَ.

2441. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Allah Elçisi ﷺ belə

buyurdu: “Var-dövləti olub zəkatını verməyin həmin malı Qiyamət günü ilan olub boynuna dolanacaq. Adam ondan qaçmaq istəsə də ilan onu təqib edəcək”. Sonra Allah Elçisi ﷺ Allahın ﷻ Kitabından bu sözləri oxudu: **“Allahın Öz lütfündən bəxş etdiyini xərcləməyə xəsislik edən kimsələr elə güman etməsinlər ki, bu, onların xeyrinədir. Əksinə, bu, onların zərərinədir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır”.** (Ali-İmran, 180)”.

٢٤٤٢– أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي عَرُوبَةَ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ أَبِي عَمْرٍو الْغُدَانِيِّ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : أَيُّمَا رَجُلٍ كَانَتْ لَهُ إِبِلٌ لاَ يُعْطِي حَقَّهَا فِي نَجْدَتِهَا وَرِسْلِهَا ، قَالُوا : يَا رَسُولَ اللهِ ، مَا نَجْدَتُهَا وَرِسْلُهَا ؟ قَالَ : فِي عُسْرِهَا وَيُسْرِهَا ، فَإِنَّهَا تَأْتِي يَوْمَ الْقِيَامَةِ كَأَغَذِّ مَا كَانَتْ وَأَسْمَنِهِ وَآشَرِهِ ، يُبْطَحُ لَهَا بِقَاعٍ قَرْقَرٍ فَتَطَؤُهُ بِأَخْفَافِهَا ، إِذَا جَاءَتْ أُخْرَاهَا أُعِيدَتْ عَلَيْهِ أُولاَهَا فِي يَوْمٍ كَانَ مِقْدَارُهُ خَمْسِينَ أَلْفَ سَنَةٍ ،حَتَّى يُقْضَى بَيْنَ النَّاسِ فَيَرَى سَبِيلَهُ ، وَأَيُّمَا رَجُلٍ كَانَتْ لَهُ بَقَرٌ لاَ يُعْطِي حَقَّهَا فِي نَجْدَتِهَا وَرِسْلِهَا ، فَإِنَّهَا تَأْتِي يَوْمَ الْقِيَامَةِ أَغَذَّ مَا كَانَتْ وَأَسْمَنَهُ وَآشَرَهُ ، يُبْطَحُ لَهَا بِقَاعٍ قَرْقَرٍ ، فَتَنْطَحُهُ كُلُّ ذَاتِ قَرْنٍ بِقَرْنِهَا ، وَتَطَؤُهُ كُلُّ ذَاتِ ظِلْفٍ بِظِلْفِهَا ، إِذَا جَاوَزَتْهُ أُخْرَاهَا أُعِيدَتْ عَلَيْهِ أُولاَهَا فِي يَوْمٍ كَانَ مِقْدَارُهُ خَمْسِينَ أَلْفَ سَنَةٍ ، حَتَّى يُقْضَى بَيْنَ النَّاسِ فَيَرَى سَبِيلَهُ ، وَأَيُّمَا رَجُلٍ كَانَتْ لَهُ غَنَمٌ لاَ يُعْطِي حَقَّهَا فِي نَجْدَتِهَا وَرِسْلِهَا ، فَإِنَّهَا تَأْتِي يَوْمَ الْقِيَامَةِ كَأَغَذِّ مَا كَانَتْ وَأَكْثَرِهِ وَأَسْمَنِهِ وَآشَرِهِ ، ثُمَّ يُبْطَحُ لَهَا بِقَاعٍ قَرْقَرٍ فَتَطَؤُهُ كُلُّ ذَاتِ ظِلْفٍ بِظِلْفِهَا ، وَتَنْطَحُهُ كُلُّ ذَاتِ قَرْنٍ بِقَرْنِهَا ، لَيْسَ فِيهَا عَقْصَاءُ وَلاَ عَضْبَاءُ ، إِذَا جَاوَزَتْهُ أُخْرَاهَا أُعِيدَتْ عَلَيْهِ أُولاَهَا فِي يَوْمٍ كَانَ مِقْدَارُهُ خَمْسِينَ أَلْفَ سَنَةٍ ، حَتَّى يُقْضَى بَيْنَ النَّاسِ فَيَرَى سَبِيلَهُ.

2442. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Kimin dəvələri olduğu halda darlıqda və ya bolluqda ikən zəkatını verməzsə...”. Səhabələr dedilər: “Ey Allahın Elçisi, darlıq və bolluq nə deməkdir?” Allah Elçisi ﷺ buyurdu: “Asanlıq və çətinlik halları deməkdir. Qiyamət günü dəvələri daha canlı və kök halda gələcəklər və geniş bir ərazidə qoyulmuş yiyələrini yerə yıxıb tapdalayacaqlar. Dəvələrin sonuncusu gəldikdə əvvəlkilər yenidən gəlib onu yerə yıxıb tapdalayacaqlar. Bu hal müddəti əlli min olan Qiyamət günü bütün insanlar haqq-hesab olub qurtarana qədər davam edəcək. Sonra isə adam gedəcəyi yeri görəcək. Kimin inəkləri olduğu halda darlıqda və ya bolluqda ikən zəkatını verməzsə, Qiyamət günü inəkləri daha canlı və kök halda gələcəklər və geniş bir ərazidə qoyulmuş yiyələrini yerə yıxıb tapdalayacaq, buynuzları ilə vuracaqlar. İnəklərin sonuncusu gəldikdə əvvəlkilər yenidən gəlib onu yerə yıxıb tapdalayacaq və buynuzlayacaqlar. Onların buynuzlarında heç bir qırıqlıq olmayacaq. Qoyunları da eyni şəkildə sonuncusu gəldikdə əvvəlkilər yenidən gəlib onu yerə yıxıb tapdalayacaq. Bu əzab, müddəti əlli min il olan Qiyamət günündə bəndələr

arasında haqq-hesab edilənə qədər davam edəcəkdir. Sonra isə həmin adam gedəcəyi yeri görəcək".

### ٣- بَابُ : مَانِعِ الزَّكَاةِ

### 3-cü fəsil: Zəkatı verməkdən imtina edən

٢٤٤٣- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ بْنِ مَسْعُودٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : لَمَّا تُوُفِّيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاسْتُخْلِفَ أَبُو بَكْرٍ بَعْدَهُ وَكَفَرَ مَنْ كَفَرَ مِنَ الْعَرَبِ ، قَالَ عُمَرُ ، لأَبِي بَكْرٍ : كَيْفَ تُقَاتِلُ النَّاسَ ، وَقَدْ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَمَنْ قَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، عَصَمَ مِنِّي مَالَهُ وَنَفْسَهُ ، إِلاَّ بِحَقِّهِ وَحِسَابُهُ عَلَى اللهِ ، فَقَالَ أَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ : لأُقَاتِلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَةِ وَالزَّكَاةِ ، فَإِنَّ الزَّكَاةَ حَقُّ الْمَالِ ، وَاللهِ لَوْ مَنَعُونِي عِقَالاً كَانُوا يُؤَدُّونَهُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعِهِ قَالَ عُمَرُ ، رَضِيَ اللَّهُ عَنْهُ : فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ رَأَيْتُ اللَّهَ شَرَحَ صَدْرَ أَبِي بَكْرٍ لِلْقِتَالِ ، فَعَرَفْتُ أَنَّهُ الْحَقُّ.

2443. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ vəfat etdikdən sonra yerinə Əbu Bəkr xəlifə seçildi. (Onun xəlifəliyi vaxtı) bəzi ərəb qəbilələri dinlərindən dönərək kafir oldular. Ömər Əbu Bəkrə dedi: "Dindən dönən bu insanlarla necə vuruşacaqsan? Axı Allah Elçisi ﷺ "Mən insanlar "lə iləhə illəllah" deyənə qədər onlarla vuruşmaqla əmr olundum. Əgər "lə iləhə illəllah" deyərlərsə, məndən mallarını və canlarını qorumuş olarlar. Haqq-hesabları isə Allaha aiddir" deməmişdimi?" Əbu Bəkr dedi: "Mən namazla zəkatın arasını ayıranlarla vuruşacam. Zəkat malın haqqıdır. Allaha and olsun! Əgər Allah Elçisinə ﷺ zəkat olaraq verəcəkləri bir yüyən olsa belə onlarla vuruşaram". Ömər dedi: "Allaha and içirəm ki, Allahın Əbu Bəkrin qəlbini döyüş üçün rahat etdiyi gördüm və bildim ki, o haqdır".

### ٤- بَابُ : عُقُوبَةِ مَانِعِ الزَّكَاةِ

### 4-cü fəsil: Zəkat verməyənə verilən cəza

٢٤٤٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ حَكِيمٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ جَدِّي ، قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : فِي كُلِّ إِبِلٍ سَائِمَةٍ فِي كُلِّ أَرْبَعِينَ ابْنَةُ لَبُونٍ ، لاَ يُفَرَّقُ إِبِلٌ عَنْ حِسَابِهَا ، مَنْ أَعْطَاهَا مُؤْتَجِرًا فَلَهُ أَجْرُهَا ، وَمَنْ أَبَى فَإِنَّا آخِذُوهَا ، وَشَطْرَ إِبِلِهِ عَزْمَةٌ مِنْ عَزَمَاتِ رَبِّنَا ، لاَ يَحِلُّ لِآلِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْهَا شَيْءٌ.

2444. ...Rəvayət edilir ki, Bəhz ibn Həkim ﵀ demişdir: "Atam babamın belə dediyini mənə danışdı: "Mən Allah Elçisinin ﷺ belə dediyini eşitmişəm: "Qırx dəvədən üç yaşına çatmış bir dəvə zəkat verilir. Dəvələrdə

kiçik-böyüklükdə fərq yoxdur. Kim savab qazanmaq üçün verərsə, ona əvəzi verilər. Kim dəvələrin zəkatını vermək istəməzsə, ondan həm zəkatı, həm də dəvələrin yarısını Rəbbinizin haqqı olaraq alarıq. Muhəmmədin nəslindən gələnlərə zəkat almaq halal deyil".

## ٥- بَابُ : زَكَاةِ الإِبِلِ

## 5-ci fəsil: Dəvələrin zəkatı

٢٤٤٥- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ يَحْيَى (ح) وأَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، وَشُعْبَةَ ، وَمَالِكٍ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوْسُقٍ صَدَقَةٌ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ صَدَقَةٌ ، وَلاَ فِيمَا دُونَ خَمْسَةِ أَوَاقٍ صَدَقَةٌ.

2445. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş vəsəqdən[1] az olan məhsula zəkat düşmür. Dəvələr beşdən azdırsa, zəkat düşmür. Beş uqiyədən az olan gümüşə zəkat düşmür".

٢٤٤٦- أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى بْنِ عُمَارَةَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ فِيمَا دُونَ خَمْسَةِ ذَوْدٍ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوَاقٍ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوْسُقٍ صَدَقَةٌ.

2446. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Dəvələr beşdən azdırsa, onlara zəkat düşmür. Beş vəsəqdən az olan məhsula zəkat düşmür. Beş uqiyədən az olan gümüşə zəkat düşmür".

٢٤٤٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا الْمُظَفَّرُ بْنُ مُدْرِكٍ أَبُو كَامِلٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، قَالَ : أَخَذْتُ هَذَا الْكِتَابَ مِنْ ثُمَامَةَ بْنِ عَبْدِ اللهِ بْنِ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ : أَنَّ أَبَا بَكْرٍ ، كَتَبَ لَهُمْ إِنَّ هَذِهِ فَرَائِضُ الصَّدَقَةِ الَّتِي فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمُسْلِمِينَ الَّتِي أَمَرَ اللَّهُ عَزَّ وَجَلَّ بِهَا رَسُولَهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَمَنْ سُئِلَهَا مِنَ الْمُسْلِمِينَ عَلَى وَجْهِهَا فَلْيُعْطِ ، وَمَنْ سُئِلَ فَوْقَ ذَلِكَ فَلاَ يُعْطِ فِيمَا دُونَ خَمْسٍ وَعِشْرِينَ مِنَ الإِبِلِ فِي كُلِّ خَمْسِ ذَوْدٍ شَاةٌ ، فَإِذَا بَلَغَتْ خَمْسًا وَعِشْرِينَ فَفِيهَا بِنْتُ مَخَاضٍ إِلَى خَمْسٍ وَثَلاَثِينَ ، فَإِنْ لَمْ تَكُنْ بِنْتُ مَخَاضٍ فَابْنُ لَبُونٍ ذَكَرٌ ، فَإِذَا بَلَغَتْ سِتًّا وَثَلاَثِينَ فَفِيهَا بِنْتُ لَبُونٍ إِلَى خَمْسٍ وَأَرْبَعِينَ ، فَإِذَا بَلَغَتْ سِتَّةً وَأَرْبَعِينَ فَفِيهَا حِقَّةٌ طَرُوقَةُ الْفَحْلِ إِلَى سِتِّينَ ، فَإِذَا بَلَغَتْ إِحْدَى وَسِتِّينَ فَفِيهَا جَذَعَةٌ إِلَى خَمْسٍ وَسَبْعِينَ ، فَإِذَا بَلَغَتْ سِتًّا وَسَبْعِينَ فَفِيهَا بِنْتَا لَبُونٍ إِلَى تِسْعِينَ ، فَإِذَا بَلَغَتْ إِحْدَى وَتِسْعِينَ فَفِيهَا حِقَّتَانِ طَرُوقَتَا الْفَحْلِ إِلَى عِشْرِينَ وَمِائَةٍ ، فَإِذَا زَادَتْ عَلَى عِشْرِينَ وَمِائَةٍ فَفِي كُلِّ أَرْبَعِينَ بِنْتُ لَبُونٍ وَفِي كُلِّ خَمْسِينَ حِقَّةٌ ، فَإِذَا تَبَايَنَ أَسْنَانُ الإِبِلِ فِي فَرَائِضِ الصَّدَقَاتِ ، فَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْجَذَعَةِ وَلَيْسَتْ عِنْدَهُ جَذَعَةٌ وَعِنْدَهُ حِقَّةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ الْحِقَّةُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ حِقَّةٌ وَعِنْدَهُ جَذَعَةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيُعْطِيهِ الْمُصَّدِّقُ عِشْرِينَ دِرْهَمًا

---

[1] Vəsəq – 60 saa və ya 653 kiloqrama bərabərdir.

أَوْ شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ وَعِنْدَهُ بِنْتُ لَبُونٍ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ ابْنَةِ لَبُونٍ وَلَيْسَتْ عِنْدَهُ إِلاَّ حِقَّةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيُعْطِيهِ الْمُصَدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ ابْنَةِ لَبُونٍ وَلَيْستْ عِنْدَهُ بِنْتُ لَبُونٍ وَعِنْدَهُ بِنْتُ مَخَاضٍ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ ابْنَةِ مَخَاضٍ وَلَيْسَ عِنْدَهُ إِلاَّ ابْنُ لَبُونٍ ذَكَرٌ ، فَإِنَّهُ يُقْبَلُ مِنْهُ وَلَيْسَ مَعَهُ شَيْءٌ ، وَمَنْ لَمْ يَكُنْ عِنْدَهُ إِلاَّ أَرْبَعٌ مِنَ الإِبِلِ فَلَيْسَ فِيهَا شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا ، وَفِي صَدَقَةِ الْغَنَمِ فِي سَائِمَتِهَا إِذَا كَانَتْ أَرْبَعِينَ فَفِيهَا شَاةٌ إِلَى عِشْرِينَ وَمِائَةٍ ، فَإِذَا زَادَتْ وَاحِدَةً فَفِيهَا شَاتَانِ إِلَى مِائَتَيْنِ ، فَإِذَا زَادَتْ وَاحِدَةً فَفِيهَا ثَلاَثُ شِيَاهٍ إِلَى ثَلاَثِ مِئَةٍ ، فَإِذَا زَادَتْ فَفِي كُلِّ مِئَةٍ شَاةٌ ، وَلاَ يُؤْخَذُ فِي الصَّدَقَةِ هَرِمَةٌ وَلاَ ذَاتُ عَوَارٍ وَلاَ تَيْسُ الْغَنَمِ إِلاَّ أَنْ يَشَاءَ الْمُصَّدِّقُ ، وَلاَ يُجْمَعُ بَيْنَ مُتَفَرِّقٍ ، وَلاَ يُفَرَّقُ بَيْنَ مُجْتَمِعٍ خَشْيَةَ الصَّدَقَةِ ، وَمَا كَانَ مِنْ خَلِيطَيْنِ فَإِنَّهُمَا يَتَرَاجَعَانِ بَيْنَهُمَا بِالسَّوِيَّةِ ، فَإِذَا كَانَتْ سَائِمَةُ الرَّجُلِ نَاقِصَةً مِنْ أَرْبَعِينَ شَاةً وَاحِدَةٌ فَلَيْسَ فِيهَا شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا ، وَفِي الرِّقَةِ رُبْعُ الْعُشْرِ ، فَإِنْ لَمْ تَكُنْ إِلاَّ تِسْعِينَ وَمِائَةَ دِرْهَمٍ فَلَيْسَ فِيهَا شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا.

2447. ...Ənəs ibn Malik رضي الله عنه rəvayət edir ki, Əbu Bəkr (Bəhreynlilərə) zəkat haqda bunları yazdı: “Bu, Allahın və Onun Elçisinin ﷺ müsəlmanlara vacib buyurduğu, habelə Allahın ﷻ Öz elçisinə ﷺ vacib buyurduğu zəkatdır; hansı müsəlmandan burada göstərilən miqdarda zəkat tələb olunarsa, onu versin, bundan artığı tələb olunsa, verməsin. İyirmi beş dəvəyə qədər hər beş dəvəyə bir qoyun verilir. İyirmi beş dəvədən otuz beş dəvəyə qədər bir yaşını keçmiş bir dişi dəvə verilir. Əgər bir yaşını keçmiş dəvə yoxdursa, üç yaşına keçmiş bir erkək dəvə verilir. Dəvələrin sayı otuz altıdan qırx beş dəvəyə qədər olarsa, üç yaşına keçmiş bir dişi dəvə verilir. Dəvələrin sayı qırx altıdan altmış dəvəyə qədər olarsa, hamilə olan dörd yaşa keçmiş bir dəvə verilir. Altmış birdən yetmiş beşə qədər olarsa, beş yaşına çatmış bir dəvə, yetmiş altıdan doxsana qədər olarsa, üç yaşşına keçmiş iki dişi dəvə verilir. Dəvələrin sayı doxsan birdən yüz iyirmiyə qədər olduqda dörd yaşına keçmiş hamilə olan iki dəvə zəkat verilir. Yüz iyirmidən sonra hər qırx dəvəyə görə iki yaşlı bir dişi dəvə, hər əlli dəvəyə isə dörd yaşına keçmiş bir dəvə zəkat verilir. Zəkat olaraq veriləcək dəvələrin yaşları məsələsində çətinlik olarsa, məsələn, beş yaşlı bir dəvəni zəkat verməsi gərəkən bir adamın bu yaşda bir dəvəsi olmaz və dörd yaşlı bir dəvəsi varsa, onu və üstəlik iki qoyunu zəkat verir. Qoyun tapa bilməsə, pul şəklində iyirmi dirhəm də verə bilər. Dörd yaşı olmuş bir dəvə verməsi gərəkən adamda bu yaşda dəvə olmazsa, beş yaşlı bir dəvə taparsa, zəkat məmuru bunu həmin adamdan götürüb əvəzində ya iki qoyun, ya da iyirmi dirhəm verir. Dəvələri dörd yaşına çatmış bir dəvəni zəkat verəcək olan adam dörd yaşına çatmış dəvə tapmasa, üç yaşına çatmış bir dəvə taparsa, zəkat məmuru bunu götürür, hansı asandırsa, dəvənin yiyəsindən ya iki qoyun, ya da pul şəklində iyirmi dirhəm alır.

Dəvələrinin sayı üç yaşa keçmiş dəvəni zəkat verəcək miqdara çatan və belə bir dəvəsi olmayanın, dörd yaşına keçmiş bir dəvəsi olarsa, zəkat məmuru bu dəvəni götürür, ona ya iki qoyun, ya da iyirmi dirhəm geri qaytarır. Dəvələrinin sayı iki yaşlı dəvənin zəkat verilməsi miqdarına çatıbsa, lakin belə bir dəvə tapa bilmir və bir yaşı olmuş dəvəsi varsa, zəkat məmuru tərəfindən bu dəvə götürülür və mal yiyəsi üçün hansı daha rahatdırsa, ya iyirmi dirhəm, ya da iki qoyun verir. Dəvələrinin sayı bir yaşlı bir dəvənin zəkat verilməsi miqdarına çatıbsa, lakin belə bir dəvə tapa bilmir və üç yaşı olmuş erkək dəvəsi varsa, zəkat məmuru tərəfindən bu dəvə götürülür, başqa heç nə almır. Dəvələrin sayı dörd ədəd olana zəkat düşmür, amma yiyəsi Rəbbinin istədiyi qədər bir şey verərəsə, istisnadır. Otlayan qoyunların sayı qırx ədəd olarsa, bir qoyunun zəkat verilməsi lazımdır. Yüz iyirmi ədəd qoyuna qədər bir qoyun zəkat verilir. Yüz iyirmidən iki yüzə qədər qoyuna görə iki qoyun zəkat verilir. İki yüz bir ədəd qoyundan üç yüz qoyuna qədər üç qoyun zəkat verilir. Üç yüzdən sonra hər yüz qoyuna görə bir qoyun zəkat verilir. Dişləri tökülən, yaşlı və qüsurlu qoyunlar zəkat alınmır. Yiyəsi əlavə olaraq versə, zərəri yoxdur. Zəkat almaq üçün ayrı-ayrı adamların malları birləşdirilmədiyi kimi, zəkat verməmək üçün bir adamın malı onun ailəsi və yaxınları arasında paylaşdırıla bilməz. Şərik olan mallarda zəkatı şərikliyin miqdarına görə bərabər şəkildə bölünür. Otlaqda otarılan qoyunların sayı qırxdan azdırsa, onlara zəkat düşmür, amma yiyəsi əlavə olaraq verərsə, zərər deyil. Gümüşün zəkatı qırxdabirdir. Kimin yüz doxsan dirhəm gümüşü olarsa, buna zəkat düşmür, amma yiyəsi əlavə olaraq istəsə verə bilər".

### ٦- بَابُ : مَانِعِ زَكَاةِ الإِبِلِ

### 6-cı fəsil: Dəvələrin zəkatını verməkdən imtina edən

٢٤٤٨- أَخْبَرَنَا عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : حَدَّثَنِي أَبُو الزِّنَادِ ، مِمَّا حَدَّثَهُ عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، مِمَّا ذَكَرَ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يُحَدِّثُ بِهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَأْتِي الإِبِلُ عَلَى رَبِّهَا عَلَى خَيْرِ مَا كَانَتْ إِذَا هِيَ لَمْ يُعْطِ فِيهَا حَقَّهَا تَطَؤُهُ بِأَخْفَافِهَا ، وَتَأْتِي الْغَنَمُ عَلَى رَبِّهَا عَلَى خَيْرِ مَا كَانَتْ إِذَا لَمْ يُعْطِ فِيهَا حَقَّهَا تَطَؤُهُ بِأَظْلاَفِهَا وَتَنْطَحُهُ بِقُرُونِهَا ، قَالَ : وَمِنْ حَقِّهَا أَنْ تُحْلَبَ عَلَى الْمَاءِ ، أَلاَ لاَ يَأْتِيَنَّ أَحَدُكُمْ يَوْمَ الْقِيَامَةِ بِبَعِيرٍ يَحْمِلُهُ عَلَى رَقَبَتِهِ لَهُ رُغَاءٌ ، فَيَقُولُ : يَا مُحَمَّدُ ، فَأَقُولُ : لاَ أَمْلِكُ لَكَ شَيْئًا قَدْ بَلَّغْتُ ، أَلاَ لاَ يَأْتِيَنَّ أَحَدُكُمْ يَوْمَ الْقِيَامَةِ بِشَاةٍ يَحْمِلُهَا عَلَى رَقَبَتِهِ لَهَا يُعَارٌ ، فَيَقُولُ : يَا مُحَمَّدُ ، فَأَقُولُ لاَ أَمْلِكُ لَكَ شَيْئًا قَدْ بَلَّغْتُ . قَالَ : وَيَكُونُ كَنْزُ أَحَدِهِمْ يَوْمَ الْقِيَامَةِ شُجَاعًا أَقْرَعَ يَفِرُّ مِنْهُ صَاحِبُهُ وَيَطْلُبُهُ أَنَا كَنْزُكَ ، فَلاَ يَزَالُ حَتَّى يُلْقِمَهُ أُصْبُعَهُ.

2448. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Qiyamət günü zəkatı verilməyən dəvələr dünyadakından daha güclü və daha yaxşı halda yiyəsinin yanına gələcək və onu tapdalayacaqlar. Zəkatı verilməyən qoyunlar da əvvəlkindən daha güclü və daha yaxşı vəziyyətdə gətirilib dırnaqları ilə yiyəsini tapdalayacaq və buynuzları ilə vuracaqlar. Heyvanların su içirdildikləri yerlərdə süd sağılması da onların haqlarındandır. Sizdən biri Qiyamət günü dəvəsinə yüklənərək və dəvə kimi böyürərək: “Ey Muhəmməd!” deyərək gəlməsin. Mən ona deyəcəyəm: “Mən sənə bir köməklik edə bilmərəm, çünki sənə bunu çatdırmışdım”. Sizdən biri Qiyamət günü qoyununu çiyninə alıb qoyun kimi mələyərək: “Ey Muhəmməd!” deyərək gəlməsin. Mən ona deyəcəyəm: “Mən sənə bir köməklik edə bilmərəm, çünki sənə bunu çatdırmışdım”. Qiyamət günü sizdən birinin zəkatı verilməmiş xəzinəsi varsa, həmin mallar başının tükü tökülmüş ilan şəklində yiyəsinin barmağından tutub “mən sənin malların və xəzinənəm” deyəcək”.

٧ – بَابُ : سُقُوطِ الزَّكَاةِ عَنِ الإِبِلِ إِذَا كَانَتْ رُسُلاً لأَهْلِهَا وَلِحُمُولَتِهِمْ

## 7-ci fəsil: Yiyəsi üçün yükdaşımada istifadə edilən dəvəyə zəkatın düşməməsi

٢٤٤٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، قَالَ : سَمِعْتُ بَهْزَ بْنَ حَكِيمٍ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : فِي كُلِّ إِبِلٍ سَائِمَةٍ مِنْ كُلِّ أَرْبَعِينَ ابْنَةُ لَبُونٍ ، لاَ تُفَرَّقُ إِبِلٌ عَنْ حِسَابِهَا ، مَنْ أَعْطَاهَا مُؤْتَجِرًا لَهُ أَجْرُهَا ، وَمَنْ مَنَعَهَا فَإِنَّا آخِذُوهَا ، وَشَطْرَ إِبِلِهِ عَزْمَةً مِنْ عَزَمَاتِ رَبِّنَا ، لاَ يَحِلُّ لِآلِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْهَا شَيْءٌ.

2449. ...Bəhz ibn Həkim atasının və babasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Otarılan dəvələrdən hər qırxına görə üç yaşlı dişi bir dəvə zəkat olaraq verilir. Dəvələr sayılarkən cavan, yaşlı, iri, balaca fərq etmədən hesaba alınır. Kim savab qazanmaq üçün zəkat verərsə, ona savabı verilər. Zəkat verməyi istəməyəndən cəza olaraq dəvələrin yarısı alınar. Bu, Rəbbiniz tərəfindən təyin edilmiş bir haqdır. Muhəmmədin ﷺ ailəsinə isə zəkatdan bir şey götürmək halal deyil”.

٨– بَابُ : زَكَاةِ الْبَقَرِ

## 8-ci fəsil: İnəklərin zəkatı

٢٤٥٠– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلٌ وَهُوَ ابْنُ مُهَلْهَلٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ شَقِيقٍ ،

عَنْ مَسْرُوقٍ ، عَنْ مُعَاذٍ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعَثَهُ إِلَى الْيَمَنِ وَأَمَرَهُ أَنْ يَأْخُذَ مِنْ كُلِّ حَالِمٍ دِينَارًا أَوْ عِدْلَهُ مَعَافِرَ ، وَمِنَ الْبَقَرِ مِنْ ثَلاَثِينَ تَبِيعًا أَوْ تَبِيعَةً ، وَمِنْ كُلِّ أَرْبَعِينَ مُسِنَّةً.

2450. ...Rəvayət edilir ki, Allah Elçisi ﷺ Muazı Yəmənə göndərdikdə ağlı başında olan (qeyri-müsəlman) hər kəsdən bir dinar və ya əvəzində bir Yəmən libasını cizyə olaraq almağı, inəklərin sayı otuza çatdıqda iki yaşlı erkək və ya dişi inəyi, sayı qırxa çatdıqda iki yaşı tamam olan bir inəyi zəkat olaraq almağı əmr etdi".

٢٤٥١– أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَعْلَى وَهُوَ ابْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ شَقِيقٍ ، عَنْ مَسْرُوقٍ ، وَالأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، قَالاَ : قَالَ مُعَاذٌ : بَعَثَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الْيَمَنِ فَأَمَرَنِي أَنْ آخُذَ مِنْ كُلِّ أَرْبَعِينَ بَقَرَةً ثَنِيَّةً ، وَمِنْ كُلِّ ثَلاَثِينَ تَبِيعًا ، وَمِنْ كُلِّ حَالِمٍ دِينَارًا أَوْ عِدْلَهُ مَعَافِرَ.

2451. ...Rəvayət edilir ki, Muaz ﷺ demişdir: "Allah Elçisi ﷺ məni Yəmənə göndərdikdə qırx inəyi olandan iki yaşı tamam olan bir inək, otuz inəyi olandan iki yaşlı erkək inəyi və bir buzovu zəkat olaraq almağımı əmr etdi. Həmçinin müsəlman olmayan və ağlı başında olan hər adamdan cizyə olaraq bir dinar və ya əvəz olaraq Yəmən libası almağımı da əmr etdi".

٢٤٥٢– أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ مَسْرُوقٍ ، عَنْ مُعَاذٍ ، قَالَ : لَمَّا بَعَثَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الْيَمَنِ أَمَرَهُ أَنْ يَأْخُذَ مِنْ كُلِّ ثَلاَثِينَ مِنَ الْبَقَرِ تَبِيعًا أَوْ تَبِيعَةً ، وَمِنْ كُلِّ أَرْبَعِينَ مُسِنَّةً ، وَمِنْ كُلِّ حَالِمٍ دِينَارًا أَوْ عِدْلَهُ مَعَافِرَ.

2452. ...Rəvayət edilir ki, Muaz ﷺ demişdir: "Allah Elçisi ﷺ məni Yəmənə göndərdikdə otuz inəyi olandan iki yaşı tamam olan erkək və ya dişi bir inəyi, qırx inəyi olandan bir yaşı tamam olan bir inəyi zəkat olaraq almağımı əmr etdi. Həmçinin müsəlman olmayan və ağlı başında olan hər adamdan cizyə olaraq bir dinar və ya əvəz olaraq Yəmən libası almağımı da əmr etdi".

٢٤٥٣– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الطُّوسِيُّ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ ابْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي سُلَيْمَانُ الأَعْمَشُ ، عَنْ أَبِي وَائِلِ بْنِ سَلَمَةَ ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ ، قَالَ : أَمَرَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ بَعَثَنِي إِلَى الْيَمَنِ أَنْ لاَ آخُذَ مِنَ الْبَقَرِ شَيْئًا حَتَّى تَبْلُغَ ثَلاَثِينَ ، فَإِذَا بَلَغَتْ ثَلاَثِينَ فَفِيهَا عِجْلٌ تَابِعٌ جَذَعٌ أَوْ جَذَعَةٌ حَتَّى تَبْلُغَ أَرْبَعِينَ ، فَإِذَا بَلَغَتْ أَرْبَعِينَ فَفِيهَا بَقَرَةٌ مُسِنَّةٌ.

2453. ...Rəvayət edilir ki, Muaz ibn Cəbəl ﷺ demişdir: "Allah Elçisi ﷺ məni

Yəmənə göndərdikdə sayı otuzdan az inəyi olandan heç nə almamağımı, sayı otuz olduqda isə bir yaşı tamam olan erkək və ya dişi bir inəyi, sayı qırxa çatdıqda isə iki yaşı tamam olan bir inəyi zəkat olaraq almağımı əmr etdi".

## ٩– بَابُ : مَانِعِ زَكَاةِ الْبَقَرِ

## 9-cu fəsil: İnəklərin zəkatını verməkdən imtina edən

٢٤٥٤– أَخْبَرَنَا وَاصِلُ بْنُ عَبْدِ الأَعْلَى ، عَنِ ابْنِ فُضَيْلٍ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ صَاحِبِ إِبِلٍ وَلاَ بَقَرٍ وَلاَ غَنَمٍ لاَ يُؤَدِّي حَقَّهَا ، إِلاَّ وُقِفَ لَهَا يَوْمَ الْقِيَامَةِ بِقَاعٍ قَرْقَرٍ تَطَؤُهُ ذَاتُ الأَظْلاَفِ بِأَظْلاَفِهَا ، وَتَنْطَحُهُ ذَاتُ الْقُرُونِ بِقُرُونِهَا ، لَيْسَ فِيهَا يَوْمَئِذٍ جَمَّاءُ وَلاَ مَكْسُورَةُ الْقَرْنِ . قُلْنَا : يَا رَسُولَ اللهِ ، وَمَاذَا حَقُّهَا ؟ قَالَ : إِطْرَاقُ فَحْلِهَا ، وَإِعَارَةُ دَلْوِهَا ، وَحَمْلٌ عَلَيْهَا فِي سَبِيلِ اللهِ ، وَلاَ صَاحِبِ مَالٍ لاَ يُؤَدِّي حَقَّهُ ، إِلاَّ يُخَيَّلُ لَهُ يَوْمَ الْقِيَامَةِ شُجَاعٌ أَقْرَعُ يَفِرُّ مِنْهُ صَاحِبُهُ وَهُوَ يَتَّبِعُهُ يَقُولُ لَهُ : هَذَا كَنْزُكَ الَّذِي كُنْتَ تَبْخَلُ بِهِ ، فَإِذَا رَأَى أَنَّهُ لاَ بُدَّ لَهُ مِنْهُ أَدْخَلَ يَدَهُ فِي فِيهِ ، فَجَعَلَ يَقْضَمُهَا كَمَا يَقْضَمُ الْفَحْلُ.

2454. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Dəvənin, inəyin və qoyunun zəkatını verməyən elə bir adam yoxdur ki, zəkatını vermədiyi həmin heyvanlar Qiyamət günü bir meydanda yiyəsini dırnaqları və buynuzları ilə vurmasınlar. O gün buynuzsuz və ya buynuzu qırıq heyvan olmayacaq". Biz dedik: "Ey Allahın Elçisi, o heyvanların haqqı nədir?" Allah Elçisi ﷺ buyurdu: "Heyvanların erkəklərini başqalarına tumluq olaraq vermək, həmçinin Allah xatirinə yük daşımaq üçün o heyvanları kirayə verməkdir. Bu heyvanlardan başqa digər mallarının zəkatını verməyən elə bir adam yoxdur ki, zəkatını vermədiyi həmin mal-dövlət Qiyamət günü başının tükləri tökülmüş bir ilan şəklində gəlməsin. Yiyəsi ondan qaçacaq, o isə yiyəsinin ardı ilə düşüb belə deyəcək: "Bu, sənin xəsislik etdiyin sərvətindir". Yiyəsi görəcək ki, ondan xilas olmaq mümkün deyil və əlini o ilanın ağzına qoyacaq. İlan da güclü bir heyvan kimi dişləri ilə əlini çeynəyib əzməyə başlayacaq".

## ١٠– بَابُ : زَكَاةِ الْغَنَمِ

## 10-cu fəsil: Qoyunların zəkatı

٢٤٥٥– أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ النَّسَائِيُّ ، قَالَ : أَنْبَأَنَا سُرَيْجُ بْنُ النُّعْمَانِ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ ثُمَامَةَ بْنِ عَبْدِ اللهِ بْنِ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ : أَنَّ أَبَا بَكْرٍ ، رَضِيَ اللَّهُ عَنْهُ كَتَبَ لَهُ أَنَّ هَذِهِ فَرَائِضُ الصَّدَقَةِ الَّتِي فَرَضَ رَسُولُ

اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمُسْلِمِينَ الَّتِي أَمَرَ اللَّهُ بِهَا رَسُولَهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَمَنْ سُئِلَهَا مِنَ الْمُسْلِمِينَ عَلَى وَجْهِهَا فَلْيُعْطِهَا ، وَمَنْ سُئِلَ فَوْقَهَا فَلاَ يُعْطِهِ فِيمَا دُونَ خَمْسٍ وَعِشْرِينَ مِنَ الإِبِلِ فِي خَمْسٍ ذَوْدٍ شَاةٌ ، فَإِذَا بَلَغَتْ خَمْسًا وَعِشْرِينَ فَفِيهَا بِنْتُ مَخَاضٍ إِلَى خَمْسٍ وَثَلاَثِينَ ، فَإِنْ لَمْ تَكُنِ ابْنَةُ مَخَاضٍ فَابْنُ لَبُونٍ ذَكَرٌ ، فَإِذَا بَلَغَتْ سِتَّةً وَثَلاَثِينَ فَفِيهَا بِنْتُ لَبُونٍ إِلَى خَمْسٍ وَأَرْبَعِينَ ، فَإِذَا بَلَغَتْ سِتَّةً وَأَرْبَعِينَ فَفِيهَا حِقَّةٌ طَرُوقَةُ الْفَحْلِ إِلَى سِتِّينَ ، فَإِذَا بَلَغَتْ إِحْدَى وَسِتِّينَ فَفِيهَا جَذَعَةٌ إِلَى خَمْسَةٍ وَسَبْعِينَ ، فَإِذَا بَلَغَتْ سِتَّةً وَسَبْعِينَ فَفِيهَا ابْنَتَا لَبُونٍ إِلَى تِسْعِينَ ، فَإِذَا بَلَغَتْ إِحْدَى وَتِسْعِينَ فَفِيهَا حِقَّتَانِ طَرُوقَتَا الْفَحْلِ إِلَى عِشْرِينَ وَمِائَةٍ ، فَإِذَا زَادَتْ عَلَى عِشْرِينَ وَمِائَةٍ فَفِي كُلِّ أَرْبَعِينَ ابْنَةُ لَبُونٍ وَفِي كُلِّ خَمْسِينَ حِقَّةٌ ، فَإِذَا تَبَايَنَ أَسْنَانُ الإِبِلِ فِي فَرَائِضِ الصَّدَقَاتِ فَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْجَذَعَةِ وَلَيْسَتْ عِنْدَهُ جَذَعَةٌ وَعِنْدَهُ حِقَّةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ الْحِقَّةُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ إِلاَّ جَذَعَةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيُعْطِيهِ الْمُصَّدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ الْحِقَّةِ وَلَيْسَتْ عِنْدَهُ وَعِنْدَهُ ابْنَةُ لَبُونٍ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ بِنْتِ لَبُونٍ وَلَيْسَتْ عِنْدَهُ إِلاَّ حِقَّةٌ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيُعْطِيهِ الْمُصَّدِّقُ عِشْرِينَ دِرْهَمًا أَوْ شَاتَيْنِ ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ بِنْتِ لَبُونٍ وَلَيْسَتْ عِنْدَهُ بِنْتُ لَبُونٍ وَعِنْدَهُ بِنْتُ مَخَاضٍ ، فَإِنَّهَا تُقْبَلُ مِنْهُ وَيَجْعَلُ مَعَهَا شَاتَيْنِ إِنْ اسْتَيْسَرَتَا لَهُ أَوْ عِشْرِينَ دِرْهَمًا ، وَمَنْ بَلَغَتْ عِنْدَهُ صَدَقَةُ ابْنَةِ مَخَاضٍ وَلَيْسَتْ عِنْدَهُ إِلاَّ ابْنُ لَبُونٍ ذَكَرٌ فَإِنَّهُ يُقْبَلُ مِنْهُ وَلَيْسَ مَعَهُ شَيْءٌ ، وَمَنْ لَمْ يَكُنْ عِنْدَهُ إِلاَّ أَرْبَعَةٌ مِنَ الإِبِلِ فَلَيْسَ فِيهَا شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا ، وَفِي صَدَقَةِ الْغَنَمِ فِي سَائِمَتِهَا إِذَا كَانَتْ أَرْبَعِينَ فَفِيهَا شَاةٌ إِلَى عِشْرِينَ وَمِائَةٍ ، فَإِذَا زَادَتْ وَاحِدَةً فَفِيهَا شَاتَانِ إِلَى مِائَتَيْنِ ، فَإِذَا زَادَتْ وَاحِدَةً فَفِيهَا ثَلاَثُ شِيَاهٍ إِلَى ثَلاَثِ مِئَةٍ ، فَإِذَا زَادَتْ وَاحِدَةً فَفِي كُلِّ مِئَةٍ شَاةٌ ، وَلاَ تُؤْخَذُ فِي الصَّدَقَةِ هَرِمَةٌ وَلاَ ذَاتُ عَوَارٍ وَلاَ تَيْسُ الْغَنَمِ إِلاَّ أَنْ يَشَاءَ الْمُصَّدِّقُ ، وَلاَ يُجْمَعُ بَيْنَ مُتَفَرِّقٍ ، وَلاَ يُفَرَّقُ بَيْنَ مُجْتَمِعٍ خَشْيَةَ الصَّدَقَةِ ، وَمَا كَانَ مِنْ خَلِيطَيْنِ فَإِنَّهُمَا يَتَرَاجَعَانِ بَيْنَهُمَا بِالسَّوِيَّةِ ، وَإِذَا كَانَتْ سَائِمَةُ الرَّجُلِ نَاقِصَةً مِنْ أَرْبَعِينَ شَاةً وَاحِدَةً فَلَيْسَ فِيهَا شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا ، وَفِي الرِّقَةِ رُبْعُ الْعُشْرِ ، فَإِنْ لَمْ يَكُنِ الْمَالُ إِلاَّ تِسْعِينَ وَمِائَةً فَلَيْسَ فِيهِ شَيْءٌ إِلاَّ أَنْ يَشَاءَ رَبُّهَا.

2455. ...Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Əbu Bəkr ona zəkat mövzusunda Allahın və Onun Elçisinin ﷺ fərz (vacib) etdiyi miqdarları belə yazmışdır: Müsəlmanlardan buna uyğun zəkat istənilərsə, versin. Bundan çoxu istənilərsə verməsin. İyirmi beş dəvəyə qədər hər beş dəvəyə görə bir qoyun, iyirmi beşdən otuz beşə qədər bir yaşı tamam olmuş bir dişi dəvə zəkat olaraq verilir. Əgər bir yaşı tamam olmuş dişi dəvə yoxdursa, iki yaşı tamam olmuş bir erkək dəvə verilməlidir. Otuz altıdan qırx beşə qədər iki yaşı tamam olmuş bir dişi dəvə zəkat olaraq verilməlidir. Qırx altıdan altmışa qədər üç yaşı tamam olmuş toxumluq bir dəvə verilir. Altmış birdən yetmiş beşə qədər dörd yaşı tamam olmuş dişi dəvə zəkat olaraq verilir. Yetmiş altıdan doxsana qədər iki yaşı tamam olmuş iki dişi dəvə zəkat olaraq verilir. Doxsan birdən yüz iyirmiyə qədər üç yaşı tamam olmuş toxumluq iki erkək dəvə verilir. Yüz iyirmidən sonra hər qırx dəvəyə iki yaşı tamam olmuş bir dişi dəvə və hər əlli dəvəyə üç yaşı tamam olmuş bir dişi dəvə zəkat olaraq verilir. Zəkat üçün lazım olan yaşda dəvə tapılmasa, birinin dörd yaşı tamam olmuş bir dəvə zəkat verməsi lazım olduğu halda bu yaşda dəvəsi olmasa, üç yaşı tamam olmuş

dəvəsi olarsa, ondan bu dəvə zəkat olaraq götürülür. Həmçinin hansı daha rahatdırsa, ya iki qoyun, ya da iyirmi dirhəm alınır. Kimin üç yaşı tamam olmuş bir dəvə verməsi lazım olar, lakin belə bir dəvəsi tapılmazsa, dörd yaşı tamam olmuş bir dəvəsi olarsa, zəkat olaraq bu dəvə götürülür. Zəkat məmuru bu adama ya iyirmi dirhəm, ya da iki qoyun verir. Kimin iki yaşı tamam olmuş bir dişi dəvə zəkat verməsi lazımdırsa, lakin belə bir dəvəsi yoxdursa, bir yaşı tamam olmuş bir dişi dəvəsi varsa, zəkat məmuru həm bunu götürür, həm də həmin adama hansı rahatdırsa, iki qoyun və ya iyirmi dirhəm götürür. Kim bir yaşı tamam olmuş bir dəvəni zəkat olaraq verməlidirsə, belə bir dəvə yoxdursa və iki yaşı tamam olmuş dəvəsi varsa, onun əvəzinə bu dəvə alınır və zəkat məmuru iki qoyunu və ya iyirmi dirhəmi ona geri qaytarır. Dörd dəvəsi olana zəkat düşmür, amma yiyəsi istəsə verə bilər. Otlaqda qidalanan qoyunların sayı qırxa çatdıqda, bir qoyun zəkat olaraq verilir. Yüz iyirmi ədəd qoyuna qədər bu say dəyişmir. Yüz iyirmi birdən iki yüzə qədər iki qoyun zəkat olaraq verilir. İki yüz birdən üç yüzə qədər üç qoyun zəkat olaraq verilir. Üç yüz birdən sonra hər yüz qoyuna bir qoyun zəkat verilir. Yaşlı, naqis heyvanlarla sürünün qoçu zəkat kimi götürülmür. Amma yiyəsi istəsə verə bilər. Mal-qara sahibi çox verməmək üçün, zəkat məmuru da çox almamaq üçün ayrılıqda hesaba alınması lazım olanları bir yerdə, bir yerdə hesaba alınması lazım olanları ayıraraq hesablaya bilməz. Şərik mallarda zəkat olaraq alınan heyvan şəriklər tərəfindən şəriklik səviyyəsinə görə bərabər şəkildə ödənir. Otlaqda qidalanan heyvanlar qırxdan bir əskik olarsa, bunlara zəkat düşmür. Amma yiyəsi istəsə verə bilər. Gümüşün zəkatı qırxdabirdir. Yüz doxsan dirhəm gümüşü olana zəkat düşmür, amma yiyəsi istəsə verə bilər".

## ١١– بَابُ : مَانِعِ زَكَاةِ الْغَنَمِ

## 11-ci fəsil: Qoyunların zəkatını verməkdən imtina edən

٢٤٥٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنِ الْمَعْرُورِ بْنِ سُوَيْدٍ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ صَاحِبِ إِبِلٍ وَلاَ بَقَرٍ وَلاَ غَنَمٍ لاَ يُؤَدِّي زَكَاتَهَا ، إِلاَّ جَاءَتْ يَوْمَ الْقِيَامَةِ أَعْظَمَ مَا كَانَتْ وَأَسْمَنَهُ ، تَنْطَحُهُ بِقُرُونِهَا ، وَتَطَؤُهُ بِأَخْفَافِهَا ، كُلَّمَا نَفِدَتْ أُخْرَاهَا أَعَادَتْ عَلَيْهِ أُولاَهَا ، حَتَّى يُقْضَى بَيْنَ النَّاسِ.

2456. ...Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kimin dəvəsi, inəyi və qoyunu olarsa, lakin onların zəkatını verməzsə, həmin heyvanlar Qiyamət günü dünyada olduqlarından daha sağlam

və daha cüssəli halda gətirilib yiyələrini buynuzları ilə vurub tapdalayacaqlar. Sonda olan heyvan tapdalamanı bitirdikdə, əvvəlkilər yenidən gəlib bunu insanların sorğu-sualı bitincəyə qədər davam edəcəklər".

١٢- بَابُ : الْجَمْعِ بَيْنَ الْمُتَفَرِّقِ وَالتَّفْرِيقِ بَيْنَ الْمُجْتَمِعِ

## 12-ci fəsil: Zəkatı çox verməmək üçün ayrılıqda hesaba alınması lazım olanları bir yerdə, bir yerdə hesaba alınması lazım olanları ayıraraq hesablamaq haqda

٢٤٥٧- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ هُشَيْمٍ ، عَنْ هِلاَلِ بْنِ خَبَابٍ ، عَنْ مَيْسَرَةَ أَبِي صَالِحٍ ، عَنْ سُوَيْدِ بْنِ غَفَلَةَ ، قَالَ : أَتَانَا مُصَدِّقُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَتَيْتُهُ فَجَلَسْتُ إِلَيْهِ فَسَمِعْتُهُ يَقُولُ : إِنَّ فِي عَهْدِي أَنْ لاَ نَأْخُذَ رَاضِعَ لَبَنٍ ، وَلاَ نَجْمَعَ بَيْنَ مُتَفَرِّقٍ ، وَلاَ نُفَرِّقَ بَيْنَ مُجْتَمِعٍ ، فَأَتَاهُ رَجُلٌ بِنَاقَةٍ كَوْمَاءَ فَقَالَ : خُذْهَا ، فَأَبَى.

2457. ...Rəvayət edilir ki, Suveyd ibn Ğafələ ﷺ demişdir: "Peyğəmbərin ﷺ zəkat məmuru bizə gəlmişdi. Onun yanına gəlib oturdum və dediyini eşitdim: "Südündən istifadə etmək üçün saxlanılan sağmal heyvanlardan zəkat alınmaması bizə əmr edildi. Həmçinin insanların mallarını çox zəkat almaq üçün birləşdirməməyimiz və az zəkat üçün ayırmamağımız da bizə əmr edildi". Bu əsnada bir nəfər yaşlı bir dəvə gətirdi və: "Bunu götür!" dedi. Zəkat məmuru isə götürmədi".

٢٤٥٨- أَخْبَرَنَا هَارُونُ بْنُ زَيْدِ بْنِ يَزِيدَ ، يَعْنِي ابْنَ أَبِي الزَّرْقَاءِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعَثَ سَاعِيًا فَأَتَى رَجُلاً فَآتَاهُ فَصِيلاً مَخْلُولاً ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بَعَثْنَا مُصَدِّقَ اللهِ وَرَسُولِهِ ، وَإِنَّ فُلاَنًا أَعْطَاهُ فَصِيلاً مَخْلُولاً ، اللَّهُمَّ لاَ تُبَارِكْ فِيهِ وَلاَ فِي إِبِلِهِ ، فَبَلَغَ ذَلِكَ الرَّجُلَ فَجَاءَ بِنَاقَةٍ حَسْنَاءَ فَقَالَ : أَتُوبُ إِلَى اللهِ عَزَّ وَجَلَّ وَإِلَى نَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ بَارِكْ فِيهِ وَفِي إِبِلِهِ.

2458. ...Vail ibn Hucr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ onu zəkat məmuru olaraq göndərmişdi. Bir nəfər ona xəstə və zəif bir heyvan gətirdi. Peyğəmbər ﷺ buyurdu: "Biz Allah və Onun Elçisinin zəkat məmurunu göndərmişik. Filankəs isə zəkat olaraq xəstə və zəif bir dəvə verib. Allah ona və dəvələrinə bərəkət verməsin!" Peyğəmbərin ﷺ bu sözü həmin adama çatdıqda gözəl bir dişi dəvə gətirərək: "Allah və Onun Elçisinin əmrinə tabe oluram" dedi. Peyğəmbər ﷺ də belə dua etdi: "Allahım, ona və dəvələrinə bərəkət ver!"

١٣- بَابُ : صَلاَةِ الإِمَامِ عَلَى صَاحِبِ الصَّدَقَةِ

## 13-cü fəsil: İmamın sədəqə (zəkat) verən üçün duası

٢٤٥٩- أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ عَمْرُو بْنُ مُرَّةَ : أَخْبَرَنِي ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ أَبِي أَوْفَى ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَتَاهُ قَوْمٌ بِصَدَقَتِهِمْ ، قَالَ : اللَّهُمَّ صَلِّ عَلَى آلِ فُلاَنٍ ، فَأَتَاهُ أَبِي بِصَدَقَتِهِ فَقَالَ : اللَّهُمَّ صَلِّ عَلَى آلِ أَبِي أَوْفَى.

2459. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə ﷺ demişdir: "Bir dəstə insan zəkatlarını əlləri ilə gətirib Allah Elçisinə ﷺ vermişdilər. Allah Elçisi ﷺ də belə dua etdi: "Allahım, filan ailəyə rəhm et!" Sonra atam da zəkatını gətirmişdi. Allah Elçisi ﷺ ona belə dua etdi: "Allahım, Əbu Əufənin ailəsinə rəhm et!"

١٤- بَابُ : إِذَا جَاوَزَ فِي الصَّدَقَةِ

## 14-cü fəsil: Sədəqəni artıq verərsə nə olur?

٢٤٦٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ أَبِي إِسْمَعِيلَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ هِلاَلٍ ، قَالَ : قَالَ جَرِيرٌ : أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَاسٌ مِنَ الأَعْرَابِ ، فَقَالُوا : يَا رَسُولَ اللهِ ، يَأْتِينَا نَاسٌ مِنْ مُصَدِّقِيكَ يَظْلِمُونَ ، قَالَ : أَرْضُوا مُصَدِّقِيكُمْ ، قَالُوا : وَإِنْ ظَلَمَ ؟ قَالَ : أَرْضُوا مُصَدِّقِيكُمْ ، ثُمَّ قَالُوا : وَإِنْ ظَلَمَ ؟ قَالَ : أَرْضُوا مُصَدِّقِيكُمْ قَالَ جَرِيرٌ : فَمَا صَدَرَ عَنِّي مُصَدِّقٌ مُنْذُ سَمِعْتُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلاَّ وَهُوَ رَاضٍ.

2460. ...Rəvayət edilir ki, Cərir ﷺ demişdir: "Bədəvilərdən bir dəstə Peyğəmbərin ﷺ yanına gələrək dedilər: "Ey Allahın Elçisi, sənin zəkat məmurların gəlib bizə zülm edirlər". Peyğəmbər ﷺ buyurdu: "Məmurlarımı razı salın!" Bədəvilər dedilər: "Zülm etsələr də?" Peyğəmbər ﷺ buyurdu: "Məmurlarımı razı salın!" Bədəvilər yenə dedilər: "Zülm etsələr də?" Peyğəmbər ﷺ buyurdu: "Məmurlarımı razı salın!" Cərir deyir: "Mən bu sözləri Allah Elçisindən ﷺ eşidəndən bəri həmişə zəkat məmurunu razı etdim".

٢٤٦١- أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ هُوَ ابْنُ عُلَيَّةَ ، قَالَ : أَنْبَأَنَا دَاوُدُ ، عَنِ الشَّعْبِيِّ ، قَالَ : قَالَ جَرِيرٌ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أَتَاكُمُ الْمُصَّدِّقُ فَلْيَصْدُرْ وَهُوَ عَنْكُمْ رَاضٍ.

2461. ...Rəvayət edilir ki, Cərir ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizin yanınıza zəkat məmuru gəldikdə sizdən razı olduğu halda qayıtsın!"

١٥- بَابُ : إِعْطَاءِ السَّيِّدِ الْمَالَ بِغَيْرِ اخْتِيَارِ الْمُصَدِّقِ

## 15-ci fəsil: Mal sahibinin zəkatının zəkat məmurunun seçimi ilə olmaması

٢٤٦٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا بْنُ إِسْحَاقَ ، عَنْ عَمْرِو بْنِ أَبِي سُفْيَانَ ، عَنْ مُسْلِمِ بْنِ ثَفِنَةَ ، قَالَ : اسْتَعْمَلَ ابْنُ عَلْقَمَةَ أَبِي عَلَى عِرَافَةِ قَوْمِهِ ، وَأَمَرَهُ أَنْ يُصَدِّقَهُمْ ، فَبَعَثَنِي أَبِي إِلَى طَائِفَةٍ مِنْهُمْ لآتِيَهُ بِصَدَقَتِهِمْ ، فَخَرَجْتُ حَتَّى أَتَيْتُ عَلَى شَيْخٍ كَبِيرٍ يُقَالُ لَهُ سَعْرٌ ، فَقُلْتُ : إِنَّ أَبِي بَعَثَنِي إِلَيْكَ لِتُؤَدِّيَ صَدَقَةَ غَنَمِكَ ، قَالَ : ابْنَ أَخِي وَأَيُّ نَحْوٍ تَأْخُذُونَ ؟ قُلْتُ : نَخْتَارُ حَتَّى إِنَّا لَنَشْبُرُ ضُرُوعَ الْغَنَمِ ، قَالَ : ابْنَ أَخِي فَإِنِّي أُحَدِّثُكَ أَنِّي كُنْتُ فِي شِعْبٍ مِنْ هَذِهِ الشِّعَابِ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي غَنَمٍ لِي ، فَجَاءَنِي رَجُلاَنِ ، عَلَى بَعِيرٍ ، فَقَالاَ : إِنَّا رَسُولاَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَيْكَ لِتُؤَدِّيَ صَدَقَةَ غَنَمِكَ ، قَالَ : قُلْتُ : وَمَا عَلَيَّ فِيهَا ؟ قَالاَ : شَاةٌ ، فَأَعْمِدُ إِلَى شَاةٍ قَدْ عَرَفْتُ مَكَانَهَا مُمْتَلِئَةٍ مَحْضًا وَشَحْمًا فَأَخْرَجْتُهَا إِلَيْهِمَا ، فَقَالَ : هَذِهِ الشَّافِعُ ، وَالشَّافِعُ الْحَائِلُ ، وَقَدْ نَهَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ نَأْخُذَ شَافِعًا ، قَالَ : فَأَعْمِدُ إِلَى عَنَاقٍ مُعْتَاطٍ ، وَالْمُعْتَاطُ الَّتِي لَمْ تَلِدْ وَلَدًا وَقَدْ حَانَ وِلاَدُهَا ، فَأَخْرَجْتُهَا إِلَيْهِمَا فَقَالاَ : نَاوِلْنَاهَا ، فَرَفَعْتُهَا إِلَيْهِمَا فَجَعَلاَهَا مَعَهُمَا عَلَى بَعِيرِهِمَا ثُمَّ انْطَلَقَا.

2462. ...Rəvayət edilir ki, Muslim ibn Səfinə ﷺ demişdir: "İbn Alqamə atamı qövmün xəzinədarı təyin etdi və ona zəkatları toplamağı əmr etdi. Atam da məni bir toplumun zəkatını almaq üçün onların yanına göndərdi. Mən də Sər adlı bir qocanın yanına gəlib dedim: "Atam məni sənin qoyunlarının zəkatını almaq üçün göndərib". O dedi: "Ey qardaşım oğlu, necə alacaqsan?" Mən də dedim: "Seçim edəcəyik, belə ki heyvanların sinələrini də ölçəcəyik". Sər dedi: "Ey qardaşım oğlu, sənə bir şey danışacam. Mən Allah Elçisinin ﷺ dövründə bu vadilərin birində qoyunlarımı otarırdım. İki nəfər dəvələrinin üzərində gəlib dedilər: "Biz Allah Elçisinin ﷺ təyin etdiyi zəkat məmurlarıyıq. Qoyunların zəkatını almağa gəlmişik". Mən dedim: "Nə verməyim lazımdır?" Onlar dedilər: "Bir qoyun". Mən də ətli və kök bir qoyun vermək qərarına gəldim və qoyunu tutub məmurlara gətirdim. Məmurlardan biri dedi: "Bu cüt sayılır, çünki qarnında balası var. Allah Elçisi ﷺ bizə qarnında balası olan heyvanları almağımızı qadağan etmişdir". Mən də onlara bir az arıq və doğacaq yaşda olan bir qoyun gətirdim. Onlar: "Onu ver!" dedilər. Mən də qoyunu dəvənin üzərinə qaldırdım, onlar da qoyunu götürüb getdilər".[1]

٢٤٦٣- أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا رَوْحٌ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ أَبِي سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي مُسْلِمُ بْنُ ثَفِنَةَ ، أَنَّ ابْنَ عَلْقَمَةَ اسْتَعْمَلَ أَبَاهُ عَلَى صَدَقَةِ قَوْمِهِ ، وَسَاقَ الْحَدِيثَ.

2463. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

---

[1] Hədis zəifdir.

٢٤٦٤– أَخْبَرَنِي عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : حَدَّثَنِي أَبُو الزِّنَادِ ، مِمَّا حَدَّثَهُ عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، مِمَّا ذَكَرَ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يُحَدِّثُ ، قَالَ : وَقَالَ عُمَرُ : أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِصَدَقَةٍ فَقِيلَ : مَنَعَ ابْنُ جَمِيلٍ وَخَالِدُ بْنُ الْوَلِيدِ وَعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا يَنْقِمُ ابْنُ جَمِيلٍ إِلاَّ أَنَّهُ كَانَ فَقِيرًا فَأَغْنَاهُ اللَّهُ ، وَأَمَّا خَالِدُ بْنُ الْوَلِيدِ فَإِنَّكُمْ تَظْلِمُونَ خَالِدًا قَدْ احْتَبَسَ أَدْرَاعَهُ وَأَعْتُدَهُ فِي سَبِيلِ اللهِ ، وَأَمَّا الْعَبَّاسُ بْنُ عَبْدِ الْمُطَّلِبِ عَمُّ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَهِيَ عَلَيْهِ صَدَقَةٌ وَمِثْلُهَا مَعَهَا

2464. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Ömər demişdir: “Allah Elçisi ﷺ zəkatın toplanmasını əmr etmişdi. Ona deyildi ki, İbn Cəmil, Xalid ibn əl-Valid və Abbas ibn Abdul-Muttalib zəkat vermək istəmirlər. Allah Elçisi ﷺ buyurdu: “İbn Cəmil əvvəllər kasıb idi. Allah onu varlandırdı. İndi isə zəkat vermək istəmir. Xalid ibn əl-Validə gəlincə, siz ona zülm edirsiniz, çünki o, zireh və bütün hərb alətlərini Allah üçün vermişdir. Allah Elçisinin ﷺ əmisi Abbas ibn Abdul-Muttalibə gəlincə, ona düşən zəkatdan əlavə bir mislini də verməsi lazımdır”.

٢٤٦٥– أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَفْصٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ بْنُ طَهْمَانَ ، عَنْ مُوسَى ، قَالَ : حَدَّثَنِي أَبُو الزِّنَادِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِصَدَقَةٍ مِثْلَهُ سَوَاءً.

2465. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ əmr etdi ki...” və yuxarıdakı hədisin eynisini rəvayət etdi.

٢٤٦٦– أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، وَمَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالاَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مَيْسَرَةَ ، عَنْ عُثْمَانَ بْنِ عَبْدِ اللهِ بْنِ الأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ بْنِ هِلاَلٍ الثَّقَفِيِّ ، قَالَ : جَاءَ رَجُلٌ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : كِدْتُ أُقْتَلُ بَعْدَكَ فِي عَنَاقٍ أَوْ شَاةٍ مِنَ الصَّدَقَةِ ، فَقَالَ : لَوْلاَ أَنَّهَا تُعْطَى فُقَرَاءَ الْمُهَاجِرِينَ مَا أَخَذْتُهَا.

2466. ...Rəvayət edilir ki, Abdullah ibn Hilal əs-Səqafi ﵁ demişdir: “Bir kişi Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Səndən sonra bir keçi və ya bir qoyunun zəkatına görə az qalmışdı ki, öldürüləcəkdim”. Peyğəmbər ﷺ buyurdu: “Əgər toplanan bu zəkat kasıb mühacirlərə verilməsəydi, onları almazdım”.[1]

## ١٦– بَابُ : زَكَاةِ الْخَيْلِ
## 16-cı fəsil: Atların zəkatı

٢٤٦٧– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ شُعْبَةَ ، وَسُفْيَانُ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ عَلَى الْمُسْلِمِ فِي عَبْدِهِ وَلاَ فَرَسِهِ صَدَقَةٌ.

[1] Hədis zəifdir.

2467. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Müsəlmanın köləsinə və atına zəkat düşmür".

٢٤٦٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ حَرْبٍ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا مُحْرِزُ بْنُ الْوَضَّاحِ ، عَنْ إِسْمَعِيلَ وَهُوَ ابْنُ أُمَيَّةَ ، عَنْ مَكْحُولٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ زَكَاةَ عَلَى الرَّجُلِ الْمُسْلِمِ فِي عَبْدِهِ وَلاَ فَرَسِهِ.

2468. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Müsəlman kişinin köləsinə və atına zəkat düşmür".

٢٤٦٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ بْنُ مُوسَى ، عَنْ مَكْحُولٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، يَرْفَعُهُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ عَلَى الْمُسْلِمِ فِي عَبْدِهِ وَلاَ فِي فَرَسِهِ صَدَقَةٌ.

2469. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Müsəlmanın köləsinə və atına zəkat düşmür".

٢٤٧٠- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ خُثَيْمٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ عَلَى الْمَرْءِ فِي فَرَسِهِ وَلاَ فِي مَمْلُوكِهِ صَدَقَةٌ.

2470. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Kişinin atına və mülkünə zəkat düşmür".

## ١٧- بَابُ : زَكَاةِ الرَّقِيقِ
## 17-ci fəsil: Kölələrin zəkatı

٢٤٧١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ عَلَى الْمُسْلِمِ فِي عَبْدِهِ وَلاَ فِي فَرَسِهِ صَدَقَةٌ.

2471. ...Əbu Hureyra ﷛ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Müsəlmanın köləsinə və atına zəkat düşmür".

٢٤٧٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ خُثَيْمِ بْنِ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ عَلَى الْمُسْلِمِ صَدَقَةٌ فِي غُلاَمِهِ وَلاَ فِي فَرَسِهِ.

2472. ...Əbu Hureyra ﷛ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Müsəlmanın köləsinə və atına zəkat düşmür".

١٨- بَابُ : زَكَاةِ الْوَرِقِ

18-ci fəsil: Gümüşün zəkatı

٢٤٧٣- أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوَاقٍ صَدَقَةٌ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوْسُقٍ صَدَقَةٌ.

2473. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Beş uqiyədən az gümüşə, beşdən az dəvəyə və beş vəsəqdən az məhsula zəkat düşmür".

٢٤٧٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي صَعْصَعَةَ الْمَازِنِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوْسُقٍ مِنَ التَّمْرِ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ مِنَ الْوَرِقِ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ مِنَ الإِبِلِ صَدَقَةٌ.

2474. ...Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş vəsəq xurmadan az məhsula zəkat düşmür. Beş uqiyədən az gümüşə zəkat düşmür. Beşdən az dəvəyə zəkat düşmür".

٢٤٧٥- أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، عَنِ الْوَلِيدِ بْنِ كَثِيرٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي صَعْصَعَةَ ، عَنْ يَحْيَى بْنِ عُمَارَةَ ، وَعَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : لاَ صَدَقَةَ فِيمَا دُونَ خَمْسِ أَوْسَاقٍ مِنَ التَّمْرِ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ مِنَ الْوَرِقِ صَدَقَةٌ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ مِنَ الإِبِلِ صَدَقَةٌ.

2475. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: "Beş vəsəq xurmadan az məhsula zəkat düşmür. Beş uqiyədən az gümüşə zəkat düşmür. Beşdən az dəvəyə zəkat düşmür".

٢٤٧٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الطُّوسِيُّ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا ابْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ حِبَّانَ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي صَعْصَعَةَ ، وَكَانَا ثِقَةً ، عَنْ يَحْيَى بْنِ عُمَارَةَ بْنِ أَبِي حَسَنٍ ، وَعَبَّادِ بْنِ تَمِيمٍ ، وَكَانَا ثِقَةً ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : لَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ مِنَ الْوَرِقِ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسٍ مِنَ الإِبِلِ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوْسُقٍ صَدَقَةٌ.

2476. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Beş uqiyədən az gümüşə zəkat düşmür. Beşdən az dəvəyə zəkat düşmür. Beş vəsəqdən az məhsula zəkat düşmür".

٢٤٧٧– أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَاصِمِ بْنِ ضَمْرَةَ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ عَفَوْتُ عَنِ الْخَيْلِ وَالرَّقِيقِ ، فَأَدُّوا زَكَاةَ أَمْوَالِكُمْ مِنْ كُلِّ مِائَتَيْنِ خَمْسَةً.

2477. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Mən atlardan və gümüşdən zəkat almıram. Digər malınızın hər iki yüzün beşini zəkat verin".

٢٤٧٨– أَخْبَرَنَا حُسَيْنُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَاصِمِ بْنِ ضَمْرَةَ ، عَنْ عَلِيٍّ ، رَضِيَ اللَّهُ عَنْهُ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ عَفَوْتُ عَنِ الْخَيْلِ وَالرَّقِيقِ وَلَيْسَ فِيمَا دُونَ مِائَتَيْنِ زَكَاةٌ.

2478. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Mən atlardan və gümüşdən zəkat almıram. İki yüzdən az olan mal üçün zəkat yoxdur".

## ١٩– بَابُ : زَكَاةِ الْحُلِيِّ

## 19-cu fəsil: Bəzək əşyalarının zəkatı

٢٤٧٩– أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ حُسَيْنٍ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، أَنَّ امْرَأَةً مِنْ أَهْلِ الْيَمَنِ أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِنْتٌ لَهَا ، فِي يَدِ ابْنَتِهَا مَسَكَتَانِ غَلِيظَتَانِ مِنْ ذَهَبٍ ، فَقَالَ : أَتُؤَدِّينَ زَكَاةَ هَذَا ؟ قَالَتْ : لاَ ، قَالَ : أَيَسُرُّكِ أَنْ يُسَوِّرَكِ اللَّهُ عَزَّ وَجَلَّ بِهِمَا يَوْمَ الْقِيَامَةِ سِوَارَيْنِ مِنْ نَارٍ ، قَالَ : فَخَلَعَتْهُمَا فَأَلْقَتْهُمَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : هُمَا لِلَّهِ وَلِرَسُولِهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2479. ...Amr ibn Şueyb atasından və babasından ﷺ rəvayət edir ki, Yəmənli bir qadın Allah Elçisinin ﷺ yanına gəldi. Onun yanında əlində iki qızıl bilərzik olan qız uşağı var idi. Allah Elçisi ﷺ buyurdu: "Bunun zəkatını vermisənmi?" Qadın: "Xeyr" dedi. Allah Elçisi ﷺ buyurdu: "Allahın ﷻ Qiyamət günü onların əvəzinə oddan iki bilərzik taxması səni sevindirirmi?" Qadın ikisini də çıxararaq Allah Elçisinə ﷺ uzatdı və dedi: "Onlar Allah və Onun Elçisinə ﷺ aiddir!"

٢٤٨٠– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ بْنُ سُلَيْمَانَ ، قَالَ : سَمِعْتُ حُسَيْنًا ، قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ شُعَيْبٍ ، قَالَ : جَاءَتِ امْرَأَةٌ وَمَعَهَا بِنْتٌ لَهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَفِي يَدِ ابْنَتِهَا مَسَكَتَانِ ، نَحْوَهُ مُرْسَلٌ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : خَالِدٌ أَثْبَتُ مِنَ الْمُعْتَمِرِ.

2480. ...Rəvayət edilir ki, Amr ibn Şueyb ﷺ demişdir: "Yanında qızı olan

bir qadın Allah Elçisinin ﷺ yanına gəldi. Onun əlində iki qızıl bilərzik var idi". Sonra yuxarıdakı hədis qeyd olunur".

٢٠- بَابُ : مَانِعِ زَكَاةِ مَالِهِ

20-ci fəsil: Malının zəkatını verməyən

٢٤٨١- أَخْبَرَنَا الْفَضْلُ بْنُ سَهْلٍ ، قَالَ : حَدَّثَنَا أَبُو النَّضْرِ هَاشِمُ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ عَبْدِ اللهِ بْنِ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الَّذِي لاَ يُؤَدِّي زَكَاةَ مَالِهِ يُخَيَّلُ إِلَيْهِ مَالُهُ يَوْمَ الْقِيَامَةِ شُجَاعًا أَقْرَعَ لَهُ زَبِيبَتَانِ ، قَالَ : فَيَلْتَزِمُهُ أَوْ يُطَوِّقُهُ ، قَالَ : يَقُولُ : أَنَا كَنْزُكَ ، أَنَا كَنْزُكَ.

2481. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Malının zəkatını verməyənlərə Qiyamət günü həmin malları keçəl başlı və iki buynuzlu ilan olaraq göstəriləcək. İlan ona sarılaraq və ya yapışaraq deyəcək: "Mən sənin dünyada zəkatını vermədiyin xəzinənəm. Mən sənin dünyada zəkatını vermədiyin xəzinənəm".

٢٤٨٢- أَخْبَرَنَا الْفَضْلُ بْنُ سَهْلٍ ، قَالَ : حَدَّثَنَا حَسَنُ بْنُ مُوسَى الأَشْيَبُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ عَبْدِ اللهِ بْنِ دِينَارٍ الْمَدَنِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ آتَاهُ اللَّهُ عَزَّ وَجَلَّ مَالاً فَلَمْ يُؤَدِّ زَكَاتَهُ مُثِّلَ لَهُ مَالُهُ يَوْمَ الْقِيَامَةِ شُجَاعًا أَقْرَعَ لَهُ زَبِيبَتَانِ ، يَأْخُذُ بِلِهْزِمَتَيْهِ يَوْمَ الْقِيَامَةِ ، فَيَقُولُ : أَنَا مَالُكَ ، أَنَا كَنْزُكَ ، ثُمَّ تَلاَ هَذِهِ الآيَةَ **{وَلاَ يَحْسَبَنَّ الَّذِينَ يَبْخَلُونَ بِمَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ}** الآيَةَ.

2482. ...Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Allah عز وجل kimə mal-dövlət verər, o isə bunun zəkatını verməzsə, Qiyamət günü həmin mal-dövləti keçəl başlı və iki buynuzlu bir ilan şəklinə gətiriləcək və ağzı ilə yiyəsini tutaraq deyəcək: "Mən sənin mal-dövlətinəm. Mən sənin xəzinənəm". Sonra Allah Elçisi ﷺ bu ayəni oxudu: **"Allahın Öz lütfündən bəxş etdiyini xərcləməyə xəsislik edən kimsələr elə güman etməsinlər ki, bu, onların xeyrinədir. Əksinə, bu, onların zərərinədir. Onların xəsislik etdikləri şey qiyamət günü boyunlarına dolanacaqdır. Göylərin və yerin mirası Allaha məxsusdur. Allah nə etdiklərinizdən xəbərdardır"** (Ali-İmran, 180)".

٢١- زَكَاةُ التَّمْرِ

21-ci fəsil: Xurmanın zəkatı

٢٤٨٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنْ إِسْمَعِيلَ بْنِ أُمَيَّةَ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ

، عَنْ يَحْيَى بْنِ عُمَارَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوْسَاقٍ مِنْ حَبٍّ أَوْ تَمْرٍ صَدَقَةٌ.

2483. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Beş vəsəqdən az olan taxıl və xurmaya zəkat düşmür".

٢٢- بَابُ : زَكَاةِ الْحِنْطَةِ

## 22-ci fəsil: Buğdanın zəkatı

٢٤٨٤- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا رَوْحُ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ يَحْيَى بْنِ عُمَارَةَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لاَ يَحِلُّ فِي الْبُرِّ وَالتَّمْرِ زَكَاةٌ حَتَّى تَبْلُغَ خَمْسَةَ أَوْسُقٍ ، وَلاَ يَحِلُّ فِي الْوَرِقِ زَكَاةٌ حَتَّى تَبْلُغَ خَمْسَةَ أَوَاقٍ ، وَلاَ يَحِلُّ فِي إِبِلٍ زَكَاةٌ حَتَّى تَبْلُغَ خَمْسَ ذَوْدٍ.

2484. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş vəsəqə çatana qədər buğdaya və xurmaya zəkat düşmür. Beş uqiyə olana qədər gümüşə zəkat düşmür. Dəvələrin sayı beşə çatana qədər onlara zəkat düşmür".

٢٣- بَابُ : زَكَاةِ الْحُبُوبِ

## 23-cü fəsil: Toxumların zəkatı

٢٤٨٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِسْمَعِيلَ بْنِ أُمَيَّةَ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ يَحْيَى بْنِ عُمَارَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ فِي حَبٍّ وَلاَ تَمْرٍ صَدَقَةٌ حَتَّى تَبْلُغَ خَمْسَةَ أَوْسُقٍ ، وَلاَ فِيمَا دُونَ خَمْسٍ ذَوْدٍ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ صَدَقَةٌ.

2485. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Beş vəsəqə çatana qədər toxuma və xurmaya zəkat düşmür. Dəvələrin sayı beşə çatana qədər onlara zəkat düşmür. Beş uqiyə olana qədər gümüşə zəkat düşmür".

٢٤- الْقَدْرُ الَّذِي تَجِبُ فِيهِ الصَّدَقَةُ

## 24-cü fəsil: Zəkat nə qədər mala düşür?

٢٤٨٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا إِدْرِيسُ الأَوْدِيُّ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ أَبِي الْبَخْتَرِيِّ ، عَنْ أَبِي سَعِيدٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ صَدَقَةٌ.

2486. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Beş uqiyə olana qədər gümüşə zəkat düşmür".

٢٤٨٧– أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، وَعُبَيْدُ اللهِ بْنُ عُمَرَ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيْسَ فِيمَا دُونَ خَمْسِ أَوَاقٍ صَدَقَةٌ ، وَلاَ فِيمَا دُونَ خَمْسِ ذَوْدٍ صَدَقَةٌ ، وَلَيْسَ فِيمَا دُونَ خَمْسَةِ أَوْسُقٍ صَدَقَةٌ.

2487. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Beş uqiyə olana qədər gümüşə zəkat düşmür. Dəvələrin sayı beşə çatana qədər onlara zəkat düşmür. Beş vəsəqə çatana qədər məhsula zəkat düşmür".

٢٥– بَابُ : مَا يُوجِبُ الْعُشْرَ وَمَا يُوجِبُ نِصْفَ الْعُشْرِ

## 25-ci fəsil: Ondabir və iyirmidəbir nə vaxt vacib olur?

٢٤٨٨– أَخْبَرَنَا هَارُونُ بْنُ سَعِيدِ بْنِ الْهَيْثَمِ أَبُو جَعْفَرٍ الأَيْلِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : فِيمَا سَقَتِ السَّمَاءُ وَالأَنْهَارُ وَالْعُيُونُ أَوْ كَانَ بَعْلاً الْعُشْرُ ، وَمَا سُقِيَ بِالسَّوَانِي وَالنَّضْحِ نِصْفُ الْعُشْرِ.

2488. ...Səlim atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Yağışla, çayla və bulaq suyu ilə suvarılan və ya dibinə su tökülmədən kökündən su içən (bitkilərdən yığılan) məhsulun ondan biri (zəkat verilməlidir). Daşınma yolu ilə və ya süni yolla suvarılan (ərazilərdən götürülmüş) məhsulun isə ondan birinin yarısı (yəni iyirmidəbiri zəkat verilməlidir)".

٢٤٨٩– أَخْبَرَنِي عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، وَأَحْمَدُ بْنُ عَمْرٍو ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ أَبَا الزُّبَيْرِ ، حَدَّثَهُ أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : فِيمَا سَقَتِ السَّمَاءُ وَالأَنْهَارُ وَالْعُيُونُ الْعُشْرُ ، وَفِيمَا سُقِيَ بِالسَّانِيَةِ نِصْفُ الْعُشْرِ.

2489. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Yağışla, çayla və bulaq suyu ilə suvarılan (bitkilərdən yığılan) məhsulun ondan biri (zəkat verilməlidir). Daşınma yolu və ya quyudan çəkilərək suvarılan (ərazilərdən götürülmüş) məhsulun isə ondan birinin yarısı (yəni iyirmidən biri zəkat verilməlidir).

٢٤٩٠- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي بَكْرٍ وَهُوَ ابْنُ عَيَّاشٍ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ مُعَاذٍ ، قَالَ : بَعَثَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الْيَمَنِ فَأَمَرَنِي أَنْ آخُذَ مِمَّا سَقَتِ السَّمَاءُ الْعُشْرَ ، وَفِيمَا سُقِيَ بِالدَّوَالِي نِصْفَ الْعُشْرِ.

2490. ...Rəvayət edilir ki, Muaz ﷺ demişdir: "Allah Elçisi ﷺ məni Yəmənə göndərəndə yağışla suvarılan (bitkilərdən yığılan) məhsulun ondan biri, daşınma yolu ilə və quyudan çəkilərək suvarılan (ərazilərdən götürülmüş) məhsulun gəlirindən isə ondan birinin yarısını (yəni iyirmidən birini) zəkat yığmağımı əmr etdi".

## ٢٦- كَمْ يَتْرُكُ الْخَارِصُ

## 26-cı fəsil: Zəkat məmuru götürəcəyi maldan nəyi saxlamalıdır?[1]

٢٤٩١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، وَمُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالاَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ خُبَيْبَ بْنَ عَبْدِ الرَّحْمَنِ ، يُحَدِّثُ عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ مَسْعُودِ بْنِ نِيَارٍ ، عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ ، قَالَ : أَتَانَا وَنَحْنُ فِي السُّوقِ ، فَقَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا خَرَصْتُمْ فَخُذُوا وَدَعُوا الثُّلُثَ ، فَإِنْ لَمْ تَأْخُذُوا أَوْ تَدَعُوا الثُّلُثَ - شَكَّ شُعْبَةُ - فَدَعُوا الرُّبُعَ.

2491. ...Rəvayət edilir ki, Səhl ibn Əbu Həsmə ﷺ demişdir: "Bir bazarda olarkən zəkat məmuru yanımıza gələrək Allah Elçisinin ﷺ belə buyurduğunu dedi: "Zəkatı təxmini miqdarda aldığınız vaxt üçdəbirini buraxaraq alın".[2]

## ٢٧- قَوْلُهُ عَزَّ وَجَلَّ {وَلاَ تَيَمَّمُوا الْخَبِيثَ مِنْهُ تُنْفِقُونَ}

## 27-ci fəsil: Allahın ﷻ "...**Özünüzə verildiyi təqdirdə, ancaq göz yumub alacağınız pis şeylərdən xərcləməyə çalışmayın**" (əl-Bəqərə, 267) kəlamı

٢٤٩٢- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الْجَلِيلِ بْنُ حُمَيْدٍ الْيَحْصَبِيُّ ، أَنَّ ابْنَ شِهَابٍ ، حَدَّثَهُ ، قَالَ : حَدَّثَنِي أَبُو أُمَامَةَ بْنُ سَهْلِ بْنِ حُنَيْفٍ ، فِي الآيَةِ الَّتِي قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَلاَ تَيَمَّمُوا الْخَبِيثَ مِنْهُ تُنْفِقُونَ}** ، قَالَ : هُوَ الْجُعْرُورُ وَلَوْنُ حُبَيْقٍ فَنَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُؤْخَذَا فِي الصَّدَقَةِ.

2492. ...Rəvayət edilir ki, Əbu Umamə Səhl ibn Huneyf ﷺ Allahın ﷻ bu ayəsi **"...Özünüzə verildiyi təqdirdə, ancaq göz yumub alacağınız pis şeylərdən xərcləməyə çalışmayın**" (əl-Bəqərə, 267) haqda demişdir: "Bu, rəngi qaçmış, keyfiyyəti düşmüş xurmadır. Allah Elçisi ﷺ korlanmış şeylərin zəkat olaraq verilməsini qadağan etmişdir".

---

[1] Yəni zəkat məmuru mala nəzər yetirdikdə itkini çıxandan sonra qalan malın zəkatını hesablayır.

[2] Hədis zəifdir.

٢٧م- الرذالة من الصدقة

## 27m-ci fəsil: Sədəqədən ən pis olanı

٢٤٩٣- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنِ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي صَالِحُ بْنُ أَبِي عَرِيبٍ ، عَنْ كَثِيرِ بْنِ مُرَّةَ الْحَضْرَمِيِّ ، عَنْ عَوْفِ بْنِ مَالِكٍ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِيَدِهِ عَصًا وَقَدْ عَلَّقَ رَجُلٌ قِنْوَ حَشَفٍ ، فَجَعَلَ يَطْعَنُ فِي ذَلِكَ الْقِنْوِ ، فَقَالَ : لَوْ شَاءَ رَبُّ هَذِهِ الصَّدَقَةِ تَصَدَّقَ بِأَطْيَبَ مِنْ هَذَا ، إِنَّ رَبَّ هَذِهِ الصَّدَقَةِ يَأْكُلُ حَشَفًا يَوْمَ الْقِيَامَةِ.

2493. ...Rəvayət edilir ki, Auf ibn Malik ﵁ demişdir: "Bir dəfə Allah Elçisi ﷺ əlində bir əsa ilə gəldi. Bir nəfər məsciddən korlanmış xurma salxımı asmışdı. Allah Elçisi ﷺ əsası ilə bu salxımı tərpədərək belə buyurdu: "Kaş bunun yiyəsi bundan daha yaxşısını sədəqə verərdi. Bu xurmanın yiyəsi Qiyamət günü korlanmış xurma yeyəcək".

٢٨- بَابُ الْمَعْدِنِ

## 28-ci fəsil: Mədən haqda

٢٤٩٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ الأَخْنَسِ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ اللُّقَطَةِ ؟ فَقَالَ : مَا كَانَ فِي طَرِيقٍ مَأْتِيٍّ أَوْ فِي قَرْيَةٍ عَامِرَةٍ فَعَرِّفْهَا سَنَةً ، فَإِنْ جَاءَ صَاحِبُهَا وَإِلاَّ فَلَكَ ، وَمَا لَمْ يَكُنْ فِي طَرِيقٍ مَأْتِيٍّ وَلاَ فِي قَرْيَةٍ عَامِرَةٍ فَفِيهِ وَفِي الرِّكَازِ الْخُمْسُ.

2494. ...Amr ibn Şueyb atasının və babasının ﵄ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ tapıntı haqda soruşulduqda buyurdu: "Yol kənarında və ya bir yaşayış mərkəzində bir əşya tapdıqda onu bir il ərzində elan et! Yiyəsi tapılsa ona ver, tapılmasa o mal sənindir. Əgər o əşya yol kənarında və ya yaşayış mərkəzində tapılmayıbsa, dəfinələr və xəzinələr kimidir. Ona görə həmin maldan beşdəbir xums[1] alınır".

٢٤٩٥- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ح وأَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، وَأَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : الْعَجْمَاءُ جُرْحُهَا جُبَارٌ ، وَالْبِئْرُ جُبَارٌ ، وَالْمَعْدِنُ جُبَارٌ ، وَفِي الرِّكَازِ الْخُمُسُ

2495. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Yiyəsindən qaçaraq başqasına ziyan verən heyvanın ziyanına təzminat

[1] Xums – xəzinə tapıldıqda bunun dəyərinin beşdəbiri zəkat olaraq yığılıb Peyğəmbərin ﷺ nəslindən olanlara paylanılır.

düşmür. Su quyusuna düşüb ölənə və mədənlərdə ölən kəslərə də təzminat və fidyə düşmür. Xəzinəyə görə isə xums zəkatı düşür".

٢٤٩٦- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، وَعُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِمِثْلِهِ.

2496. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٤٩٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، وَأَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : جُرْحُ الْعَجْمَاءِ جُبَارٌ ، وَالْبِئْرُ جُبَارٌ ، وَالْمَعْدِنُ جُبَارٌ ، وَفِي الرِّكَازِ الْخُمْسُ.

2497. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Yiyəsindən qaçaraq başqasına ziyan verən heyvanın ziyanına təzminat düşmür. Su quyusuna düşüb ölənə və mədənlərdə ölən kəslərə də təzminat düşmür. Xəzinəyə görə isə xums zəkatı düşür".

٢٤٩٨- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، حَدَّثَنَا هُشَيْمٌ ، أَنْبَأَنَا مَنْصُورٌ ، وَهِشَامٌ ، عَنْ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، رَضِيَ اللَّهُ عَنْهُ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْبِئْرُ جُبَارٌ ، وَالْعَجْمَاءُ جُبَارٌ ، وَالْمَعْدِنُ جُبَارٌ ، وَفِي الرِّكَازِ الْخُمْسُ.

2498. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Yiyəsindən qaçaraq başqasına ziyan verən heyvanın ziyanına təzminat düşmür. Su quyusuna düşüb ölənə, yiyəsindən qaçaraq başqasına ziyan verən heyvanın ziyanına və mədənlərdə ölən kəslərə görə təzminat düşmür. Xəzinəyə görə isə xums zəkatı düşür".

## ٢٩- بَابُ : زَكَاةِ النَّحْلِ
## 29-cu fəsil: Balın zəkatı

٢٤٩٩- أَخْبَرَنِي الْمُغِيرَةُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ أَبِي شُعَيْبٍ ، عَنْ مُوسَى بْنِ أَعْيَنَ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : جَاءَ هِلاَلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِعُشُورِ نَحْلٍ لَهُ ، وَسَأَلَهُ أَنْ يَحْمِيَ لَهُ وَادِيًا يُقَالُ لَهُ سَلَبَةُ ، فَحَمَى لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَلِكَ الْوَادِيَ فَلَمَّا وَلِيَ عُمَرُ بْنُ الْخَطَّابِ ، كَتَبَ سُفْيَانُ بْنُ وَهْبٍ إِلَى عُمَرَ بْنِ الْخَطَّابِ يَسْأَلُهُ ، فَكَتَبَ عُمَرُ ، إِنْ أَدَّى إِلَيَّ مَا كَانَ يُؤَدِّي إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ عُشْرِ نَحْلِهِ فَاحْمِ لَهُ سَلَبَةَ ذَلِكَ ، وَإِلاَّ فَإِنَّمَا هُوَ ذُبَابُ غَيْثٍ يَأْكُلُهُ مَنْ شَاءَ.

2499. Amr ibn Şueyb atasının və babasının ﷺ belə dediyini rəvayət etmişdir: "Hilal balın ondabirini Allah Elçisinə ﷺ vermək üçün onun

yanına gəldi. O, "Sələbə" vadisindən istifadə etmək üçün Allah Elçisindən ﷺ icazə istədi. Allah Elçisi ﷺ də bu vadini onun himayəsinə verdi. Ömər ibn əl-Xattab xəlifə olduqda Süfyan ibn Vəhb Ömərə məktub yazıb bu vadi haqda soruşdu. Ömər də belə bir cavab yazdı: "O, Allah Elçisinə ﷺ balın ondabirini verdiyi kimi mənə də, balın ondabirini verərsə, o vadi onun himayəsində qala bilər. Əks təqdirdə bu bal selin gətirdiyi kimidir, kim istəyirsə, ondan yeyə bilər".

٣٠- بَابُ : فَرْضِ زَكَاةِ رَمَضَانَ

## 30-cu fəsil: Ramazanda verilən fitrə zəkatı

٢٥٠٠- أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، عَنْ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ زَكَاةَ رَمَضَانَ عَلَى الْحُرِّ وَالْعَبْدِ ، وَالذَّكَرِ وَالأُنْثَى ، صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، فَعَدَلَ النَّاسُ بِهِ نِصْفَ صَاعٍ مِنْ بُرٍّ.

2500. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ azad, kölə, qadın, kişi - hamı üçün Ramazanda bir saa xurma və ya bir saa arpa qədər fitrə zəkatı vermələrini əmr etmişdir. İnsanlar bunu yarım saa buğdaya bərabər saymışlar".

٣١- بَابُ : فَرْضِ زَكَاةِ رَمَضَانَ عَلَى الْمَمْلُوكِ

## 31-ci fəsil: Ramazan fitrəsinin kölələrin də üzərinə vacib olması

٢٥٠١- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَدَقَةَ الْفِطْرِ عَلَى الذَّكَرِ وَالأُنْثَى ، وَالْحُرِّ وَالْمَمْلُوكِ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، قَالَ : فَعَدَلَ النَّاسُ إِلَى نِصْفِ صَاعٍ مِنْ بُرٍّ.

2501. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ kişi, qadın, azad, kölə, hamı üçün bir saa xurma və ya bir saa arpa qədər fitrə zəkatını vermələrini əmr etmişdir". İbn Ömər deyir: "Sonrakı dövrlərdə insanlar bunu yarım saa buğdaya bərabər saymış və buğdanın da yarım saa miqdarı zəkat verərdilər".

٣٢- فَرْضُ زَكَاةِ رَمَضَانَ عَلَى الصَّغِيرِ

## 32-ci fəsil: Ramazan fitrəsinin kiçiklərin də verməsinin vacib olması

٢٥٠٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ زَكَاةَ رَمَضَانَ عَلَى كُلِّ صَغِيرٍ وَكَبِيرٍ ، حُرٍّ وَعَبْدٍ ، ذَكَرٍ وَأُنْثَى صَاعًا مِنْ تَمْرٍ أَوْ صَاعًا مِنْ شَعِيرٍ.

2502. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Allah Elçisi ﷺ hər bir böyük və kiçiyə, azad və köləyə, kişi və qadına Ramazan fitrəsini bir saa xurma və ya bir saa arpa vermələrini əmr etmişdir".

### ٣٣- فَرْضُ زَكَاةِ رَمَضَانَ عَلَى الْمُسْلِمِينَ دُونَ الْمُعَاهِدِينَ

### 33-cü fəsil: Ramazan fitrəsinin kafirlərə deyil, yalnız müsəlmanlara vacib olması

٢٥٠٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَضَ زَكَاةَ الْفِطْرِ مِنْ رَمَضَانَ عَلَى النَّاسِ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ عَلَى كُلِّ حُرٍّ أَوْ عَبْدٍ ، ذَكَرٍ أَوْ أُنْثَى مِنَ الْمُسْلِمِينَ.

2503. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ azad, kölə, kişi, qadın bütün müsəlmanlar üçün bir saa xurma və ya bir saa arpa qədər fitrə zəkatını verməyi vacib etmişdir".

٢٥٠٤- أَخْبَرَنَا يَحْيَى بْنُ مُحَمَّدِ بْنِ السَّكَنِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَهْضَمٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ ، عَنْ عُمَرَ بْنِ نَافِعٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ زَكَاةَ الْفِطْرِ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ عَلَى الْحُرِّ وَالْعَبْدِ ، وَالذَّكَرِ وَالأُنْثَى ، وَالصَّغِيرِ وَالْكَبِيرِ مِنَ الْمُسْلِمِينَ ، وَأَمَرَ بِهَا أَنْ تُؤَدَّى قَبْلَ خُرُوجِ النَّاسِ إِلَى الصَّلاَةِ.

2504. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ azad, kölə, kişi, qadın, kiçik, böyük - bütün müsəlmanlar üçün bir saa xurma və ya bir saa arpa qədər fitrə zəkatını vermələrini vacib etmiş və bunu insanların bayram namazına getməmişdən qabaq verilməsini əmr etmişdir".

### ٣٤- كَمْ فَرَضَ ؟

### 34-cü fəsil: Vacib olan miqdar nə qədərdir?

٢٥٠٥- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عِيسَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَدَقَةَ الْفِطْرِ عَلَى الصَّغِيرِ وَالْكَبِيرِ ، وَالذَّكَرِ وَالأُنْثَى ، وَالْحُرِّ وَالْعَبْدِ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ.

2505. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Allah Elçisi ﷺ kiçiyə, böyüyə, kişiyə, qadına, azad olana və köləyə bir saa xurma və ya bir saa arpa qədər fitrə zəkatını verməsini vacib etmişdir".

## ٣٥- بَابُ : فَرْضِ صَدَقَةِ الْفِطْرِ قَبْلَ نُزُولِ الزَّكَاةِ

## 35-ci fəsil: Fitrə zəkatının zəkatın nazil olmasından qabaq vacib edilməsi

٢٥٠٦- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ بْنِ عُتَيْبَةَ ، عَنِ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ ، عَنْ عَمْرِو بْنِ شُرَحْبِيلَ ، عَنْ قَيْسِ بْنِ سَعْدِ بْنِ عُبَادَةَ ، قَالَ : كُنَّا نَصُومُ عَاشُورَاءَ وَنُؤَدِّي زَكَاةَ الْفِطْرِ ، فَلَمَّا نَزَلَ رَمَضَانُ وَنَزَلَتِ الزَّكَاةُ ، لَمْ نُؤْمَرْ بِهِ وَلَمْ نُنْهَ عَنْهُ ، وَكُنَّا نَفْعَلُهُ.

2506. ...Rəvayət edilir ki, Qeys ibn Səd ibn Ubadə ﵁ demişdir: “Biz Aşura orucunu tutar və fitrə zəkatını verərdik. Ramazan ayı olduqda isə zəkat vermək vacib edildi, fitrə zəkatı haqda isə bir əmr və qadağa gəlmədi deyə biz fitrə zəkatını verməyə davam etdik”.

٢٥٠٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنِ الْقَاسِمِ بْنِ مُخَيْمِرَةَ ، عَنْ أَبِي عَمَّارٍ الْهَمْدَانِيِّ ، عَنْ قَيْسِ بْنِ سَعْدٍ ، قَالَ : أَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِصَدَقَةِ الْفِطْرِ قَبْلَ أَنْ تَنْزِلَ الزَّكَاةُ ، فَلَمَّا نَزَلَتِ الزَّكَاةُ لَمْ يَأْمُرْنَا وَلَمْ يَنْهَنَا وَنَحْنُ نَفْعَلُهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : أَبُو عَمَّارٍ اسْمُهُ عَرِيبُ بْنُ حُمَيْدٍ ، وَعَمْرُو بْنُ شُرَحْبِيلَ يُكْنَى أَبَا مَيْسَرَةَ ، وَسَلَمَةُ بْنُ كُهَيْلٍ خَالَفَ الْحَكَمَ فِي إِسْنَادِهِ ، وَالْحَكَمُ أَثْبَتُ مِنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ.

2507. ...Rəvayət edilir ki, Qeys ibn Səd ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə fitrə zəkatını verməyi zəkat vermək vacib edilməmişdən qabaq əmr etmişdi. Zəkat vermək vacib edildikdə fitrə zəkatını vermək və ya verməmək haqda bir şey əmr etmədi. Biz də fitrə zəkatını verməyə davam etdik”.

## ٣٦- مَكِيلَةُ زَكَاةِ الْفِطْرِ

## 36-cı fəsil: Fitrə zəkatının miqdarı

٢٥٠٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنِ الْحَسَنِ ، قَالَ : قَالَ ابْنُ عَبَّاسٍ – وَهُوَ أَمِيرُ الْبَصْرَةِ – فِي آخِرِ الشَّهْرِ أَخْرِجُوا زَكَاةَ صَوْمِكُمْ ، فَنَظَرَ النَّاسُ بَعْضُهُمْ إِلَى بَعْضٍ ، فَقَالَ : مَنْ هَاهُنَا مِنْ أَهْلِ الْمَدِينَةِ قُومُوا فَعَلِّمُوا إِخْوَانَكُمْ فَإِنَّهُمْ لاَ يَعْلَمُونَ أَنَّ هَذِهِ الزَّكَاةَ فَرَضَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى كُلِّ ذَكَرٍ وَأُنْثَى ، حُرٍّ وَمَمْلُوكٍ ، صَاعًا مِنْ شَعِيرٍ أَوْ تَمْرٍ أَوْ نِصْفَ صَاعٍ مِنْ قَمْحٍ ، فَقَامُوا. خَالَفَهُ هِشَامٌ ، فَقَالَ : عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ.

2508. ...Rəvayət edilir ki, Həsən əl-Bəsri ﵀ demişdir: “Bəsrənin valisi olanda İbn Abbas Ramazan ayının sonunda dedi: “Orucunuzun zəkatı olan fitrəni verin”. İnsanlar bir-birinə baxmağa başladılar. İbn Abbas dedi: “Kim Mədinədəndirsə, qalxsın və qardaşlarını öyrətsin, çünki onlar bilmirlər. Bu fitrə zəkatını Allah Elçisi ﷺ bir saa arpa və ya bir saa xurma

və ya yarım saa buğda verilməsini hər bir kişiyə və qadına, azad olana və köləyə vacib etmişdir". Oradakılar da ayağa durdular".[1]

٢٥٠٩– أَخْبَرَنَا عَلِيُّ بْنُ مَيْمُونٍ ، عَنْ مَخْلَدٍ ، عَنْ هِشَامٍ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : ذَكَرَ فِي صَدَقَةِ الْفِطْرِ ، قَالَ : صَاعًا مِنْ بُرٍّ ، أَوْ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ سُلْتٍ.

2509. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ fitrə sədəqəsi haqda demişdir: "Buğdadan bir saa və ya xurmadan bir saa və ya arpadan bir saa və ya yulafdan[2] bir saa verilir".[3]

٢٥١٠– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي رَجَاءٍ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَخْطُبُ عَلَى مِنْبَرِكُمْ – يَعْنِي مِنْبَرَ الْبَصْرَةِ – يَقُولُ : صَدَقَةُ الْفِطْرِ صَاعٌ مِنْ طَعَامٍ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا أَثْبَتُ الثَّلاَثَةِ.

2510. ...Rəvayət edilir ki, Əbu Racə ﵀ demişdir: "Mən sizin minbərinizdən, yəni Bəsrə minbərindən İbn Abbasın belə dediyini eşitmişəm: "Fitrə sədəqəsi bir saa yeyintidən verilir".

## ٣٧– بَابُ : التَّمْرِ فِي زَكَاةِ الْفِطْرِ

## 37-ci fəsil: Fitrə zəkatında xurma verilməsi

٢٥١١– أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا مُحْرِزُ بْنُ الْوَضَّاحِ ، عَنْ إِسْمَعِيلَ وَهُوَ ابْنُ أُمَيَّةَ ، عَنِ الْحَارِثِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي ذُبَابٍ ، عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي سَرْحٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : فَرَضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَدَقَةَ الْفِطْرِ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ أَقِطٍ.

2511. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Allah Elçisi ﷺ fitrə zəkatını bir saa arpadan və ya bir saa xurmadan və ya bir saa qurudulmuş pendirdən verməyi vacib etmişdir".

## ٣٨– الزَّبِيبُ

## 38-ci fəsil: Fitrə zəkatında kişmişin verilməsi

٢٥١٢– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي سَرْحٍ ، عَنْ أَبِي سَعِيدٍ ، قَالَ : كُنَّا نُخْرِجُ زَكَاةَ الْفِطْرِ إِذْ كَانَ فِينَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَاعًا مِنْ طَعَامٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ زَبِيبٍ ، أَوْ صَاعًا مِنْ أَقِطٍ.

---

[1] Hədis zəifdir.
[2] Yulaf - dənindən yarma hazırlanan dənli bitkiyə deyilir.
[3] Hədis zəifdir.

2512. ...Rəvayət edilir ki, Əbu Səid ﵁ demişdir: "Allah Elçisi ﷺ bizimlə birlikdə olduqda ərzaqdan bir saa, və ya arpadan bir saa, və ya xurmadan bir saa, və ya kişmişdən bir saa, və ya qurudulmuş pendirdən bir saa fitrə zəkatı çıxarardıq".

٢٥١٣– أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنْ دَاوُدَ بْنِ قَيْسٍ ، عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي سَعِيدٍ ، قَالَ : كُنَّا نُخْرِجُ صَدَقَةَ الْفِطْرِ إِذْ كَانَ فِينَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَاعًا مِنْ طَعَامٍ ، أَوْ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ أَقِطٍ فَلَمْ نَزَلْ كَذَلِكَ حَتَّى قَدِمَ مُعَاوِيَةُ مِنَ الشَّامِ ، وَكَانَ فِيمَا عَلَّمَ النَّاسَ أَنَّهُ قَالَ : مَا أَرَى مُدَّيْنِ مِنْ سَمْرَاءِ الشَّامِ إِلاَّ تَعْدِلُ صَاعًا مِنْ هَذَا ، قَالَ : فَأَخَذَ النَّاسُ بِذَلِكَ.

2513. ...Rəvayət edilir ki, Əbu Səid ﵁ demişdir: "Allah Elçisi ﷺ bizimlə birlikdə olduqda ərzaqdan bir saa, və ya xurmadan bir saa və ya arpadan bir saa və ya qurudulmuş pendirdən bir saa fitrə zəkatı çıxarardıq. Müaviyə Şamdan gələn dövrə qədər bir dəyişiklik olmadı. Müaviyə insanlara öyrədərək belə dedi: "İki mudd Şam buğdası bu verilənlərə bərabərdir". İnsanlar da buğda üçün bu ölçünü əsas götürdülər".

## ٣٩– الدَّقِيقُ

## 39-cu fəsil: Fitrə zəkatında un verilməsi

٢٥١٤– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، قَالَ : سَمِعْتُ عِيَاضَ بْنَ عَبْدِ اللهِ ، يُخْبِرُ عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : لَمْ نُخْرِجْ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلاَّ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ زَبِيبٍ ، أَوْ صَاعًا مِنْ دَقِيقٍ ، أَوْ صَاعًا مِنْ أَقِطٍ ، أَوْ صَاعًا مِنْ سُلْتٍ ثُمَّ شَكَّ سُفْيَانُ ، فَقَالَ : دَقِيقٍ أَوْ سُلْتٍ.

2514. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Biz Allah Elçisinin ﷺ dövründə xurmadan bir saa və ya arpadan bir saa və ya kişmişdən bir saa və ya undan bir saa və ya qurudulmuş pendirdən və ya yulafdan bir saa fitrə zəkatı çıxarardıq". Süfyan dəqiq yadda saxlamayaraq dedi: "Ya un, ya da yulafdan".[1]

## ٤٠– الْحِنْطَةُ

## 40-cı fəsil: Fitrə zəkatında buğda verilməsi

٢٥١٥– أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنِ الْحَسَنِ ، أَنَّ ابْنَ عَبَّاسٍ ، خَطَبَ بِالْبَصْرَةِ فَقَالَ : أَدُّوا زَكَاةَ صَوْمِكُمْ ، فَجَعَلَ النَّاسُ يَنْظُرُ بَعْضُهُمْ إِلَى بَعْضٍ ، فَقَالَ : مَنْ هَاهُنَا مِنْ أَهْلِ الْمَدِينَةِ قُومُوا إِلَى إِخْوَانِكُمْ فَعَلِّمُوهُمْ ، فَإِنَّهُمْ لاَ يَعْلَمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَضَ صَدَقَةَ الْفِطْرِ عَلَى الصَّغِيرِ وَالْكَبِيرِ ، وَالْحُرِّ وَالْعَبْدِ ، وَالذَّكَرِ وَالأُنْثَى نِصْفَ صَاعِ بُرٍّ ، أَوْ

---

[1] Hədisdə olan "ya un" hissəsi zəfidir.

صَاعًا مِنْ تَمْرٍ أَوْ شَعِيرٍ قَالَ الْحَسَنُ : فَقَالَ عَلِيٌّ : أَمَّا إِذَا أَوْسَعَ اللَّهُ فَأَوْسِعُوا أَعْطُوا صَاعًا مِنْ بُرٍّ أَوْ غَيْرِهِ.

2515. ...Həsən əl-Bəsri ﷺ rəvayət edir ki, bir dəfə İbn Abbas Bəsrədə xütbə dedi: "Orucunuzun zəkatını verin!" İnsanlar bir-birinə baxmağa başladılar. İbn Abbas dedi: "Burada Mədinədən olanlar haradadır?! Qalxın qardaşlarınızı öyrədin, çünki onlar bilmirlər. Həqiqətən, Allah Elçisi ﷺ fitr sədəqəsini yarım saa buğdadan, bir saa xurma və ya arpadan verilməsini kiçik, böyük, azad, kölə, kişi və qadın hamıya vacib etmişdir". Həsən deyir ki, Əli belə dedi: "Əgər Allah sizə bol nemət verirsə, siz də buğda və digər şeylərdən bol verin".[1]

٤١ – السُّلْتُ

## 41-ci fəsil: Fitrə zəkatında yulaf verilməsi

٢٥١٦– أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي رَوَّادٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : كَانَ النَّاسُ يُخْرِجُونَ عَنْ صَدَقَةِ الْفِطْرِ فِي عَهْدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَاعًا مِنْ شَعِيرٍ أَوْ تَمْرٍ أَوْ سُلْتٍ أَوْ زَبِيبٍ.

2516. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "İnsanlar Peyğəmbərin ﷺ dövründə fitrə sədəqəsini bir saa arpa və ya xurma və ya yulafdan çıxarardılar".

٤٢ – الشَّعِيرُ

## 42-ci fəsil: Fitrə zəkatında arpa verilməsi

٢٥١٧– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ قَيْسٍ ، قَالَ : حَدَّثَنَا عِيَاضٌ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : كُنَّا نُخْرِجُ فِي عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَاعًا مِنْ شَعِيرٍ أَوْ تَمْرٍ أَوْ زَبِيبٍ أَوْ أَقِطٍ ، فَلَمْ نَزَلْ كَذَلِكَ حَتَّى كَانَ فِي عَهْدِ مُعَاوِيَةَ ، قَالَ : مَا أَرَى مُدَّيْنِ مِنْ سَمْرَاءِ الشَّامِ إِلاَّ تَعْدِلُ صَاعًا مِنْ شَعِيرٍ.

2517. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Biz Allah Elçisinin ﷺ dövründə fitrəni bir saa arpadan, kişmişdən və ya qurumuş pendirdən çıxarardıq. Bu, Müaviyənin dövrünə qədər beləcə davam etdi. Müaviyə dedi: "Mənə qalsa, iki mud Şam buğdası bir saa arpaya bərabərdir".

٤٣ – الأَقِطُ

## 43-cü fəsil: Qurumuş pendirdən fitrə zəkatının verilməsi

٢٥١٨– أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُثْمَانَ ، أَنَّ عِيَاضَ بْنَ عَبْدِ اللهِ بْنِ

[1] Hədisin isnadı zəifdir.

سَعْدٍ ، حَدَّثَهُ أَنَّ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ ، قَالَ : كُنَّا نُخْرِجُ فِي عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَاعًا مِنْ تَمْرٍ ، أَوْ صَاعًا مِنْ شَعِيرٍ ، أَوْ صَاعًا مِنْ أَقِطٍ لاَ نُخْرِجُ غَيْرَهُ.

2518. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Biz Allah Elçisinin ﷺ dövründə fitrəni bir saa xurmadan, arpadan və ya qurumuş pendirdən çıxarardıq. Bundan başqası ilə çıxarmazdıq".

### ٤٤- كَمِ الصَّاعُ

### 44-cü fəsil: Bir saa nə qədərdir?

٢٥١٩- أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : أَنْبَأَنَا الْقَاسِمُ وَهُوَ ابْنُ مَالِكٍ ، عَنِ الْجُعَيْدِ ، سَمِعْتُ السَّائِبَ بْنَ يَزِيدَ ، قَالَ : كَانَ الصَّاعُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُدًّا وَثُلُثًا بِمُدِّكُمُ الْيَوْمَ وَقَدْ زِيدَ فِيهِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَحَدَّثَنِيهِ زِيَادُ بْنُ أَيُّوبَ.

2519. ...Rəvayət edilir ki, əs-Saib ibn Yəzid ﷺ demişdir: "Allah Elçisinin ﷺ dövründə bir saa sizin (bugünkü) bir mudd və üçdəbiri qədər idi".

٢٥٢٠- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ حَنْظَلَةَ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْمِكْيَالُ مِكْيَالُ أَهْلِ الْمَدِينَةِ وَالْوَزْنُ وَزْنُ أَهْلِ مَكَّةَ.

2520. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Ölçü vahidlərində əsas olan Mədinə ölçü vahidləridir. Çəki vahidlərində isə əsas olan Məkkə çəki vahidləridir".

### ٤٥- بَابُ الْوَقْتِ الَّذِي يُسْتَحَبُّ أَنْ تُؤَدَّى صَدَقَةُ الْفِطْرِ فِيهِ

### 45-ci fəsil: Fitrə sədəqəsini verməyin müstəhəb olan vaxtı

٢٥٢١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْدَانَ بْنِ عِيسَى ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ ، حَدَّثَنَا زُهَيْرٌ ، حَدَّثَنَا مُوسَى (ح) قَالَ : وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ ، قَالَ : حَدَّثَنَا مُوسَى ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ بِصَدَقَةِ الْفِطْرِ ، أَنْ تُؤَدَّى قَبْلَ خُرُوجِ النَّاسِ إِلَى الصَّلاَةِ قَالَ ابْنُ بَزِيعٍ : بِزَكَاةِ الْفِطْرِ.

2521. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ fitr sədəqəsini insanlar bayram namazını bitirməmiş verməyi əmr etmişdir.

### ٤٦- إِخْرَاجُ الزَّكَاةِ مِنْ بَلَدٍ إِلَى بَلَدٍ

### 46-cı fəsil: Zəkatın bir bölgədən başqa bölgəyə aparılması

٢٥٢٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا بْنُ إِسْحَاقَ ، وَكَانَ ثِقَةً ، عَنْ يَحْيَى بْنِ عَبْدِ

اللهِ بْنِ صَيْفِيٍّ ، عَنْ أَبِي مَعْبَدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعَثَ مُعَاذَ بْنَ جَبَلٍ إِلَى الْيَمَنِ فَقَالَ : إِنَّكَ تَأْتِي قَوْمًا أَهْلَ كِتَابٍ فَادْعُهُمْ إِلَى شَهَادَةِ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنِّي رَسُولُ اللهِ ، فَإِنْ هُمْ أَطَاعُوكَ ، فَأَعْلِمْهُمْ أَنَّ اللهَ عَزَّ وَجَلَّ افْتَرَضَ عَلَيْهِمْ : خَمْسَ صَلَوَاتٍ فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ ، فَإِنْ هُمْ أَطَاعُوكَ ، فَأَعْلِمْهُمْ أَنَّ اللهَ عَزَّ وَجَلَّ قَدِ افْتَرَضَ عَلَيْهِمْ صَدَقَةً فِي أَمْوَالِهِمْ ، تُؤْخَذُ مِنْ أَغْنِيَائِهِمْ ، فَتُوضَعُ فِي فُقَرَائِهِمْ ، فَإِنْ هُمْ أَطَاعُوكَ لِذَلِكَ ، فَإِيَّاكَ وَكَرَائِمَ أَمْوَالِهِمْ ، وَاتَّقِ دَعْوَةَ الْمَظْلُومِ ، فَإِنَّهَا لَيْسَ بَيْنَهَا وَبَيْنَ اللهِ عَزَّ وَجَلَّ حِجَابٌ.

2522. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Muaz ibn Cəbəli Yəmənə göndərərkən ona belə buyurdu: "Sən Kitab əhlindən olan bir qövmün yanına gedirsən. Onları Allahdan başqa ibadətə layiq haqq məbudun olmadığına və mənim Allahın elçisi olduğuma şəhadət verməyə dəvət et. Əgər bu işdə sənə itaət etsələr, onlara xəbər ver ki, Allah ﷻ onlara gündəlik olaraq beş vaxt namaz qılmağı vacib buyurmuşdur. Əgər bu işdə sənə itaət etsələr, onları xəbərdar et ki, Allah ﷻ onlara zəkat verməyi, varlılarından götürülüb kasıblarına paylanılmasını vacib buyurmuşdur. Əgər bu işdə də sənə itaət etsələr, onda onların mallarının ən qiymətlisini götürməkdən çəkin və məzlumun bəddüasından qorx. Çünki onunla Allah ﷻ arasında (bu bədduanın qarşısını ala biləcək) heç bir pərdə yoxdur".

## ٤٧- بَابُ إِذَا أَعْطَاهَا غَنِيًّا وَهُوَ لاَ يَشْعُرُ

## 47-ci fəsil: Bilmədən varlı adama zəkat vermək

٢٥٢٣- أَخْبَرَنَا عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : حَدَّثَنِي أَبُو الزِّنَادِ ، مِمَّا حَدَّثَهُ عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، مِمَّا ذَكَرَ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يُحَدِّثُ بِهِ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : قَالَ رَجُلٌ : لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدِ سَارِقٍ ، فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ عَلَى سَارِقٍ ، فَقَالَ : اللَّهُمَّ لَكَ الْحَمْدُ عَلَى سَارِقٍ ، لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ ، فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدِ زَانِيَةٍ ، فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ اللَّيْلَةَ عَلَى زَانِيَةٍ ، فَقَالَ : اللَّهُمَّ لَكَ الْحَمْدُ عَلَى زَانِيَةٍ ، لأَتَصَدَّقَنَّ بِصَدَقَةٍ ، فَخَرَجَ بِصَدَقَتِهِ فَوَضَعَهَا فِي يَدِ غَنِيٍّ ، فَأَصْبَحُوا يَتَحَدَّثُونَ تُصُدِّقَ عَلَى غَنِيٍّ ، قَالَ : اللَّهُمَّ لَكَ الْحَمْدُ عَلَى زَانِيَةٍ ، وَعَلَى سَارِقٍ ، وَعَلَى غَنِيٍّ ، فَأُتِيَ فَقِيلَ لَهُ : أَمَّا صَدَقَتُكَ فَقَدْ تُقُبِّلَتْ ، أَمَّا الزَّانِيَةُ فَلَعَلَّهَا أَنْ تَسْتَعِفَّ بِهِ مِنْ زِنَاهَا ، وَلَعَلَّ السَّارِقَ أَنْ يَسْتَعِفَّ بِهِ عَنْ سَرِقَتِهِ ، وَلَعَلَّ الْغَنِيَّ أَنْ يَعْتَبِرَ فَيُنْفِقَ مِمَّا أَعْطَاهُ اللَّهُ عَزَّ وَجَلَّ.

2523. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bir nəfər: "Mən mütləq sədəqə verəcəyəm"– dedi, sonra da (verəcəyi) sədəqəni götürüb (evdən) çıxdı və (özü də bilmədən) onu bir oğruya verdi. Səhər açıldıqda insanlar: "Oğruya sədəqə verilmişdir"– deyə danışmağa başladılar. Bu adam: "Allahım, həmd Sənə məxsusdur! Mən yenə sədəqə verəcəyəm"– dedi, sonra verəcəyi sədəqəni götürüb (evdən) çıxdı və (bilmədən) onu zinakar bir qadına verdi. Səhər açıldıqda insanlar: "Bu gecə

zinakar qadına sədəqə verilmişdir”– deyə danışmağa başladılar. Adam: “Allahım, həmd Sənə məxsusdur! (Verdiyim sədəqə) zinakar qadına çatdı. Mən yenə sədəqə verəcəyəm”– dedi, sonra sədəqəni götürüb (evdən) çıxdı və (bilmədən) onu varlı bir adama verdi. Səhər açıldıqda insanlar: “Varlıya sədəqə verilmişdir”– deyə danışmağa başladılar. Adam dedi: “Allahım, həmd Sənə məxsusdur! (Verdiyim sədəqələr) oğruya, zinakara və varlıya qismət oldu”. Bundan sonra bir nəfər onun yanına gəlib dedi: “Sənin sədəqən qəbil oldu. Zinakar qadına gəldikdə, ola bilsin ki, o, (ibrət alıb) zinakarlığına son qoysun. Oğruya verdiyin sədəqəyə gəlincə isə, ola bilsin ki, o, (bundan ibrət alsın) və oğurluq etməkdən əl çəksin. O ki qaldı varlı adama, ola bilsin ki, o, (bundan) ibrət alsın və Allahın ﷻ ona verdiyi nemətlərdən (Onun yolunda) xərcləsin”.

### ٤٨– بَابُ الصَّدَقَةِ مِنْ غُلُولٍ

### 48-ci fəsil: Oğurluq maldan verilən zəkat

٢٥٢٤– أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ مُحَمَّدٍ الذَّارِعُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : وَأَنْبَأَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ وَهُوَ ابْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ – وَاللَّفْظُ لِبِشْرٍ – عَنْ قَتَادَةَ ، عَنْ أَبِي الْمَلِيحِ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ لاَ يَقْبَلُ صَلاَةً بِغَيْرِ طُهُورٍ ، وَلاَ صَدَقَةً مِنْ غُلُولٍ.

2524. ...Əbul-Məlih atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Həqiqətən, Allah təmizlənmədən qılınan namazı və oğurluqla əldə edilən maldan verilən zəkatı qəbul etməz”.

٢٥٢٥– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ سَعِيدِ بْنِ يَسَارٍ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا تَصَدَّقَ أَحَدٌ بِصَدَقَةٍ مِنْ طَيِّبٍ ، وَلاَ يَقْبَلُ اللَّهُ عَزَّ وَجَلَّ إِلاَّ الطَّيِّبَ ، إِلاَّ أَخَذَهَا الرَّحْمَنُ عَزَّ وَجَلَّ بِيَمِينِهِ ، وَإِنْ كَانَتْ تَمْرَةً ، فَتَرْبُو فِي كَفِّ الرَّحْمَنِ ، حَتَّى تَكُونَ أَعْظَمَ مِنَ الْجَبَلِ ، كَمَا يُرَبِّي أَحَدُكُمْ فَلُوَّهُ ، أَوْ فَصِيلَهُ.

2525. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim halal yolla qazandığı malından sədəqə verərsə, – Allah ancaq halal olanı qəbul edir – bu, bir xurma olsa belə ər-Rahmən onu sağ Əli ilə qəbul edər. Bu sədəqə ər-Rahmənin ovucunda, sizin dayçanı və ya dəvə balasını bəsləyərək böyütdüyünüz kimi dağdan böyük olana qədər böyüyər”.

## ٤٩ – جُهْدُ الْمُقِلِّ

## 49-cu fəsil: Sədəqə imkana görə verilir

٢٥٢٦– أَخْبَرَنَا عَبْدُ الْوَهَّابِ بْنُ عَبْدِ الْحَكَمِ ، عَنْ حَجَّاجٍ ، قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي عُثْمَانُ بْنُ أَبِي سُلَيْمَانَ ، عَنْ عَلِيٍّ الأَزْدِيِّ ، عَنْ عُبَيْدِ بْنِ عُمَيْرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ حُبْشِيٍّ الْخَثْعَمِيِّ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُئِلَ أَيُّ الأَعْمَالِ أَفْضَلُ ؟ قَالَ : إِيمَانٌ لاَ شَكَّ فِيهِ ، وَجِهَادٌ لاَ غُلُولَ فِيهِ ، وَحَجَّةٌ مَبْرُورَةٌ قِيلَ : فَأَيُّ الصَّلاَةِ أَفْضَلُ ؟ قَالَ : طُولُ الْقُنُوتِ قِيلَ : فَأَيُّ الصَّدَقَةِ أَفْضَلُ ؟ قَالَ : جُهْدُ الْمُقِلِّ قِيلَ : فَأَيُّ الْهِجْرَةِ أَفْضَلُ ؟ قَالَ : مَنْ هَجَرَ مَا حَرَّمَ اللهُ عَزَّ وَجَلَّ قِيلَ : فَأَيُّ الْجِهَادِ أَفْضَلُ ؟ قَالَ : مَنْ جَاهَدَ الْمُشْرِكِينَ بِمَالِهِ ، وَنَفْسِهِ قِيلَ : فَأَيُّ الْقَتْلِ أَشْرَفُ ؟ قَالَ : مَنْ أُهَرِيقَ دَمُهُ ، وَعُقِرَ جَوَادُهُ.

2526. ...Abdullah ibn Hubşi əl-Xasami ﷺ rəvayət edir ki, Peyğəmbərə ﷺ hansı əməlin daha fəzilətli olması haqda sual verildi. Peyğəmbər ﷺ buyurdu: "İçində heç bir şübhə olmayan iman, qənimətdən oğurluq edilməyərək edilən cihad və qəbul olunmuş həcc". Sonra deyildi: Bəs ən fəzilətli namaz hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Qunutu uzun olan namaz". Sonra deyildi: "Bəs ən fəzilətli sədəqə hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Vəziyyətə görə verilən sədəqə". Sonra deyildi: "Bəs ən fəzilətli hicrət hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Allahın ﷻ haramlarından uzaqlaşmaq". Sonra deyildi: "Bəs ən fəzilətli cihad hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Müşriklərə qarşı malı və canı ilə edilən cihad". Sonra deyildi: "Bəs ən şərəfli ölüm hansıdır?" Peyğəmbər ﷺ buyurdu: "Qanı axıdılıb atı kəsilib öldürülməkdir".

٢٥٢٧– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، وَالْقَعْقَاعُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : سَبَقَ دِرْهَمٌ مِئَةَ أَلْفِ دِرْهَمٍ قَالُوا : وَكَيْفَ ؟ قَالَ : كَانَ لِرَجُلٍ دِرْهَمَانِ تَصَدَّقَ بِأَحَدِهِمَا ، وَانْطَلَقَ رَجُلٌ إِلَى عُرْضِ مَالِهِ ، فَأَخَذَ مِنْهُ مِئَةَ أَلْفِ دِرْهَمٍ فَتَصَدَّقَ بِهَا.

2527. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bir dirhəm yüz min dirhəmi qabaqladı". Səhabələr dedilər: "Bu necə olur?" Allah Elçisi ﷺ buyurdu: "Bir kişinin iki dirhəmi var, o da bunlardan birini sədəqə verir. Bir kişinin də çoxlu mal-dövləti var, ondan götürüb yüz min dirhəmini sədəqə verir".

٢٥٢٨– أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا صَفْوَانُ بْنُ عِيسَى ، قَالَ : حَدَّثَنَا ابْنُ عَجْلاَنَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَبَقَ دِرْهَمٌ مِئَةَ أَلْفٍ قَالُوا : يَا رَسُولَ اللهِ وَكَيْفَ ؟ قَالَ : رَجُلٌ لَهُ دِرْهَمَانِ فَأَخَذَ أَحَدَهُمَا فَتَصَدَّقَ بِهِ ، وَرَجُلٌ لَهُ مَالٌ كَثِيرٌ فَأَخَذَ مِنْ عُرْضِ مَالِهِ مِئَةَ أَلْفٍ ، فَتَصَدَّقَ بِهَا.

2528. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bir dirhəm yüz mini qabaqladı”. Səhabələr dedilər: “Ey Allahın Elçisi, bu necə olur?” Allah Elçisi ﷺ buyurdu: “Bir kişinin iki dirhəmi var, o da bunlardan birini götürüb sədəqə verir. Bir kişinin də çoxlu mal-dövləti var, ondan götürüb yüz min dirhəmini sədəqə verir”

٢٥٢٩– أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنِ الْحُسَيْنِ ، عَنْ مَنْصُورٍ ، عَنْ شَقِيقٍ ، عَنْ أَبِي مَسْعُودٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَأْمُرُنَا بِالصَّدَقَةِ فَمَا يَجِدُ أَحَدُنَا شَيْئًا يَتَصَدَّقُ بِهِ حَتَّى يَنْطَلِقَ إِلَى السُّوقِ ، فَيَحْمِلَ عَلَى ظَهْرِهِ ، فَيَجِيءَ بِالْمُدِّ فَيُعْطِيَهُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِنِّي لأَعْرِفُ الْيَوْمَ رَجُلاً لَهُ مِئَةُ أَلْفٍ مَا كَانَ لَهُ يَوْمَئِذٍ دِرْهَمٌ.

2529. ...Rəvayət edilir ki, Əbu Məsud ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə sədəqə verməyimizi əmr edər, bir çoxumuz da sədəqə verməyə bir şey tapmazdı. Lakin bazara gedərək etdiyi hamballığın əvəzi olaraq bir mudd əldə edər və onu sədəqə olaraq Allah Elçisinə ﷺ verərdik. Baxıram ki, o gün bir dirhəmi olmayanların, bu gün yüz minləri var”.

٢٥٣٠– أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ أَبِي مَسْعُودٍ ، قَالَ : لَمَّا أَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالصَّدَقَةِ ، فَتَصَدَّقَ أَبُو عَقِيلٍ بِنِصْفِ صَاعٍ ، وَجَاءَ إِنْسَانٌ بِشَيْءٍ أَكْثَرَ مِنْهُ ، فَقَالَ الْمُنَافِقُونَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ لَغَنِيٌّ عَنْ صَدَقَةِ هَذَا ، وَمَا فَعَلَ هَذَا الآخَرُ ، إِلاَّ رِيَاءً ، فَنَزَلَتْ : **{الَّذِينَ يَلْمِزُونَ الْمُطَّوِّعِينَ مِنَ الْمُؤْمِنِينَ فِي الصَّدَقَاتِ وَالَّذِينَ لاَ يَجِدُونَ إِلاَّ جُهْدَهُمْ}**.

2530. ...Rəvayət edilir ki, Əbu Məsud ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə sədəqə verməyi əmr etdikdə, Əbu Aqil yarım saa sədəqə verdi. Başqası isə ondan çox verdikdə münafiqlər dedilər: “Həqiqətən, Allah ﷻ varlıdır və sədəqəyə ehtiyacı yoxdur”. Sonra verən üçün isə dedilər: “O riya edir”. Sonra bu ayə nazil edildi: **“Möminlərdən könüllü surətdə sədəqə verənlərə və çətinliklə tapdıqlarını verənlərə eyib tutanları, onları məsxərəyə qoyanları, Allah məsxərəyə qoyacaqdır”** (ət-Tövbə, 79)”.

## ٥٠– الْيَدُ الْعُلْيَا

## 50-ci fəsil: Verən əl daha üstündür

٢٥٣١– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي سَعِيدٌ ، وَعُرْوَةُ ، سَمِعَا حَكِيمَ بْنَ حِزَامٍ ، يَقُولُ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ فَأَعْطَانِي ، ثُمَّ قَالَ : إِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ ، فَمَنْ أَخَذَهُ بِطِيبِ نَفْسٍ ، بُورِكَ لَهُ فِيهِ ، وَمَنْ أَخَذَهُ بِإِشْرَافِ نَفْسٍ ، لَمْ يُبَارَكْ لَهُ فِيهِ ، وَكَانَ كَالَّذِي يَأْكُلُ وَلاَ يَشْبَعُ ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى.

2531. ...Rəvayət edilir ki, Həkim ibn Hizam ﵁ demişdir: “Mən Allah Elçisindən ﷺ dünya malı istədim, verdi. Sonra yenə istədim, yenə verdi. Sonra yenə istədim, yenə verdi, sonra buyurdu: “Bu dünya malı göz-oxşayan və şirindir. Kim təmiz nəfs ilə götürərsə, onun üçün bərəkətli olar. Kim də acgözlüklə götürərsə, onun üçün bərəkətli olmaz. Belələri yeyib doymayan şəxslər kimidir. Verən əl alan əldən daha xeyirlidir”.

٥١- بَابُ أَيَّتُهُمَا الْيَدُ الْعُلْيَا

## 51-ci fəsil: Daha üstün olan əl

٢٥٣٢- أَخْبَرَنَا يُوسُفُ بْنُ عِيسَى ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زِيَادِ بْنِ أَبِي الْجَعْدِ ، عَنْ جَامِعِ بْنِ شَدَّادٍ ، عَنْ طَارِقٍ الْمُحَارِبِيِّ ، قَالَ : قَدِمْنَا الْمَدِينَةَ فَإِذَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمٌ عَلَى الْمِنْبَرِ يَخْطُبُ النَّاسَ وَهُوَ يَقُولُ : يَدُ الْمُعْطِي الْعُلْيَا ، وَابْدَأْ بِمَنْ تَعُولُ : أُمَّكَ ، وَأَبَاكَ ، وَأُخْتَكَ ، وَأَخَاكَ ، ثُمَّ أَدْنَاكَ ، أَدْنَاكَ مُخْتَصَرٌ.

2532. ...Rəvayət edilir ki, Tariq əl-Muharibi ﵁ demişdir: “Biz Mədinəyə gəldikdə Allah Elçisi ﷺ minbərdə insanlara xütbə deyərək belə buyurdu: “Verən əl daha üstündür. Sənin himayəndə olanlardan - anandan, atandan, bacından, qardaşından, sonra sənə yaxın olanlardan başla”.

٥٢- الْيَدُ السُّفْلَى

## 52-ci fəsil: Alan əl

٢٥٣٣- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ وَهُوَ يَذْكُرُ الصَّدَقَةَ ، وَالتَّعَفُّفَ عَنِ الْمَسْأَلَةِ : الْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى ، وَالْيَدُ الْعُلْيَا الْمُنْفِقَةُ ، وَالْيَدُ السُّفْلَى السَّائِلَةُ.

2533. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ sədəqə vermək və istəmək haqda belə buyurdu: “Verən əl alan əldən daha xeyirlidir. Üstün olan əl sədəqəni verən əldir. Alan əl isə istəyən əldir”.

٥٣- الصَّدَقَةُ عَنْ ظَهْرِ غِنًى

## 53-cü fəsil: Sədəqə, onu verən adamı çətinliyə salmayan sədəqədir

٢٥٣٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَيْرُ الصَّدَقَةِ : مَا كَانَ عَنْ ظَهْرِ غِنًى ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى ، وَابْدَأْ بِمَنْ تَعُولُ.

2534. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu:

"Xeyirli olan sədəqə onu verəni çətinliyə salmayan sədəqədir. Verən əl alan əldən daha xeyirlidir. Sənin himayəndə olanlardan başla".

## ٥٤– تَفْسِيرُ ذَلِكَ

## 54-cü fəsil: Bunun izahı

٢٥٣٥– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَصَدَّقُوا فَقَالَ رَجُلٌ : يَا رَسُولَ اللهِ عِنْدِي دِينَارٌ ، قَالَ : تَصَدَّقْ بِهِ عَلَى نَفْسِكَ قَالَ : عِنْدِي آخَرُ ، قَالَ : تَصَدَّقْ بِهِ عَلَى زَوْجَتِكَ قَالَ : عِنْدِي آخَرُ ، قَالَ : تَصَدَّقْ بِهِ عَلَى وَلَدِكَ قَالَ : عِنْدِي آخَرُ ، قَالَ : تَصَدَّقْ بِهِ عَلَى خَادِمِكَ قَالَ : عِنْدِي آخَرُ ، قَالَ : أَنْتَ أَبْصَرُ.

2535. Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sədəqə verin!" Bir kişi dedi: "Ey Allahın Elçisi, mənim bir dinarım var". Peyğəmbər ﷺ buyurdu: "Onu özünə xərclə". O kişi dedi: "Məndə bir dinar da var". Peyğəmbər ﷺ buyurdu: "Onu zövcənə xərclə". Kişi dedi: "Məndə biri  də var". Peyğəmbər ﷺ buyurdu: "Onu uşağına xərclə". Kişi dedi: "Məndə biri də var". Peyğəmbər ﷺ buyurdu: "Onu xidmətçinə xərclə". Kişi dedi: "Məndə biri də var". Peyğəmbər ﷺ buyurdu: "Onu artıq sən bilirsən".

## ٥٥– بَابُ إِذَا تَصَدَّقَ وَهُوَ مُحْتَاجٌ إِلَيْهِ ، هَلْ يُرَدُّ عَلَيْهِ ؟

## 55-ci fəsil: Ehtiyacı olan adam sədəqə verərsə, bu sədəqə ona qaytarılırmı?

٢٥٣٦– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ عَجْلاَنَ ، عَنْ عِيَاضٍ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَجُلاً دَخَلَ الْمَسْجِدَ يَوْمَ الْجُمُعَةِ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ فَقَالَ : صَلِّ رَكْعَتَيْنِ ثُمَّ جَاءَ الْجُمُعَةَ الثَّانِيَةَ ، وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ ، فَقَالَ : صَلِّ رَكْعَتَيْنِ ثُمَّ جَاءَ الْجُمُعَةَ الثَّالِثَةَ ، فَقَالَ : صَلِّ رَكْعَتَيْنِ ثُمَّ قَالَ : تَصَدَّقُوا فَتَصَدَّقُوا ، فَأَعْطَاهُ ثَوْبَيْنِ ثُمَّ قَالَ : تَصَدَّقُوا فَطَرَحَ أَحَدَ ثَوْبَيْهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَلَمْ تَرَوْا إِلَى هَذَا ، أَنَّهُ دَخَلَ الْمَسْجِدَ بِهَيْئَةٍ بَذَّةٍ فَرَجَوْتُ أَنْ تَفْطِنُوا لَهُ ، فَتَتَصَدَّقُوا عَلَيْهِ ، فَلَمْ تَفْعَلُوا ، فَقُلْتُ : تَصَدَّقُوا ، فَتَصَدَّقْتُمْ فَأَعْطَيْتُهُ ثَوْبَيْنِ ، ثُمَّ قُلْتُ : تَصَدَّقُوا ، فَطَرَحَ أَحَدَ ثَوْبَيْهِ ، خُذْ ثَوْبَكَ ، وَانْتَهَرَهُ.

2536. ...Əbu Səid ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ cümə günü xütbə deyərkən bir kişi məscidə daxil oldu. Allah Elçisi ﷺ buyurdu: "İki rükət namaz qıl!" Sonra növbəti cümə olduqda Allah Elçisi ﷺ xütbə deyərkən yenə o kişi gəldi və Allah Elçisi ﷺ ona buyurdu: "İki rükət namaz qıl!" Sonra üçüncü cümədə o kişi gəldi və Allah Elçisi ﷺ buyurdu: "İki rükət namaz qıl!" Sonra dedi: "(Bu adama) sədəqə verin!" Biz ona iki paltar

verdik. Allah Elçisi ﷺ yenə buyurdu: "(Ona) sədəqə verin!" Həmin adam da ona verilən iki paltardan birini çıxartdı. Allah Elçisi ﷺ buyurdu: "Onun məscidə pis paltarla gəldiyini görmürsünüz!? Sizin sədəqə verəcəyinizi zənn etmişdim, lakin bunu etmədiniz. Mən "Sədəqə verin!" dedim, ondan sonra sədəqə olaraq iki paltar verdiniz. Sonra "Sədəqə verin!" dedim, o adam da paltarlarından birini çıxarıb sədəqə olaraq verdi". Allah Elçisi ﷺ həmin adama buyurdu: "Paltarını geri götür!"

## ٥٦- صَدَقَةُ الْعَبْدِ

## 56-cı fəsil: Kölənin verdiyi sədəqə

٢٥٣٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَاتِمٌ ، عَنْ يَزِيدَ بْنِ أَبِي عُبَيْدٍ ، قَالَ : سَمِعْتُ عُمَيْرًا مَوْلَى آبِي اللَّحْمِ ، قَالَ : أَمَرَنِي مَوْلاَيَ أَنْ أُقَدِّدَ لَحْمًا ، فَجَاءَ مِسْكِينٌ ، فَأَطْعَمْتُهُ مِنْهُ ، فَعَلِمَ بِذَلِكَ مَوْلاَيَ فَضَرَبَنِي ، فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَدَعَاهُ ، فَقَالَ : لِمَ ضَرَبْتَهُ فَقَالَ : يُطْعِمُ طَعَامِي بِغَيْرِ أَنْ آمُرَهُ – وَقَالَ مَرَّةً أُخْرَى : بِغَيْرِ أَمْرِي – قَالَ : الأَجْرُ بَيْنَكُمَا.

2537. ...Rəvayət edilir ki, Yəzid ibn Əbu Ubeyd ﷺ demişdir: "Mən Əbu əl-Ləhmin köləlikdən azad etdiyi Umeyrin belə dediyini eşitmişəm: "Mənim ağam qurutmağım üçün mənə ət doğramağı əmr etdi. Bu arada bir kasıb gəldi, mən də o ətdən həmin kasıba verdim. Bunu bilən ağam məni vurdu. Mən də Allah Elçisinin ﷺ yanına getdim. Peyğəmbər ﷺ ağamı çağırtdırıb: "Onu niyə vurmusan?"- dedi. Ağam: "Mənim icazəm olmadan azuqəmi başqasına verir"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Onun verdiyinin mükafatı hər ikinizə də aiddir".

٢٥٣٨- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي ابْنُ أَبِي بُرْدَةَ ، قَالَ : سَمِعْتُ أَبِي يُحَدِّثُ ، عَنْ أَبِي مُوسَى ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : عَلَى كُلِّ مُسْلِمٍ صَدَقَةٌ قِيلَ : أَرَأَيْتَ إِنْ لَمْ يَجِدْهَا ؟ قَالَ : يَعْتَمِلُ بِيَدِهِ ، فَيَنْفَعُ نَفْسَهُ ، وَيَتَصَدَّقُ قِيلَ : أَرَأَيْتَ إِنْ لَمْ يَفْعَلْ ؟ قَالَ : يُعِينُ ذَا الْحَاجَةِ الْمَلْهُوفَ قِيلَ : فَإِنْ لَمْ يَفْعَلْ ؟ قَالَ : يَأْمُرُ بِالْخَيْرِ قِيلَ : أَرَأَيْتَ إِنْ لَمْ يَفْعَلْ ؟ قَالَ : يُمْسِكُ عَنِ الشَّرِّ ، فَإِنَّهَا صَدَقَةٌ.

2538. ...Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Hər bir müsəlman sədəqə verməlidir". Ona deyildi: "Bəs (sədəqə verməyə) bir şey tapmasa necə?" Peyğəmbər ﷺ dedi: "Öz əlləri ilə işləyib qazansın və (bu qazancından) həm özü faydalansın, həm də (başqalarına) sədəqə versin". Ona deyildi: "Bəs bunu edə bilməsə necə?" Peyğəmbər ﷺ dedi: "Ehtiyacı olan çarəsiz adama kömək etsin". Ona deyildi: "Bunu da edə bilməsə necə?" Peyğəmbər ﷺ dedi: "Xeyrə təşviq etsin". Ona deyildi: "Bunu da edə

bilməsə necə?" Peyğəmbər ﷺ buyurdu: "Şər əməllərdən çəkinsin. Həqiqətən də, bu onun üçün sədəqə olar".

### ٥٧– صَدَقَةُ الْمَرْأَةِ مِنْ بَيْتِ زَوْجِهَا

### 57-ci fəsil: Qadının ərinin evindən sədəqə verməsi

٢٥٣٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالاَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، قَالَ : سَمِعْتُ أَبَا وَائِلٍ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا تَصَدَّقَتِ الْمَرْأَةُ مِنْ بَيْتِ زَوْجِهَا ، كَانَ لَهَا أَجْرٌ ، وَلِلزَّوْجِ مِثْلُ ذَلِكَ ، وَلِلْخَازِنِ مِثْلُ ذَلِكَ ، وَلاَ يَنْقُصُ كُلُّ وَاحِدٍ مِنْهُمَا مِنْ أَجْرِ صَاحِبِهِ شَيْئًا ، لِلزَّوْجِ بِمَا كَسَبَ ، وَلَهَا بِمَا أَنْفَقَتْ.

2539. ...Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Qadın ərinin evindən sədəqə verərsə, ona, ərinə və malın xəzinədarına sədəqə savabı verilər. Bu savabdan heç bir şey əskilmədən evin sahibinə qazancına görə, xanımına və xidmətçiyə də eyni savab verilər".

### ٥٨– عَطِيَّةُ الْمَرْأَةِ بِغَيْرِ إِذْنِ زَوْجِهَا

### 58-ci fəsil: Ərinin icazəsi olmadan qadının sədəqə verməsi

٢٥٤٠– أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ الْمُعَلِّمُ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : لَمَّا فَتَحَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ قَامَ خَطِيبًا فَقَالَ فِي خُطْبَتِهِ : لاَ يَجُوزُ لاِمْرَأَةٍ عَطِيَّةٌ ، إِلاَّ بِإِذْنِ زَوْجِهَا مُخْتَصَرٌ.

2540. ...Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ Məkkəni fəth etdikdə ayağa duraraq xütbə verdi və bu xütbəsində buyurdu: "Qadının ərindən icazəsiz sədəqə verməsi icazəli deyil".

### ٥٩– فَضْلُ الصَّدَقَةِ

### 59-cu fəsil: Sədəqənin fəziləti

٢٥٤١– أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ حَمَّادٍ ، قَالَ : أَنْبَأَنَا أَبُو عَوَانَةَ ، عَنْ فِرَاسٍ ، عَنْ عَامِرٍ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ أَزْوَاجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اجْتَمَعْنَ عِنْدَهُ فَقُلْنَ : أَيَّتُنَا بِكَ أَسْرَعُ لُحُوقًا ، فَقَالَ : أَطْوَلُكُنَّ يَدًا فَأَخَذْنَ قَصَبَةً ، فَجَعَلْنَ يَذْرَعْنَهَا ، فَكَانَتْ سَوْدَةُ أَسْرَعَهُنَّ بِهِ لُحُوقًا ، فَكَانَتْ أَطْوَلَهُنَّ يَدًا ، فَكَانَ ذَلِكَ مِنْ كَثْرَةِ الصَّدَقَةِ.

2541. ...Aişə رضي الله عنها rəvayət edir ki, bir gün Peyğəmbərin ﷺ zövcələri onun yanında toplaşaraq dedilər: "Səndən sonra bizim hansımız ilk vəfat edəcək?" Peyğəmbər ﷺ buyurdu: "Əli ən uzun olanınız". Bundan sonra

onlar bir qamış parçası ilə əllərini ölçməyə başladılar. Səvdə Peyğəmbərə ﷺ hamımızdan qabaq qovuşdu. Bu da onun çox sədəqə verdiyinə görə idi".

## ٦٠- بَابُ أَيُّ الصَّدَقَةِ أَفْضَلُ

## 60-cı fəsil: Hansı sədəqə daha fəzilətlidir?

٢٥٤٢- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُمَارَةَ بْنِ الْقَعْقَاعِ ، عَنْ أَبِي زُرْعَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَجُلٌ : يَا رَسُولَ اللهِ أَيُّ الصَّدَقَةِ أَفْضَلُ ؟ قَالَ : أَنْ تَصَدَّقَ ، وَأَنْتَ صَحِيحٌ شَحِيحٌ ، تَأْمُلُ الْعَيْشَ ، وَتَخْشَى الْفَقْرَ.

2542. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Bir kişi dedi: "Ey Allahın Elçisi, hansı sədəqə daha fəzilətlidir?" Peyğəmbər ﷺ buyurdu: "Sağlam və varlı olmağa həris olduğun, çox yaşamağa ümid etdiyin və kasıbçılıqdan qorxduğun vaxt verdiyin sədəqə".

٢٥٤٣- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : سَمِعْتُ مُوسَى بْنَ طَلْحَةَ ، أَنَّ حَكِيمَ بْنَ حِزَامٍ ، حَدَّثَهُ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْضَلُ الصَّدَقَةِ ، مَا كَانَ عَنْ ظَهْرِ غِنًى ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى ، وَابْدَأْ بِمَنْ تَعُولُ.

2543. ...Rəvayət edilir ki, Həkim ibn Hizam ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sədəqələrin ən fəzilətlisi verilən adamı ehtiyacından xilas edəndir. Verən əl alan əldən xeyirlidir. Sədəqə verməyə sənə daha yaxın olanlardan başla".

٢٥٤٤- أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرُ الصَّدَقَةِ مَا كَانَ عَنْ ظَهْرِ غِنًى ، وَابْدَأْ بِمَنْ تَعُولُ.

2544. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sədəqələrin ən fəzilətlisi verilən adamı ehtiyacından xilas edəndir. Baxmağın vacib olan kimsələrdən başla[1]".

٢٥٤٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَدِيِّ بْنِ ثَابِتٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ يَزِيدَ الأَنْصَارِيَّ ، يُحَدِّثُ عَنْ أَبِي مَسْعُودٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا أَنْفَقَ الرَّجُلُ عَلَى أَهْلِهِ وَهُوَ يَحْتَسِبُهَا ، كَانَتْ لَهُ صَدَقَةً.

2545. ...Əbu Məsud ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kişi

[1] Burada insanın özü, ata-anası və digər ailə üzvləri nəzərdə tutulur.

ailəsinə xərcləyər və savabını Allahdan umarsa, bu onun üçün sədəqə olar".

٢٥٤٦– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : أَعْتَقَ رَجُلٌ مِنْ بَنِي عُذْرَةَ عَبْدًا لَهُ عَنْ دُبُرٍ ، فَبَلَغَ ذَلِكَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَلَكَ مَالٌ غَيْرُهُ قَالَ : لاَ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ يَشْتَرِيهِ مِنِّي ، فَاشْتَرَاهُ نُعَيْمُ بْنُ عَبْدِ اللهِ الْعَدَوِيُّ بِثَمَانِ مِئَةِ دِرْهَمٍ ، فَجَاءَ بِهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَدَفَعَهَا إِلَيْهِ ، ثُمَّ قَالَ : ابْدَأْ بِنَفْسِكَ ، فَتَصَدَّقْ عَلَيْهَا ، فَإِنْ فَضَلَ شَيْءٌ فَلأَهْلِكَ ، فَإِنْ فَضَلَ شَيْءٌ عَنْ أَهْلِكَ ، فَلِذِي قَرَابَتِكَ ، فَإِنْ فَضَلَ عَنْ ذِي قَرَابَتِكَ شَيْءٌ ، فَهَكَذَا ، وَهَكَذَا يَقُولُ : بَيْنَ يَدَيْكَ ، وَعَنْ يَمِينِكَ ، وَعَنْ شِمَالِكَ.

2546. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Bəni Uzra tayfasından olan bir kişi köləsinin xəbəri olmadan onu azad etmişdi. Bu xəbər Allah Elçisinə ﷺ çatdıqda o buyurdu: "O kölədən başqa malın varmı?" Kişi dedi: "Xeyr". Allah Elçisi ﷺ buyurdu: "Bu köləni məndən kim alar?" Nueym ibn Abdullah əl-Adəvi onu səkkiz yüz dirhəmə aldı. Allah Elçisi ﷺ pulu götürüb həmin adama verdi və buyurdu: "Əvvəl özündən başlayaraq bunu xərclə. Əgər artıq qalarsa, ailənə xərclə. Əgər ailənə xərclədiyindən artıq qalarsa, "belə və belə" yaxınlarına xərclə".

٦١– صَدَقَةُ الْبَخِيلِ

## 61-ci fəsil: Xəsis adamın sədəqəsi

٢٥٤٧– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ابْنِ جُرَيْجٍ ، عَنِ الْحَسَنِ بْنِ مُسْلِمٍ ، عَنْ طَاوُوسٍ ، قَالَ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ ، ثُمَّ قَالَ : حَدَّثَنَاهُ أَبُو الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ مَثَلَ الْمُنْفِقِ الْمُتَصَدِّقِ ، وَالْبَخِيلِ كَمَثَلِ رَجُلَيْنِ عَلَيْهِمَا جُبَّتَانِ – أَوْ جُنَّتَانِ – مِنْ حَدِيدٍ ، مِنْ لَدُنْ ثُدِيِّهِمَا إِلَى تَرَاقِيهِمَا ، فَإِذَا أَرَادَ الْمُنْفِقُ أَنْ يُنْفِقَ اتَّسَعَتْ عَلَيْهِ الدِّرْعُ أَوْ مَرَّتْ حَتَّى تُجِنَّ بَنَانَهُ ، وَتَعْفُوَ أَثَرَهُ ، وَإِذَا أَرَادَ الْبَخِيلُ أَنْ يُنْفِقَ قَلَصَتْ وَلَزِمَتْ كُلُّ حَلْقَةٍ مَوْضِعَهَا ، حَتَّى إِذَا أَخَذَتْهُ بِتَرْقُوَتِهِ – أَوْ بِرَقَبَتِهِ ، يَقُولُ أَبُو هُرَيْرَةَ : أَشْهَدُ أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُوَسِّعُهَا ، فَلاَ تَتَّسِعُ ، قَالَ طَاوُوسٌ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ يُشِيرُ بِيَدِهِ وَهُوَ يُوَسِّعُهَا وَلاَ تَتَوَسَّعُ.

2547. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sədəqə verən əliaçıq adamla xəsisin misalı, əyninə dəmirdən cübbə[1] geymiş, cübbə də onların boyunlarından sinələrinə qədər tutmuş iki nəfərin misalına bənzəyir. Əliaçıq adam sədəqə vermək istədikdə bu cübbə barmaqlarının ucunu örtənə və ayaq izlərini silənədək[2] genişlənir.

[1] Cübbə - keçmişdə üstdən geyilən uzun ətəkli, enli, düyməsiz geyimə deyilirdi.

[2] Burada cübbənin ətəyinin yerlə sürünməsi və yiyəsinin günahlarını ört-basdır etməsi nəzərdə tutulur.

Xəsis adam sədəqə vermək istədikdə əynindəki cübbənin həlqəsi olduğu yerə yapışır və cübbəni genişləndirməyə qoymur". Əbu Hureyra dedi: "Allah Elçisi ﷺ demək istəmişdir ki, həmin adam zirehi genişləndirməyə çalışsa da genişlənmir". Tavus deyir: "Mən Əbu Hureyranın belə dediyini eşitdim: "Peyğəmbər ﷺ əli ilə cübbəni genişləndirməyə çalışır, lakin cübbə genişlənmir ki, genişlənmir".

٢٥٤٨– أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَثَلُ الْبَخِيلِ ، وَالْمُتَصَدِّقِ ، مَثَلُ رَجُلَيْنِ عَلَيْهِمَا جُنَّتَانِ مِنْ حَدِيدٍ ، قَدِ اضْطَرَّتْ أَيْدِيَهُمَا إِلَى تَرَاقِيهِمَا ، فَكُلَّمَا هَمَّ الْمُتَصَدِّقُ بِصَدَقَةٍ ، اتَّسَعَتْ عَلَيْهِ ، حَتَّى تُعَفِّيَ أَثَرَهُ ، وَكُلَّمَا هَمَّ الْبَخِيلُ بِصَدَقَةٍ ، تَقَبَّضَتْ كُلُّ حَلْقَةٍ إِلَى صَاحِبَتِهَا ، وَتَقَلَّصَتْ عَلَيْهِ ، وَانْضَمَّتْ يَدَاهُ إِلَى تَرَاقِيهِ ، وَسَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : فَيَجْتَهِدُ أَنْ يُوَسِّعَهَا فَلاَ تَتَّسِعُ.

2348. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sədəqə verən əliaçıq adamla xəsisin misalı, əyninə dəmirdən cübbə geymiş, cübbə də onların boyunlarından sinələrinə qədər tutmuş iki nəfərin misalına bənzəyir. Bu zireh barmaq ucları olan yerə qədərdir. Əliaçıq adam sədəqə vermək istədikdə bu cübbə ayaq izlərini silənədək genişlənir. Xəsis adam sədəqə vermək istədikdə əynindəki cübbə büzülür və həlqəsi olduğu yerə yapışır, barmaq uclarından boynuna qədər hər yeri sıxır". Allah Elçisinin ﷺ, həmçinin belə buyurduğunu eşitdim: "O, zirehi genişləndirməyə çalışsa da genişləndirə bilmir".

## ٦٢– الإِحْصَاءُ فِي الصَّدَقَةِ

## 62-ci fəsil: Sədəqəni saymaq

٢٥٤٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، حَدَّثَنِي اللَّيْثُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنْ أُمَيَّةَ بْنِ هِنْدٍ ، عَنْ أَبِي أُمَامَةَ بْنِ سَهْلِ بْنِ حُنَيْفٍ ، قَالَ : كُنَّا يَوْمًا فِي الْمَسْجِدِ جُلُوسًا ، وَنَفَرٌ مِنَ الْمُهَاجِرِينَ وَالأَنْصَارِ فَأَرْسَلْنَا رَجُلاً إِلَى عَائِشَةَ لِيَسْتَأْذِنَ ، فَدَخَلْنَا عَلَيْهَا ، قَالَتْ : دَخَلَ عَلَيَّ سَائِلٌ مَرَّةً ، وَعِنْدِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَمَرْتُ لَهُ بِشَيْءٍ ، ثُمَّ دَعَوْتُ بِهِ ، فَنَظَرْتُ إِلَيْهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَمَا تُرِيدِينَ أَنْ لاَ يَدْخُلَ بَيْتَكِ شَيْءٌ ، وَلاَ يَخْرُجَ ، إِلاَّ بِعِلْمِكِ قُلْتُ : نَعَمْ ، قَالَ : مَهْلاً يَا عَائِشَةُ ، لاَ تُحْصِي ، فَيُحْصِيَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَيْكِ.

2549. ...Rəvayət edilir ki, Səhl ibn Huneyf ﵁ demişdir: "Bir dəfə biz məsciddə mühacir və ənsarla oturmuşduq. Biz Aişə ilə görüşməyə izin almaq üçün adam göndərdik. Sonra onun yanına gəldik. O dedi: "Bir dəfə yanıma ehtiyacı olan bir adam gəlmişdi. Allah Elçisi ﷺ də mənim yanımda

idi. Mən ona bir şeyin verilməsini istədim. Veriləcək şeyi gətirzdirdim və ona baxdım. Allah Elçisi ﷺ buyurdu: “İstəməzdinmi ki, evinə səndən xəbərsiz heç bir şey girib-çıxmasın?” Mən: “Bəli, istəyirəm” dedim. O dedi: “Bax, ey Aişə! Sayma, yoxsa Allah ﷻ sənə sayaraq verər”.

٢٥٥٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عَبْدَةَ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ فَاطِمَةَ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لَهَا : لاَ تُحْصِي ، فَيُحْصِيَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَيْكِ.

2550. ...Əsma bint Əbu Bəkr رضي الله عنها rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ ona dedi: “(Sədəqə verərkən) sayma, yoxsa Allah ﷻ da sayaraq verər”.

٢٥٥١- أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ ، عَنْ حَجَّاجٍ ، قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي ابْنُ أَبِي مُلَيْكَةَ ، عَنْ عَبَّادِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، أَنَّهَا جَاءَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَتْ : يَا نَبِيَّ اللهِ لَيْسَ لِي شَيْءٌ إِلاَّ مَا أَدْخَلَ عَلَيَّ الزُّبَيْرُ ، فَهَلْ عَلَيَّ جُنَاحٌ فِي أَنْ أَرْضَخَ مِمَّا يُدْخِلُ عَلَيَّ ؟ فَقَالَ : ارْضَخِي مَا اسْتَطَعْتِ ، وَلاَ تُوكِي فَيُوكِيَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَيْكِ.

2551. ...Rəvayət edilir ki, bir dəfə Əsma bint Əbu Bəkr رضي الله عنها Peyğəmbərin ﷺ yanına gəlib dedi: “Ey Allahın Peyğəmbəri! əz-Zubeyrin gətirdiyindən başqa heç nəyim yoxdur. Onun gətirdiklərindən cüzi bir şey sədəqə versəm mənə günah olmaz ki?” Peyğəmbər ﷺ buyurdu: “Bacardığın qədər (sədəqə) ver! Xəsislik etmə ki, Allah ﷻ da səndən nemətlərini əsirgəməsin”.

## ٦٣- الْقَلِيلُ فِي الصَّدَقَةِ

## 63-cü fəsil: Sədəqənin azı

٢٥٥٢- أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، عَنْ خَالِدٍ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْمُحِلِّ ، عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اتَّقُوا النَّارَ ، وَلَوْ بِشِقِّ تَمْرَةٍ.

2552. ...Adiy ibn Hatim رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Yarım xurma ilə olsa belə Cəhənnəm odundan qorunun!”

٢٥٥٣- أَنْبَأَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، أَنَّ عَمْرَو بْنَ مُرَّةَ ، حَدَّثَهُمْ عَنْ خَيْثَمَةَ ، عَنْ عَدِيِّ بْنِ حَاتِمٍ ، قَالَ : ذَكَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ النَّارَ فَأَشَاحَ بِوَجْهِهِ وَتَعَوَّذَ مِنْهَا - ذَكَرَ شُعْبَةُ أَنَّهُ فَعَلَهُ ثَلاَثَ مَرَّاتٍ - ثُمَّ قَالَ : اتَّقُوا النَّارَ ، وَلَوْ بِشِقِّ التَّمْرَةِ ، فَإِنْ لَمْ تَجِدُوا ، فَبِكَلِمَةٍ طَيِّبَةٍ.

2553. ...Rəvayət edilir ki, Adiy ibn Hatim رضي الله عنه demişdir: “Allah Elçisi ﷺ

Cəhənnəm haqda həyəcanla danışdı və ondan Allaha sığındı". Şubə deyir ki, bu hal üç dəfə təkrar oldu. Sonra Allah Elçisi ﷺ buyurdu: "Yarım xurma ilə belə olsa Cəhənnəm odundan qorunun. Bunu da tapmasanız gözəl söz söyləyin".

## ٦٤- بَابُ التَّحْرِيضِ عَلَى الصَّدَقَةِ

## 64-cü fəsil: Sədəqə verməyə təşviq etmək

٢٥٥٤- أَخْبَرَنَا أَزْهَرُ بْنُ جَمِيلٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : وَذَكَرَ عَوْنَ بْنَ أَبِي جُحَيْفَةَ قَالَ : سَمِعْتُ الْمُنْذِرَ بْنَ جَرِيرٍ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، قَالَ : كُنَّا عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فِي صَدْرِ النَّهَارِ ، فَجَاءَ قَوْمٌ عُرَاةً حُفَاةً مُتَقَلِّدِي السُّيُوفِ ، عَامَّتُهُمْ مِنْ مُضَرَ ، بَلْ كُلُّهُمْ مِنْ مُضَرَ ، فَتَغَيَّرَ وَجْهُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِمَا رَأَى بِهِمْ مِنَ الْفَاقَةِ ، فَدَخَلَ ثُمَّ خَرَجَ ، فَأَمَرَ بِلالاً فَأَذَّنَ ، فَأَقَامَ الصَّلاَةَ ، فَصَلَّى ثُمَّ خَطَبَ ، فَقَالَ : يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ ، وَخَلَقَ مِنْهَا زَوْجَهَا ، وَبَثَّ مِنْهُمَا ، رِجَالاً كَثِيرًا ، وَنِسَاءً ، وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ ، وَالأَرْحَامَ ، إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا ، وَاتَّقُوا اللَّهَ وَلْتَنْظُرْ نَفْسٌ مَا قَدَّمَتْ لِغَدٍ ، تَصَدَّقَ رَجُلٌ مِنْ دِينَارِهِ مِنْ دِرْهَمِهِ مِنْ ثَوْبِهِ ، مِنْ صَاعِ بُرِّهِ مِنْ صَاعِ تَمْرِهِ ، حَتَّى قَالَ : وَلَوْ بِشِقِّ تَمْرَةٍ ، فَجَاءَ رَجُلٌ مِنَ الأَنْصَارِ بِصُرَّةٍ كَادَتْ كَفُّهُ تَعْجِزُ عَنْهَا ، بَلْ قَدْ عَجَزَتْ ، ثُمَّ تَتَابَعَ النَّاسُ حَتَّى رَأَيْتُ كَوْمَيْنِ مِنْ طَعَامٍ ، وَثِيَابٍ ، حَتَّى رَأَيْتُ وَجْهَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَتَهَلَّلُ كَأَنَّهُ مُذْهَبَةٌ ، فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ سَنَّ فِي الإِسْلاَمِ سُنَّةً حَسَنَةً ، فَلَهُ أَجْرُهَا ، وَأَجْرُ مَنْ عَمِلَ بِهَا مِنْ غَيْرِ أَنْ يَنْقُصَ مِنْ أُجُورِهِمْ شَيْئًا ، وَمَنْ سَنَّ فِي الإِسْلاَمِ سُنَّةً سَيِّئَةً ، فَعَلَيْهِ وِزْرُهَا ، وَوِزْرُ مَنْ عَمِلَ بِهَا مِنْ غَيْرِ أَنْ يَنْقُصَ مِنْ أَوْزَارِهِمْ شَيْئًا.

2554. ...Rəvayət edilir ki, Munzir ibn Cərir atasının رضي الله عنه belə dediyini eşitmişdir: "Günorta vaxtı Allah Elçisi ﷺ ilə birlikdə oturmuşduq. Mudar tayfasından bir dəstə insan paltarsız və ayaqyalın bir vəziyyətdə əllərində qılınc yanımıza gəldilər. Allah Elçisi ﷺ onların bu vəziyyətini gördükdə üzünün rəngi dəyişdi. İçəri girdi, sonra çıxdı və Bilala azan verməsini əmr etdi. İqamə deyildikdən sonra namaz qılındı. Sonra xütbə deyərək belə buyurdu: **"Ey insanlar! Sizi tək bir candan xəlq edən, ondan zövcəsini yaradan və o ikisindən də bir çox kişi və qadın törədib yer üzünə yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən cürbəcür şeylər istədiyiniz Allahdan və qohumluq əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir"** (ən-Nisa, 1). Allahın əzabından qorunmağa çalışın. Hər kəs sabah üçün hazırladığına baxsın...". İnsanlar dinarlarından, dirhəmlərindən, paltarlarından, buğda və xurmasından bir xurma belə olsa sədəqə verdilər. Ənsardan olan bir nəfər çətinliklə daşıdığı bir səbət xurma ilə gəldi. Başqaları da onun ardınca bəzi şeylər gətirdilər. Gətirilən ərzağın və geyimlərin iki topa olduğunu gördüm. Allah Elçisinin ﷺ üzü güldü və sevincdən qızıl kimi parıldayırdı. O buyurdu: "Kim

İslamda yaxşı bir yol qoyarsa, ona həm bu etdiyinin, həm də bu yolda mükafat qazananların, mükafatlarından heç bir şey əskilmədən mükafatı verilər. Kim İslamda pis bir yol qoyarsa, ona həm bu etdiyinin, həm də bu yolda günah qazananların, günahlarından bir şey əskilmədən günahı verilər".

٢٥٥٥– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَعْبَدِ بْنِ خَالِدٍ ، عَنْ حَارِثَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : تَصَدَّقُوا ، فَإِنَّهُ سَيَأْتِي عَلَيْكُمْ زَمَانٌ يَمْشِي الرَّجُلُ بِصَدَقَتِهِ ، فَيَقُولُ الَّذِي يُعْطَاهَا لَوْ جِئْتَ بِهَا بِالأَمْسِ قَبِلْتُهَا ، فَأَمَّا الْيَوْمَ فَلاَ.

2555. ...Rəvayət edilir ki, Harisə ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Sədəqə verin! Sizə elə bir zaman gələcək ki, bir kişi sədəqəsi ilə gəlib birinə sədəqə vermək istədikdə o deyəcək: "Dünən gətirsəydin götürərdim, bu gün isə ehtiyacım yoxdur".

## ٦٥– الشَّفَاعَةُ فِي الصَّدَقَةِ

## 65-ci fəsil: Sədəqə verməyə vasitə olmaq

٢٥٥٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : أَخْبَرَنِي أَبُو بُرْدَةَ بْنُ عَبْدِ اللهِ بْنِ أَبِي بُرْدَةَ ، عَنْ جَدِّهِ أَبِي بُرْدَةَ ، عَنْ أَبِي مُوسَى ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اشْفَعُوا ، تُشَفَّعُوا ، وَيَقْضِي اللَّهُ عَزَّ وَجَلَّ عَلَى لِسَانِ نَبِيِّهِ مَا شَاءَ.

2556. ...Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Şəfaət edin ki, şəfaət olunasınız.[1] Allah dilədiyi bir şeyə Öz peyğəmbərinin ﷺ dili ilə hökm edəcək".

٢٥٥٧– أَخْبَرَنَا هَارُونُ بْنُ سَعِيدٍ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنِ ابْنِ مُنَبِّهٍ ، عَنْ أَخِيهِ ، عَنْ مُعَاوِيَةَ بْنِ أَبِي سُفْيَانَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الرَّجُلَ لَيَسْأَلُنِي الشَّيْءَ فَأَمْنَعُهُ حَتَّى تَشْفَعُوا فِيهِ ، فَتُؤْجَرُوا ، وَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اشْفَعُوا ، تُؤْجَرُوا.

2557. ...Müaviyə ibn Əbu Süfyan ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bəzən bir kişi məndən bir şey şey istəyir, mən də sizin də o işə vasitə olmanızı istədiyim üçün onu həmin vaxt vermirəm ki, siz də savab qazanasınız". Allah Elçisi ﷺ buyurmuşdur: "Şəfaət edin ki,[2] savab qazanasınız".

[1] Yəni ehtiyacı olanlara kömək edin ki, savab qazanasınız.
[2] Yəni ehtiyacı olanlara kömək edin.

## ٦٦- الاِخْتِيَالُ فِي الصَّدَقَةِ

## 66-cı fəsil: Sədəqə verəndə qürurlu olmaq

٢٥٥٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ بْنِ الْحَارِثِ التَّيْمِيُّ ، عَنِ ابْنِ جَابِرٍ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ مِنَ الْغَيْرَةِ : مَا يُحِبُّ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمِنْهَا مَا يَبْغُضُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمِنَ الْخُيَلاَءِ : مَا يُحِبُّ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمِنْهَا مَا يَبْغُضُ اللَّهُ عَزَّ وَجَلَّ ، فَأَمَّا الْغَيْرَةُ الَّتِي يُحِبُّ اللَّهُ عَزَّ وَجَلَّ : فَالْغَيْرَةُ فِي الرِّيبَةِ ، وَأَمَّا الْغَيْرَةُ الَّتِي يَبْغُضُ اللَّهُ عَزَّ وَجَلَّ : فَالْغَيْرَةُ فِي غَيْرِ رِيبَةٍ ، وَالاِخْتِيَالُ الَّذِي يُحِبُّ اللَّهُ عَزَّ وَجَلَّ : اخْتِيَالُ الرَّجُلِ بِنَفْسِهِ ، عِنْدَ الْقِتَالِ ، وَعِنْدَ الصَّدَقَةِ ، وَالاِخْتِيَالُ الَّذِي يَبْغُضُ اللَّهُ عَزَّ وَجَلَّ : الْخُيَلاَءُ فِي الْبَاطِلِ.

2558. ...İbn Cabir atasının belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, Allah ﷻ qısqancdır. Allahın ﷻ sevdiyi qısqanclıq kimi, qəzəbinə səbəb olan qısqanclıq da var. Allahın sevdiyi qısqanclıq yerli-yerində olan qısqanclıqdır. Allahın qəzəbləndiyi qısqanclıq isə yersiz qısqanmaqdır. Allahın sevdiyi qürur döyüşdə və sədəqə verilən məqamda olan qürurdur. Allahın qəzəbinə səbəb olan qürur isə batil yolda edilən qürurdur”.

٢٥٥٩- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ حَدَّثَنَا يَزِيدُ ، قَالَ حَدَّثَنَا هَمَّامٌ ، عَنْ قَتَادَةَ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كُلُوا ، وَتَصَدَّقُوا ، وَالْبَسُوا فِي غَيْرِ إِسْرَافٍ ، وَلاَ مَخِيلَةٍ.

2559. ...Amr ibn Şueyb atasının və babasının رضي الله عنهما belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Yeyin və sədəqə verin. İsrafa və təkəbbürə yol vermədən geyinin”.

## ٦٧- بَابُ أَجْرِ الْخَازِنِ إِذَا تَصَدَّقَ بِإِذْنِ مَوْلاَهُ

## 67-ci fəsil: Ağasının icazəsi ilə sədəqə verənin savabı

٢٥٦٠- أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ الْهَيْثَمِ بْنِ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ حَدَّثَنَا سُفْيَانُ ، عَنْ بُرَيْدِ بْنِ أَبِي بُرْدَةَ ، عَنْ جَدِّهِ ، عَنْ أَبِي مُوسَى ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْمُؤْمِنُ لِلْمُؤْمِنِ كَالْبُنْيَانِ ، يَشُدُّ بَعْضُهُ بَعْضًا وَقَالَ : الْخَازِنُ الأَمِينُ : الَّذِي يُعْطِي مَا أُمِرَ بِهِ طَيِّبًا بِهَا نَفْسُهُ أَحَدُ الْمُتَصَدِّقَيْنِ.

2560. ...Rəvayət edilir ki, Əbu Musa رضي الله عنه demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Mömin mömin üçün bina kimidir, bir-birinə dəstək olurlar”. Allah Elçisi ﷺ davam edərək belə buyurdu: “Əmr olunanları yerinə yetirən əmin xəzinədar ağasının əmri ilə verdiyi sədəqəyə görə ağası ilə bərabər savab qazanır”.

٦٨- بَابُ الْمُسِرِّ بِالصَّدَقَةِ

## 68-ci fəsil: Gizli verilən sədəqə

٢٥٦١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ بَحِيرِ بْنِ سَعْدٍ ، عَنْ خَالِدِ بْنِ مَعْدَانَ ، عَنْ كَثِيرِ بْنِ مُرَّةَ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْجَاهِرُ بِالْقُرْآنِ كَالْجَاهِرِ بِالصَّدَقَةِ ، وَالْمُسِرُّ بِالْقُرْآنِ كَالْمُسِرِّ بِالصَّدَقَةِ.

2561. ...Uqbə ibn Amir ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Quranı səsli oxuyan açıq şəkildə sədəqə verən kimidir. Quranı gizli oxuyan gizli şəkildə sədəqə verən kimidir".

٦٩- الْمَنَّانُ بِمَا أَعْطَى

## 69-cu fəsil: Verdiyini başa qaxan

٢٥٦٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ يَسَارٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ثَلاَثَةٌ لاَ يَنْظُرُ اللَّهُ عَزَّ وَجَلَّ إِلَيْهِمْ يَوْمَ الْقِيَامَةِ : الْعَاقُّ لِوَالِدَيْهِ ، وَالْمَرْأَةُ الْمُتَرَجِّلَةُ ، وَالدَّيُّوثُ ، وَثَلاَثَةٌ لاَ يَدْخُلُونَ الْجَنَّةَ : الْعَاقُّ لِوَالِدَيْهِ ، وَالْمُدْمِنُ عَلَى الْخَمْرِ ، وَالْمَنَّانُ بِمَا أَعْطَى.

2562. ...Səlim ibn Abdullah atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Üç nəfər var ki, Qiyamət günü Allah ﷻ onlara baxmayacaq: valideynlərinə asi olan, kişilərə oxşamaq istəyən qadın və dəyyus. Üç nəfər var ki, onlar Cənnətə girməyəcək: valideynlərinə asi olan, daima sərxoş olan və verdiyini başa qaxan".

٢٥٦٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَلِيِّ بْنِ الْمُدْرِكِ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ ، عَنْ خَرَشَةَ بْنِ الْحُرِّ ، عَنْ أَبِي ذَرٍّ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللَّهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ ، وَلاَ يُزَكِّيهِمْ ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ، فَقَرَأَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ - فَقَالَ أَبُو ذَرٍّ : خَابُوا وَخَسِرُوا ، خَابُوا وَخَسِرُوا - قَالَ : الْمُسْبِلُ إِزَارَهُ ، وَالْمُنَفِّقُ سِلْعَتَهُ بِالْحَلِفِ الْكَاذِبِ ، وَالْمَنَّانُ عَطَاءَهُ.

2563. ...Əbu Zərr ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Üç nəfər var ki, Qiyamət günü Allah onları danışdırmayacaq, üzlərinə baxmayacaq və onları təmizə çıxarmaycaq. Onları ağrılı-acılı əzab gözləyir". Allah Elçisi ﷺ bu ayələri (Ali-İmran, 77) oxudu.[1] Əbu Zərr dedi: "Aldanıb ziyana

[1] Uca Allah buyurur: **"Allah ilə olan əhdlərini və andlarını ucuz qiymətə satan kimsələrə gəlincə, onlara axirətdə heç bir pay yoxdur. Allah onları danışdırmayacaq, Qiyamət günü**

düşdülər. Aldanıb ziyana düşdülər. Allah Elçisi ﷺ davam edərək buyurdu: "Təkəbbürlə ətəyini sürüyənlər, yalandan and içib malını satanlar və verdiyini başa qaxanlar".

٢٥٦٤– أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، قَالَ : سَمِعْتُ سُلَيْمَانَ وَهُوَ الأَعْمَشُ ، عَنْ سُلَيْمَانَ بْنِ مُسْهِرٍ ، عَنْ خَرَشَةَ بْنِ الْحُرِّ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ ، وَلاَ يَنْظُرُ إِلَيْهِمْ ، وَلاَ يُزَكِّيهِمْ ، وَلَهُمْ عَذَابٌ أَلِيمٌ : الْمَنَّانُ بِمَا أَعْطَى ، وَالْمُسْبِلُ إِزَارَهُ ، وَالْمُنَفِّقُ سِلْعَتَهُ بِالْحَلِفِ الْكَاذِبِ.

2564. ...Rəvayət edilir ki, Əbu Zərr ؓ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Üç nəfər var ki, Qiyamət günü Allah onları danışdırmayacaq, üzlərinə baxmayacaq və onları təmizə çıxarmaycaq. Onları ağrılı-acılı əzab gözləyir". Allah Elçisi ﷺ bu ayələri (Ali-İmran, 77) oxudu. Əbu Zərr dedi: "Aldanıb ziyana düşdülər. Aldanıb ziyana düşdülər. Allah Elçisi ﷺ davam edərək buyurdu: "Verdiyini başa qaxanlar, təkəbbürlə ətəyini sürüyənlər və yalandan and içib malını satanlar".

## ٧٠– بَابُ رَدِّ السَّائِلِ

## 70-ci fəsil: Ehtiyacı olanı əliboş qaytaran

٢٥٦٥– أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ (ح) وَأَنْبَأَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنِ ابْنِ بُجَيْدٍ الأَنْصَارِيِّ ، عَنْ جَدَّتِهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : رُدُّوا السَّائِلَ وَلَوْ بِظِلْفٍ – فِي حَدِيثِ هَارُونَ – مُحْرَقٍ.

2565. ...İbn Buceyd əl-Ənsari babasından ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Ehtiyacı olanı əliboş qaytarmayın. Bir heyvan dırnağı olsa belə ona mütləq verin".

## ٧١– مَنْ يُسْأَلُ وَلاَ يُعْطِي

## 71-ci fəsil: İstəyənə verməyən

٢٥٦٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ بَهْزَ بْنَ حَكِيمٍ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ يَأْتِي رَجُلٌ مَوْلاَهُ يَسْأَلُهُ مِنْ فَضْلٍ عِنْدَهُ ، فَيَمْنَعُهُ إِيَّاهُ ، إِلاَّ دُعِيَ لَهُ يَوْمَ الْقِيَامَةِ شُجَاعٌ أَقْرَعُ يَتَلَمَّظُ فَضْلَهُ الَّذِي مَنَعَ.

---

**onların üzünə baxmayacaq və onları təmizə çıxarmayacaqdır. Onlar üçün ağrılı-acılı bir əzab vardır".** (Ali-İmran, 77).

2566. ...Bəhz ibn Həkəm atasının və babasının رضي الله عنهما belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Bir kişinin yanına bir ehtiyacı olan gəldikdə, onun malı olduğu halda həmin adama vermədiyinə görə Qiyamət günü keçəl başlı bir ilan çağırılacaq və vermədiyi həmin malı zəhərləyərək ona yedirəcək".

### ٧٢- مَنْ سَأَلَ بِاللَّهِ عَزَّ وَجَلَّ
### 72-ci fəsil: Allah عز وجل üçün istəyən

٢٥٦٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنِ اسْتَعَاذَ بِاللَّهِ فَأَعِيذُوهُ ، وَمَنْ سَأَلَكُمْ بِاللَّهِ فَأَعْطُوهُ ، وَمَنِ اسْتَجَارَ بِاللَّهِ فَأَجِيرُوهُ ، وَمَنْ آتَى إِلَيْكُمْ مَعْرُوفًا فَكَافِئُوهُ ، فَإِنْ لَمْ تَجِدُوا فَادْعُوا لَهُ حَتَّى تَعْلَمُوا أَنْ قَدْ كَافَأْتُمُوهُ.

2567. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah rizası üçün sizə sığınana yardım edin. Allah rizası üçün istəyənə istədiyini verin. Allah rizası üçün çətinliyə düşənə yardım edin. Sizə yaxşılıq edəni mükafatlandırın. Mükafatlandıracaq bir şey tapmasanız, onu razı etdiyinizə inanıncaya qədər ona dua edin".

### ٧٣- مَنْ سَأَلَ بِوَجْهِ اللهِ عَزَّ وَجَلَّ
### 73-cü fəsil: Allahın عز وجل Üzü xatirinə istəyən

٢٥٦٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ سَمِعْتُ بَهْزَ بْنَ حَكِيمٍ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : قُلْتُ : يَا نَبِيَّ اللهِ مَا أَتَيْتُكَ حَتَّى حَلَفْتُ أَكْثَرَ مِنْ عَدَدِهِنَّ لأَصَابِعِ يَدَيْهِ ، أَلاَّ آتِيَكَ ، وَلاَ آتِيَ دِينَكَ ، وَإِنِّي كُنْتُ امْرَأً لاَ أَعْقِلُ شَيْئًا ، إِلاَّ مَا عَلَّمَنِي اللَّهُ وَرَسُولُهُ ، وَإِنِّي أَسْأَلُكَ بِوَجْهِ اللهِ عَزَّ وَجَلَّ بِمَا بَعَثَكَ رَبُّكَ إِلَيْنَا ؟ قَالَ : بِالإِسْلاَمِ قَالَ : قُلْتُ وَمَا آيَاتُ الإِسْلاَمِ ؟ قَالَ : أَنْ تَقُولَ : أَسْلَمْتُ وَجْهِي إِلَى اللهِ عَزَّ وَجَلَّ ، وَتَخَلَّيْتُ ، وَتُقِيمَ الصَّلاَةَ ، وَتُؤْتِيَ الزَّكَاةَ ، كُلُّ مُسْلِمٍ عَلَى مُسْلِمٍ مُحَرَّمٌ أَخَوَانِ نَصِيرَانِ لاَ يَقْبَلُ اللَّهُ عَزَّ وَجَلَّ مِنْ مُشْرِكٍ بَعْدَمَا أَسْلَمَ عَمَلاً ، أَوْ يُفَارِقَ الْمُشْرِكِينَ إِلَى الْمُسْلِمِينَ.

2568. ...Bəhz ibn Həkəm atasının və babasının رضي الله عنهما belə dediyini rəvayət etmişdir: "Mən dedim: "Ey Allahın Peyğəmbəri! Sənin yanına gəlməməyə və dinini qəbul etməməyə əlimin barmaqlarının sayı qədər and içmişdim. Mən Allah və Onun Elçisinin öyrətdiyindən başqa bir şey bilməyən adam idim. Mən səndən Allahın Üzü xatirinə soruşuram, Rəbbin səni nə ilə göndərdi?" Allah Elçisi ﷺ: "İslamla" dedi. Bəhz dedi: "İslamın əlamətləri nədir?" Allah Elçisi ﷺ buyurdu: "Allahın Üzü xatirinə İslamı qəbul etdim və İslamdan başqa hər şeydən uzaqlaşdım deməyin, namaz qılmağın,

zəkat verməyin və müsəlmanın müsəlmana canının, namusunun və malının haram olduğunu bilməyin, ona görə yaşamağın və müsəlmanların qardaş olduqlarını bilməyin, müsəlman olan birinin müşriklərin arasında qalmayaraq müsəlmanların yanına gəlməsinin lazım bilmirsə, Allahın onun heç bir əməlini qəbul etməyəcəyini bilməyindir".

### ٧٤- مَنْ يُسْأَلُ بِاللَّهِ عَزَّ وَجَلَّ وَلاَ يُعْطِي بِهِ

### 74-cü fəsil: Allah ﷻ rizası üçün istəyənə verməyən

٢٥٦٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي فُدَيْكٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ أَبِي ذِئْبٍ ، عَنْ سَعِيدِ بْنِ خَالِدٍ الْقَارِظِيِّ ، عَنْ إِسْمَعِيلَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَلاَ أُخْبِرُكُمْ بِخَيْرِ النَّاسِ مَنْزِلاً ؟ قُلْنَا : بَلَى يَا رَسُولَ اللهِ قَالَ : رَجُلٌ آخِذٌ بِرَأْسِ فَرَسِهِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ حَتَّى يَمُوتَ ، أَوْ يُقْتَلَ ، وَأُخْبِرُكُمْ بِالَّذِي يَلِيهِ ؟ قُلْنَا : نَعَمْ يَا رَسُولَ اللهِ ، قَالَ : رَجُلٌ مُعْتَزِلٌ فِي شِعْبٍ يُقِيمُ الصَّلاَةَ ، وَيُؤْتِي الزَّكَاةَ ، وَيَعْتَزِلُ شُرُورَ النَّاسِ ، وَأُخْبِرُكُمْ بِشَرِّ النَّاسِ ؟ قُلْنَا : نَعَمْ يَا رَسُولَ اللهِ ، قَالَ : الَّذِي يُسْأَلُ بِاللَّهِ عَزَّ وَجَلَّ ، وَلاَ يُعْطِي بِهِ.

2569. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Məqamına görə insanların ən xeyirlisini sizə xəbər verimmi?" Biz dedik: "Əlbəttə, ey Allahın Elçisi!" Allah Elçisi ﷺ buyurdu: "Ölənə və ya öldürülənə qədər Allah ﷻ yolunda atının yüyənini buraxmayan kimsədir. Bundan sonra kimin olduğunu sizə xəbər verimmi?" Biz dedik: "Bəli, ey Allahın Elçisi!" Allah Elçisi ﷺ buyurdu: "Bir dağın başında qalıb namaz qılan, zəkat verən, insanların şərindən və şərlilərindən uzaq qalan kimsədir. Sonra sizə insanların ən şər olanları haqda xəbər verimmi?" Biz dedik: "Bəli, ey Allahın Elçisi!" Allah Elçisi ﷺ buyurdu: "Allah ﷻ rizası üçün istəyən kimsəyə verməyən kimsədir".

### ٧٥- ثَوَابُ مَنْ يُعْطِي

### 75-ci fəsil: Ondan istəyənə verənin savabı

٢٥٧٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : سَمِعْتُ رِبْعِيًّا ، يُحَدِّثُ عَنْ زَيْدِ بْنِ ظَبْيَانَ ، رَفَعَهُ إِلَى أَبِي ذَرٍّ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ثَلاَثَةٌ يُحِبُّهُمُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَثَلاَثَةٌ يَبْغُضُهُمُ اللَّهُ عَزَّ وَجَلَّ ، أَمَّا الَّذِينَ يُحِبُّهُمُ اللَّهُ عَزَّ وَجَلَّ : فَرَجُلٌ أَتَى قَوْمًا فَسَأَلَهُمْ بِاللَّهِ عَزَّ وَجَلَّ ، وَلَمْ يَسْأَلْهُمْ بِقَرَابَةٍ بَيْنَهُ وَبَيْنَهُمْ ، فَمَنَعُوهُ ، فَتَخَلَّفَهُ رَجُلٌ بِأَعْقَابِهِمْ فَأَعْطَاهُ سِرًّا لاَ يَعْلَمُ بِعَطِيَّتِهِ إِلاَّ اللَّهُ عَزَّ وَجَلَّ ، وَالَّذِي أَعْطَاهُ ، وَقَوْمٌ سَارُوا لَيْلَتَهُمْ حَتَّى إِذَا كَانَ النَّوْمُ أَحَبَّ إِلَيْهِمْ مِمَّا يُعْدَلُ بِهِ ، نَزَلُوا فَوَضَعُوا رُؤُوسَهُمْ ، فَقَامَ يَتَمَلَّقُنِي ، وَيَتْلُو آيَاتِي ، وَرَجُلٌ كَانَ فِي سَرِيَّةٍ فَلَقُوا الْعَدُوَّ فَهُزِمُوا ، فَأَقْبَلَ بِصَدْرِهِ حَتَّى يُقْتَلَ أَوْ يَفْتَحَ اللَّهُ لَهُ ، وَالثَّلاَثَةُ : الَّذِينَ يَبْغُضُهُمُ اللَّهُ عَزَّ وَجَلَّ : الشَّيْخُ الزَّانِي ، وَالْفَقِيرُ الْمُخْتَالُ ، وَالْغَنِيُّ الظَّلُومُ.

2570. ...Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Üç kimsə var ki, Allah ﷻ onları sevir, üç kimsə də var ki, Allah ﷻ onlara qəzəblənir. Bir kişi bir toplumun yanına gəlib Allah rizası üçün bir şey istəyir – istədiyi aralarında olan qohumluğa görə deyil - lakin onlar ona heç nə vermirlər. Onların içindən bir nəfər ona Allahdan ﷻ başqa heç kəsin bilmədiyi halda gizli şəkildə bir şey verir. Həmçinin bir toplumla gecə səfərə çıxan, toplumdakı insanların yorğunluqdan yatdıqları vaxt başını yerə qoyub Allaha yalvaran kimsə. Həmçinin bir dəstədə düşmənlə qarşılaşan, dostları məğlubiyyətə uğradıqdan sonra təkbaşına da olsa zəfər qazanana qədər mərdliklə döyüşən, ya şəhid olan, ya da zəfər qazanan kimsə. Allahın ﷻ qəzəbləndiyi isə, zinakar qoca, təkəbbürlü kasıb və zalım varlıdır”.[1]

## ٧٦- تَفْسِيرُ الْمِسْكِينِ

## 76-cı fəsil: Yoxsulun izahı

٢٥٧١- أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَاعِيلُ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ الْمِسْكِينُ الَّذِي تَرُدُّهُ التَّمْرَةُ ، وَالتَّمْرَتَانِ ، وَاللُّقْمَةُ ، وَاللُّقْمَتَانِ ، إِنَّ الْمِسْكِينَ الْمُتَعَفِّفُ اقْرَؤُوا إِنْ شِئْتُمْ **{لاَ يَسْأَلُونَ النَّاسَ إِلْحَافًا}**.

2571. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “(İnsanlar arasında gəzib-dolaşıb) bir-iki loxma və ya bir-iki xurma ilə kifayətlənən adam heç də yoxsul deyil”. Yoxsul o adamdır ki, (onun özünə bəs edəcək qədər malı olmaz, vəziyyətinin ağır olduğunu heç kəsə bildirməz və buna görə də ona sədəqə verilməz, özü də) həya edib insanlardan heç bir şey istəməz. İstəyirsinizsə, Allahın bu ayəsini oxuyun: **“...Bu adamlar həya edib dilənmədiklərinə görə tanımayan adam onları varlı hesab edir...”** (əl-Bəqərə, 273)”.[2]

٢٥٧٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ الْمِسْكِينُ بِهَذَا الطَّوَّافِ الَّذِي يَطُوفُ عَلَى النَّاسِ تَرُدُّهُ اللُّقْمَةُ وَاللُّقْمَتَانِ وَالتَّمْرَةُ وَالتَّمْرَتَانِ قَالُوا : فَمَا الْمِسْكِينُ ؟ قَالُوا : الَّذِي لاَ يَجِدُ غِنًى يُغْنِيهِ وَلاَ يُفْطَنُ لَهُ ، فَيُتَصَدَّقَ عَلَيْهِ وَلاَ يَقُومُ فَيَسْأَلَ النَّاسَ.

[1] Hədis zəifdir.
[2] Hədisin sonunda “istəyirsinizsə...” cümləsi səhih deyil.

2572. ...Əbu Hureyra ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Qapı-qapı gəzərək bir-iki loxma və ya bir-iki xurma ilə kifayətlənən adam heç də yoxsul deyil”. Səhabələr dedilər: “Bəs yoxsul kimdir?” Allah Elçisi ﷺ buyurdu: “Yoxsul o adamdır ki, onun özünə bəs edəcək qədər malı olmaz, vəziyyətinin ağır olduğunu heç kəsə bildirməz və buna görə də ona heç kəs heç nə verməz, özü də həya edib insanlardan heç bir şey istəməz”.

٢٥٧٣- أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ الْمِسْكِينُ الَّذِي تَرُدُّهُ الأُكْلَةُ وَالأُكْلَتَانِ ، وَالتَّمْرَةُ وَالتَّمْرَتَانِ قَالُوا : فَمَا الْمِسْكِينُ يَا رَسُولَ اللهِ ؟ قَالَ : الَّذِي لاَ يَجِدُ غِنًى ، وَلاَ يَعْلَمُ النَّاسُ حَاجَتَهُ ، فَيُتَصَدَّقَ عَلَيْهِ.

2573. ...Əbu Hureyra ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “(İnsanlar arasında gəzib-dolaşıb) bir-iki loxma və ya bir-iki xurma ilə kifayətlənən adam heç də yoxsul deyil”. Səhabələr dedilər: “Bəs yoxsul kimdir, ey Allahın Elçisi?” Allah Elçisi ﷺ buyurdu: “Yoxsul o adamdır ki, onun özünə bəs edəcək qədər malı olmaz, lakin insanlar ondan xəbərsiz olar, bu səbəblə də ona sədəqə verilməz”.

٢٥٧٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ بُجَيْدٍ ، عَنْ جَدَّتِهِ أُمِّ بُجَيْدٍ - وَكَانَتْ مِمَّنْ بَايَعَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ - أَنَّهَا قَالَتْ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْمِسْكِينَ لَيَقُومُ عَلَى بَابِي فَمَا أَجِدُ لَهُ شَيْئًا أُعْطِيهِ إِيَّاهُ ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنْ لَمْ تَجِدِي شَيْئًا تُعْطِينَهُ إِيَّاهُ ، إِلاَّ ظِلْفًا مُحْرَقًا ، فَادْفَعِيهِ إِلَيْهِ.

2574. ...Rəvayət edilir ki, Allah Elçisinə ﷺ beyət edənlərdən olmuş Ummu Buceyd Allah Elçisinə ﷺ demişdir: “Qapıma kasıb adam gəlir, lakin ona verməyə bir şey tapmıram”. Allah Elçisi ﷺ ona buyurdu: “Əgər ona verməyə bir şey tapmasan, yanmış heyvan dırnağı da olsa ver”.

## ٧٧- الْفَقِيرُ الْمُخْتَالُ

## 77-ci fəsil: Təkəbbürlü kasıb

٢٥٧٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ عَجْلاَنَ ، قَالَ : سَمِعْتُ أَبِي يُحَدِّثُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ثَلاَثَةٌ لاَ يُكَلِّمُهُمُ اللهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ : الشَّيْخُ الزَّانِي ، وَالْعَائِلُ الْمَزْهُوُّ ، وَالإِمَامُ الْكَذَّابُ.

2575. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷠ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Üç nəfər var ki, Allah ﷻ onları Qiyamət günü danışdırmayacaq: zinakar qoca, təkəbbürlü kasıb və yalan danışan rəhbər”.

٢٥٧٦- أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا عَارِمٌ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عُمَرَ ، عَنْ سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ أَبِي

هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَرْبَعَةٌ يَبْغُضُهُمُ اللَّهُ عَزَّ وَجَلَّ : الْبَيَّاعُ الْحَلاَّفُ ، وَالْفَقِيرُ الْمُخْتَالُ ، وَالشَّيْخُ الزَّانِي ، وَالإِمَامُ الْجَائِرُ.

2576. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Allah ﷻ dörd nəfərə qəzəblənmişdir: malını and içərək satan, təkəbbürlü kasıb, zinakar qoca və zalım rəhbər”.

### ٧٨- فَضْلُ السَّاعِي عَلَى الأَرْمَلَةِ

### 78-ci fəsil: Dullara kömək edənin fəziləti

٢٥٧٧- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ مَسْلَمَةَ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ ثَوْرِ بْنِ زَيْدٍ الدِّيْلِيِّ ، عَنْ أَبِي الْغَيْثِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : السَّاعِي عَلَى الأَرْمَلَةِ ، وَالْمِسْكِينِ كَالْمُجَاهِدِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ.

2577. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Dul qadınlara və miskinlərə kömək edən şəxs Allah yolunda cihad edən kimidir”.

### ٧٩- الْمُؤَلَّفَةُ قُلُوبُهُمْ

### 79-cu fəsil: Qəlbləri İslama isinişənlər

٢٥٧٨- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ سَعِيدِ بْنِ مَسْرُوقٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي نُعْمٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : بَعَثَ عَلِيٌّ وَهُوَ بِالْيَمَنِ بِذُهَيْبَةٍ بِتُرْبَتِهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَسَمَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بَيْنَ أَرْبَعَةِ نَفَرٍ : الأَقْرَعِ بْنِ حَابِسٍ الْحَنْظَلِيِّ ، وَعُيَيْنَةَ بْنِ بَدْرٍ الْفَزَارِيِّ ، وَعَلْقَمَةَ بْنِ عُلاَثَةَ الْعَامِرِيِّ ، ثُمَّ أَحَدِ بَنِي كِلاَبٍ ، وَزَيْدٍ الطَّائِيِّ ثُمَّ أَحَدِ بَنِي نَبْهَانَ فَغَضِبَتْ قُرَيْشٌ – وَقَالَ مَرَّةً أُخْرَى : صَنَادِيدُ قُرَيْشٍ – فَقَالُوا : تُعْطِي صَنَادِيدَ نَجْدٍ ، وَتَدَعُنَا قَالَ : إِنَّمَا فَعَلْتُ ذَلِكَ لأَتَأَلَّفَهُمْ فَجَاءَ رَجُلٌ كَثُّ اللِّحْيَةِ ، مُشْرِفُ الْوَجْنَتَيْنِ ، غَائِرُ الْعَيْنَيْنِ ، نَاتِئُ الْجَبِينِ ، مَحْلُوقُ الرَّأْسِ ، فَقَالَ : اتَّقِ اللَّهَ يَا مُحَمَّدُ ، قَالَ : فَمَنْ يُطِيعُ اللَّهَ عَزَّ وَجَلَّ إِنْ عَصَيْتُهُ أَيَأْمَنُنِي عَلَى أَهْلِ الأَرْضِ وَلاَ تَأْمَنُونِي ، ثُمَّ أَدْبَرَ الرَّجُلُ فَاسْتَأْذَنَ رَجُلٌ مِنَ الْقَوْمِ ، فِي قَتْلِهِ يَرَوْنَ أَنَّهُ خَالِدُ بْنُ الْوَلِيدِ فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ مِنْ ضِئْضِئِ هَذَا قَوْمًا يَقْرَؤُونَ الْقُرْآنَ لاَ يُجَاوِزُ حَنَاجِرَهُمْ ، يَقْتُلُونَ أَهْلَ الإِسْلاَمِ ، وَيَدَعُونَ أَهْلَ الأَوْثَانِ ، يَمْرُقُونَ مِنَ الإِسْلاَمِ ، كَمَا يَمْرُقُ السَّهْمُ مِنَ الرَّمِيَّةِ لَئِنْ أَدْرَكْتُهُمْ لأَقْتُلَنَّهُمْ قَتْلَ عَادٍ.

2578. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri demişdir: “Əli Yəməndə olarkən Allah Elçisinə ﷺ bir qədər qızıl göndərmişdi. Allah Elçisi ﷺ də bu qızılları dörd nəfərə paylamışdı. Bunlar: əl-Əqra ibn Haris əl-Hənzali, Uyeynə ibn Bədr əl-Fəzari, bir tərəfdən əl-Amiri tayfasına, bir tərəfdən də Bəni Kiləb tayfasına mənsub olan Alqamə ibn Ulasə, ət-Tai və Bəni Nəbhən tayfalarından olan Zeyd adında olan kimsələr idi. Qureyşin öndərləri qəzəblənərək dedilər: “Bizi tərk edib Nəcdlilərin öndə gedənlərinə pay-

layır". Allah Elçisi ﷺ buyurdu: "Mən onları İslama isinişdirmək üçün belə etdim". Bu vaxt sıx saqqallı, yanaqları domba, gözləri çökək, alnı geniş, başı qırxıq bir nəfər gəlib dedi: "Allahdan qorx, ey Muhəmməd!" Allah Elçisi ﷺ buyurdu: "Mən də Allahdan ﷻ qorxmasam, Ona asi olsam kim Ona itaət edər? Yer üzündə hər kəs mənə güvənərkən, siz necə olur güvənmirsiniz?" Sonra o adam çıxıb getdi. Orada olanlardan biri bu adamı öldürmək üçün izin istədi. Bu adam Xalid ibn Valid idi. Allah Elçisi ﷺ buyurdu: "Bu adamın nəslindəm bir qövm gələcək, onlar Quran oxuyacaqlar, lakin oxuduqları Quran boğazlarından aşağı düşməyəcək. Onlar müsəlmanları öldürüb bütpərəstləri sağ buraxacaqlar. Ox ovunu dəlib keçdiyi kimi İslamdan çıxacaqlar. Əgər siz onların dövrünə qədər yaşasanız, heç birini sağ buraxmayıb Ad qövmünün yox olduğu kimi hamısını öldürərsiniz".

## ٨٠- الصَّدَقَةُ لِمَنْ تَحَمَّلَ بِحَمَالَةٍ

## 80-ci fəsil: Zamin olana sədəqənin verilməsi

٢٥٧٩- أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادٍ ، عَنْ هَارُونَ بْنِ رِئَابٍ ، قَالَ : حَدَّثَنِي كِنَانَةُ بْنُ نُعَيْمٍ (ح) وَأَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ - وَاللَّفْظُ لَهُ - ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ هَارُونَ ، عَنْ كِنَانَةَ بْنِ نُعَيْمٍ ، عَنْ قَبِيصَةَ بْنِ مُخَارِقٍ ، قَالَ : تَحَمَّلْتُ حَمَالَةً ، فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَأَلْتُهُ فِيهَا فَقَالَ : إِنَّ الْمَسْأَلَةَ لاَ تَحِلُّ ، إِلاَّ لِثَلاَثَةٍ رَجُلٍ تَحَمَّلَ بِحَمَالَةٍ بَيْنَ قَوْمٍ فَسَأَلَ فِيهَا حَتَّى يُؤَدِّيَهَا ، ثُمَّ يُمْسِكَ.

2579. ...Rəvayət edilir ki, Qabisa ibn Muxariq رضي الله عنه demişdir: "Bir dəfə zamin duraraq borca düşmüşdüm. Peyğəmbərin ﷺ yanına gəlib bu haqda ondan soruşdum. O buyurdu: "İstəmək üç nəfərdən başqa heç kimə halal deyil; iki nəfər arasında zamin olub borca düşənə bu borcları əldə edənə qədər istəyər, sonra da bunu tərk edər".

٢٥٨٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ النَّضْرِ بْنِ مُسَاوِرٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ هَارُونَ بْنِ رِئَابٍ ، قَالَ : حَدَّثَنِي كِنَانَةُ بْنُ نُعَيْمٍ ، عَنْ قَبِيصَةَ بْنِ مُخَارِقٍ ، قَالَ : تَحَمَّلْتُ حَمَالَةً فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَسْأَلُهُ فِيهَا فَقَالَ : أَقِمْ يَا قَبِيصَةُ حَتَّى تَأْتِيَنَا الصَّدَقَةُ ، فَنَأْمُرَ لَكَ قَالَ : ثُمَّ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا قَبِيصَةُ إِنَّ الصَّدَقَةَ لاَ تَحِلُّ إِلاَّ لأَحَدِ ثَلاَثَةٍ : رَجُلٍ تَحَمَّلَ حَمَالَةً ، فَحَلَّتْ لَهُ الْمَسْأَلَةُ حَتَّى يُصِيبَ قِوَامًا مِنْ عَيْشٍ ، أَوْ سِدَادًا مِنْ عَيْشٍ ، وَرَجُلٍ أَصَابَتْهُ جَائِحَةٌ ، فَاجْتَاحَتْ مَالَهُ ، فَحَلَّتْ لَهُ الْمَسْأَلَةُ حَتَّى يُصِيبَهَا ثُمَّ يُمْسِكَ ، وَرَجُلٍ أَصَابَتْهُ فَاقَةٌ حَتَّى يَشْهَدَ ثَلاَثَةٌ مِنْ ذَوِي الْحِجَا مِنْ قَوْمِهِ قَدْ أَصَابَتْ فُلاَنًا فَاقَةٌ فَحَلَّتْ لَهُ الْمَسْأَلَةُ حَتَّى يُصِيبَ قِوَامًا مِنْ عَيْشٍ ، أَوْ سِدَادًا مِنْ عَيْشٍ ، فَمَا سِوَى هَذَا مِنَ الْمَسْأَلَةِ يَا قَبِيصَةُ ؟ سُحْتٌ يَأْكُلُهَا صَاحِبُهَا سُحْتًا.

2580. ...Rəvayət edilir ki, Qabisa ibn Muxariq رضي الله عنه demişdir: "Bir dəfə zamin

duraraq borca düşmüşdüm. Allah Elçisinin ﷺ yanına gəlib bu haqda ondan soruşdum. Peyğəmbər ﷺ buyurdu: “Zəkat gətirilənə qədər bir az gözlə, ey Qabisa! Əmr edərəm sənə verilər”. Sonra Allah Elçisi ﷺ belə buyurdu: “Ey Qabisa! Həqiqətən, zəkat istəmək üç nəfərdən başqa heç kimə halal deyil; iki nəfər arasında zamin olub borca düşən bu məbləği toplayana qədər istəyə bilər; bir çətinliyə düşmüş, var-dövləti itirənin yaşamaq üçün istəməsi; üç kişinin onun yoxsul olmasına şahidlik etdiyi kimsə də dolanmaq üçün istəyə bilər. (Bilirsənmi) bundan başqa istənilən nədir, ey Qabisa? Zülmlə insanların malını yeməkdir”.

## ٨١- الصَّدَقَةُ عَلَى الْيَتِيمِ

## 81-ci fəsil: Yetimlərə sədəqə vermək

٢٥٨١- أَخْبَرَنِي زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ ابْنُ عُلَيَّةَ ، قَالَ : أَخْبَرَنِي هِشَامٌ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي هِلاَلٌ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : جَلَسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ ، وَجَلَسْنَا حَوْلَهُ فَقَالَ : إِنَّمَا أَخَافُ عَلَيْكُمْ مِنْ بَعْدِي ، مَا يُفْتَحُ لَكُمْ مِنْ زَهْرَةٍ ، وَذَكَرَ الدُّنْيَا ، وَزِينَتَهَا فَقَالَ رَجُلٌ : أَوَ يَأْتِي الْخَيْرُ بِالشَّرِّ ؟ فَسَكَتَ عَنْهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقِيلَ لَهُ : مَا شَأْنُكَ ؟ تُكَلِّمُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَلاَ يُكَلِّمُكَ قَالَ : وَرَأَيْنَا أَنَّهُ يُنْزَلُ عَلَيْهِ فَأَفَاقَ يَمْسَحُ الرُّحَضَاءَ وَقَالَ : أَشَاهِدٌ السَّائِلُ إِنَّهُ لاَ يَأْتِي الْخَيْرُ بِالشَّرِّ وَإِنَّ مِمَّا يُنْبِتُ الرَّبِيعُ يَقْتُلُ ، أَوْ يُلِمُّ إِلاَّ آكِلَةُ الْخَضِرِ ، فَإِنَّهَا أَكَلَتْ حَتَّى إِذَا امْتَدَّتْ خَاصِرَتَاهَا ، اسْتَقْبَلَتْ عَيْنَ الشَّمْسِ فَثَلَطَتْ ثُمَّ بَالَتْ ثُمَّ رَتَعَتْ ، وَإِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ ، وَنِعْمَ صَاحِبُ الْمُسْلِمِ ، هُوَ إِنْ أَعْطَى مِنْهُ الْيَتِيمَ ، وَالْمِسْكِينَ ، وَابْنَ السَّبِيلِ ، وَإِنَّ الَّذِي يَأْخُذُهُ بِغَيْرِ حَقِّهِ ، كَالَّذِي يَأْكُلُ وَلاَ يَشْبَعُ ، وَيَكُونُ عَلَيْهِ شَهِيدًا يَوْمَ الْقِيَامَةِ.

2581. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ؓ demişdir: “Bir dəfə Allah Elçisi ﷺ minbərdə oturdu və biz də onun ətrafında oturduq. Allah Elçisi ﷺ buyurdu: “Mən (bu dünyadan) köçəndən sonra sizin üçün ən çox qorxduğum şeylərdən biri dünyanın zövq-səfa və bər-bəzək (qapılarının) sizin üzünüzə açılmasıdır”. Bir nəfər soruşdu: “Ey Allahın Elçisi, xeyirli bir şey özü ilə şər gətirə bilərmi?” Allah Elçisi ﷺ susdu. Bəziləri həmin adamdan soruşdular: “Nə olub, niyə sən ondan söz soruşursan, o isə sənə cavab vermir?” Sonra bizə agah oldu ki, ona vəhy nazil olur. Bir müddət keçdikdən sonra Allah Elçisi ﷺ üzündəki təri sildi və sanki sual verən adamı tərifləyərək: “Soruşan adam haradadır?”– dedi. Sonra buyurdu: “Həqiqətən, xeyir özü ilə şər gətirməz! Doğrusu, baharda yetişən bitkilərin bəzisi (onu yeyən heyvanı) öldürür, yaxud zəhərləyir. Yalnız yaşıl ot yeyən heyvanlardan başqa. Bu heyvanlar doyanadək (otdan) yeyir və nəhayət, böyrü şişdikdən sonra yerə uzanıb özünü günə verir. Sonra qalxıb təbii eh-

tiyacını ödəyir və yenidən yaşıl otdan bol-bol yeyir. Həqiqətən, bu (dünya) malı yaşıl ot kimi şirindir. Malından yetimlərə, kasıblara və müsafirlərə verən varlı müsəlman nə gözəl bəndədir! Haqsız yolla mal-dövlət əldə edən adam, əməllicə yeyən, lakin doymayan kimsəyə bənzəyir. Qiyamət günü isə bu mal-dövlət onun əleyhinə şahidlik edəcək".

### ٨٢- الصَّدَقَةُ عَلَى الأَقَارِبِ

### 82-ci fəsil: Qohumlara sədəqə vermək

٢٥٨٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ حَفْصَةَ ، عَنْ أُمِّ الرَّائِحِ ، عَنْ سَلْمَانَ بْنِ عَامِرٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الصَّدَقَةَ عَلَى الْمِسْكِينِ صَدَقَةٌ ، وَعَلَى ذِي الرَّحِمِ اثْنَتَانِ صَدَقَةٌ وَصِلَةٌ.

2582. ...Salman ibn Amir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Miskinə verilən sədəqə savabdır. Qohuma veilən sədəqədə isə iki savab var; sədəqə və qohumluq əlaqələrini möhkəmləndirmək".

٢٥٨٣- أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ زَيْنَبَ ، امْرَأَةِ عَبْدِ اللهِ ، قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِلنِّسَاءِ : تَصَدَّقْنَ وَلَوْ مِنْ حُلِيِّكُنَّ قَالَتْ : وَكَانَ عَبْدُ اللهِ خَفِيفَ ذَاتِ الْيَدِ ، فَقَالَتْ لَهُ : أَيَسَعُنِي أَنْ أَضَعَ صَدَقَتِي فِيكَ وَفِي بَنِي أَخٍ لِي يَتَامَى ، فَقَالَ عَبْدُ اللهِ : سَلِي عَنْ ذَلِكَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَإِذَا عَلَى بَابِهِ امْرَأَةٌ مِنَ الأَنْصَارِ يُقَالُ لَهَا : زَيْنَبُ تَسْأَلُ عَمَّا أَسْأَلُ عَنْهُ ، فَخَرَجَ إِلَيْنَا بِلاَلٌ ، فَقُلْنَا لَهُ : انْطَلِقْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَلْهُ عَنْ ذَلِكَ ، وَلاَ تُخْبِرْهُ مَنْ نَحْنُ ، فَانْطَلَقَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : مَنْ هُمَا ؟ قَالَ : زَيْنَبُ قَالَ : أَيُّ الزَّيَانِبِ ؟ قَالَ : زَيْنَبُ امْرَأَةُ عَبْدِ اللهِ وَزَيْنَبُ الأَنْصَارِيَّةُ قَالَ : نَعَمْ ، لَهُمَا أَجْرَانِ : أَجْرُ الْقَرَابَةِ ، وَأَجْرُ الصَّدَقَةِ.

2583. ...Rəvayət edilir ki, Abdullah ibn Məsudun ﵁ zövcəsi Zeynəb ﵂ demişdir: "Allah Elçisi ﷺ qadınlara buyurdu: "Taxdığnız zinət əşyalarından olsa belə, sədəqə verin". Zeynəb deyir: "Ərim Abdullah kasıb idi, ona görə də mən ona dedim: "Mən sədəqəmi sənə və qardaşının yetim uşaqlarına verə bilərəm?" O da: "Bu haqda Allah Elçisindən ﷺ soruş" dedi. Mən Peyğəmbərin ﷺ yanına gəldim. Qapının qabağında ənsardan olan Zeynəb adlı bir nəfər də var idi və mənim soruşmaq istədiyim haqda soruşmaq üçün gəlmişdi. Qapını döydük, Bilal çıxdı. Biz də: "Get Allah Elçisindən ﷺ bu haqda soruş, lakin ona bizim kim olduğumuzu demə" dedik. O da Allah Elçisinin ﷺ yanına getdi. Allah Elçisi ﷺ buyurdu: "Onlar kimlərdir?" Bilal dedi: "Zeynəb". Allah Elçisi ﷺ buyurdu: "Hansı Zeynəb?" Bilal dedi: "Abdullahın zövcəsi Zeynəb və ənsardan olan Zeynəb".

Allah Elçisi ﷺ buyurdu: "(Bəli, verə bilər). Onlara ikiqat savab var; həm qohumluq əlaqələrini möhkəmlətmək savabı, həm də sədəqə savabı".

٨٣- الْمَسْأَلَةُ

## 83-cü fəsil: İstəmək

٢٥٨٤- أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ أَبَا عُبَيْدٍ مَوْلَى عَبْدِ الرَّحْمَنِ بْنِ أَزْهَرَ ، أَخْبَرَهُ أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لأَنْ يَحْتَزِمَ أَحَدُكُمْ حُزْمَةَ حَطَبٍ عَلَى ظَهْرِهِ فَيَبِيعَهَا خَيْرٌ مِنْ أَنْ يَسْأَلَ رَجُلاً فَيُعْطِيَهُ ، أَوْ يَمْنَعَهُ.

2584. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Birinizin kürəyinə odun yığaraq bazarda satması, istəməsindən daha xeyirlidir. Həm də bilinmir ki, istədiyi adam ona nəsə verəcək və ya verməyəcək bilinmir".

٢٥٨٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ بْنِ سَعْدٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ أَبِي جَعْفَرٍ ، قَالَ : سَمِعْتُ حَمْزَةَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا يَزَالُ الرَّجُلُ يَسْأَلُ حَتَّى يَأْتِيَ يَوْمَ الْقِيَامَةِ لَيْسَ فِي وَجْهِهِ مُزْعَةٌ مِنْ لَحْمٍ.

2585. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "İstəyən adam Qiyamət günü üzündə ət olmadığı halda gələcək".

٢٥٨٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُثْمَانَ بْنِ أَبِي صَفْوَانَ الثَّقَفِيُّ ، قَالَ : حَدَّثَنَا أُمَيَّةُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ بِسْطَامَ بْنِ مُسْلِمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ خَلِيفَةَ ، عَنْ عَائِذِ بْنِ عَمْرٍو ، أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَسَأَلَهُ فَأَعْطَاهُ ، فَلَمَّا وَضَعَ رِجْلَهُ عَلَى أُسْكُفَّةِ الْبَابِ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَوْ تَعْلَمُونَ مَا فِي الْمَسْأَلَةِ ، مَا مَشَى أَحَدٌ إِلَى أَحَدٍ يَسْأَلُهُ شَيْئًا.

2586. ...Aiz ibn Amr ﷺ rəvayət edir ki, bir kişi Peyğəmbərin ﷺ yanına gəlib bir şey istədi. Peyğəmbər ﷺ onun istədiyini verdi. Həmin adam ayağını qapıdan bayıra qoyduqda Allah Elçisi ﷺ buyurdu: "Əgər bilsəydiniz ki, istəməkdə nə var, heç biriniz bir şey istəmək üçün bir addım belə atmazdınız".

٨٤- سُؤَالُ الصَّالِحِينَ

## 84-cü fəsil: İstəyəndə əməlisaleh insanlardan istəmək

٢٥٨٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ بَكْرِ بْنِ سَوَادَةَ ، عَنْ مُسْلِمِ بْنِ مَخْشِيٍّ ، عَنْ ابْنِ الْفِرَاسِيِّ ، أَنَّ الْفِرَاسِيَّ ، قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَسْأَلُ يَا رَسُولَ اللهِ ؟ قَالَ : لاَ وَإِنْ كُنْتَ سَائِلاً ، لاَ بُدَّ فَاسْأَلِ الصَّالِحِينَ.

2587. ...Rəvayət edilir ki, əl-Firasi ﷺ demişdir: "Mən Allah Elçisinə ﷺ dedim: "Ey Allahın Elçisi, mən istəyə bilərəmmi?" Allah Elçisi ﷺ buyurdu: "Xeyr, istəməli olsan əməlisaleh insanlardan istə".[1]

٨٥- الاِسْتِعْفَافُ عَنِ الْمَسْأَلَةِ

## 85-ci fəsil: Kimdənsə nəsə istəməkdən uzaq durmaq

٢٥٨٨- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ نَاسًا مِنَ الأَنْصَارِ ، سَأَلُوا رَسُولَ اللهِ ، فَأَعْطَاهُمْ ، ثُمَّ سَأَلُوهُ ، فَأَعْطَاهُمْ حَتَّى إِذَا نَفِدَ مَا عِنْدَهُ ، قَالَ : مَا يَكُونُ عِنْدِي مِنْ خَيْرٍ ، فَلَنْ أَدَّخِرَهُ عَنْكُمْ ، وَمَنْ يَسْتَعْفِفْ يُعِفَّهُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمَنْ يَصْبِرْ ، يُصَبِّرْهُ اللَّهُ ، وَمَا أُعْطِيَ أَحَدٌ عَطَاءً هُوَ خَيْرٌ ، وَأَوْسَعُ مِنَ الصَّبْرِ.

2588. ...Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, ənsardan olan adamlar Allah Elçisindən ﷺ istədilər. Allah Elçisi ﷺ onların istədiyini verdi. Sonra yenə istədilər, yenə verdi. Allah Elçisinin ﷺ yanında mal qurtarana qədər onlara verdi, sonra belə buyurdu: "Məndə olandan sizə verməyə heç nə əsirgəmərəm, amma kim ləyaqətli olmağı istəyərsə, Allah ﷻ onu ləyaqətli edər. Kim səbirli olmağı istəyərsə, Allah onu səbirli edər. Heç kimə səbirdən daha xeyirli və daha geniş bir şey verilməmişdir".

٢٥٨٩- أَخْبَرَنَا عَلِيُّ بْنُ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا مَعْنٌ ، قَالَ : أَنْبَأَنَا مَالِكٌ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ لأَنْ يَأْخُذَ أَحَدُكُمْ حَبْلَهُ فَيَحْتَطِبَ عَلَى ظَهْرِهِ ، خَيْرٌ لَهُ مِنْ أَنْ يَأْتِيَ رَجُلاً أَعْطَاهُ اللَّهُ عَزَّ وَجَلَّ مِنْ فَضْلِهِ ، فَيَسْأَلَهُ أَعْطَاهُ ، أَوْ مَنَعَهُ.

2589. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Canım Əlində Olana and olsun ki, sizdən birinizin ipini götürərək kürəyində odun daşıması, Allahın ﷻ lütf edərək verdiyi bir kimsədən nəsə istəməsindən daha xeyirlidir. O adam da ona istədiyini verəcək, ya verməyəcək, bəlli deyil".

٨٦- فَضْلُ مَنْ لاَ يَسْأَلُ النَّاسَ شَيْئًا

## 86-cı fəsil: İnsanlardan heç kəsdən istəməməyin fəziləti

٢٥٩٠- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي ذِئْبٍ ، حَدَّثَنِي مُحَمَّدُ بْنُ قَيْسٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ بْنِ مُعَاوِيَةَ ، عَنْ ثَوْبَانَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ يَضْمَنْ لِي وَاحِدَةً وَلَهُ الْجَنَّةُ قَالَ يَحْيَى : هَاهُنَا كَلِمَةٌ مَعْنَاهَا أَنْ لاَ يَسْأَلَ النَّاسَ شَيْئًا.

[1] Hədis zəifdir.

2590. ...Rəvayət edilir ki, Səvban ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim bir məsələdə mənə zəmanət verərsə, ona Cənnət var”. Ravi Yəhya deyir: “Bu istəmək insanlardan heç nə istəməməkdir”.

٢٥٩١- أَخْبَرَنَا هِشَامُ بْنُ عَمَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ حَمْزَةَ ، قَالَ : حَدَّثَنِي الأَوْزَاعِيُّ ، عَنْ هَارُونَ بْنِ رِئَابٍ أَنَّهُ حَدَّثَهُ ، عَنْ أَبِي بَكْرٍ ، عَنْ قَبِيصَةَ بْنِ مُخَارِقٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ تَصْلُحُ الْمَسْأَلَةُ إِلاَّ لِثَلاَثَةٍ رَجُلٍ : أَصَابَتْ مَالَهُ جَائِحَةٌ ، فَيَسْأَلُ حَتَّى يُصِيبَ سِدَادًا مِنْ عَيْشٍ ، ثُمَّ يُمْسِكُ ، وَرَجُلٍ تَحَمَّلَ حَمَالَةً ، فَيَسْأَلُ حَتَّى يُؤَدِّيَ إِلَيْهِمْ حَمَالَتَهُمْ ، ثُمَّ يُمْسِكُ عَنِ الْمَسْأَلَةِ ، وَرَجُلٍ يَحْلِفُ ثَلاَثَةُ نَفَرٍ مِنْ قَوْمِهِ مِنْ ذَوِي الْحِجَا بِاللهِ ، لَقَدْ حَلَّتِ الْمَسْأَلَةُ لِفُلاَنٍ ، فَيَسْأَلُ حَتَّى يُصِيبَ قِوَامًا مِنْ مَعِيشَةٍ ، ثُمَّ يُمْسِكُ عَنِ الْمَسْأَلَةِ ، فَمَا سِوَى ذَلِكَ سُحْتٌ.

2591. ...Rəvayət edilir ki, Qabisa ibn Muxariq ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “İstəmək üç nəfərdən başqa heç kimə yaramır; bir çətinliyə düşən adamın, malına bəla gəlmiş birinin vəziyyəti düzələnə qədər istəməsi, sonra bunu tərk edir; iki nəfər arasında zamin olub borca düşən bu məbləği toplayana qədər istəyə bilər, sonra istəməyi tərk edir; yoxsul olmasına üç kişinin onun şahidlik etdiyi kimsə dolanmaq üçün istəyə bilər, sonra istəməyi tərk edir. Bunlardan başqalarının istəməsi istəmək malı haqsız yeməkdir”.

## ٨٧- حَدُّ الْغِنَى

## 87-ci fəsil: Varlı olmağın həddi

٢٥٩٢- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ الثَّوْرِيُّ ، عَنْ حَكِيمِ بْنِ جُبَيْرٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ سَأَلَ وَلَهُ مَا يُغْنِيهِ ، جَاءَتْ خُمُوشًا ، أَوْ كُدُوحًا فِي وَجْهِهِ يَوْمَ الْقِيَامَةِ قِيلَ يَا رَسُولَ اللهِ : وَمَاذَا يُغْنِيهِ ، أَوْ مَاذَا أَغْنَاهُ ؟ قَالَ : خَمْسُونَ دِرْهَمًا ، أَوْ حِسَابُهَا مِنَ الذَّهَبِ قَالَ يَحْيَى : قَالَ سُفْيَانُ : وَسَمِعْتُ زُبَيْدًا ، يُحَدِّثُ عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ.

2592. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim ehtiyacı olmadığı halda istəyərsə, Qiyamət günü üzü cırılmış və ya ətsiz vəziyyətdə gələcək”. Ona deyildi: “Ey Allahın Elçisi, varlı kim sayılır?” Allah Elçisi ﷺ buyurdu: “Əlli dirhəm gümüş və ya buna bərabər qızılı olan kimsə varlı sayılır”.

## ٨٨- بَابُ الإِلْحَافِ فِي الْمَسْأَلَةِ

## 88-ci fəsil: İstəməkdə israrlı olmamaq

٢٥٩٣- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ وَهْبِ بْنِ مُنَبِّهٍ ، عَنْ أَخِيهِ ، عَنْ مُعَاوِيَةَ ، أَنَّ رَسُولَ اللهِ

صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تُلْحِفُوا فِي الْمَسْأَلَةِ ، وَلاَ يَسْأَلُنِي أَحَدٌ مِنْكُمْ شَيْئًا ، وَأَنَا لَهُ كَارِهٌ ، فَيُبَارَكَ لَهُ فِيمَا أَعْطَيْتُهُ.

2593. ...Müaviyə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "İstəməkdə israr etməyin! Biriniz məndən xoşlamadığım bir şeyi istəyərsə, mən də ona istədiyi şeyi versəm belə verdiyim şeyin bərəkəti olmaz".

## ٨٩- مَنِ الْمُلْحِفُ

## 89-cu fəsil: İstəyən kimdir?

٢٥٩٤- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ سُفْيَانَ بْنِ عُيَيْنَةَ ، عَنْ دَاوُدَ بْنِ شَابُورَ ، عَنْ عَمْرِو بْنِ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ سَأَلَ وَلَهُ أَرْبَعُونَ دِرْهَمًا ، فَهُوَ الْمُلْحِفُ.

2594. ...Amr ibn Şueyb atasının və babasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim qırx dirhəmi ola-ola istəyərsə, o, ehtiyac olmadan istəmiş sayılır".

٢٥٩٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي الرِّجَالِ ، عَنْ عُمَارَةَ بْنِ غَزِيَّةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنْ أَبِيهِ ، قَالَ : سَرَّحَتْنِي أُمِّي إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَيْتُهُ وَقَعَدْتُ ، فَاسْتَقْبَلَنِي ، وَقَالَ : مَنِ اسْتَغْنَى : أَغْنَاهُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمَنِ اسْتَعَفَّ : أَعَفَّهُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمَنِ اسْتَكْفَى : كَفَاهُ اللَّهُ عَزَّ وَجَلَّ ، وَمَنْ سَأَلَ وَلَهُ قِيمَةُ أُوقِيَّةٍ : فَقَدْ أَلْحَفَ ، فَقُلْتُ : نَاقَتِي الْيَاقُوتَةُ ، خَيْرٌ مِنْ أُوقِيَّةٍ فَرَجَعْتُ ، وَلَمْ أَسْأَلْهُ.

2595. ...Abdur-Rahmən ibn Əbu Səid əl-Xudri atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Anam məni Allah Elçisinin ﷺ yanına göndərmişdi. Mən onun yanına gəldikdə məni qarşıladı və belə buyurdu: "Kim başqalarına möhtac olmaq istəməzsə, Allah ﷻ onu heç kimə möhtac etməz. Ləyaqətli olmaq istəyəni, Allah ﷻ ləyaqətli edər. Kim ehtiyacına kifayət edəcək qədər yaşayış istəyərsə, Allah ﷻ onu heç kimə möhtac etməz. Kim qırx dirhəmi ola-ola istəyərsə, ehtiyacı olmadığı halda istəmiş olar". Mən özözümə: "Mənim yaqut rəngli dəvəm qırx dirhəmdən də çox edər" dedim və qayıdaraq bir şey istəmədim".

## ٩٠- إِذَا لَمْ يَكُنْ لَهُ دَرَاهِمُ وَكَانَ لَهُ عَدْلُهَا

## 90-cı fəsil: Dirhəmi olmayıb ona bərabər bir şeyi olan

٢٥٩٦- قَالَ الْحَارِثُ بْنُ مِسْكِينٍ : ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : أَنْبَأَنَا مَالِكٌ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ رَجُلٍ مِنْ بَنِي أَسَدٍ قَالَ : نَزَلْتُ أَنَا وَأَهْلِي ، بِبَقِيعِ الْغَرْقَدِ فَقَالَتْ لِي أَهْلِي : اذْهَبْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ،

فَسَلْهُ لَنَا شَيْئًا نَأْكُلُهُ ، فَذَهَبْتُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَوَجَدْتُ عِنْدَهُ رَجُلاً يَسْأَلُهُ ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : لاَ أَجِدُ مَا أُعْطِيكَ فَوَلَّى الرَّجُلُ عَنْهُ وَهُوَ مُغْضَبٌ ، وَهُوَ يَقُولُ : لَعَمْرِي إِنَّكَ لَتُعْطِي مَنْ شِئْتَ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّهُ لَيَغْضَبُ عَلَيَّ أَنْ لاَ أَجِدَ مَا أُعْطِيهِ ، مَنْ سَأَلَ مِنْكُمْ وَلَهُ أُوقِيَّةٌ أَوْ عِدْلُهَا ، فَقَدْ سَأَلَ إِلْحَافًا قَالَ الأَسَدِيُّ : فَقُلْتُ لَلَقْحَةٌ لَنَا خَيْرٌ مِنْ أُوقِيَّة ، وَالأُوقِيَّةُ : أَرْبَعُونَ دِرْهَمًا ، فَرَجَعْتُ ، وَلَمْ أَسْأَلْهُ ، فَقَدِمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ ذَلِكَ ، شَعِيرٌ ، وَزَبِيبٌ ، فَقَسَّمَ لَنَا مِنْهُ حَتَّى أَغْنَانَا اللَّهُ عَزَّ وَجَلَّ.

2596. ...Əta ibn Yəsar ﷺ Bəni Əsəd tayfasından olan bir kişinin belə dediyini rəvayət etmişdir: “Mən və ailəm Bəqiul-Ğarqadda məskunlaşdıq. Ailə üzvlərim mənə dedi: “Allah Elçisinin ﷺ yanına get və yeməyə bir şey istə”. Mən də onun yanına getdim Onun yanında bir şey istəyən bir adam var idi. Allah Elçisi ﷺ ona belə deyirdi: “Sənə verməyə bir şeyim yoxdur”. Adam qəzəbli halda geri qayıtdı və bu əsnada belə deyirdi: “Ömrümə and olsun[1] ki, istədiyin adamlara verirsən”. Allah Elçisi ﷺ buyurdu: “Ona verəcək bir şey olmadığına görə mənə qəzəbi tutur. Birinizin qırx dirhəmi və ona bərabər bir malı varsa, bu halda bir şey istəyirsə, o, ehtiyacı olmadan istəyəndir”. Mən də öz-özümə: “Mənim çoxlu süd verən bir dəvəm var. Bu dəvəm qırx dirhəmdən çox edir”- dedim və heç bir şey istəmədən geriyə qayıtdım. Bu hadisədən sonra Allah Elçisinə ﷺ arpa və quru üzüm gətirildi, o da o gətiriləndən bizim aramızda paylaşdırdı və Allah bizi bu şeylərlə varlandırdı”.

٢٥٩٧– أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي بَكْرٍ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَحِلُّ الصَّدَقَةُ لِغَنِيٍّ ، وَلاَ لِذِي مِرَّةٍ سَوِيٍّ.

2597. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Varlı və sağlam adama sədəqə götürmək halal deyil”.

## ٩١– مَسْأَلَةُ الْقَوِيِّ الْمُكْتَسِبِ

## 91-ci fəsil: Varlı və qazanmağa gücü çatanın istəməsi

٢٥٩٨– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنِي عُبَيْدُ اللهِ بْنُ عَدِيِّ بْنِ الْخِيَارِ ، أَنَّ رَجُلَيْنِ حَدَّثَاهُ أَنَّهُمَا : أَتَيَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْأَلاَنِهِ مِنَ الصَّدَقَةِ ؟ فَقَلَّبَ فِيهِمَا الْبَصَرَ ، – وَقَالَ مُحَمَّدٌ : بَصَرَهُ – فَرَآهُمَا جَلْدَيْنِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنْ شِئْتُمَا ، وَلاَ حَظَّ فِيهَا لِغَنِيٍّ ، وَلاَ لِقَوِيٍّ مُكْتَسِبٍ.

[1] Bu söz ərəb dilində and mənasında işlənməyən bir sözdür. Necə ki Peyğəmbər Muaz üçün “Anan sənə ağlasın!” demişdi. Halbuki, bu sözü ilə Peyğəmbər ona xeyir arzulayırdı.

2598. ...Ubeydullah ibn Adiy ibn əl-Xiyər ﵁ iki nəfərdən bunları rəvayət etmişdir: “Onlar Allah Elçisinin ﷺ yanına sədəqə istəmək üçün gəlmişdilər. Allah Elçisi ﷺ onlara baxıb onların sağlam olduğunu gördükdən sonra belə buyurdu: “İstəyirsənizsə, verim, amma bu sədəqədə varlı və qazanmağa gücü çatan şəxsin haqqı yoxdur”.

### ٩٢- مَسْأَلَةُ الرَّجُلِ ذَا سُلْطَانٍ

### 92-ci fəsil: Rəhbərdən istəyən adam

٢٥٩٩- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : مُحَمَّدُ بْنُ بِشْرٍ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الْمَلِكِ ، عَنْ زَيْدِ بْنِ عُقْبَةَ ، عَنْ سَمُرَةَ بْنِ جُنْدُبٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْمَسَائِلَ كُدُوحٌ ، يَكْدَحُ بِهَا الرَّجُلُ وَجْهَهُ ، فَمَنْ شَاءَ كَدَحَ وَجْهَهُ ، وَمَنْ شَاءَ تَرَكَ ، إِلاَّ أَنْ يَسْأَلَ الرَّجُلُ ذَا سُلْطَانٍ ، أَوْ شَيْئًا لاَ يَجِدُ مِنْهُ بُدًّا.

2599. ...Rəvayət edilir ki, Səmura ibn Cundəb ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, istəmək cırmaqlanmaq deməkdir. İstəyən adam öz üzünü cırmaqlayır. Kim istəsə üzünü cırmaqlayar, kim də istəsə bunu tərk edər. Ancaq adamın bir vəzifəlidən istəməsi və ya həqiqi çətinlikdə olanın istəməsi belə deyil”.

### ٩٣- مَسْأَلَةُ الرَّجُلِ فِي أَمْرٍ لاَ بُدَّ لَهُ مِنْهُ

### 93-cü fəsil: Çətin vəziyyətdə olan adamın istəməsi

٢٦٠٠- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ الْمَلِكِ ، عَنْ زَيْدِ بْنِ عُقْبَةَ ، عَنْ سَمُرَةَ بْنِ جُنْدُبٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْمَسْأَلَةُ كَدٌّ يَكُدُّ بِهَا الرَّجُلُ وَجْهَهُ ، إِلاَّ أَنْ يَسْأَلَ الرَّجُلُ سُلْطَانًا ، أَوْ فِي أَمْرٍ لاَ بُدَّ مِنْهُ.

2600. ...Rəvayət edilir ki, Səmura ibn Cundəb ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, istəmək özünü cırmaqlamaq deməkdir. İstəyən adam üzünü cırmaqlayır. Ancaq insanın dövlətdən nəsə istəməsi və ya çətinlikdə olanın istəməsi belə deyil”.

٢٦٠١- أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلاَءِ بْنِ عَبْدِ الْجَبَّارِ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ ، عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ، قَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ ، فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ ، فَأَعْطَانِي ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا حَكِيمُ إِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ ، فَمَنْ أَخَذَهُ بِطِيبِ نَفْسٍ ، بُورِكَ لَهُ فِيهِ ، وَمَنْ أَخَذَهُ بِإِشْرَافِ نَفْسٍ ، لَمْ يُبَارَكْ لَهُ فِيهِ ، وَكَانَ كَالَّذِي يَأْكُلُ ، وَلاَ يَشْبَعُ ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى.

2601. ...Rəvayət edilir ki, Həkim ibn Hizam رضي الله عنه demişdir: “Mən Allah Elçisindən ﷺ istədim, o verdi, mən ondan istədim, o verdi, mən yenə ondan istədim, o verdi. Sonra Allah Elçisi ﷺ belə buyurdu: “Ey Həkim, bu dünya malı şirin və cəzbedicidir. Kim onu qəlb rahatlığı ilə götürərsə, onun üçün bərəkətli olar. Kim onu acgözlük və hərisliklə götürərsə, onun üçün bərəkəti olmaz. O, yeyib doymayan adama bənzəyir. Verən əl alan əldən daha xeyirlidir”.

٢٦٠٢– أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا مِسْكِينُ بْنُ بُكَيْرٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ حَكِيمِ بْنِ حِزَامٍ ، قَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ ، فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ ، فَأَعْطَانِي ، ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا حَكِيمُ إِنَّ هَذَا الْمَالَ خَضِرَةٌ حُلْوَةٌ ، مَنْ أَخَذَهُ بِسَخَاوَةِ نَفْسٍ ، بُورِكَ لَهُ فِيهِ ، وَمَنْ أَخَذَهُ بِإِشْرَافِ النَّفْسِ ، لَمْ يُبَارَكْ لَهُ فِيهِ ، وَكَانَ كَالَّذِي يَأْكُلُ ، وَلاَ يَشْبَعُ ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى.

2602. ...Rəvayət edilir ki, Həkim ibn Hizam رضي الله عنه demişdir: “Mən Allah Elçisindən ﷺ istədim, o verdi, mən ondan istədim, o verdi, mən yenə ondan istədim, o verdi. Sonra Allah Elçisi ﷺ belə buyurdu: “Ey Həkim, həqiqətən, bu mal şirin və cəzbedicidir. Kim onu səxavətli nəfs ilə götürərsə, onun üçün bərəkətli olar. Kim onu acgözlük və hərisliklə götürərsə, onun bərəkəti olmaz. O, yeyib doymayan adama bənzəyir. Verən əl alan əldən daha xeyirlidir”.

٢٦٠٣– أَخْبَرَنِي الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ بَكْرٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، وَسَعِيدِ بْنِ الْمُسَيَّبِ ، أَنَّ حَكِيمَ بْنَ حِزَامٍ ، قَالَ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَعْطَانِي ، ثُمَّ سَأَلْتُهُ ، فَأَعْطَانِي ، ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا حَكِيمُ إِنَّ هَذَا الْمَالَ حُلْوَةٌ ، فَمَنْ أَخَذَهُ بِسَخَاوَةِ نَفْسٍ ، بُورِكَ لَهُ فِيهِ ، وَمَنْ أَخَذَهُ بِإِشْرَافِ نَفْسٍ ، لَمْ يُبَارَكْ لَهُ فِيهِ ، وَكَانَ كَالَّذِي يَأْكُلُ ، وَلاَ يَشْبَعُ ، وَالْيَدُ الْعُلْيَا ، خَيْرٌ مِنَ الْيَدِ السُّفْلَى قَالَ حَكِيمٌ : فَقُلْتُ يَا رَسُولَ اللهِ : وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ ، لاَ أَرْزَأُ أَحَدًا بَعْدَكَ حَتَّى أُفَارِقَ الدُّنْيَا بِشَيْءٍ.

2603. ...Rəvayət edilir ki, Həkim ibn Hizam رضي الله عنه demişdir: “Mən Allah Elçisindən ﷺ istədim, o verdi, mən istədim, o verdi, mən yenə istədim, o verdi. Sonra Allah Elçisi ﷺ belə buyurdu: “Ey Həkim, həqiqətən, bu mal şirin və cəzbedicidir. Kim onu səxavətli nəfs ilə götürərsə, onun üçün bərəkətli olar. Kim onu acgözlük və hərisliklə götürərsə, onun bərəkəti olmaz. O, yeyib doymayan adama bənzəyir. Verən əl alan əldən daha xeyirlidir”. Həkim deyir: “Mən dedim: “Ey Allahın Elçisi, səni haqq ilə göndərənə and olsun! Ölənə qədər dünyaya aid heç nəyi heç kimdən istəməyəcəyəm”.

٩٤- مَنْ آتَاهُ اللَّهُ عَزَّ وَجَلَّ مَالاً مِنْ غَيْرِ مَسْأَلَةٍ

## 94-cü fəsil: İstəmədən Allahın ﷻ ona var-dövlət verməsi

٢٦٠٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ بُكَيْرٍ ، عَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، عَنِ ابْنِ السَّاعِدِيِّ الْمَالِكِيِّ ، قَالَ : اسْتَعْمَلَنِي عُمَرُ بْنُ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ عَلَى الصَّدَقَةِ ، فَلَمَّا فَرَغْتُ مِنْهَا فَأَدَّيْتُهَا إِلَيْهِ ، أَمَرَ لِي بِعُمَالَةٍ ، فَقُلْتُ لَهُ : إِنَّمَا عَمِلْتُ لِلَّهِ عَزَّ وَجَلَّ ، وَأَجْرِي عَلَى اللهِ عَزَّ وَجَلَّ ، فَقَالَ : خُذْ مَا أَعْطَيْتُكَ ، فَإِنِّي قَدْ عَمِلْتُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ لَهُ : مِثْلَ قَوْلِكَ ، فَقَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أُعْطِيتَ شَيْئًا مِنْ غَيْرِ أَنْ تَسْأَلَ ، فَكُلْ ، وَتَصَدَّقْ.

2604. ...Rəvayət edilir ki, İbn əs-Səidi əl-Maliki ؓ demişdir: "Ömər ibn əl-Xattab ؓ məni zəkat toplamaq üçün cavabdeh etmişdi. Mən işimi bitirdikdə topladıqlarımı ona verdim və Ömər mənə məvacib verilməsini əmr etdi. Mən ona dedim: "Mən bunu Allah ﷻ üçün etdim, əvəzini də Allahdan ﷻ gözləyirəm". O dedi: "Sənə verdiyimi götür! Mən Allah Elçisinin ﷺ dövründə bir işlə vəzifələndirilmişdim. O vaxt mən də sənin dediyin kimi demişdim. Allah Elçisi ﷺ mənə belə buyurdu: "İstəmədiyin halda sənə versələr, (götür) ye və sədəqə ver".[1]

٢٦٠٥- أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ أَبُو عُبَيْدِ اللهِ الْمَخْزُومِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ السَّائِبِ بْنِ يَزِيدَ ، عَنْ حُوَيْطِبِ بْنِ عَبْدِ الْعُزَّى ، قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ السَّعْدِيِّ ، أَنَّهُ قَدِمَ عَلَى عُمَرَ بْنِ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ مِنَ الشَّامِ فَقَالَ : أَلَمْ أُخْبَرْ أَنَّكَ تَعْمَلُ عَلَى عَمَلٍ مِنْ أَعْمَالِ الْمُسْلِمِينَ ، فَتُعْطَى عَلَيْهِ عُمَالَةً ، فَلاَ تَقْبَلُهَا ، قَالَ : أَجَلْ إِنَّ لِي أَفْرَاسًا ، وَأَعْبُدًا ، وَأَنَا بِخَيْرٍ ، وَأُرِيدُ أَنْ يَكُونَ عَمَلِي صَدَقَةً عَلَى الْمُسْلِمِينَ ، فَقَالَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ : إِنِّي أَرَدْتُ الَّذِي أَرَدْتَ ، وَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُعْطِينِي الْمَالَ ، فَأَقُولُ أَعْطِهِ ، مَنْ هُوَ أَفْقَرُ إِلَيْهِ مِنِّي ، وَإِنَّهُ أَعْطَانِي مَرَّةً مَالاً ، فَقُلْتُ لَهُ ، أَعْطِهِ ، مَنْ هُوَ أَحْوَجُ إِلَيْهِ مِنِّي ، فَقَالَ : مَا آتَاكَ اللَّهُ عَزَّ وَجَلَّ مِنْ هَذَا الْمَالِ مِنْ غَيْرِ مَسْأَلَةٍ ، وَلاَ إِشْرَافٍ ، فَخُذْهُ ، فَتَمَوَّلْهُ ، أَوْ تَصَدَّقْ بِهِ ، وَمَا لاَ فَلاَ تُتْبِعْهُ نَفْسَكَ.

2605. ...Rəvayət edilir ki, Abdullah ibn əs-Sədi ؓ demişdir: "Mən Şamdan Ömər ibn əl-Xattabın yanına gəldim. Ömər mənə dedi: "Məgər sənin müsəlmanların bir işinə məsul edildiyin vaxt bir məvacib verildikdə, onu götürməli olduğunu bilmirsənmi? Sən isə onu qəbul etmirsən". Mən dedim: "Mənim atlarım və kölələrim var. Xeyir içində yaşayıram. Etdiyim işin məvacibini müsəlmanlara sədəqə olsun deyə götürmədim". Ömər dedi: "Mən də sənin istədiyin kimi istəmişdim, lakin Allah Elçisi ﷺ mənə bu məvacibi verdi. Mən dedim: "Bunu məndən daha kasıb olanlara verin". Bir dəfə də belə bir məvacib vermişdi, mən də: "Məndən daha çox ehtiyacı olan verin" dedim. Allah Elçisi ﷺ buyurdu: "İstəmədiyin halda Allah

---

[1] Yəni nəsə versələr, onu götürüb istifadə edərək qida alıb yeyə, həmçinin sədəqə də verə bilərsən.

tərəfindən sənə verilən bu malı acgözlük olmadan götür və qəbul et. İstəsən ondan özün istifadə et, istəsən, sədəqə ver. Sənə verilməyən malda isə gözün qalmasın”.

٢٦٠٦– أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ السَّائِبِ بْنِ يَزِيدَ ، أَنَّ حُوَيْطِبَ بْنَ عَبْدِ الْعُزَّى أَخْبَرَهُ ، أَنَّ عَبْدَ اللهِ بْنَ السَّعْدِيِّ ، أَخْبَرَهُ أَنَّهُ قَدِمَ عَلَى عُمَرَ بْنِ الْخَطَّابِ فِي خِلاَفَتِهِ ، فَقَالَ لَهُ عُمَرُ : أَلَمْ أُحَدَّثْ أَنَّكَ تَلِي مِنْ أَعْمَالِ النَّاسِ أَعْمَالاً ، فَإِذَا أُعْطِيتَ الْعُمَالَةَ رَدَدْتَهَا فَقُلْتُ بَلَى ، فَقَالَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ : فَمَا تُرِيدُ إِلَى ذَلِكَ ، فَقُلْتُ : لِي أَفْرَاسٌ وَأَعْبُدٌ وَأَنَا بِخَيْرٍ ، وَأُرِيدُ أَنْ يَكُونَ عَمَلِي صَدَقَةً عَلَى الْمُسْلِمِينَ ، فَقَالَ لَهُ عُمَرُ : فَلاَ تَفْعَلْ فَإِنِّي كُنْتُ أَرَدْتُ مِثْلَ الَّذِي أَرَدْتَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُعْطِينِي الْعَطَاءَ ، فَأَقُولُ أَعْطِهِ أَفْقَرَ إِلَيْهِ مِنِّي ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خُذْهُ فَتَمَوَّلْهُ ، أَوْ تَصَدَّقْ بِهِ مَا جَاءَكَ مِنْ هَذَا الْمَالِ ، وَأَنْتَ غَيْرُ مُشْرِفٍ ، وَلاَ سَائِلٍ فَخُذْهُ ، وَمَا لاَ فَلاَ تُتْبِعْهُ نَفْسَكَ.

2606. ...Abdullah ibn əs-Sədi ﵀ rəvayət edir ki, Ömər ibn əl-Xattabın xilafəti zamanı onun yanına gəldi. Ömər ona dedi: “Mənə verilən məlumata görə, sən digər insanlar kimi işlədilirsən, sənə məvacib verəndə isə onu götürmürsən”. Mən: Bəli” dedim. Ömər dedi: “Bu verilənı niyə götürmürsən?” Mən dedim: “Mənim atlarım və kölələrim var. Xeyir içində yaşayıram. Etdiyim işin məvacibini müsəlmanlara sədəqə olsun deyə götürmürəm”. Ömər dedi: “Belə etmə! Mən də sənin istəyin kimi etmişdim, lakin Allah Elçisi ﷺ mənə bu məvacibi verdi. Mən dedim: “Bunu məndən daha kasıb olanlara verin”. Allah Elçisi ﷺ buyurdu: “Sənə veriləni götür, sənin olsun və ya onu sədəqə ver. İstəmədiyin halda sənə verilən bu malı acgözlük olmadan götür, lakin sənə verilməyən malda gözün qalmasın”.

٢٦٠٧– أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، وَإِسْحَقُ بْنُ مَنْصُورٍ ، عَنِ الْحَكَمِ بْنِ نَافِعٍ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي السَّائِبُ بْنُ يَزِيدَ ، أَنَّ حُوَيْطِبَ بْنَ عَبْدِ الْعُزَّى أَخْبَرَهُ ، أَنَّ عَبْدَ اللهِ بْنَ السَّعْدِيِّ أَخْبَرَهُ ، أَنَّهُ قَدِمَ عَلَى عُمَرَ بْنِ الْخَطَّابِ فِي خِلاَفَتِهِ فَقَالَ عُمَرُ : أَلَمْ أُخْبَرْ أَنَّكَ تَلِي مِنْ أَعْمَالِ النَّاسِ أَعْمَالاً ، فَإِذَا أُعْطِيتَ الْعُمَالَةَ كَرِهْتَهَا ، قَالَ : فَقُلْتُ : بَلَى ، قَالَ : فَمَا تُرِيدُ إِلَى ذَلِكَ ، فَقُلْتُ : إِنَّ لِي أَفْرَاسًا وَأَعْبُدًا ، وَأَنَا بِخَيْرٍ وَأُرِيدُ أَنْ يَكُونَ عَمَلِي صَدَقَةً عَلَى الْمُسْلِمِينَ ، فَقَالَ عُمَرُ : فَلاَ تَفْعَلْ فَإِنِّي كُنْتُ أَرَدْتُ الَّذِي أَرَدْتَ ، فَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُعْطِينِي الْعَطَاءَ ، فَأَقُولُ : أَعْطِهِ ، أَفْقَرَ إِلَيْهِ مِنِّي ، حَتَّى أَعْطَانِي مَرَّةً مَالاً ، فَقُلْتُ : أَعْطِهِ ، أَفْقَرَ إِلَيْهِ مِنِّي ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خُذْهُ ، فَتَمَوَّلْهُ ، وَتَصَدَّقْ بِهِ ، فَمَا جَاءَكَ مِنْ هَذَا الْمَالِ وَأَنْتَ غَيْرُ مُشْرِفٍ ، وَلاَ سَائِلٍ فَخُذْهُ ، وَمَا لاَ فَلاَ تُتْبِعْهُ نَفْسَكَ.

2607. ...Rəvayət edilir ki, Abdullah ibn əs-Sədi ﵀ Ömər ibn əl-Xattabın xilafəti zamanı onun yanına gəldi. Ömər ona dedi: “Mənə verilən məlumata görə, sən digər insanlar kimi işlədilirsən, sənə məvacib verəndə isə onu götürmürsən”. Mən: Bəli” dedim. Ömər dedi: “Bu veriləni niyə

götürmürsən?" Mən dedim: "Mənim atlarım və kölələrim var. Xeyir içində yaşayıram. Etdiyim işin məvacibini müsəlmanlara sədəqə olsun deyə götürmürəm". Ömər dedi: "Belə etmə! Mən də sənin istədiyin kimi istəmişdim, lakin Peyğəmbər ﷺ mənə bu məvacibi verdi. Mən dedim: "Bunu məndən daha kasıb olanlara verin". Bir dəfə də mənə mal verdikdə dedim: "Bunu məndən daha kasıb olanlara verin". Peyğəmbər ﷺ buyurdu: "Sənə veriləni götür, sənin olsun və ya onu sədəqə ver. İstəmədiyin halda sənə verilən bu malı acgözlük olmadan götür, lakin sənə verilməyən malda gözün qalmasın".

٢٦٠٨- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا الْحَكَمُ بْنُ نَافِعٍ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي سَالِمُ بْنُ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، قَالَ : سَمِعْتُ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُ ، يَقُولُ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُعْطِينِي الْعَطَاءَ ، فَأَقُولُ : أَعْطِهِ ، أَفْقَرَ إِلَيْهِ مِنِّي ، حَتَّى أَعْطَانِي مَرَّةً مَالاً ، فَقُلْتُ لَهُ : أَعْطِهِ ، أَفْقَرَ إِلَيْهِ مِنِّي ، فَقَالَ : خُذْهُ ، فَتَمَوَّلْهُ ، وَتَصَدَّقْ بِهِ ، وَمَا جَاءَكَ مِنْ هَذَا الْمَالِ وَأَنْتَ غَيْرُ مُشْرِفٍ ، وَلاَ سَائِلٍ ، فَخُذْهُ ، وَمَا لاَ فَلاَ تُتْبِعْهُ نَفْسَكَ.

2608. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Mən Ömərin belə dediyini eşitdim: "Peyğəmbər ﷺ mənə mal verdikdə mən dedim: "Bunu məndən daha kasıb olanlara ver". Bir dəfə də mənə mal verdikdə mən ona dedim: "Bunu məndən daha kasıb olanlara verin". Peyğəmbər ﷺ buyurdu: "Sənə veriləni götür, sənin olsun və ya onu sədəqə ver. İstəmədiyin halda sənə verilən bu malı acgözlük olmadan götür, lakin sənə verilməyən malda gözün qalmasın".

## ٩٥- بَابُ اسْتِعْمَالِ آلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الصَّدَقَةِ

## 95-ci fəsil: Peyğəmbərin ﷺ ailəsindən olana sədəqə yığmaq cavabdehliyi

٢٦٠٩- أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْحَارِثِ بْنِ نَوْفَلٍ الْهَاشِمِيِّ ، أَنَّ عَبْدَ الْمُطَّلِبِ بْنَ رَبِيعَةَ بْنِ الْحَارِثِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ، أَخْبَرَهُ أَنَّ أَبَاهُ رَبِيعَةَ بْنَ الْحَارِثِ قَالَ : لِعَبْدِ الْمُطَّلِبِ بْنِ رَبِيعَةَ بْنِ الْحَارِثِ ، وَالْفَضْلِ بْنِ الْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ، ائْتِيَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُولاَ لَهُ : اسْتَعْمِلْنَا يَا رَسُولَ اللهِ عَلَى الصَّدَقَاتِ ، فَأَتَى عَلِيُّ بْنُ أَبِي طَالِبٍ ، وَنَحْنُ عَلَى تِلْكَ الْحَالِ ، فَقَالَ لَهُمَا : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لاَ يَسْتَعْمِلُ مِنْكُمْ أَحَدًا عَلَى الصَّدَقَةِ ، قَالَ عَبْدُ الْمُطَّلِبِ : فَانْطَلَقْتُ أَنَا وَالْفَضْلُ ، حَتَّى أَتَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ لَنَا : إِنَّ هَذِهِ الصَّدَقَةَ ، إِنَّمَا هِيَ أَوْسَاخُ النَّاسِ ، وَإِنَّهَا لاَ تَحِلُّ ، لِمُحَمَّدٍ وَلاَ لِآلِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2609. ...Rəvayət edilir ki, Rabia ibn əl-Haris رضي الله عنه demişdir: "Mən Abdul-Muttalib ibn Rabia ibn əl-Haris və Fədl ibn Abdul-Muttalibə dedim: "Allah Elçisinin ﷺ yanına gedin və: "Ey Allahın Elçisi, bizə sədəqə yığmaq üçün

vəzifə ver" deyin". Biz bu halda olarkən Əli ibn Əbu Talib gəldi və onlara dedi: "Allah Elçisi ﷺ sizdən heç birinizi zəkat toplamaq üçün məsul etməz". Abdul-Muttalib hadisənin davamını belə danışır: "Mən və Fədl Allah Elçisinin ﷺ yanına getdik. O bizə dedi: "Bu sədəqə insanların mallarının kirləridir. Ona görə sədəqə Muhəmmədə və Muhəmmədin ailə üzvlərinə halal deyil".

٩٦- بَابُ ابْنُ أُخْتِ الْقَوْمِ مِنْهُمْ

96-cı fəsil: Bir qövmün bacısı oğlunun onlardan sayılması

٢٦١٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : قُلْتُ لأَبِي إِيَاسٍ مُعَاوِيَةَ بْنِ قُرَّةَ ، أَسَمِعْتَ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ابْنُ أُخْتِ الْقَوْمِ مِنْ أَنْفُسِهِمْ قَالَ : نَعَمْ.

2610. ...Rəvayət edilir ki, Şubə ﷺ demişdir: "Mən Əbu İyasa Müaviyə ibn Qurraya dedim: "Sən Ənəs ibn Malikin Allah Elçisindən ﷺ eşitdiyi bu hədisi "Bir qövmün bacısı oğlu onlardandır"- eşitmisənmi?" O da: "Bəli"- dedi".

٢٦١١- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ابْنُ أُخْتِ الْقَوْمِ مِنْهُمْ.

2611. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bir qövmün bacısı oğlu onlardandır".

٩٧- بَابُ مَوْلَى الْقَوْمِ مِنْهُمْ

97-ci fəsil: Bir qövmün kölələikdən azad etdiyi şəxsin onlardan sayılması

٢٦١٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا الْحَكَمُ ، عَنِ ابْنِ أَبِي رَافِعٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، اسْتَعْمَلَ رَجُلاً مِنْ بَنِي مَخْزُومٍ عَلَى الصَّدَقَةِ ، فَأَرَادَ أَبُو رَافِعٍ أَنْ يَتْبَعَهُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الصَّدَقَةَ لاَ تَحِلُّ لَنَا ، وَإِنَّ مَوْلَى الْقَوْمِ مِنْهُمْ.

2612. ...İbn Əbu Rafi atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Bəni Məxzum tayfasından bir kişini zəkat toplamaq üçün cavabdeh etmişdi. Əbu Rafi də onunla birlikdə getmək istədi. Allah Elçisi ﷺ belə buyurdu:

"Bizə sədəqə götürmək halal deyil. Bir qövmün köləlikdən azad etdiyi şəxs onlardan sayılır".[1]

### ٩٨- الصَّدَقَةُ لاَ تَحِلُّ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

### 98-ci fəsil: Sədəqənin Peyğəmbərə ﷺ halal olmaması

٢٦١٣- أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ بْنُ وَاصِلٍ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ حَكِيمٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِذَا أُتِيَ بِشَيْءٍ سَأَلَ عَنْهُ أَهَدِيَّةٌ أَمْ صَدَقَةٌ ؟ فَإِنْ قِيلَ صَدَقَةٌ ، لَمْ يَأْكُلْ ، وَإِنْ قِيلَ ، هَدِيَّةٌ بَسَطَ يَدَهُ.

2613. ...Bəhz ibn Həkim atasının və babasının رضي الله عنهما belə dediklərini rəvayət etmişdir: "Peyğəmbərə ﷺ bir şey gətirildikdə bunun hədiyyə, yoxsa sədəqə olmasını soruşardı. Əgər sədəqə deyilsəydi, onu yeməz, hədiyyə deyilsəydi, əlini ona uzadıb götürərdi".

### ٩٩- إِذَا تَحَوَّلَتِ الصَّدَقَةُ

### 99-cu fəsil: Sədəqə bir adama verildikdə onun sədəqəni başqasına verməsi sədəqə olmur

٢٦١٤- أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا الْحَكَمُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، أَنَّهَا أَرَادَتْ أَنْ تَشْتَرِيَ بَرِيرَةَ فَتُعْتِقَهَا ، وَإِنَّهُمُ اشْتَرَطُوا وَلاَءَهَا ، فَذَكَرَتْ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : اشْتَرِيهَا ، وَأَعْتِقِيهَا ، فَإِنَّ الْوَلاَءَ لِمَنْ أَعْتَقَ وَخُيِّرَتْ حِينَ أُعْتِقَتْ ، وَأُتِيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِلَحْمٍ ، فَقِيلَ : هَذَا مِمَّا تُصُدِّقَ بِهِ عَلَى بَرِيرَةَ فَقَالَ : هُوَ لَهَا صَدَقَةٌ ، وَلَنَا هَدِيَّةٌ ، وَكَانَ زَوْجُهَا حُرًّا.

2614. ...əl-Əsvəd رحمه الله rəvayət edir ki, Aişə Bərira adlı köləni alıb azad etmək istədi, lakin Bəriranın ağaları ağalıq haqqının onlara aid olmasını tələb etdilər. Aişə vəziyyəti Allah Elçisinə ﷺ bildirdikdə o dedi: "Onu al və azad et, çünki ağalıq haqqı azad edənə aiddir". Beləliklə Bərira pul ilə alınaraq azad edildi. Bundan sonra Allah Elçisinə ﷺ bir qədər ət gətirildi. Ona deyildi: "Bu ət Bəriraya sədəqə olaraq verilən ətdəndir". Allah Elçisi ﷺ buyurdu: "Bu ət ona sədəqədir, bizə isə Bəriranın hədiyyəsidir. Onun əri də azad insandır".

---

[1] Əbu Rafi رضي الله عنه əslən Misirdə yaşayan Qibtilərdən idi. Adı dəqiq olaraq bilinmir. Əbu Rafi Abbas ibn Abdul-Muttalibin köləsi idi. Sonralar Abbas onu Peyğəmbərə ﷺ hədiyyə etmişdi. Abbasın İslamı qəbul edərək müsəlman olmasını eşidən Peyğəmbər ﷺ Əbu Rafini köləlikdən azad etmişdi, elə buna görə də Peyğəmbər ﷺ onu öz qohumlarından saymışdır.

## ١٠٠- شِرَاءُ الصَّدَقَةِ

## 100-cü fəsil: Geri götürülən sədəqə

٢٦١٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ عُمَرَ ، يَقُولُ : حَمَلْتُ عَلَى فَرَسٍ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ ، فَأَضَاعَهُ الَّذِي كَانَ عِنْدَهُ ، وَأَرَدْتُ أَنْ أَبْتَاعَهُ مِنْهُ ، وَظَنَنْتُ أَنَّهُ بَائِعُهُ بِرُخْصٍ ، فَسَأَلْتُ عَنْ ذَلِكَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : لاَ تَشْتَرِهِ وَإِنْ أَعْطَاكَهُ بِدِرْهَمٍ ، فَإِنَّ الْعَائِدَ فِي صَدَقَتِهِ كَالْكَلْبِ يَعُودُ فِي قَيْئِهِ.

2615. ...Zeyd ibn Əsləm atasının رضي الله عنه belə dediyini rəvayət etmişdir: "Mən Ömərin belə dediyini eşitdim: "Allah yolunda istifadəsi üçün dişi bir at sədəqə vermişdim, lakin həmin adam ondan istifadə etməmişdi. Mən də ondan bu atı pul ilə almaq istədim və onu ucuz satacağını təxmin etdim. Bu haqda Allah Elçisindən ﷺ soruşduqda belə buyurdu: "Onu pul ilə alma! Çünki verdiyi sədəqəsini geri alan adam qusduğunu yeyən köpək kimidir".

٢٦١٦- أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، عَنْ عُمَرَ ، أَنَّهُ حَمَلَ عَلَى فَرَسٍ فِي سَبِيلِ اللهِ ، فَرَآهَا تُبَاعُ ، فَأَرَادَ شِرَاءَهَا ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَعْرِضْ فِي صَدَقَتِكَ.

2616. ...Rəvayət edilir ki, Ömər رضي الله عنه Allah yolunda istifadəsi üçün dişi bir at sədəqə vermişdi. Onun satıldığını gördükdə almaq istədi. Bunu Peyğəmbərə ﷺ xəbər verdikdə belə buyurdu: "Sədəqəndən imtina etmə (onu alma)!"

٢٦١٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا حُجَيْنٌ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، كَانَ يُحَدِّثُ أَنَّ عُمَرَ ، تَصَدَّقَ بِفَرَسٍ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ ، فَوَجَدَهَا تُبَاعُ بَعْدَ ذَلِكَ ، فَأَرَادَ أَنْ يَشْتَرِيَهُ ، ثُمَّ أَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَاسْتَأْمَرَهُ فِي ذَلِكَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَعُدْ فِي صَدَقَتِكَ.

2617. ...Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Ömər Allah ﷻ yolunda istifadəsi üçün dişi bir at sədəqə etmişdi. Onun satışa çıxarıldığını görüb almaq istədi. Bunu Allah Elçisinə ﷺ dedikdə o belə buyurdu: "Sədəqəndən imtina etmə (onu alma)!"

٢٦١٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، وَيَزِيدُ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِسْحَاقَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَمَرَ عَتَّابَ بْنَ أَسِيدٍ أَنْ يَخْرُصَ الْعِنَبَ ، فَتُؤَدَّى زَكَاتُهُ زَبِيبًا ، كَمَا تُؤَدَّى زَكَاةُ النَّخْلِ تَمْرًا.

2618. ..Səid ibn əl-Museyyib ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ yaş xurmanın zəkatının quru xurmadan verilməsi kimi, yaş üzümün miqdarını təyin edib zəkatının quru üzümdən verilməsini əmr etdi.

٢٤- كِتَابُ مَنَاسِكِ الْحَجِّ

# 24. Həcc ayinləri kitabı

١- بَابُ وُجُوبِ الْحَجِّ

## 1-ci fəsil: Həccin vacibliyi

٢٦١٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو هِشَامٍ وَاسْمُهُ الْمُغِيرَةُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا الرَّبِيعُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ زِيَادٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : خَطَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ النَّاسَ ، فَقَالَ : إِنَّ اللهَ عَزَّ وَجَلَّ ، قَدْ فَرَضَ عَلَيْكُمُ الْحَجَّ فَقَالَ رَجُلٌ : فِي كُلِّ عَامٍ ؟ فَسَكَتَ عَنْهُ حَتَّى أَعَادَهُ ثَلاَثًا ، فَقَالَ : لَوْ قُلْتُ نَعَمْ ، لَوَجَبَتْ ، وَلَوْ وَجَبَتْ ، مَا قُمْتُمْ بِهَا ، ذَرُونِي مَا تَرَكْتُكُمْ ، فَإِنَّمَا هَلَكَ مَنْ كَانَ قَبْلَكُمْ بِكَثْرَةِ سُؤَالِهِمْ ، وَاخْتِلاَفِهِمْ عَلَى أَنْبِيَائِهِمْ ، فَإِذَا أَمَرْتُكُمْ بِالشَّيْءِ فَخُذُوا بِهِ مَا اسْتَطَعْتُمْ ، وَإِذَا نَهَيْتُكُمْ عَنْ شَيْءٍ ، فَاجْتَنِبُوهُ.

2619. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ camaata xitab edərək belə buyurdu: “Allah ﷻ sizə həcci fərz (vacib) etmişdir”. Bir kişi ayağa qalxıb dedi: “Hər il?” Allah Elçisi ﷺ susdu. Həmin adam sualını üçüncü dəfə təkrar etdikdə Allah Elçisi ﷺ belə buyurdu: “Əgər bəli desəydim hər il həcc etməyiniz vacib olardı. Hər il həcc etmək vacib olsaydı, sizin buna gücünüz çatmazdı. Dediyim kimi əməl edin, çünki sizdən əvvəlkilər Peyğəmbərlərinə çox sual verdikləri və onlar üzərində də ixtilafa düşdükləri üçün həlak oldular. Sizə bir şeyi əmr etdiyim zaman gücünüz çatan qədər ona əməl edin. Qadağan etdiyim şeydən də mütləq çəkinin”.

٢٦٢٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ النَّيْسَابُورِيُّ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي مَرْيَمَ ، قَالَ : أَنْبَأَنَا مُوسَى بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الْجَلِيلِ بْنُ حُمَيْدٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سِنَانٍ الدُّؤَلِيِّ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَامَ ، فَقَالَ : إِنَّ اللَّهَ تَعَالَى كَتَبَ عَلَيْكُمُ الْحَجَّ فَقَالَ الأَقْرَعُ بْنُ حَابِسٍ التَّمِيمِيُّ كُلُّ عَامٍ يَا رَسُولَ اللهِ ؟ فَسَكَتَ ، فَقَالَ : لَوْ قُلْتُ نَعَمْ ، لَوَجَبَتْ ، ثُمَّ إِذًا لاَ تَسْمَعُونَ ، وَلاَ تُطِيعُونَ ، وَلَكِنَّهُ حَجَّةٌ وَاحِدَةٌ.

2620. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Bir dəfə Allah Elçisi ﷺ ayağa duraraq belə buyurdu: “Allah sizə həcci vacib etdi”. Bu vaxt əl-Əqra ibn Habis ət-Təmimi dedi: “Hər il, ey Allahın Elçisi?” Allah Elçisi ﷺ susdu, sonra da belə buyurdu: “Bəli” desəydim hər il həcc etmək sizə vacib olacaq, sizin də buna gücünüz çatmayacaqdı. Siz həcci bir dəfə edin”.

### ٢- وُجُوبُ الْعُمْرَةِ

### 2-ci fəsil: Ümrənin vacibliyi

٢٦٢١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ النُّعْمَانَ بْنَ سَالِمٍ ، قَالَ : سَمِعْتُ عَمْرَو بْنَ أَوْسٍ ، يُحَدِّثُ عَنْ أَبِي رَزِينٍ ، أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ إِنَّ أَبِي شَيْخٌ كَبِيرٌ ، لاَ يَسْتَطِيعُ الْحَجَّ ، وَلاَ الْعُمْرَةَ ، وَلاَ الظَّعْنَ ، قَالَ : فَحُجَّ ، عَنْ أَبِيكَ ، وَاعْتَمِرْ.

2621. …Rəvayət edilir ki, Əbu Rəzin ﷺ demişdir: “Ey Allahın Elçisi! Atam çox yaşlı bir adamdır, həcc və ümrə üçün səfərə çıxmağa gücü çatmır”. Allah Elçisi ﷺ buyurdu: “Onun yerinə həcc və ümrəni sən et”

### ٣- فَضْلُ الْحَجِّ الْمَبْرُورِ

### 3-cü fəsil: Qəbul edilmiş həccin fəziləti

٢٦٢٢- أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ الصَّفَّارِ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُوَيْدٌ وَهُوَ ابْنُ عَمْرٍو الْكَلْبِيُّ ، عَنْ زُهَيْرٍ ، قَالَ : حَدَّثَنَا سُهَيْلٌ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْحَجَّةُ الْمَبْرُورَةُ : لَيْسَ لَهَا جَزَاءٌ إِلاَّ الْجَنَّةُ ، وَالْعُمْرَةُ إِلَى الْعُمْرَةِ كَفَّارَةٌ لِمَا بَيْنَهُمَا.

2622. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allah tərəfindən qəbul edilmiş həccin mükafatı mütləq Cənnətdir. Edilən bir ümrə isə digər ümrəyə kimi olan günahların silinməsinə səbəbdir”.

٢٦٢٣- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي سُهَيْلٌ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : الْحَجَّةُ الْمَبْرُورَةُ : لَيْسَ لَهَا ثَوَابٌ إِلاَّ الْجَنَّةُ ، مِثْلَهُ سَوَاءً ، إِلاَّ أَنَّهُ قَالَ : تُكَفِّرُ مَا بَيْنَهُمَا.

2623. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurmuşdur: “Allah tərəfindən qəbul edilmiş həccin savabı ancaq Cənnətdir. İkinci dəfə ediləcək nafilə həcc də eynidir. Ancaq ikinci həcc iki həcc arasındakı günahlara kəffarədir”.

### ٤- فَضْلُ الْحَجِّ

### 4-cü fəsil: Həccin fəziləti

٢٦٢٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ ابْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ،

قَالَ : سَأَلَ رَجُلٌ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ يَا رَسُولَ اللهِ : أَيُّ الأَعْمَالِ أَفْضَلُ ؟ قَالَ : الإِيمَانُ بِاللهِ قَالَ : ثُمَّ مَاذَا ؟ قَالَ : الْجِهَادُ فِي سَبِيلِ اللهِ قَالَ : ثُمَّ مَاذَا ؟ قَالَ : ثُمَّ الْحَجُّ الْمَبْرُورُ.

2624. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ belə demişdir: "Bir kişi Allah Elçisindən ﷺ soruşdu: "Hansı əməl daha fəzilətlidir". Allah Elçisi ﷺ belə buyurdu: "Allaha iman gətirmək". Kişi dedi: "Sonra hansıdır?" Allah Elçisi ﷺ buyurdu: "Allah yolunda cihad". Kişi yenə soruşdu: "Daha sonra hansıdır?" Allah Elçisi ﷺ buyurdu: "Allah tərəfindən qəbul edilmiş həcc".

٢٦٢٥- أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ بْنِ مَثْرُودٍ ، قَالَ حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ مَخْرَمَةَ ، عَنْ أَبِيهِ ، قَالَ سَمِعْتُ سُهَيْلَ بْنَ أَبِي صَالِحٍ ، قَالَ : سَمِعْتُ أَبِي يَقُولُ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَفْدُ اللهِ ثَلاَثَةٌ : الْغَازِي ، وَالْحَاجُّ ، وَالْمُعْتَمِرُ.

2625. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allahın elçiləri üç növdür; qazilər, həcc edənlər və ümrə edənlər".

٢٦٢٦- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : جِهَادُ الْكَبِيرِ ، وَالصَّغِيرِ ، وَالضَّعِيفِ ، وَالْمَرْأَةِ : الْحَجُّ ، وَالْعُمْرَةُ.

2626. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Böyüyün, kiçiyin, zəifin və qadının cihadı həcc və ümrədir".

٢٦٢٧- أَخْبَرَنَا أَبُو عَمَّارٍ الْحُسَيْنُ بْنُ حُرَيْثٍ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ وَهُوَ ابْنُ عِيَاضٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ حَجَّ هَذَا الْبَيْتَ فَلَمْ يَرْفُثْ ، وَلَمْ يَفْسُقْ ، رَجَعَ كَمَا وَلَدَتْهُ أُمُّهُ.

2627. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim bu Evi (Kəbəni) həcc edər və həcc əsnasında qadını ilə yaxınlıq etməz və günahı tərk edərsə, anasından yeni doğulmuş kimi günahsız olar".

٢٦٢٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ حَبِيبٍ وَهُوَ ابْنُ أَبِي عَمْرَةَ ، عَنْ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، قَالَتْ : أَخْبَرَتْنِي أُمُّ الْمُؤْمِنِينَ عَائِشَةُ قَالَتْ : قُلْتُ يَا رَسُولَ اللهِ ، أَلاَ نَخْرُجُ فَنُجَاهِدَ مَعَكَ ، فَإِنِّي لاَ أَرَى عَمَلاً فِي الْقُرْآنِ ، أَفْضَلَ مِنَ الْجِهَادِ ، قَالَ : لاَ ، وَلَكِنَّ أَحْسَنُ الْجِهَادِ وَأَجْمَلُهُ ، حَجُّ الْبَيْتِ ، حَجٌّ مَبْرُورٌ.

2528. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﷺ demişdir: "Mən dedim: "Ey Allahın Elçisi! Səninlə çıxıb cihad etməyəcəyikmi? Çünki mən

Quranda cihaddan daha fəzilətli bir əməl görmürəm". Peyğəmbər ﷺ buyurdu: "Xeyr, sizin edəcəyiniz ən yaxşı və ən gözəl cihad Kəbəni təvaf etməklə edilən qəbul edilmiş həccdir".

٥- فَضْلُ الْعُمْرَةِ

5-ci fəsil: Ümrənin fəziləti

٢٦٢٩- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْعُمْرَةُ إِلَى الْعُمْرَةِ كَفَّارَةٌ لِمَا بَيْنَهُمَا ، وَالْحَجُّ الْمَبْرُورُ ، لَيْسَ لَهُ جَزَاءٌ إِلاَّ الْجَنَّةُ.

2629. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "İki ümrə, aralarında edilən günahlara kəffarədir. Allah tərəfindən qəbul edilmiş həccin mükafatı isə yalnız Cənnətdir".

٦- فَضْلُ الْمُتَابَعَةِ بَيْنَ الْحَجِّ وَالْعُمْرَةِ

6-ci fəsil: Həcc və ümrəni birlikdə etməyin fəziləti

٢٦٣٠- أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَتَّابٍ ، قَالَ : حَدَّثَنَا عَزْرَةُ بْنُ ثَابِتٍ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، قَالَ : قَالَ ابْنُ عَبَّاسٍ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَابِعُوا بَيْنَ الْحَجِّ وَالْعُمْرَةِ ، فَإِنَّهُمَا : يَنْفِيَانِ الْفَقْرَ ، وَالذُّنُوبَ ، كَمَا يَنْفِي الْكِيرُ خَبَثَ الْحَدِيدِ.

2630. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həcc ilə ümrəni birlikdə edin. Həcc və ümrə kasıblıq və günahları körüyün dəmir paslarını tökdüyü kimi əridib yox edir".

٢٦٣١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَيَّانَ أَبُو خَالِدٍ ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ ، عَنْ عَاصِمٍ ، عَنْ شَقِيقٍ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تَابِعُوا بَيْنَ الْحَجِّ وَالْعُمْرَةِ ، فَإِنَّهُمَا : يَنْفِيَانِ الْفَقْرَ وَالذُّنُوبَ ، كَمَا يَنْفِي الْكِيرُ : خَبَثَ الْحَدِيدِ وَالذَّهَبِ وَالْفِضَّةِ ، وَلَيْسَ لِلْحَجِّ الْمَبْرُورِ ثَوَابٌ دُونَ الْجَنَّةِ.

2631. ...Rəvayət edilir ki, Abdullah  demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həcc ilə ümrəni birlikdə edin, çünki ümrə və həcc kasıblığı və günahları körüyün dəmir, qızıl və gümüşü əritdiyi kimi əridib yox edir. Allah tərəfindən qəbul edilən həccin savabı isə ancaq Cənnətdir".

٧- الْحَجُّ عَنِ الْمَيِّتِ الَّذِي نَذَرَ أَنْ يَحُجَّ

7-ci fəsil: Həcc etməyi nəzir edən, lakin həcc etmədən ölən şəxsin yerinə edilən həcc

٢٦٣٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ ، قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ ، يُحَدِّثُ

عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ امْرَأَةً نَذَرَتْ أَنْ تَحُجَّ ، فَمَاتَتْ ، فَأَتَى أَخُوهَا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَسَأَلَهُ عَنْ ذَلِكَ ؟ فَقَالَ : أَرَأَيْتَ لَوْ كَانَ عَلَى أُخْتِكَ دَيْنٌ أَكُنْتَ قَاضِيَهُ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَاقْضُوا اللهَ ، فَهُوَ أَحَقُّ بِالْوَفَاءِ.

2632. ...İbn Abbasdan ﷻ rəvayət edilir ki, bir qadın həccə getməyi nəzir etdi, lakin getməzdən əvvəl vəfat etdi. Qadının qardaşı Peyğəmbərin ﷺ yanına gələrək nə etməsi barədə soruşdu. Peyğəmbər ﷺ də belə buyurdu: "Bacının borcu olsa, ödəyərdin?" Adam: "Bəli"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Elə isə Allaha olan borcunu da ödə, çünki ödənilməyə daha layiq olan borc Allahın borcudur".

٨- الْحَجُّ عَنِ الْمَيِّتِ ، الَّذِي لَمْ يَحُجَّ.

8-ci fəsil: Həcc edə bilmədən ölənin adından həcc

٢٦٣٣- أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَبُو التَّيَّاحِ ، قَالَ : حَدَّثَنِي مُوسَى بْنُ سَلَمَةَ الْهُذَلِيُّ ، أَنَّ ابْنَ عَبَّاسٍ ، قَالَ : أَمَرَتِ امْرَأَةٌ سِنَانَ بْنَ سَلَمَةَ الْجُهَنِيَّ أَنْ يَسْأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ أُمَّهَا مَاتَتْ وَلَمْ تَحُجَّ ، أَفَيُجْزِئُ عَنْ أُمِّهَا أَنْ تَحُجَّ عَنْهَا ؟ قَالَ : نَعَمْ ، لَوْ كَانَ عَلَى أُمِّهَا دَيْنٌ فَقَضَتْهُ عَنْهَا ، أَلَمْ يَكُنْ يُجْزِئُ عَنْهَا فَلْتَحُجَّ عَنْ أُمِّهَا.

2633. …Rəvayət edilir ki, İbn Abbas ﷻ demişdir: "Sinan ibn Sələmə əl-Cuhəninin zövcəsi, Allah Elçisindən ﷺ həcc ziyarətini edə bilmədən vəfat edən anasının yerinə həcc etməsinin soruşulmasını istədi. Allah Elçisi ﷺ də: "Bəli. Anasının borcu olsaydı, onu ödəyərdimi? Eləcə də anasının adına həcc etsin".

٢٦٣٤- أَخْبَرَنِي عُثْمَانُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ حَكِيمٍ الأَوْدِيُّ ، قَالَ : حَدَّثَنَا حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الرُّؤَاسِيُّ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ ابْنُ زَيْدٍ ، عَنْ أَيُّوبَ السَّخْتِيَانِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ امْرَأَةً سَأَلَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ أَبِيهَا ، مَاتَ وَلَمْ يَحُجَّ ؟ قَالَ : حُجِّي عَنْ أَبِيكِ.

2634. …İbn Abbas ﷻ rəvayət edir ki, bir qadın Allah Elçisinə ﷺ həcc edə bilmədən ölən atası haqqında soruşdu. Allah Elçisi ﷺ buyurdu: "Atanın yerinə həcc et".

٩- الْحَجُّ عَنِ الْحَيِّ الَّذِي لاَ يَسْتَمْسِكُ عَلَى الرَّحْلِ

9-cu fəsil: Səfərə çıxmağa taqəti olmayan kimsənin yerinə başqa birisi həcc edə bilərmi?

٢٦٣٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ امْرَأَةً مِنْ خَثْعَمَ سَأَلَتِ النَّبِيَّ

صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَدَاةَ جَمْعٍ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ فَرِيضَةُ اللهِ فِي الْحَجِّ عَلَى عِبَادِهِ ، أَدْرَكَتْ أَبِي شَيْخًا كَبِيرًا ، لاَ يَسْتَمْسِكُ عَلَى الرَّحْلِ ، أَفَأَحُجُّ عَنْهُ ؟ قَالَ : نَعَمْ

2635. …İbn Abbasdan ﷺ rəvayət edilir ki, Xasam tayfasından olan bir qadın Müzdəlifə günü Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi! Allahın qullarına vacib buyurduğu həcc qoca atama da vacib oldu. Atamın səfərə çıxmağa taqəti yoxdur, onun yerinə mən həcc edə bilərəm?" Allah Elçisi ﷺ də: "Bəli" deyə buyurdu.

٢٦٣٦- أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ أَبُو عُبَيْدِ اللهِ الْمَخْزُومِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ مِثْلَهُ.

2636. …Yuxarıdakı hədisin mətni ilə eynidir.

١٠- الْعُمْرَةُ عَنِ الرَّجُلِ الَّذِي لاَ يَسْتَطِيعُ

## 10-cu fəsil: Ümrə edə bilməyənin yerinə başqasının ümrə etməsi

٢٦٣٧- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ النُّعْمَانِ بْنِ سَالِمٍ ، عَنْ عَمْرِو بْنِ أَوْسٍ ، عَنْ أَبِي رَزِينٍ الْعُقَيْلِيِّ ، أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ إِنَّ أَبِي شَيْخٌ كَبِيرٌ ، لاَ يَسْتَطِيعُ الْحَجَّ ، وَلاَ الْعُمْرَةَ ، وَالظَّعْنَ قَالَ : حُجَّ ، عَنْ أَبِيكَ ، وَاعْتَمِرْ.

2637. …Rəvayət edilir ki, Əbu Rəzin əl-Uqeyli ﷺ demişdir: "Bir nəfər Allah Elçisinə ﷺ dedi: "Ey Allahın Elçisi! Atam nə həcc, nə də ümrə edə bilən qocadır". Allah Elçisi ﷺ buyurdu: "Atanızın adından həcc edin və ümrə edin".

١١- تَشْبِيهُ قَضَاءِ الْحَجِّ بِقَضَاءِ الدَّيْنِ

## 11-ci fəsil: Həccin də digər borclar kimi bir borc olması

٢٦٣٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ يُوسُفَ بْنِ الزُّبَيْرِ ، عَنْ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، قَالَ : جَاءَ رَجُلٌ مِنْ خَثْعَمَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنَّ أَبِي شَيْخٌ كَبِيرٌ ، لاَ يَسْتَطِيعُ الرُّكُوبَ ، وَأَدْرَكَتْهُ فَرِيضَةُ اللهِ فِي الْحَجِّ ، فَهَلْ يُجْزِئُ أَنْ أَحُجَّ عَنْهُ ؟ قَالَ : آنْتَ أَكْبَرُ وَلَدِهِ ؟ قَالَ : نَعَمْ ، قَالَ : أَرَأَيْتَ لَوْ كَانَ عَلَيْهِ دَيْنٌ أَكُنْتَ تَقْضِيهِ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَحُجَّ عَنْهُ.

2638. …Rəvayət edilir ki, Abdullah ibn əz-Zubeyr ﷺ demişdir: "Xasam tayfasından bir kişi Allah Elçisinin ﷺ yanına gələrək dedi: "Atam çox qocadır. Bir miniyə minib səfərə çıxa biləcək vəziyyətdə deyil. Özünə də

həcc vacib olmuş vəziyyətdədir, onun yerinə mən həcc edə bilərəm?" Allah Elçisi ﷺ buyurdu: "Atanın böyük oğlu sənsən?" Həmin kişi: "Bəli" dedi. Allah Elçisi ﷺ buyurdu: "Atanın borcu olsaydı, sən onu ödəyərdin?" Kişi: "Bəli" dedi. Allah Elçisi ﷺ də buyurdu: "Elə isə onun yerinə sən həcc et".[1]

٢٦٣٩- أَخْبَرَنَا أَبُو عَاصِمٍ خُشَيْشُ بْنُ أَصْرَمَ النَّسَائِيُّ ، عَنْ عَبْدِ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الْحَكَمِ بْنِ أَبَانَ ، عَنْ عِكْرِمَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَجُلٌ : يَا رَسُولَ اللهِ إِنَّ أَبِي مَاتَ ، وَلَمْ يَحُجَّ ، أَفَأَحُجُّ عَنْهُ ؟ قَالَ : أَرَأَيْتَ لَوْ كَانَ عَلَى أَبِيكَ دَيْنٌ أَكُنْتَ قَاضِيَهُ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَدَيْنُ اللهِ أَحَقُّ.

2639. …Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Bir kişi dedi: "Ey Allahın Elçisi! Atam həcc etmədən öldü. Onun yerinə mən həcc edə bilərəm?" Allah Elçisi ﷺ dedi: "Atanın bir borcu olsa onu sən ödəyərdin?" Kişi: "Bəli" dedi. Allah Elçisi ﷺ də buyurdu: "Allaha olan borc ödənilməyə daha layiqdir".[2]

٢٦٤٠- أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، عَنْ هُشَيْمٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي إِسْحَاقَ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، أَنَّ رَجُلاً سَأَلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ أَبِي أَدْرَكَهُ الْحَجُّ ، وَهُوَ شَيْخٌ كَبِيرٌ ، لاَ يَثْبُتُ عَلَى رَاحِلَتِهِ ، فَإِنْ شَدَدْتُهُ خَشِيتُ أَنْ يَمُوتَ ، أَفَأَحُجُّ عَنْهُ ؟ قَالَ : أَرَأَيْتَ لَوْ كَانَ عَلَيْهِ دَيْنٌ فَقَضَيْتَهُ أَكَانَ مُجْزِئًا ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَحُجَّ عَنْ أَبِيكَ.

2640. …Abdullah ibn Abbas رضي الله عنهما rəvayət edir ki, bir kişi Allah Elçisinin ﷺ yanına gələrək soruşdu: "Atamın boynunda həcc ziyarəti var, lakin o çox qocadır. Miniyə minə bilməz, miniyə bağlasam da öləcəyindən qorxuram. Onun yerinə mən həcc edə bilərəm?" Allah Elçisi ﷺ dedi: "Əgər atanın bir borcu olsa ödəyərsən?" Kişi: "Bəli" dedi. Allah Elçisi ﷺ də buyurdu: "Elə isə atanın yerinə həcc et".[3]

## ١٢- حَجُّ الْمَرْأَةِ عَنِ الرَّجُلِ

## 12-ci fəsil: Qadın kişinin yerinə həcc edə bilərmi?

٢٦٤١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، قَالَ : كَانَ الْفَضْلُ بْنُ عَبَّاسٍ رَدِيفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَجَاءَتْهُ امْرَأَةٌ مِنْ خَثْعَمَ تَسْتَفْتِيهِ ، وَجَعَلَ الْفَضْلُ يَنْظُرُ إِلَيْهَا ، وَتَنْظُرُ إِلَيْهِ ، وَجَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَصْرِفُ وَجْهَ الْفَضْلِ إِلَى الشِّقِّ الآخَرِ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ إِنَّ فَرِيضَةَ اللهِ فِي الْحَجِّ عَلَى عِبَادِهِ أَدْرَكَتْ أَبِي شَيْخًا كَبِيرًا ، لاَ يَسْتَطِيعُ أَنْ يَثْبُتَ عَلَى الرَّاحِلَةِ ، أَفَأَحُجُّ عَنْهُ ؟ قَالَ : نَعَمْ ، وَذَلِكَ فِي حَجَّةِ الْوَدَاعِ.

---

[1] Hədisin isnadı zəifdir.
[2] Hədisin isnadı zəifdir.
[3] Hədis zəifdir.

2641. …Rəvayət edilir ki, Abdullah ibn Abbas ﵄ demişdir: "Fədl ibn Abbas Allah Elçisinin ﷺ tərkində idi. Xasam tayfasından olan bir qadın Allah Elçisindən ﷺ fətva soruşmağa gəlmişdi. Bu vaxt Fədl ilə qadın bir-birinə baxmağa başladı. Allah Elçisi ﷺ də Fədlin üzünü digər tərəfə çevirdi. Qadın dedi: "Ey Allahın Elçisi! Allahın qullarına vacib buyurduğu həcc atama da vacib oldu, lakin atam miniyə minəcək vəziyyətdə deyil. Onun yerinə mən həcc edə bilərəmmi?" Allah Elçisi ﷺ: "Bəli"- dedi. Bu hadisə vida həccində olmuşdu".

٢٦٤٢- أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحِ بْنِ كَيْسَانَ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ سُلَيْمَانَ بْنَ يَسَارٍ ، أَخْبَرَهُ أَنَّ ابْنَ عَبَّاسٍ ، أَخْبَرَهُ أَنَّ امْرَأَةً مِنْ خَثْعَمَ اسْتَفْتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ ، وَالْفَضْلُ بْنُ عَبَّاسٍ رَدِيفُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ إِنَّ فَرِيضَةَ اللهِ فِي الْحَجِّ عَلَى عِبَادِهِ أَدْرَكَتْ أَبِي شَيْخًا كَبِيرًا ، لاَ يَسْتَوِي عَلَى الرَّاحِلَةِ ، فَهَلْ يَقْضِي عَنْهُ أَنْ أَحُجَّ عَنْهُ ؟ فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَعَمْ فَأَخَذَ الْفَضْلُ بْنُ عَبَّاسٍ يَلْتَفِتُ إِلَيْهَا ، وَكَانَتِ امْرَأَةً حَسْنَاءَ ، وَأَخَذَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْفَضْلَ فَحَوَّلَ وَجْهَهُ مِنَ الشِّقِّ الآخَرِ.

2642. …Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Xasəm qəbiləsindən bir qadın vida həccində fətva soruşmaq üçün Allah Elçisinin ﷺ yanına gəldi. Fədl ibn Abbas da Allah Elçisinin ﷺ miniyində onunla birlikdə idi. Qadın dedi: "Ey Allahın Elçisi! Allahın qullarına vacib buyurduğu həcc ziyarəti qoca atama da vacib oldu, lakin o, miniyə minə biləcək vəziyyətdə deyil. Mən onun yerinə həcc etsəm borcu yerinə yetirilmiş olarmı?" Allah Elçisi ﷺ buyurdu: "Bəli". O əsnada miniyin arxasında olan Fədl ibn Abbas qadına baxırdı, qadın çox gözəl idi. Allah Elçisi ﷺ Fədlin üzünü digər tərəfə çevirdi".

### ١٣- حَجُّ الرَّجُلِ عَنِ الْمَرْأَةِ

### 13-cü fəsil: Kişi qadının yerinə həcc edə bilərmi?

٢٦٤٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا هِشَامٌ ، عَنْ مُحَمَّدٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي إِسْحَاقَ ، عَنْ سُلَيْمَانَ بْنِ يَسَارٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، أَنَّهُ كَانَ رَدِيفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَجَاءَهُ رَجُلٌ فَقَالَ : يَا رَسُولَ اللهِ إِنَّ أُمِّي عَجُوزٌ كَبِيرَةٌ ، وَإِنْ حَمَلْتُهَا لَمْ تَسْتَمْسِكْ ، وَإِنْ رَبَطْتُهَا خَشِيتُ أَنْ أَقْتُلَهَا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَرَأَيْتَ لَوْ كَانَ عَلَى أُمِّكَ دَيْنٌ أَكُنْتَ قَاضِيَهُ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَحُجَّ عَنْ أُمِّكَ.

2643. ….Rəvayət edilir ki, Fadl ibn Abbas ﵄ Allah Elçisinin ﷺ miniyinin arxasında oturmuşdu. Bir kişi Allah Elçisinin ﷺ yanına gələrək dedi: "Ey Allahın Elçisi! Anam qoca bir qadındır, miniyə mindirsəm üzərində

dayana bilməz, bağlayacağım halda isə öləcəyindən qorxuram". Allah Elçisi ﷺ buyurdu: "Ananın bir borcu olsa onu ödəyərdinmi?" Kişi: "Bəli" dedi. Allah Elçisi ﷺ buyurdu: "Elə isə ananın adından həcci sən et".[1]

١٤– مَا يُسْتَحَبُّ أَنْ يَحُجَّ عَنِ الرَّجُلِ أَكْبَرُ وَلَدِهِ

14-cü fəsil: Kişinin böyük oğlu onun yerinə həcc edirmi?

٢٦٤٤– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ يُوسُفَ ، عَنْ ابْنِ الزُّبَيْرِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لِرَجُلٍ : أَنْتَ أَكْبَرُ وَلَدِ أَبِيكَ ، فَحُجَّ عَنْهُ.

2644. …İbn əz-Zubeyr رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ bir kişiyə buyurdu: "Atanın ən böyük oğlu sənsən, ona görə də onun yerinə sən həcc et".[2]

١٥– الْحَجُّ بِالصَّغِيرِ

15-ci fəsil: Kiçik uşağın həcci

٢٦٤٥– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مُحَمَّدِ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ امْرَأَةً رَفَعَتْ صَبِيًّا لَهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ أَلِهَذَا حَجٌّ ؟ قَالَ : نَعَمْ ، وَلَكِ أَجْرٌ.

2645. …İbn Abbas رضي الله عنهما rəvayət edir ki, bir qadın uşağını Allah Elçisinə ﷺ göstərərək dedi: "Bu uşaq üçün həcc ziyarəti olarmı?" Allah Elçisi ﷺ buyurdu: "Bəli, savabı isə sənədir".[3]

٢٦٤٦– أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مُحَمَّدِ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : رَفَعَتِ امْرَأَةٌ صَبِيًّا لَهَا مِنْ هَوْدَجٍ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ أَلِهَذَا حَجٌّ ؟ قَالَ : نَعَمْ ، وَلَكِ أَجْرٌ.

2646. …Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Bir qadın dəvə üzərində oturduğu vəziyyətdə əlindəki uşağı Allah Elçisinə ﷺ göstərərək soruşdu: "Ey Allahın Elçisi, bu uşaq üçün həcc ziyarəti olarmı?" Allah Elçisi ﷺ buyurdu: "Bəli, savabı isə sənədir".

٢٦٤٧– أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : رَفَعَتِ امْرَأَةٌ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَبِيًّا ، فَقَالَتْ : أَلِهَذَا حَجٌّ ؟ قَالَ : نَعَمْ ، وَلَكِ أَجْرٌ.

---

[1] Hədis zəifdir.

[2] Hədisin isnadı zəifdir.

[3] Yəni savabını o uşağı həccə gətirən valideyn qazanır, amma bu uşağın boynundan həccin vacibliyi düşmür. Böyüyüb həddi-büluğa çatdıqda imkan olarsa, həcc ziyarətini etmək onun boynunda vacib haqq olaraq qalır.

2647. …Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Bir qadın əlindəki uşağı Allah Elçisinə ﷺ tərəf qaldıraraq soruşdu: "Bu uşaq üçün həcc ziyarəti olarmı?" Allah Elçisi ﷺ buyurdu: "Bəli, savabı isə sənədir".

٢٦٤٨- أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ عُقْبَةَ (ح) وَحَدَّثَنَا الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنْ سُفْيَانَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : صَدَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا كَانَ بِالرَّوْحَاءِ لَقِيَ قَوْمًا فَقَالَ : مَنْ أَنْتُمْ ؟ قَالُوا : الْمُسْلِمُونَ ، قَالُوا : مَنْ أَنْتُمْ ؟ قَالُوا : رَسُولُ اللهِ قَالَ : فَأَخْرَجَتِ امْرَأَةٌ صَبِيًّا مِنَ الْمِحَفَّةِ ، فَقَالَتْ : أَلِهَذَا حَجٌّ ؟ قَالَ : نَعَمْ ، وَلَكِ أَجْرٌ.

2648. …Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Ravhə deyilən yerə çatdıqda bir toplumla qarşılaşdı və onlardan soruşdu: "Siz kimsiniz?" Onlar da: "Müsəlmanlarıq" dedilər. Bu dəfə onlar: "Siz kimsiniz?"- deyərək soruşdular. Bu tərəfdə olanlar da: "Allahın Elçisidir"- dedilər. Ravi deyir: "Bu əsnada bir qadın dəvə üzərindəki xərəkdən bir uşaq çıxararaq soruşdu: "Bu uşaq üçün həcc ziyarəti olarmı?" Allah Elçisi ﷺ buyurdu: "Bəli, savabı isə sənədir".

٢٦٤٩- أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ بْنِ حَمَّادِ بْنِ سَعْدٍ ابْنِ أَخِي رِشْدِينَ بْنِ سَعْدٍ أَبُو الرَّبِيعِ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي مَالِكُ بْنُ أَنَسٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّ بِامْرَأَةٍ وَهِيَ فِي خِدْرِهَا مَعَهَا صَبِيٌّ ، فَقَالَتْ : أَلِهَذَا حَجٌّ ؟ قَالَ : نَعَمْ ، وَلَكِ أَجْرٌ.

2649. …İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir qadının yanından keçmişdi. Qadın pərdənin arxasında idi. Yanında da bir uşağı vardı. Qadın: "Bu uşaq üçün həcc ziyarəti varmı?" deyərək soruşdu. Allah Elçisi ﷺ buyurdu: "Bəli, savabı isə sənədir".[1]

## ١٦- الْوَقْتُ الَّذِي خَرَجَ فِيهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ لِلْحَجِّ

## 16-cı fəsil: Allah Elçisinin ﷺ həcc etmək üçün Mədinədən çıxdığı vaxt

٢٦٥٠- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ أَبِي زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : أَخْبَرَتْنِي عَمْرَةُ ، أَنَّهَا سَمِعَتْ عَائِشَةَ ، تَقُولُ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لِخَمْسٍ بَقِينَ مِنْ ذِي الْقِعْدَةِ ، لاَ نُرَى إِلاَّ الْحَجَّ حَتَّى إِذَا دَنَوْنَا مِنْ مَكَّةَ ، أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ إِذَا طَافَ بِالْبَيْتِ أَنْ يَحِلَّ.

2650. …Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə Zil-Qadənin sonuna beş gün qalmış həcc etmək üçün Mədinədən

[1] Hədisin "pərdənin arxasında" hissəsi səhih deyil.

çıxmışdıq. Məkkəyə yaxınlaşdığımızda Allah Elçisi ﷺ yanında qurbanı olmayan kimsələrin evi təvafdan sonra ehramdan çıxmalarını əmr etdi".

١٧– الْمَوَاقِيتُ مِيقَاتُ أَهْلِ الْمَدِينَةِ

17-ci fəsil: Mədinəlilərin miqat[1] yeri

٢٦٥١– أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَخْبَرَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يُهِلُّ أَهْلُ الْمَدِينَةِ مِنْ ذِي الْحُلَيْفَةِ ، وَأَهْلُ الشَّامِ مِنَ الْجُحْفَةِ ، وَأَهْلُ نَجْدٍ مِنْ قَرْنٍ قَالَ عَبْدُ اللهِ : وَبَلَغَنِي أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : وَيُهِلُّ أَهْلُ الْيَمَنِ مِنْ يَلَمْلَمَ.

2651. ...Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mədinə əhalisi Zul-Huleyfədən, Şam əhalisi Cuhfədən, Nəcd əhalisi Qarndan ehrama girirlər". Abdullah deyir: "Mənə gəlib çatdığına görə Allah Elçisi ﷺ belə buyurdu: "Yəmənlilər də Yələmləmdən ehrama girirlər".

١٨– مِيقَاتُ أَهْلِ الشَّامِ

18-ci fəsil: Şamlıların ehrama girəcəkləri yer

٢٦٥٢– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا نَافِعٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَجُلاً قَامَ فِي الْمَسْجِدِ فَقَالَ : يَا رَسُولَ اللهِ ، مِنْ أَيْنَ تَأْمُرُنَا أَنْ نُهِلَّ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُهِلُّ أَهْلُ الْمَدِينَةِ مِنْ ذِي الْحُلَيْفَةِ ، وَيُهِلُّ أَهْلُ الشَّامِ مِنَ الْجُحْفَةِ ، وَيُهِلُّ أَهْلُ نَجْدٍ مِنْ قَرْنٍ قَالَ ابْنُ عُمَرَ : وَيَزْعُمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : وَيُهِلُّ أَهْلُ الْيَمَنِ مِنْ يَلَمْلَمَ وَكَانَ ابْنُ عُمَرَ يَقُولُ : لَمْ أَفْقَهْ هَذَا مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2652. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: "Bir kişi məsciddə ayağa qalxaraq belə dedi: "Ey Allahın Elçisi, haradan ehrama girməyimizi əmr edirsən?" Allah Elçisi ﷺ buyurdu: "Mədinə əhalisi Zul-Huleyfədə; Şam əhalisi Cuhfədə, Nəcd əhalisi Qarnda ehrama girirlər". İbn Ömər dedi: "Bəzi kimsələrin deməsinə görə Allah Elçisi ﷺ demişdir: "Yəmən əhalisi də "Yələmləm" deyilən yerdən ehrama girirlər". İbn Ömər belə deyirdi: "Mən bunu birbaşa Allah Elçisinin ﷺ özündən eşitmədim".

[1] Miqat – həcc və ümrə edənlərin Məkkəyə doğru gəldikləri yerdən asılı olaraq ehrama girdikləri yerlərin adlarına deyilir. Müxtəlif tərəflərdən gələnlər müxtəlif miqatlardan ziyarətə gəlirlər.

## ١٩- مِيقَاتُ أَهْلِ مِصْرَ

## 19-cu fəsil: Misirlilərin ehrama girəcəkləri yer

٢٦٥٣- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ بَهْرَامٍ ، قَالَ : حَدَّثَنَا الْمُعَافَى ، عَنْ أَفْلَحَ بْنِ حُمَيْدٍ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَقَّتَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ ، وَلأَهْلِ الشَّامِ وَمِصْرَ الْجُحْفَةَ ، وَلأَهْلِ الْعِرَاقِ ذَاتَ عِرْقٍ ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ.

2653. …Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Mədinə əhalisi üçün Zul-Huleyfəni, Şam və Misir əhalisi üçün Cuhfəni, İraq əhalisi üçün Zətu-İrqi, Yəmən əhalisi üçün də Yələmləmi ehrama girmə yeri olaraq təyin etmişdir".

## ٢٠- مِيقَاتُ أَهْلِ الْيَمَنِ

## 20-ci fəsil: Yəmənlilərin ehrama girəcəkləri yer

٢٦٥٤- أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ صَاحِبُ الشَّافِعِيِّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ حَسَّانَ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، وَحَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَّتَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ ، وَلأَهْلِ الشَّامِ الْجُحْفَةَ ، وَلأَهْلِ نَجْدٍ قَرْنًا ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ ، وَقَالَ : هُنَّ لَهُنَّ وَلِكُلِّ آتٍ أَتَى عَلَيْهِنَّ مِنْ غَيْرِهِنَّ فَمَنْ كَانَ أَهْلُهُ دُونَ الْمِيقَاتِ حَيْثُ يُنْشِئُ حَتَّى يَأْتِيَ ذَلِكَ عَلَى أَهْلِ مَكَّةَ.

2654. …İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Mədinə əhalisi üçün Zul-Huleyfəni, Şam əhalisi üçün Cuhfəni, Nəcd əhalisi üçün "Qarn" deyilən yeri, Yəmən əhalisi üçün də "Yələmləm" deyilən yeri ehrama girmək üçün yer olaraq təyin etmiş və buyurmuşdur: "Təyin edilən yerlər həm oranın camaatı üçün, həm də başqa yerlərdən gəlib oradan keçən kimsələr üçündür. Bundan başqa Məkkəyə bu sərhədlərdən daha yaxın yerdə olanlar elə o yerlərdən ehrama girirlər və Məkkəyə elə gəlirlər".

## ٢١- مِيقَاتُ أَهْلِ نَجْدٍ

## 21-ci fəsil: Nəcdlilərin ehrama girəcəkləri yer

٢٦٥٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يُهِلُّ أَهْلُ الْمَدِينَةِ مِنْ ذِي الْحُلَيْفَةِ ، وَأَهْلُ الشَّامِ مِنَ الْجُحْفَةِ ، وَأَهْلُ نَجْدٍ مِنْ قَرْنٍ ، وَذُكِرَ لِي وَلَمْ أَسْمَعْ أَنَّهُ قَالَ : وَيُهِلُّ أَهْلُ الْيَمَنِ مِنْ يَلَمْلَمَ.

2655. …Səlim atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Mədinə əhalisi Zul-Huleyfədən, Şam əhalisi Cuhfədən, Nəcd əhalisi

"Qarn" deyilən yerdən ehrama girirlər". Mən özüm birbaşa eşitmədim, amma belə deyilmişdir: "Yəmən əhalisi də Yələmləmdən ehrama girirlər".

٢٢- مِيقَاتُ أَهْلِ الْعِرَاقِ

## 22-ci fəsil: İraqlıların ehrama girəcəkləri yer

٢٦٥٦- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَمَّارٍ الْمَوْصِلِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو هَاشِمٍ مُحَمَّدُ بْنُ عَلِيٍّ ، عَنِ الْمُعَافَى ، عَنْ أَفْلَحَ بْنِ حُمَيْدٍ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : وَقَّتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ ، وَلأَهْلِ الشَّامِ وَمِصْرَ الْجُحْفَةَ ، وَلأَهْلِ الْعِرَاقِ ذَاتَ عِرْقٍ ، وَلأَهْلِ نَجْدٍ قَرْنًا ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ.

2656. …Rəvayət edilir ki, Aişə ﵂ demişdir: Allah Elçisi ﷺ Mədinə əhalisi üçün Zul-Huleyfəni, Şam əhalisi və Misir əhalisi üçün Cuhfəni, İraq əhalisi üçün Zəti-İrqi, Nəcd əhalisi üçün Qarnı, Yəmən əhalisi üçün də Yələmləməni ehrama giriləcək yer olaraq təyin etmişdir".

٢٣- مَنْ كَانَ أَهْلُهُ دُونَ الْمِيقَاتِ

## 23-cü fəsil: Kəbəyə miqatlardan daha yaxın olanlar nə edir?

٢٦٥٧- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، عَنْ مُحَمَّدِ بْنِ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : وَقَّتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ ، وَلأَهْلِ الشَّامِ الْجُحْفَةَ ، وَلأَهْلِ نَجْدٍ قَرْنًا ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ ، قَالَ : هُنَّ لَهُمْ وَلِمَنْ أَتَى عَلَيْهِنَّ مِمَّنْ سِوَاهُنَّ ، لِمَنْ أَرَادَ الْحَجَّ وَالْعُمْرَةَ ، وَمَنْ كَانَ دُونَ ذَلِكَ مِنْ حَيْثُ بَدَا حَتَّى يَبْلُغَ ذَلِكَ أَهْلَ مَكَّةَ.

2657. …Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: Allah Elçisi ﷺ Mədinə əhalisi üçün Zul-Huleyfəni, Şam əhalisi üçün Cuhfəni, Nəcd əhalisi üçün Qarnı, Yəmən əhalisi üçün Yələmləməni ehrama giriləcək yer olaraq təyin etdi və belə buyurdu: "Bura oranın camaatı və kənardan gəlib oradan keçərək həcc və ümrə etmək istəyən kimsələr üçündür. Məkkəyə daha yaxın olanlar isə olduqları yerdən ehrama girirlər. Məkkəyə gələnə qədər vəziyyət belədir".

٢٦٥٨- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَمْرٍو ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَّتَ لأَهْلِ الْمَدِينَةِ ذَا الْحُلَيْفَةِ ، وَلأَهْلِ الشَّامِ الْجُحْفَةَ ، وَلأَهْلِ الْيَمَنِ يَلَمْلَمَ ، وَلأَهْلِ نَجْدٍ قَرْنًا ، فَهُنَّ لَهُمْ وَلِمَنْ أَتَى عَلَيْهِنَّ مِنْ غَيْرِ أَهْلِهِنَّ مِمَّنْ كَانَ يُرِيدُ الْحَجَّ وَالْعُمْرَةَ ، فَمَنْ كَانَ دُونَهُنَّ فَمِنْ أَهْلِهِ ، حَتَّى أَنَّ أَهْلَ مَكَّةَ يُهِلُّونَ مِنْهَا.

2658. …İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ Mədinə əhalisi üçün Zul-Huleyfəni, Şam əhalisi üçün Cuhfəni, Yəmən əhalisi üçün Yələmlə-

məni, Nəcd əhalisi üçün Qarnı ehrama giriləcək yer olaraq təyin etmişdir. Təyin edilən yerlər oranın camaatı üçün və oradan keçərək həcc və ümrə etmək istəyən hər kəs üçündür. Bu hüdudlardan daha içəridə olanlar (Məklkəyə daha yaxın olanlar) Məkkəyə qədər olduqları yerdən ehrama girə bilərlər.

### ٢٤- التَّعْرِيسُ بِذِي الْحُلَيْفَةِ

### 24-cü fəsil: Gecənin sonunda Zul-Huleyfədə düşərgə salmaq

٢٦٥٩- أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ بْنِ مَثْرُودٍ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، قَالَ : ابْنُ شِهَابٍ ، أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ أَبَاهُ ، قَالَ : بَاتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِذِي الْحُلَيْفَةِ بِبَيْدَاءَ ، وَصَلَّى فِي مَسْجِدِهَا.

2659. …Abdullah ibn Ömərdən ﷠ rəvayət edilir ki, atası belə demişdir: “Allah Elçisi ﷺ Zul-Huleyfədəki “Beyda” deyilən yerdə gecələdi və o məsciddə namaz qıldı”.

٢٦٦٠- أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، عَنْ سُوَيْدٍ ، عَنْ زُهَيْرٍ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ وَهُوَ فِي الْمُعَرَّسِ بِذِي الْحُلَيْفَةِ أُتِيَ فَقِيلَ لَهُ : إِنَّكَ بِبَطْحَاءَ مُبَارَكَةٍ.

2660. …Abdullah ibn Ömər ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ Zul-Huleyfədə “əl-Muarras” deyilən yerdə olarkən ona “Siz mübarək Bəthədəsiniz” deyildi.

٢٦٦١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَاخَ بِالْبَطْحَاءِ الَّذِي بِذِي الْحُلَيْفَةِ وَصَلَّى بِهَا.

2661. …İbn Ömər ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ Zul-Huleyfədəki “Bəthə” deyilən yerdə gecələdi və orada namaz qıldı.

### ٢٥- الْبَيْدَاءُ

### 25-ci fəsil: əl-Beyda

٢٦٦٢- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ وَهُوَ ابْنُ شُمَيْلٍ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ وَهُوَ ابْنُ عَبْدِ الْمَلِكِ ، عَنِ الْحَسَنِ ، عَنْ أَنَسِ ابْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى الظُّهْرَ بِالْبَيْدَاءِ ، ثُمَّ رَكِبَ وَصَعِدَ جَبَلَ الْبَيْدَاءِ فَأَهَلَّ بِالْحَجِّ وَالْعُمْرَةِ ، حِينَ صَلَّى الظُّهْرَ.

2662. …Ənəs ibn Malik ﷛ rəvayət edir ki, Allah Elçisi ﷺ “əl-Beyda” deyilən

yerdə Zöhr namazını qıldı, sonra miniyinə minərək "əl-Beyda" dağına çıxdı. O, Zöhr namazını qıldıqdan sonra həcc və ümrə niyyəti ilə ehrama girdi.[1]

٢٦- الْغُسْلُ لِلإِهْلاَلِ

## 26-cı fəsil: Ehrama girmək üçün qüsl almaq

٢٦٦٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ أَسْمَاءَ بِنْتِ عُمَيْسٍ ، أَنَّهَا وَلَدَتْ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ الصِّدِّيقِ بِالْبَيْدَاءِ ، فَذَكَرَ أَبُو بَكْرٍ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : مُرْهَا فَلْتَغْتَسِلْ ، ثُمَّ لِتُهِلَّ.

2663. …Rəvayət edilir ki, Əsma bint Umeys ﵂ Muhəmməd ibn Əbu Bəkr əs-Siddiqi "əl-Beyda" deyilən yerdə doğdu. Əbu Bəkr vəziyyəti Allah Elçisinə ﷺ bildirdikdə Allah Elçisi ﷺ belə buyurdu: "Ona qüsl alıb ehrama girməsini əmr et".

٢٦٦٤- أَخْبَرَنِي أَحْمَدُ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ النَّسَائِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ مَخْلَدٍ ، قَالَ : حَدَّثَنِي سُلَيْمَانُ بْنُ بِلاَلٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ الأَنْصَارِيُّ ، قَالَ : سَمِعْتُ الْقَاسِمَ بْنَ مُحَمَّدٍ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، عَنْ أَبِي بَكْرٍ ، أَنَّهُ خَرَجَ حَاجًّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَجَّةَ الْوَدَاعِ ، وَمَعَهُ امْرَأَتُهُ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ الْخَثْعَمِيَّةُ ، فَلَمَّا كَانُوا بِذِي الْحُلَيْفَةِ ، وَلَدَتْ أَسْمَاءُ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ ، فَأَتَى أَبُو بَكْرٍ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَخْبَرَهُ ، فَأَمَرَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَأْمُرَهَا ، أَنْ تَغْتَسِلَ ثُمَّ تُهِلَّ بِالْحَجِّ ، وَتَصْنَعَ مَا يَصْنَعُ النَّاسُ ، إِلاَّ أَنَّهَا لاَ تَطُوفُ بِالْبَيْتِ.

2664. …Rəvayət edilir ki, Əbu Bəkr ﵁ Allah Elçisi ﷺ ilə birgə Vida həcci üçün yola çıxmışdı, yanında həyat yoldaşı Əsma bint Umeys əl-Xasəmiyyə də vardı. Zul-Huleyfədə olduqları vaxt Əsma Muhəmməd ibn Əbu Bəkri dünyaya gətirdi. Əbu Bəkr bunu Allah Elçisinə ﷺ bildirdikdə Allah Elçisi ﷺ Əbu Bəkrə həyat yoldaşına qüsl etməsini, həcc niyyəti ilə ehrama girməsini, insanların bütün etdiklərini etməsini, ancaq Kəbəni təvaf etməməsini söyləməsini əmr etdi.

٢٧- غُسْلُ الْمُحْرِمِ

## 27-ci fəsil: Ehramlı ikən qüsl almaq

٢٦٦٥- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، وَالْمِسْوَرِ بْنِ مَخْرَمَةَ ، أَنَّهُمَا اخْتَلَفَا بِالأَبْوَاءِ فَقَالَ ابْنُ عَبَّاسٍ : يَغْسِلُ الْمُحْرِمُ رَأْسَهُ ، وَقَالَ الْمِسْوَرُ : لاَ يَغْسِلُ رَأْسَهُ ، فَأَرْسَلَنِي

[1] Hədis zəifdir.

ابْنُ عَبَّاسٍ إِلَى أَبِي أَيُّوبَ الأَنْصَارِيِّ أَسْأَلُهُ عَنْ ذَلِكَ فَوَجَدْتُهُ يَغْتَسِلُ بَيْنَ قَرْنَيِ الْبِئْرِ ، وَهُوَ مُسْتَتِرٌ بِثَوْبٍ ، فَسَلَّمْتُ عَلَيْهِ ، وَقُلْتُ : أَرْسَلَنِي إِلَيْكَ عَبْدُ اللهِ بْنُ عَبَّاسٍ أَسْأَلُكَ ، كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغْسِلُ رَأْسَهُ وَهُوَ مُحْرِمٌ ؟ فَوَضَعَ أَبُو أَيُّوبَ يَدَهُ عَلَى الثَّوْبِ فَطَأْطَأَهُ حَتَّى بَدَا رَأْسُهُ ، ثُمَّ قَالَ لإِنْسَانٍ : يَصُبُّ عَلَى رَأْسِهِ ، ثُمَّ حَرَّكَ رَأْسَهُ بِيَدَيْهِ ، فَأَقْبَلَ بِهِمَا ، وَأَدْبَرَ ، وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ.

2665. …Rəvayət edilir ki, Abdullah ibn Abbas ﷺ və Misvər ibn Məxramə Əbva deyilən yerdə bir ixtilafa düşdülər. İbn Abbas: “Ehramlı kimsə başını yuya bilər” deyərkən, Misvər: “Başını yuya bilməz” deyirdi. İbn Abbas məni (ravini) Əbu Əyyub əl-Ənsarinin yanına göndərdi ki, ondan bu barədə soruşum. Yanına gəldikdə onu quyunun iki dirəyi arasında bir paltarla gizlənib yuyunarkən gördüm, salam verdim və: “Məni Abdullah ibn Abbas sənin yanına göndərib soruşum ki, Allah Elçisi ﷺ ehramlı ikən başını yuyardımı?” Əbu Əyyub əlini paltarın üstünə qoyub onu başı görünənə qədər aşağı saldı, sonra kiməsə onun başına su tökməsini buyurdu. Sonra əlləri ilə başını irəli və arxaya sürtdü və dedi: “Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm”.

### ٢٨- النَّهْيُ عَنِ الثِّيَابِ الْمَصْبُوغَةِ بِالْوَرْسِ وَالزَّعْفَرَانِ فِي الإِحْرَامِ

### 28-ci fəsil: Ehramlı kimsənin sarı və zəfəran rəngli bir şey geyinməsinin qadağan olması

٢٦٦٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ دِينَارٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنْ يَلْبَسَ الْمُحْرِمُ ثَوْبًا مَصْبُوغًا بِزَعْفَرَانٍ أَوْ بِوَرْسٍ.

2666. …Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ zəfəran və ya sarıkök ilə boyanmış paltar geyinməyi qadağan etmişdir”.

٢٦٦٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَا يَلْبَسُ الْمُحْرِمُ مِنَ الثِّيَابِ ؟ قَالَ : لاَ يَلْبَسُ الْقَمِيصَ ، وَلاَ الْبُرْنُسَ ، وَلاَ السَّرَاوِيلَ ، وَلاَ الْعِمَامَةَ ، وَلاَ ثَوْبًا مَسَّهُ وَرْسٌ ، وَلاَ زَعْفَرَانٌ ، وَلاَ خُفَّيْنِ إِلاَّ لِمَنْ لاَ يَجِدُ نَعْلَيْنِ ، فَإِنْ لَمْ يَجِدْ نَعْلَيْنِ ، فَلْيَقْطَعْهُمَا حَتَّى يَكُونَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ.

2667. …Səlim atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisindən ﷺ ehramlı kimsənin hansı paltarları geyinməsinin qadağan olduğu soruşuldu. Allah Elçisi ﷺ belə buyurdu: “Köynək, burnus[1], şalvar, əmmamə,

[1] Burnus – arxa tərəfdən yaxalığına başlıq bənd edilmiş üst paltarına deyilir.

sarıkök və zəfəranla boyanmış paltarlar və xuff geyinə bilməzlər, amma səndəl tapa bilməyənlər xufflarını topuqdan aşağı kəsərək geyinə bilərlər".

### ٢٩– الْجُبَّةُ فِي الإِحْرَامِ

### 29-cu fəsil: Ehramlı olaraq cübbə geyinmək

٢٦٦٨– أَخْبَرَنَا نُوحُ بْنُ حَبِيبٍ الْقُومَسِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : قَالَ حَدَّثَنِي عَطَاءٌ ، عَنْ صَفْوَانَ بْنِ يَعْلَى بْنِ أُمَيَّةَ ، عَنْ أَبِيهِ ، أَنَّهُ قَالَ : لَيْتَنِي أَرَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُنْزَلُ عَلَيْهِ ، فَبَيْنَا نَحْنُ بِالْجِعِرَّانَةِ ، وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي قُبَّةٍ فَأَتَاهُ الْوَحْيُ ، فَأَشَارَ إِلَيَّ عُمَرُ أَنْ تَعَالَ ، فَأَدْخَلْتُ رَأْسِي الْقُبَّةَ فَأَتَاهُ رَجُلٌ قَدْ أَحْرَمَ فِي جُبَّةٍ بِعُمْرَةٍ مُتَضَمِّخٌ بِطِيبٍ فَقَالَ : يَا رَسُولَ اللهِ مَا تَقُولُ فِي رَجُلٍ قَدْ أَحْرَمَ فِي جُبَّةٍ إِذْ أُنْزِلَ عَلَيْهِ الْوَحْيُ فَجَعَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَغِطُّ لِذَلِكَ فَسُرِّيَ عَنْهُ ، فَقَالَ : أَيْنَ الرَّجُلُ الَّذِي سَأَلَنِي آنِفًا ؟ فَأُتِيَ بِالرَّجُلِ فَقَالَ : أَمَّا الْجُبَّةُ فَاخْلَعْهَا ، وَأَمَّا الطِّيبُ فَاغْسِلْهُ ، ثُمَّ أَحْدِثْ إِحْرَامًا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : ثُمَّ أَحْدِثْ إِحْرَامًا مَا أَعْلَمُ أَحَدًا قَالَهُ غَيْرَ نُوحِ بْنِ حَبِيبٍ ، وَلاَ أَحْسِبُهُ مَحْفُوظًا ، وَاللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ.

2668. ...Safvan ibn Yalə ibn Umeyyə atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Biz əl-Ciranədə olarkən dedim: "Allah Elçisini ﷺ görə bilsəydim...". O, bir çadırda idi. Bu əsnada ona vəhy gəlmişdi. Ömər mənə ora gəlməyimi işarə etdi. Başımı çadırdan içəri saldıqda Allah Elçisinin ﷺ yanına bir nəfərin gəldiyini, ümrə niyyəti ilə bir cübbə geyərək ehrama girdiyini və ətir vurduğunu gördüm. O dedi: "Ey Allahın Elçisi, ehram paltarının əvəzinə bir cübbə geyinmiş adama nə deyirsən?" Bu vaxt vəhy gəldi və Allah Elçisi ﷺ xırıltılı səs çıxarmağa başladı. Vəhy qurtardıqdan sonra isə buyurdu: "Bir az əvvəl sual verən kişi haradadır?" Kişi onun yanına gətirildikdə Peyğəmbər ﷺ buyurdu: "Cübbəni çıxart, vurduğun ətiri yu və ehrama yenidən gir".[1]

### ٣٠– النَّهْيُ عَنْ لُبْسِ الْقَمِيصِ لِلْمُحْرِمِ

### 30-cu fəsil: Ehrama girənin köynək geyinməsinin qadağan olması

٢٦٦٩– أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَا يَلْبَسُ الْمُحْرِمُ مِنَ الثِّيَابِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَلْبَسُوا الْقُمُصَ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ الْخِفَافَ ، إِلاَّ أَحَدٌ لاَ يَجِدُ نَعْلَيْنِ ، فَلْيَلْبَسْ خُفَّيْنِ ، وَلْيَقْطَعْهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ ، وَلاَ تَلْبَسُوا شَيْئًا مَسَّهُ الزَّعْفَرَانُ ، وَلاَ الْوَرْسُ.

2669. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, bir kişi Allah Elçisindən ﷺ ehramlı olanın nəyi geyinə biləcəyini soruşdu. Allah Elçisi ﷺ də buyurdu: "Köynəklər, əmmamələr, şalvarlar, burnus və xuflar geyinməyin! Yalnız

---

[1] Hədisin sonunda olan "və ehrama yenidən gir" hissəsi səhih deyil.

ayaqqabı tapa bilməyənlər xuffun (dəri corabın) topuqdan aşağı hissəsini kəsib geyinsin. Həmçinin zəfəran və sarıkök dəymiş libas geyinməyin!"

### ٣١- النَّهْيُ عَنْ لُبْسِ السَّرَاوِيلِ فِي الإِحْرَامِ

### 31-ci fəsil: Ehramlı olan kimsənin şalvar geyməsinin qadağan olması

٢٦٧٠- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : حَدَّثَنِي نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَجُلاً قَالَ : يَا رَسُولَ اللهِ مَا نَلْبَسُ مِنَ الثِّيَابِ إِذَا أَحْرَمْنَا ؟ قَالَ : لاَ تَلْبَسُوا الْقَمِيصَ وَقَالَ عَمْرٌو مَرَّةً أُخْرَى : الْقُمُصَ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْخُفَّيْنِ ، إِلاَّ أَنْ لاَ يَكُونَ لأَحَدِكُمْ نَعْلاَنِ ، فَلْيَقْطَعْهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ ، وَلاَ ثَوْبًا مَسَّهُ وَرْسٌ ، وَلاَ زَعْفَرَانٌ.

2670. ...İbn Ömər ﷺ rəvayət edir ki, bir kişi dedi: "Ey Allahın Elçisi, ehramlı ikən nə geyinə bilmərik?" Peyğəmbər ﷺ buyurdu: "Köynəklər, əmmamələr, şalvarlar və xuflar geyinməyin! Yalnız ayaqqabı tapa bilməyənlər xuffun topuqdan aşağı hissəsini kəsib geyinsin. Həmçinin sarıkök və zəfəran dəymiş libas geyinməyin!"

### ٣٢- الرُّخْصَةُ فِي لُبْسِ السَّرَاوِيلِ لِمَنْ لاَ يَجِدُ الإِزَارَ

### 32-ci fəsil: İzar tapa bilməyənin şalvar geyməsinə rüsxət verilməsi

٢٦٧١- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَمْرٍو ، عَنْ جَابِرِ بْنِ زَيْدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَخْطُبُ وَهُوَ يَقُولُ : السَّرَاوِيلُ لِمَنْ لاَ يَجِدُ الإِزَارَ ، وَالْخُفَّيْنِ لِمَنْ لاَ يَجِدُ النَّعْلَيْنِ لِلْمُحْرِمِ.

2671. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ xütbə deyərək belə buyurduğunu eşitdim: "İzar tapa bilməyən şalvar, ayaqqabı tapa bilməyən isə xuff geyinə bilər".

٢٦٧٢- أَخْبَرَنِي أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ جَابِرِ بْنِ زَيْدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ لَمْ يَجِدْ إِزَارًا ، فَلْيَلْبَسْ سَرَاوِيلَ ، وَمَنْ لَمْ يَجِدْ نَعْلَيْنِ فَلْيَلْبَسْ خُفَّيْنِ.

2672. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ belə buyurduğunu eşitdim: "İzar tapa bilməyən şalvar, ayaqqabı tapa bilməyən isə xuff geyinə bilər".

### ٣٣- النَّهْيُ عَنْ أَنْ تَنْتَقِبَ الْمَرْأَةُ الْحَرَامُ

### 33-cü fəsil: Ehramlı qadının üzünü örtməsinin qadağan olması

٢٦٧٣- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : قَامَ رَجُلٌ ، فَقَالَ : يَا رَسُولَ اللهِ مَاذَا تَأْمُرُنَا أَنْ نَلْبَسَ

مِنَ الثِّيَابِ فِي الإِحْرَامِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَلْبَسُوا الْقَمِيصَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ الْخِفَافَ ، إِلاَّ أَنْ يَكُونَ أَحَدٌ لَيْسَتْ لَهُ نَعْلاَنِ فَلْيَلْبَسِ الْخُفَّيْنِ مَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ ، وَلاَ تَلْبَسُوا شَيْئًا مِنَ الثِّيَابِ مَسَّهُ الزَّعْفَرَانُ ، وَلاَ الْوَرْسُ ، وَلاَ تَنْتَقِبُ الْمَرْأَةُ الْحَرَامُ ، وَلاَ تَلْبَسُ الْقُفَّازَيْنِ.

2673. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Bir kişi ayağa durub dedi: "Ey Allahın Elçisi, sən bizə ehramlı ikən hansı paltarı geyinməyi əmr edirsən?" Allah Elçisi ﷺ buyurdu: "Köynək, şalvarlar, əmmamələr, burnus[1] və xuflar geyinməyin! Yalnız ayaqqabısı olmayan kimsə xuffun topuqdan aşağı hissəsini kəsib geyinsin. Həmçinin zəfəran və sarıkök dəymiş libas geyinməyin! Qadın da üzünü ötrməsin və əlcək geyinməsin!"

### ٣٤- النَّهْيُ عَنْ لُبْسِ الْبَرَانِسِ فِي الإِحْرَامِ

### 34-cü fəsil: Ehramlı kimsənin burnus geyməsinin qadağan olması

٢٦٧٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا يَلْبَسُ الْمُحْرِمُ مِنَ الثِّيَابِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَلْبَسُوا الْقَمِيصَ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ الْخِفَافَ ، إِلاَّ أَحَدٌ لاَ يَجِدُ نَعْلَيْنِ ، فَلْيَلْبَسْ خُفَّيْنِ ، وَلْيَقْطَعْهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ ، وَلاَ تَلْبَسُوا شَيْئًا مَسَّهُ الزَّعْفَرَانُ ، وَلاَ الْوَرْسُ.

2674. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, bir kişi Allah Elçisindən ﷺ ehramlının hansı paltar geyinə bilməsi haqda soruşduqda Peyğəmbər ﷺ buyurdu: "Köynək, əmmamə, şalvarlar, burnus və xuflar geyinməyin! Yalnız ayaqqabı tapa bilməyən kimsə xuffun topuqdan aşağı hissəsini kəsib geyinsin. Həmçinin zəfəran və sarıkök dəymiş bir şey geyinməyin!"

٢٦٧٥- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، وَعَمْرُو بْنُ عَلِيٍّ ، قَالاَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ الأَنْصَارِيُّ ، عَنْ عُمَرَ بْنِ نَافِعٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا نَلْبَسُ مِنَ الثِّيَابِ إِذَا أَحْرَمْنَا ؟ قَالَ : لاَ تَلْبَسُوا الْقَمِيصَ وَلاَ السَّرَاوِيلاَتِ وَلاَ الْعَمَائِمَ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ الْخِفَافَ إِلاَّ أَنْ يَكُونَ أَحَدٌ لَيْسَتْ لَهُ نَعْلاَنِ ، فَلْيَلْبَسِ الْخُفَّيْنِ أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ وَلاَ تَلْبَسُوا مِنَ الثِّيَابِ شَيْئًا مَسَّهُ وَرْسٌ وَلاَ زَعْفَرَانٌ.

2675. ...İbn Ömər ﵄ rəvayət edir ki, bir kişi Allah Elçisindən ﷺ soruşdu: "Biz ehramlı ikən hansı paltarı geyinə bilmərik?" Peyğəmbər ﷺ buyurdu: "Köynək, şalvarlar, əmmamələr, burnus, xuflar geyinməyin! Yalnız ayaqqabısı olmayan kəs xuffun topuqdan aşağı hissəsini kəsib geyinsin. Həmçinin sarıkök və zəfəran dəymiş bir paltar geyinməyin!"

[1] Burnus – arxa tərəfdən yaxalığına başlıq bənd edilmiş üst paltarına deyilir.

## ٣٥- النَّهْيُ عَنْ لُبْسِ الْعِمَامَةِ فِي الإِحْرَامِ

## 35-ci fəsil: Ehramlı kimsənin əmmamə geyməsinin qadağan olması

٢٦٧٦- أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : نَادَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلٌ فَقَالَ : مَا نَلْبَسُ إِذَا أَحْرَمْنَا ؟ قَالَ : لاَ تَلْبَسِ الْقَمِيصَ وَلاَ الْعِمَامَةَ ، وَلاَ السَّرَاوِيلَ وَلاَ الْبُرْنُسَ ، وَلاَ الْخُفَّيْنِ إِلاَّ أَنْ لاَ تَجِدَ نَعْلَيْنِ فَإِنْ لَمْ تَجِدِ النَّعْلَيْنِ فَمَا دُونَ الْكَعْبَيْنِ.

2676. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Bir kişi uca səslə Peyğəmbərə ﷺ dedi: "Ehrama girdikdə nə geyinək?" Allah Elçisi ﷺ buyurdu: "Köynək geyinmə! Əmmamə geyinmə! Şalvar və burnus geyinmə! Xuff geyinmə! Səndəl tapa bilməyən (xuffun) topuqlarını kəsib geyinə bilər".

٢٦٧٧- أَخْبَرَنَا أَبُو الأَشْعَثِ أَحْمَدُ بْنُ الْمِقْدَامِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : نَادَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلٌ ، فَقَالَ : مَا نَلْبَسُ إِذَا أَحْرَمْنَا ؟ قَالَ : لاَ تَلْبَسِ الْقَمِيصَ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْخِفَافَ ، إِلاَّ أَنْ لاَ يَكُونَ نِعَالٌ ، فَإِنْ لَمْ يَكُنْ نِعَالٌ فَخُفَّيْنِ دُونَ الْكَعْبَيْنِ ، وَلاَ ثَوْبًا مَصْبُوغًا بِوَرْسٍ ، أَوْ زَعْفَرَانٍ ، أَوْ مَسَّهُ وَرْسٌ ، أَوْ زَعْفَرَانٌ.

2677. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Bir kişi uca səslə Peyğəmbərə ﷺ dedi: "Ehrama girdikdə nə geyinək?" Allah Elçisi ﷺ buyurdu: "Köynək geyinmə! Əmmamə geyinmə! Burnus geyinmə! Şalvar geyinmə! Xuff geyinmə! Səndəl tapa bilməyən topuqlarını kəsib geyinə bilər. Sarıkök və zəfəran boyası ilə rənglənmiş paltarlar geyinməyin!"

## ٣٦- النَّهْيُ عَنْ لُبْسِ الْخُفَّيْنِ فِي الإِحْرَامِ

## 36-cı fəsil: Ehramlı kimsənin xuff geyməsinin qadağan olması

٢٦٧٨- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ أَبِي زَائِدَةَ ، قَالَ : أَنْبَأَنَا عُبَيْدُ اللهِ بْنُ عُمَرَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ تَلْبَسُوا فِي الإِحْرَامِ الْقَمِيصَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْعَمَائِمَ ، وَلاَ الْبَرَانِسَ ، وَلاَ الْخِفَافَ.

2678. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Mən Peyğəmbərin ﷺ belə dediyini eşitdim: "Ehrama girdikdə köynək geyinməyin! Şalvar geyinməyin! Əmmamə geyinməyin! Burnus geyinməyin! Xuff geyinməyin!"

٣٧– الرُّخْصَةُ فِي لُبْسِ الْخُفَّيْنِ فِي الإِحْرَامِ ، لِمَنْ لاَ يَجِدُ نَعْلَيْنِ

## 37-ci fəsil: Ehramlı kimsənin ayaqqabı tapa bilməyəndə xuff geyməsinə rüsxət verilməsi

٢٦٧٩– أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : أَنْبَأَنَا أَيُّوبُ ، عَنْ عَمْرٍو ، عَنْ جَابِرِ بْنِ زَيْدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا لَمْ يَجِدْ إِزَارًا ، فَلْيَلْبَسِ السَّرَاوِيلَ ، وَإِذَا لَمْ يَجِدِ النَّعْلَيْنِ ، فَلْيَلْبَسِ الْخُفَّيْنِ ، وَلْيَقْطَعْهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ.

2679. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "(Ehrama girdikdə) izar tapa bilməyən şalvar geyinsin! Ayaqqabı tapa bilməyən kəs xuffun topuqlarından aşağı hissəsini kəsib geyinsin!"

٣٨– قَطْعُهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ

## 38-ci fəsil: Ehramlı kimsənin ayaqqabı geyindikdə topuqlarını kəsib geyinməsi

٢٦٨٠– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا ابْنُ عَوْنٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا لَمْ يَجِدِ الْمُحْرِمُ النَّعْلَيْنِ فَلْيَلْبَسِ الْخُفَّيْنِ ، وَلْيَقْطَعْهُمَا أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ.

2680. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ehramlı olan kimsə ayaqqabı tapa bilmədikdə xuffun topuqlarından aşağı hissəsini kəsib geyinsin!"

٣٩– النَّهْيُ عَنْ أَنْ تَلْبَسَ الْمُحْرِمَةُ الْقُفَّازَيْنِ

## 39-cu fəsil: Ehramlı qadının əlcək geyinməsinin qadağan olması

٢٦٨١– أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَجُلاً قَامَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، مَاذَا تَأْمُرُنَا أَنْ نَلْبَسَ مِنَ الثِّيَابِ فِي الإِحْرَامِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَلْبَسُوا الْقُمُصَ ، وَلاَ السَّرَاوِيلاَتِ ، وَلاَ الْخِفَافَ ، إِلاَّ أَنْ يَكُونَ رَجُلٌ لَهُ نَعْلاَنِ ، فَلْيَلْبَسِ الْخُفَّيْنِ أَسْفَلَ مِنَ الْكَعْبَيْنِ ، وَلاَ يَلْبَسْ شَيْئًا مِنَ الثِّيَابِ مَسَّهُ الزَّعْفَرَانُ ، وَلاَ الْوَرْسُ ، وَلاَ تَنْتَقِبُ الْمَرْأَةُ الْحَرَامُ ، وَلاَ تَلْبَسُ الْقُفَّازَيْنِ.

2681. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, bir kişi ayağa durub dedi: "Ey Allahın Elçisi, ehramda olduğumuz zaman bizə nə geyinməyi əmr edirsən?" Allah Elçisi ﷺ buyurdu: "Köynək geyinməyin! Şalvar geyinməyin! Xuff geyinməyin, yalnız ayaqqabı tapa bilməyən topuqdan yuxarını kəsib

geyinə bilər. Zəfərana və sarıkökə boyanmış paltarlar geyinməyin! Qadınlar isə üzlərini bağlamasınlar və əlcək geyinməsinlər".

٤٠- التَّلْبِيدُ عِنْدَ الإِحْرَامِ

40-cı fəsil: Ehramlı kimsənin saçını qırxdırması

٢٦٨٢- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، قَالَ : أَخْبَرَنِي نَافِعٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أُخْتِهِ حَفْصَةَ قَالَتْ : قُلْتُ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا رَسُولَ اللهِ ، مَا شَأْنُ النَّاسِ حَلُّوا ، وَلَمْ تَحِلَّ مِنْ عُمْرَتِكَ ؟ قَالَ : إِنِّي لَبَّدْتُ رَأْسِي ، وَقَلَّدْتُ هَدْيِي ، فَلاَ أُحِلُّ حَتَّى أُحِلَّ مِنَ الْحَجِّ.

2682. ...Abdullah ibn Ömər ﵄ bacısı Həfsanın belə dediyini rəvayət etmişdir: "Mən Peyğəmbərə ﷺ dedim: "Ey Allahın Elçisi, nəyə görə sən ehramlı olduğun halda insanlar ümrə ehramından çıxıblar?" Peyğəmbər ﷺ buyurdu: "Mən saçımı qırxdırdım, qurbanlıq heyvanıma da işarə vurub (kəsməyə) göndərdim. Ona görə də həcci bitirənə kimi ehramdan çıxmayacam".

٢٦٨٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُهِلُّ مُلَبِّدًا.

2683. ...Səlim atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ ehramlı ikən təlbiyə dediyini görmüşəm".

٤١- إِبَاحَةُ الطِّيبِ عِنْدَ الإِحْرَامِ

41-ci fəsil: Ehramda olarkən ətir vurmaq

٢٦٨٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَمْرٍو ، عَنْ سَالِمٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عِنْدَ إِحْرَامِهِ حِينَ أَرَادَ أَنْ يُحْرِمَ ، وَعِنْدَ إِحْلاَلِهِ ، قَبْلَ أَنْ يُحِلَّ بِيَدَيَّ.

2684. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinə ﷺ ehrama girərkən və ehramdan çıxarkən öz əllərimlə gözəl bir ətir vurdum".

٢٦٨٥- أَخْبَرَنَا قُتَيْبَةُ بنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِإِحْرَامِهِ ، قَبْلَ أَنْ يُحْرِمَ ، وَلِحِلِّهِ قَبْلَ أَنْ يَطُوفَ بِالْبَيْتِ.

2685. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinə ﷺ ehrama

girməzdən qabaq və Kəbəni təvaf etməzdən qabaq ehramdan çıxması üçün gözəl ətir vurdum”.

٢٦٨٦– أَخْبَرَنَا حُسَيْنُ بْنُ مَنْصُورِ بْنِ جَعْفَرٍ النَّيْسَابُورِيُّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِإِحْرَامِهِ ، قَبْلَ أَنْ يُحْرِمَ ، وَلِحِلِّهِ حِينَ أَحَلَّ.

2686. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinə ﷺ ehrama girməmişdən qabaq və ehramı çıxardıqdan sonra gözəl ətir vurmuşdum”.

٢٦٨٧– أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ أَبُو عُبَيْدِ اللهِ الْمَخْزُومِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحُرْمِهِ ، حِينَ أَحْرَمَ ، وَلِحِلِّهِ بَعْدَ مَا رَمَى جَمْرَةَ الْعَقَبَةِ ، قَبْلَ أَنْ يَطُوفَ بِالْبَيْتِ.

2687. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinə ﷺ ehrama girməyə hazırlanarkən, Kəbəni təvaf etməzdən qabaq, böyük sütunu[1] daşladıqdan sonra və Kəbəni təvafdan qabaq ehramdan çıxmağa hazırlaşarkən gözəl ətir vurmuşdum”.

٢٦٨٨– أَخْبَرَنَا عِيسَى بْنُ مُحَمَّدٍ أَبُو عُمَيْرٍ ، عَنْ ضَمْرَةَ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِإِحْلاَلِهِ ، وَطَيَّبْتُهُ لِإِحْرَامِهِ طِيبًا لاَ يُشْبِهُ طِيبَكُمْ هَذَا ، تَعْنِي لَيْسَ لَهُ بَقَاءٌ.

2688. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinə ﷺ ehrama girdikdən qabaq və ehramdan çıxdıqdan sonra gözəl ətir vurmuşdum, lakin o ətir sizin ətirlərə bənzəməzdi. Onun heç bir izi qalmazdı”.

٢٦٨٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ بِأَيِّ شَيْءٍ طَيَّبْتِ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَتْ : بِأَطْيَبِ ، الطِّيبِ ، عِنْدَ حُرْمِهِ وَحِلِّهِ.

2689. ...Osman ibn Urva atasının ﵀ belə dediyini rəvayət etmişdir: “Mən Aişəyə dedim: “Allah Elçisi ﷺ necə ətir vurardı?” Aişə dedi: “O, ehrama girərkən də, ehramdan çıxarkən də mən ətirlərin ən yaxşısından ona vurardım”.

٢٦٩٠– أَخْبَرَنَا أَحْمَدُ بْنُ يَحْيَى بْنِ الْوَزِيرِ بْنِ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، عَنْ أَبِيهِ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ عُثْمَانَ بْنِ عُرْوَةَ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أُطَيِّبُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عِنْدَ إِحْرَامِهِ ، بِأَطْيَبِ مَا أَجِدُ.

[1] Buna ərəbcə “Cəməratul-Aqabə” deyilir. Bu, həcc ziyarətində ayin olaraq şeytana daş atılan sütunlardan ən böyüyüdür.

2690. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: Allah Elçisi ﷺ ehrama girdikdə tapa bildiyim ən yaxşı ətiri ona vurardım".

٢٦٩١– أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أُطَيِّبُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِأَطْيَبِ مَا أَجِدُ لِحُرْمِهِ ، وَلِحِلِّهِ وَحِينَ يُرِيدُ أَنْ يَزُورَ الْبَيْتَ.

2691. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ ehrama girərkən, ehramdan çıxarkən və Kəbəni təvaf etmək istədiyi vaxt tapa bildiyim ən yaxşı ətiri ona vurardım".

٢٦٩٢– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنِ الْقَاسِمِ ، قَالَ : قَالَتْ عَائِشَةُ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَبْلَ أَنْ يُحْرِمَ ، وَيَوْمَ النَّحْرِ ، قَبْلَ أَنْ يَطُوفَ بِالْبَيْتِ ، بِطِيبٍ فِيهِ مِسْكٌ.

2692. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ ehrama girməmişdən qabaq, Qurban bayramı günü və Kəbəni təvaf etməzdən qabaq mən ona müşk ətiri vurardım".

٢٦٩٣– أَخْبَرَنَا أَحْمَدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْوَلِيدِ يَعْنِي الْعَدَنِيَّ ، عَنْ سُفْيَانَ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا إِسْحَاقُ يَعْنِي الأَزْرَقَ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنِ الْحَسَنِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي رَأْسِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ مُحْرِمٌ وَقَالَ أَحْمَدُ بْنُ نَصْرٍ فِي حَدِيثِهِ : وَبِيصِ طِيبِ الْمِسْكِ فِي مَفْرِقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2693. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq başına vurduğum (müşk) ətirinin parlaqlığını, sanki hələ də görürəm".

٢٦٩٤– أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : قَالَ لِي إِبْرَاهِيمُ : حَدَّثَنِي الأَسْوَدُ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، قَالَتْ : لَقَدْ كَانَ يُرَى وَبِيصُ الطِّيبِ ، فِي مَفَارِقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2694. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq saçlarını ayıraraq başının ortasına vurduğu ətirin parlaqlığı görünürdü".

## ٤٢– مَوْضِعُ الطِّيبِ

## 42-ci fəsil: Ehramda olarkən ətirin vurulduğu yer

٢٦٩٥– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي رَأْسِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2695. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq başına vurduğu ətirin parlaqlığını, sanki hələ də görürəm”.

٢٦٩٦- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي أُصُولِ شَعْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2696. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq başına saçlarının dibinə vurduğu ətirin parlaqlığına baxardım”.

٢٦٩٧- أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، يَعْنِي ابْنَ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنِي شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي مَفْرِقِ رَأْسِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2697. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq saçlarını ayırdığı yerə vurduğu ətirin parlaqlığını, sanki hələ də görürəm”.

٢٦٩٨- أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ الْعَسْكَرِيُّ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدٌ وَهُوَ ابْنُ جَعْفَرٍ غُنْدُرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَقَدْ رَأَيْتُ وَبِيصَ الطِّيبِ فِي رَأْسِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2698. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq başına vurduğu ətirin parlaqlığını görmüşəm”.

٢٦٩٩- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَأَنِّي أَنْظُرُ إِلَى وَبِيصِ الطِّيبِ فِي مَفَارِقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُهِلُّ.

2699. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisinin ﷺ ehrama girməmişdən qabaq saçlarını ayırdığı yerə vurduğu ətirin parlaqlığını, sanki hələ də görürəm”.

٢٧٠٠- أَخْبَرَنَا قُتَيْبَةُ ، وَهَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ – وَقَالَ هَنَّادٌ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ – إِذَا أَرَادَ أَنْ يُحْرِمَ ادَّهَنَ بِأَطْيَبِ ، مَا يَجِدُهُ حَتَّى أَرَى وَبِيصَهُ فِي رَأْسِهِ وَلِحْيَتِهِ تَابَعَهُ إِسْرَائِيلُ عَلَى هَذَا الْكَلَامِ ، وَقَالَ : عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ.

2700. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ ehrama girmək

istədikdə tapa bildiyi ən gözəl ətir və yağdan istifadə edərdi. Onun saç və saqqalından yağın və ətirin parlaqlığı görünürdü".

٢٧٠١– أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ إِسْرَائِيلَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أُطَيِّبُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِأَطْيَبِ مَا كُنْتُ أَجِدُ مِنَ الطِّيبِ حَتَّى أَرَى وَبِيصَ الطِّيبِ فِي رَأْسِهِ ، وَلِحْيَتِهِ قَبْلَ أَنْ يُحْرِمَ.

2701. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Allah Elçisi ﷺ ehrama girməzdən qabaq tapa bildiyim ən gözəl ətiri ona vurardım və onun saç-saqqalına baxan kimi ətirin parlaqlığını görürdüm".

٢٧٠٢– أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَقَدْ رَأَيْتُ وَبِيصَ الطِّيبِ ، فِي مَفَارِقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بَعْدَ ثَلاَثٍ.

2702. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Allah Elçisinin ﷺ saçlarının arasına vurduğu ətirin parlaqlığını üç gün sonra da görmüşdüm".

٢٧٠٣– أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَرَى وَبِيصَ الطِّيبِ فِي مَفْرِقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ ثَلاَثٍ.

2703. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Allah Elçisinin ﷺ saçlarının arasına vurduğu ətirin izinin parlaqlığını üç gün sonra da görmüşdüm".

٢٧٠٤– أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ بِشْرٍ ، يَعْنِي ابْنَ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ ، عَنْ أَبِيهِ ، قَالَ : سَأَلْتُ ابْنَ عُمَرَ عَنِ الطِّيبِ عِنْدَ الإِحْرَامِ ، فَقَالَ : لأَنْ أَطَّلِيَ بِالْقَطِرَانِ أَحَبُّ إِلَيَّ مِنْ ذَلِكَ ، فَذَكَرْتُ ذَلِكَ لِعَائِشَةَ فَقَالَتْ : يَرْحَمُ اللَّهُ أَبَا عَبْدِ الرَّحْمَنِ ، لَقَدْ كُنْتُ أُطَيِّبُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَيَطُوفُ فِي نِسَائِهِ ، ثُمَّ يُصْبِحُ يَنْضَحُ طِيبًا.

2704. ...İbrahim ibn Muhəmməd ibn əl-Muntəşir atasının رضي الله عنه belə dediyini rəvayət etmişdir: "İbn Ömərdən ehrama girərkən ətir vurmaq haqda soruşdum. O dedi: "Ehrama girəndə ətir vuracağamsa, elə qətran [1] vuraram". Bunu Aişəyə danışdıqda buyurdu: "Allah Əbu Abdur-Rahmənə rəhm etsin! Mən Allah Elçisinə ﷺ gözəl ətir vurardım, o da zövcələrinin yanına gedərdi. Səhər olduqda belə o ətirin qoxusu hiss edilərdi".

[1] Qətran - ətir növünə deyilir.

٢٧٠٥– أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ وَكِيعٍ ، عَنْ مِسْعَرٍ ، وَسُفْيَانُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ ابْنَ عُمَرَ ، يَقُولُ : لأَنْ أُصْبِحَ مُطَّلِيًا بِقَطِرَانٍ ، أَحَبُّ إِلَيَّ مِنْ أَنْ أُصْبِحَ مُحْرِمًا أَنْضَحُ طِيبًا ، فَدَخَلْتُ عَلَى عَائِشَةَ فَأَخْبَرْتُهَا بِقَوْلِهِ ، فَقَالَتْ : طَيَّبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَطَافَ فِي نِسَائِهِ ، ثُمَّ أَصْبَحَ مُحْرِمًا.

2705. ...İbrahim ibn Muhəmməd ibn əl-Muntəşir atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən İbn Ömərin belə dediyini eşitdim: “Ehramlı ikən ətir vurub sabahlamaqdansa, qətran vurub sabahlamağım mənim üçün daha xeyirlidir”. Mən Aişənin yanına gedərək bu sözləri ona xəbər verdim. Aişə dedi: “Mən Allah Elçisinə ﷺ gözəl ətir vurdum, o da zövcələrinə baş çəkdi. Səhər olduqda isə o ətirin qoxusu getmədən ehrama girdi”.

٤٣– الزَّعْفَرَانُ لِلْمُحْرِمِ

43-cü fəsil: Ehramlı olana zəfəran ətiri sürtmək

٢٧٠٦– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ إِسْمَعِيلَ ، عَنْ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَنَسٍ ، قَالَ : نَهَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَتَزَعْفَرَ الرَّجُلُ.

2706. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Peyğəmbər ﷺ ehramlı kişiyə zəfəran ətiri sürtməyi qadağan etmişdir”.

٢٧٠٧– أَخْبَرَنِي كَثِيرُ بْنُ عُبَيْدٍ ، عَنْ بَقِيَّةَ ، عَنْ شُعْبَةَ ، قَالَ : حَدَّثَنِي إِسْمَعِيلُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الْعَزِيزِ بْنُ صُهَيْبٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عَنِ التَّزَعْفُرِ.

2707. Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ ehramlı olana zəfəran ətiri sürtməyi qadağan etmişdir”.

٢٧٠٨– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنِ التَّزَعْفُرِ قَالَ حَمَّادٌ : يَعْنِي لِلرِّجَالِ.

2708. ...Ənəs ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ ehramlıya zəfəran ətiri sürtməyi qadağan etmişdir. Ravi Həmməd deyir: “Kişilər üçün”.

٤٤– فِي الْخَلُوقِ لِلْمُحْرِمِ

44-cü fəsil: Ehramlı olanın başqa ətirlər vurması

٢٧٠٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عَطَاءٍ ، عَنْ صَفْوَانَ بْنِ يَعْلَى ، عَنْ أَبِيهِ ، أَنَّ رَجُلاً أَتَى

النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَقَدْ أَهَلَّ بِعُمْرَةٍ ، وَعَلَيْهِ مُقَطَّعَاتٌ وَهُوَ مُتَضَمِّخٌ بِخَلُوقٍ ، فَقَالَ : أَهْلَلْتُ بِعُمْرَةٍ فَمَا أَصْنَعُ ؟ فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا كُنْتَ صَانِعًا فِي حَجِّكَ قَالَ : كُنْتُ أَتَّقِي هَذَا ، وَأَغْسِلُهُ ، فَقَالَ : مَا كُنْتَ صَانِعًا فِي حَجِّكَ ، فَاصْنَعْهُ فِي عُمْرَتِكَ.

2709. ...Safvan ibn Yalə atasından ﷺ rəvayət edir ki, bir dəfə ümrə niyyəti ilə ehrama girən bir kişiyinin əynində tikilmiş bir paltar var idi, paltarına isə müxtəlif ətirlər vurmuşdu. O, Peyğəmbərə ﷺ dedi: "Ümrə niyyəti ilə ehrama girmişəm, nə etməliyəm?" Peyğəmbər ﷺ buyurdu: "Həcdə nə etmisənsə onu et". Kişi dedi: "Bu ətirdən çəkinirəm və onu yumaq istəyirəm". Peyğəmbər ﷺ buyurdu: "Həcdə nə etmisənsə ümrədə də onu et".[1]

٢٧١٠– أَخْبَرَنِي مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا أَبِي قَالَ : سَمِعْتُ قَيْسَ بْنَ سَعْدٍ ، يُحَدِّثُ عَنْ عَطَاءٍ ، عَنْ صَفْوَانَ بْنِ يَعْلَى ، عَنْ أَبِيهِ ، قَالَ : أَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلٌ وَهُوَ بِالْجِعِرَّانَةِ ، وَعَلَيْهِ جُبَّةٌ وَهُوَ مُصَفِّرٌ لِحْيَتَهُ وَرَأْسَهُ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، إِنِّي أَحْرَمْتُ بِعُمْرَةٍ وَأَنَا كَمَا تَرَى ؟ فَقَالَ : انْزِعْ عَنْكَ الْجُبَّةَ ، وَاغْسِلْ عَنْكَ الصُّفْرَةَ ، وَمَا كُنْتَ صَانِعًا فِي حَجَّتِكَ ، فَاصْنَعْهُ فِي عُمْرَتِكَ.

2710. ...Safvan ibn Yalə atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Ciranə adlı yerdə olduqda əynində bir cübbə olan, saçını və saqqalını boyamış bir kişi onun yanına gələrək dedi: "Ey Allahın Elçisi, gördüyün bu halda ümrə niyyəti ilə ehrama girmişəm, nə etməliyəm?" Allah Elçisi ﷺ buyurdu: "Cübbəni çıxar, saç və saqqalındakı boyaları yu! Həcdə nə etmisənsə ümrədə də onu et".

### ٤٥– الْكُحْلُ لِلْمُحْرِمِ

### 45-ci fəsil: Ehramlı olanın sürmədən istifadə etməsi

٢٧١١– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ بْنِ مُوسَى ، عَنْ نُبَيْهِ بْنِ وَهْبٍ ، عَنْ أَبَانَ بْنِ عُثْمَانَ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فِي الْمُحْرِمِ إِذَا اشْتَكَى رَأْسَهُ ، وَعَيْنَيْهِ أَنْ يُضَمِّدَهُمَا بِصَبِرٍ.

2711. ...Əban ibn Osman atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ehramlı olan başından və gözündən narahat olsa, ağrıyan yerə "sabir" deyilən ağrıkəsicidən vursun".

---

[1] Yəni ehrama girməzdən qabaq ətir vurmusansa, ümrəni davam et.

## ٤٦ – الْكَرَاهِيَةُ فِي الثِّيَابِ الْمُصَبَّغَةِ لِلْمُحْرِمِ

## 46-cı fəsil: Ehramlı olanın boyanmış paltar geyməsinin bəyənilməməsi

٢٧١٢– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي قَالَ : أَتَيْنَا جَابِرًا فَسَأَلْنَاهُ عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَدَّثَنَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوِ اسْتَقْبَلْتُ مِنْ أَمْرِي ، مَا اسْتَدْبَرْتُ لَمْ أَسُقِ الْهَدْيَ ، وَجَعَلْتُهَا عُمْرَةً ، فَمَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ فَلْيُحْلِلْ ، وَلْيَجْعَلْهَا عُمْرَةً وَقَدِمَ عَلِيٌّ رَضِيَ اللَّهُ عَنْهُ مِنَ الْيَمَنِ بِهَدْيٍ ، وَسَاقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مِنَ الْمَدِينَةِ هَدْيًا وَإِذَا فَاطِمَةُ قَدْ لَبِسَتْ ثِيَابًا صَبِيغًا ، وَاكْتَحَلَتْ قَالَ : فَانْطَلَقْتُ مُحَرِّشًا أَسْتَفْتِي رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ إِنَّ فَاطِمَةَ لَبِسَتْ ثِيَابًا صَبِيغًا ، وَاكْتَحَلَتْ ، وَقَالَتْ : أَمَرَنِي بِهِ أَبِي صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَدَقَتْ ، صَدَقَتْ ، صَدَقَتْ ، أَنَا أَمَرْتُهَا.

2712. ...Cəfər ibn Muhəmməd atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Biz Cabirin yanına gələrək ondan Peyğəmbərin ﷺ həcci haqda ondan soruşduq. O, bizə Allah Elçisinin ﷺ belə buyurduğunu söylədi: “Belə olacağını bilsəydim qurban göndərməz və ümrəyə etmək üçün niyyət edərdim. Kimin yanında qurbanlıq heyvanı yoxdursa, ümrəsini edib ehramdan çıxsın”. Əli Yəməndən qurban gətirmişdi. Allah Elçisi ﷺ onu Mədinədən Məkkəyə göndərmişdi. Bu arada Fatimə rənglənmiş paltarlar geyinib gözünə sürmə çəkmişdi. Fatimənin bu halı Əlinin xoşuna gəlmədi və soruşmaq üçün Allah Elçisinin ﷺ yanına gedərək dedi: “Ey Allahın Elçisi, Fatimə rənglənmiş paltarlar geyinib gözünə sürmə çəkib və “atam belə əmr etdi” deyir”. Peyğəmbər ﷺ buyurdu: “Düz deyir! Düz deyir! Düz deyir! Ona mən əmr etdim”.

## ٤٧ – تَخْمِيرُ الْمُحْرِمِ وَجْهَهُ وَرَأْسَهُ

## 47-ci fəsil: Vəfat edən ehramlı kimsənin üzünün və başının açıq kəfənlənməsi

٢٧١٣– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ أَبَا بِشْرٍ يُحَدِّثُ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَجُلاً وَقَعَ عَنْ رَاحِلَتِهِ ، فَأَقْعَصَتْهُ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ وَسِدْرٍ ، وَيُكَفَّنُ فِي ثَوْبَيْنِ خَارِجًا رَأْسُهُ وَوَجْهُهُ ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا.

2713. ...İbn Abbas ﵄ rəvayət edir ki, bir kişi miniyindən yıxılaraq öldü. Allah Elçisi ﷺ də belə buyurdu: “Onu su və sidr ilə qüsl edin, iki parça ilə kəfənləyin, amma başını və üzünü açıq saxlayın, çünki o, Qiyamət günü təlbiyə deyərək diriləcək”.

٢٧١٤– أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ الصَّفَّارُ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ يَعْنِي الْحَفَرِيَّ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : مَاتَ رَجُلٌ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ ، وَسِدْرٍ ، وَكَفِّنُوهُ فِي ثِيَابِهِ ، وَلاَ تُخَمِّرُوا وَجْهَهُ وَرَأْسَهُ ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا.

2714. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "(Həcdə) bir kişi vəfat etdi. Peyğəmbər ﷺ buyurdu: "Onu su və sidr ilə qüsl edin., üstündəki parça ilə kəfənləyin. Lakin üzünü və başını açıq saxlayın, çünki o, Qiyamət günü təlbiyə deyərək diriləcək".

## ٤٨ – إِفْرَادُ الْحَجِّ
## 48-ci fəsil: İfrad həcci[1]

٢٧١٥– أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، وَإِسْحَقُ بْنُ مَنْصُورٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَفْرَدَ الْحَجَّ.

2715. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ İfrad həcci etmişdir.[2]

٢٧١٦– أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الأَسْوَدِ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : أَهَلَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْحَجِّ.

2716. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ yalnız həcc niyyəti ilə ehrama girdi".

٢٧١٧– أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادٍ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مُوَافِينَ لِهِلاَلِ ذِي الْحِجَّةِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ شَاءَ أَنْ يُهِلَّ بِحَجٍّ فَلْيُهِلَّ ، وَمَنْ شَاءَ أَنْ يُهِلَّ بِعُمْرَةٍ فَلْيُهِلَّ بِعُمْرَةٍ.

2717. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Zil-Hiccə ayının hilalının görünməsinə beş gün qalmış (Zil-Qadə ayının 25-i) yola çıxdıq. Allah Elçisi ﷺ buyurdu: "Həcc etmək istəyən həcc niyyəti ilə, ümrə etmək istəyən ümrə niyyəti ilə ehrama girsin".

---

[1] İfrad həcci edən şəxs ehrama girərkən yalnız həcc üçün niyyət edir və deyir: "Ləbbeykə Alla:hummə həccən". Məkkəyə çatdıqda "qudum" təvafını edir, əgər istəyərsə, həccin səyini də edir yaxud da səyi "tavaful-ifadə"dən sonraya saxlayır və ehramlı halda bayram gününə kimi gözləyir.

[2] Hədiz zəifdir.

٢٧١٨– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ الطَّبَرَانِيُّ أَبُو بَكْرٍ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ حَنْبَلٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، حَدَّثَنِي مَنْصُورٌ ، وَسُلَيْمَانُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ نَرَى إِلاَّ أَنَّهُ الْحَجُّ.

2718. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə yalnız həcc etmək niyyəti ilə yola çıxdıq".

## ٤٩ – الْقِرَانُ

## 49-cu fəsil: Qiran həcci[1]

٢٧١٩– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، قَالَ : قَالَ الصُّبَيُّ بْنُ مَعْبَدٍ : كُنْتُ أَعْرَابِيًّا نَصْرَانِيًّا فَأَسْلَمْتُ ، فَكُنْتُ حَرِيصًا عَلَى الْجِهَادِ ، فَوَجَدْتُ الْحَجَّ وَالْعُمْرَةَ مَكْتُوبَيْنِ عَلَيَّ ، فَأَتَيْتُ رَجُلاً مِنْ عَشِيرَتِي يُقَالُ لَهُ هُرَيْمُ بْنُ عَبْدِ اللهِ فَسَأَلْتُهُ فَقَالَ : اجْمَعْهُمَا ، ثُمَّ اذْبَحْ مَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِ ، فَأَهْلَلْتُ بِهِمَا ، فَلَمَّا أَتَيْتُ الْعُذَيْبَ لَقِيَنِي سَلْمَانُ بْنُ رَبِيعَةَ وَزَيْدُ بْنُ صُوحَانَ ، وَأَنَا أُهِلُّ بِهِمَا ، فَقَالَ أَحَدُهُمَا لِلآخَرِ : مَا هَذَا بِأَفْقَهَ مِنْ بَعِيرِهِ ، فَأَتَيْتُ عُمَرَ فَقُلْتُ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ إِنِّي أَسْلَمْتُ ، وَأَنَا حَرِيصٌ عَلَى الْجِهَادِ ، وَإِنِّي وَجَدْتُ الْحَجَّ وَالْعُمْرَةَ مَكْتُوبَيْنِ عَلَيَّ ، فَأَتَيْتُ هُرَيْمَ بْنَ عَبْدِ اللهِ فَقُلْتُ : يَا هَنَاهْ إِنِّي وَجَدْتُ الْحَجَّ وَالْعُمْرَةَ مَكْتُوبَيْنِ عَلَيَّ ، فَقَالَ : اجْمَعْهُمَا ، ثُمَّ اذْبَحْ مَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِ ، فَأَهْلَلْتُ بِهِمَا ، فَلَمَّا أَتَيْنَا الْعُذَيْبَ لَقِيَنِي سَلْمَانُ بْنُ رَبِيعَةَ وَزَيْدُ بْنُ صُوحَانَ فَقَالَ أَحَدُهُمَا لِلآخَرِ : مَا هَذَا بِأَفْقَهَ مِنْ بَعِيرِهِ ، فَقَالَ عُمَرُ : هُدِيتَ لِسُنَّةِ نَبِيِّكَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2719. ...Rəvayət edilir ki, Əbu Vail ﵁ demişdir: "əs-Subey ibn Məbəd demişdir: "Mən xristian bir bədəvi idim, sonra müsəlman oldum. Cihad etməyə çox meyilli idim. Sonra həcc və ümrənin boynuma vacib olduğunu bildim. Mən bunu tayfamdan olan Hureym ibn Abdullah adlı bir kişidən soruşdum. O da dedi: "Həcc və ümrəni birlikdə et, sonra sənə asan gələn bir qurban kəs". Mən də həcc və ümrə niyəti ilə ehrama girdim. Uzeyb adlı yerə gəldikdə Salman ibn Rabia və Zeyd ibn Suhan ilə rastlaşdım. Onlar mənim həcc və ümrə niyyəti ilə ehrama girdiyimi gördükdə bir-birinə dedilər: "Bunun öz dəvəsi qədər belə anlayışı yoxdur". Bundan sonra mən Ömərin yanına gəlib şikayət edərək dedim: "Ey möminlərin əmiri, mən müsəlman oldum, cihada da çox meyilli insanam. Boynuma həcc və ümrənin vacib olduğunu görən kimi Hureym ibn Abdullahın yanına gəldim və həcc ilə ümrənin boynuma vacib olduğunu ona dedim. O da:

[1] Qiran həcci edən miqatda ehrama girərkən həcc və ümrəyə birgə niyyət edir və: "Ləbbeykə Alla:hummə umratən və həccən". Məkkəyə çatdıqda isə "qudum" təvafını (Kəbəyə gəliş təvafı) edir, əgər istəyərsə, səy edir, istəyərsə də onu "tavaful-ifadə"dən (10-cu gün edilən təvaf) sonraya saxlayır. Saçını isə qısaltmır və ya dibindən qırxdırmır, həmçinin ehramdan da çıxmır. Ehramlı halda bayram gününə kimi gözləyir.

"Həcc və ümrəni birlikdə et, sonra da sənə asan gələn qurban heyvanı kəs"- dedi. Mən həcc və ümrə niyyəti ilə ehrama girdim. Uzeyb adlı yerə gəldikdə Salman ibn Rabia və Zeyd ibn Suhan ilə rastlaşdım. Onlar bir-birinə belə dedilər: "Bunun öz dəvəsi qədər də anlayışı yoxdur". Ömər dedi: "Sən sənin Peyğəmbərinin ﷺ etdiyi kimi etmisən və onun yolundasan".

٢٧٢٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُصْعَبُ بْنُ الْمِقْدَامِ ، عَنْ زَائِدَةَ ، عَنْ مَنْصُورٍ ، عَنْ شَقِيقٍ ، قَالَ : أَنْبَأَنَا الصُّبَيُّ فَذَكَرَ مِثْلَهُ ، قَالَ : فَأَتَيْتُ عُمَرَ فَقَصَصْتُ عَلَيْهِ الْقِصَّةَ إِلاَّ قَوْلَهُ يَا هَنَاهْ.

2720. ...Yuxarıdakı hədisin mətninin oxşarıdır.

٢٧٢١- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، يَعْنِي ابْنَ إِسْحَاقَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ (ح) وَأَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ ، أَخْبَرَنِي حَسَنُ بْنُ مُسْلِمٍ ، عَنْ مُجَاهِدٍ وَغَيْرِهِ ، عَنْ رَجُلٍ مِنْ أَهْلِ الْعِرَاقِ ، يُقَالُ لَهُ : شَقِيقُ بْنُ سَلَمَةَ أَبُو وَائِلٍ أَنَّ رَجُلاً مِنْ بَنِي تَغْلِبَ يُقَالُ لَهُ : الصُّبَيُّ بْنُ مَعْبَدٍ وَكَانَ نَصْرَانِيًّا فَأَسْلَمَ فَأَقْبَلَ فِي أَوَّلِ مَا حَجَّ ، فَلَبَّى بِحَجٍّ وَعُمْرَةٍ جَمِيعًا ، فَهُوَ كَذَلِكَ يُلَبِّي بِهِمَا جَمِيعًا ، فَمَرَّ عَلَى سَلْمَانَ بْنِ رَبِيعَةَ وَزَيْدِ بْنِ صُوحَانَ ، فَقَالَ أَحَدُهُمَا : لأَنْتَ أَضَلُّ مِنْ جَمَلِكَ ، هَذَا فَقَالَ الصُّبَيُّ : فَلَمْ يَزَلْ فِي نَفْسِي حَتَّى لَقِيتُ عُمَرَ بْنَ الْخَطَّابِ فَذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ : هُدِيتَ لِسُنَّةِ نَبِيِّكَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ شَقِيقٌ : وَكُنْتُ أَخْتَلِفُ أَنَا وَمَسْرُوقُ بْنُ الأَجْدَعِ إِلَى الصُّبَيِّ بْنِ مَعْبَدٍ ، نَسْتَذْكِرُهُ فَلَقَدِ اخْتَلَفْنَا إِلَيْهِ مِرَارًا ، أَنَا وَمَسْرُوقُ بْنُ الأَجْدَعِ.

2721. ...Rəvayət edilir ki, Əbu Vail ﵁ demişdir: "Təğlib tayfasından olan əs-Subey ibn Məbəd adlı bir kişi əvvəllər xiristian idi. Sonra o müsəlman oldu və boynuna həcc vacib olmuşdu. Ona görə həcc və ümrə niyəti ilə ehrama girdi. Yolda Salman ibn Rabia və Zeyd ibn Suhan ilə rastlaşdı. Onlardan biri dedi: "Sən yolunu dəvəndən daha çox azmısan". Subey deyir: "Bu söz mənə o qədər pis təsir etdi ki, Ömərin yanına gəlib olanları ona xəbər verdim. Ömər dedi: "Sən sənin Peyğəmbərinin ﷺ yolundasan".

٢٧٢٢- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا عِيسَى وَهُوَ ابْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ مُسْلِمٍ الْبَطِينِ ، عَنْ عَلِيِّ بْنِ حُسَيْنٍ ، عَنْ مَرْوَانَ بْنِ الْحَكَمِ ، قَالَ : كُنْتُ جَالِسًا عِنْدَ عُثْمَانَ فَسَمِعَ عَلِيًّا يُلَبِّي بِعُمْرَةٍ ، وَحَجَّةٍ ، فَقَالَ : أَلَمْ نَكُنْ نُنْهَى عَنْ هَذَا ، قَالَ : بَلَى ، وَلَكِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُلَبِّي بِهِمَا جَمِيعًا ، فَلَمْ أَدَعْ قَوْلَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لِقَوْلِكَ.

2722. ...Rəvayət edilir ki, Mərvan ibn əl-Həkəm ﵁ demişdir: "Bir dəfə mən Osmanın yanında oturmuşdum. O, Əlinin həcc və ümrəni birlikdə etdiyini eşitdi və dedi: "Məgər biz bunu qadağan etməmişdik?" Əli dedi: "Bəli, lakin mən Allah Elçisinin ﷺ bu ikisini birlikdə etdiyini eşitmişəm və sənin əmrinə görə Allah Elçisinin ﷺ sözünü tərk edə bilmərəm".

٢٧٢٣– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا أَبُو عَامِرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، قَالَ : قَالَ سَمِعْتُ عَلِيَّ بْنَ حُسَيْنٍ ، يُحَدِّثُ عَنْ مَرْوَانَ ، أَنَّ عُثْمَانَ نَهَى عَنِ الْمُتْعَةِ ، وَأَنْ يَجْمَعَ الرَّجُلُ بَيْنَ الْحَجِّ وَالْعُمْرَةِ ، فَقَالَ عَلِيٌّ : لَبَّيْكَ بِحَجَّةٍ وَعُمْرَةٍ مَعًا ، فَقَالَ عُثْمَانُ : أَتَفْعَلُهَا ، وَأَنَا أَنْهَى عَنْهَا ، فَقَالَ عَلِيٌّ : لَمْ أَكُنْ لأَدَعَ سُنَّةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَحَدٍ مِنَ النَّاسِ

2723. ...Mərvan ﷺ rəvayət edir ki, Osman təməttu həccini[1] etməyi qadağan etmişdi. Əlinin həcc ilə ümrəni birlikdə etməsi üçün: “Ləbbeyk,[2] həcc və ümrəni birlikdə edirəm” deməsini gördükdə Osman dedi: “Mənim qadağama baxmayaraq sən həcc ilə ümrəni birlikdə edirsən?” Əli dedi: “İnsanlardan birinin əmri ilə Allah Elçisinin ﷺ sünnəsini tərk edə bilmərəm”.

٢٧٢٤– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا النَّضْرُ ، عَنْ شُعْبَةَ بِهَذَا الإِسْنَادِ مِثْلَهُ.

2724. ...Yuxarıdakı hədisin mətni ilə eynidir.

٢٧٢٥– أَخْبَرَنِي مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ مَعِينٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ ، قَالَ : كُنْتُ مَعَ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ حِينَ أَمَّرَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْيَمَنِ ، فَلَمَّا قَدِمَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ عَلِيٌّ : فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كَيْفَ صَنَعْتَ ؟ قُلْتُ : أَهْلَلْتُ بِإِهْلاَلِكَ ، قَالَ : فَإِنِّي سُقْتُ الْهَدْيَ ، وَقَرَنْتُ قَالَ : وَقَالَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَصْحَابِهِ : لَوِ اسْتَقْبَلْتُ مِنْ أَمْرِي ، مَا اسْتَدْبَرْتُ لَفَعَلْتُ كَمَا فَعَلْتُمْ ، وَلَكِنِّي سُقْتُ الْهَدْيَ ، وَقَرَنْتُ.

2725. ...Rəvayət edilir ki, əl-Bəra ﷺ demişdir: “Bir dəfə Allah Elçisi ﷺ Əli ibn Əbu Talibi Yəmənə əmir təyin etdikdə onun yanında idim. Əli Yəməndən Peyğəmbərin ﷺ yanına gəldi. Əli deyir: “Peyğəmbərin ﷺ yanına gəldikdə Allah Elçisi ﷺ buyurdu: “Nə etdin?” Mən də: “Sənin ehrama girdiyin kimi ehrama girdim”. Allah Elçisi ﷺ buyurdu: “Mən qurbanlıq heyvanı göndərdim və qiran həcci etməyə niyyət etdim”. Sonra səhabələrinə dedi: “Əgər işlərin belə olacağını bilsəydim, sizin kimi edərdim, lakin qurbanlıq heyvanı göndərdiyimə görə qiran həcci etməyə niyyət etdim”.

---

[1] Təməttu həccini edən həcc aylarında miqatda ehrama girərkən yalnız ümrə niyyəti ilə “Ləbbeykə Alla:hummə umratən” deyir. Sonra ümrənin təvaf, səy, saçını qısaltmaq və ya saçı dibindən qırxdırmaqla sona çatdırır və ehramdan çıxır. Məkkədə Zil-Hiccənin səkkizinci gününə qədər qalır. Bu gün “tərviyə günü” adlanır. Zil-Hiccənin səkkizinci günü isə həcc üçün niyyət edir, ehrama girir və həcc əməllərini tamamlayır.

[2] Tərcüməsi: Hüzurundayam!

٢٧٢٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنِي حُمَيْدُ بْنُ هِلاَلٍ ، قَالَ : سَمِعْتُ مُطَرِّفًا ، يَقُولُ : قَالَ لِي عِمْرَانُ بْنُ حُصَيْنٍ : جَمَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ حَجٍّ وَعُمْرَةٍ ، ثُمَّ تُوُفِّيَ قَبْلَ أَنْ يَنْهَى عَنْهَا ، وَقَبْلَ أَنْ يَنْزِلَ الْقُرْآنُ بِتَحْرِيمِهِ.

2726. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﵁ demişdir: “Allah Elçisi ﷺ həcc və ümrəni birləşdirdi. Sonra isə bu qaydanı qadağan edən bir Quran ayəsi nazil olmadığı kimi, özü də bunu qadağan etmədən dünyasını dəyişdi”.

٢٧٢٧– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ مُطَرِّفٍ ، عَنْ عِمْرَانَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمَعَ بَيْنَ حَجٍّ وَعُمْرَةٍ ، ثُمَّ لَمْ يَنْزِلْ فِيهَا كِتَابٌ ، وَلَمْ يَنْهَ عَنْهُمَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ فِيهِمَا رَجُلٌ بِرَأْيِهِ مَا شَاءَ.

2727. ...İmran ibn Husayn ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ həcc və ümrəni birləşdirdi. Sonra isə Kitabdan bu qaydanı qadağan edən bir bir şey nazil olmadığı kimi, Peyğəmbər ﷺ də bu qaydanı qadağan etmədi, lakin bir kişi öz istəyinə görə hərəkət etdi.[1]

٢٧٢٨– أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا مُسْلِمُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ وَاسِعٍ ، عَنْ مُطَرِّفِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : قَالَ لِي عِمْرَانُ بْنُ حُصَيْنٍ : تَمَتَّعْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : إِسْمَعِيلُ بْنُ مُسْلِمٍ ثَلاَثَةٌ هَذَا أَحَدُهُمْ لاَ بَأْسَ بِهِ ، وَإِسْمَعِيلُ بْنُ مُسْلِمٍ شَيْخٌ يَرْوِي عَنْ أَبِي الطُّفَيْلِ لاَ بَأْسَ بِهِ ، وَإِسْمَعِيلُ بْنُ مُسْلِمٍ يَرْوِي عَنِ الزُّهْرِيِّ ، وَالْحَسَنُ مَتْرُوكُ الْحَدِيثِ.

2728. ...Rəvayət edilir ki, Mutarrif ibn Abdullah ﵁ demişdir: “İmran ibn Husayn mənə dedi: “Biz Allah Elçisi ﷺ ilə birlikdə təməttu həcci etmişik”.

٢٧٢٩– أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، عَنْ هُشَيْمٍ ، عَنْ يَحْيَى ، وَعَبْدُ الْعَزِيزِ بْنُ صُهَيْبٍ ، وَحُمَيْدٌ الطَّوِيلُ (ح) وَأَنْبَأَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْعَزِيزِ بْنُ صُهَيْبٍ ، وَحُمَيْدٌ الطَّوِيلُ ، وَيَحْيَى بْنُ أَبِي إِسْحَاقَ ، كُلُّهُمْ عَنْ أَنَسٍ ، سَمِعُوهُ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لَبَّيْكَ عُمْرَةً وَحَجًّا ، لَبَّيْكَ عُمْرَةً وَحَجًّا.

2729. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Həcc və ümrəyə niyyət etdim! Həcc və ümrəyə niyyət etdim!”

[1] Burada söhbət Ömər ibn əl-Xattabın ﵁ öz xəlifəliyi dövründə etdiyi qadağadan gedir.

٢٧٣٠– أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي أَسْمَاءَ ، عَنْ أَنَسٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُلَبِّي بِهِمَا.

2730. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ həcc və ümrəyə birlikdə niyyət edərək ehrama girdiyini eşitdim".

٢٧٣١– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ الطَّوِيلُ ، قَالَ : أَنْبَأَنَا بَكْرُ بْنُ عَبْدِ اللهِ الْمُزَنِيُّ ، قَالَ : سَمِعْتُ أَنَسًا ، يُحَدِّثُ قَالَ : سَمِعْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُلَبِّي بِالْعُمْرَةِ وَالْحَجِّ جَمِيعًا ، فَحَدَّثْتُ بِذَلِكَ ابْنَ عُمَرَ فَقَالَ : لَبَّى بِالْحَجِّ وَحْدَهُ ، فَلَقِيتُ أَنَسًا فَحَدَّثْتُهُ ، بِقَوْلِ ابْنِ عُمَرَ فَقَالَ أَنَسٌ : مَا تَعُدُّونَا إِلاَّ صِبْيَانًا ، سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لَبَّيْكَ عُمْرَةً ، وَحَجًّا مَعًا.

2731. ...Rəvayət edilir ki, Abdullah əl-Muzəni ﵀ demişdir: "Mən Ənəsin belə dediyini eşitdim: "Mən Allah Elçisinin ﷺ həcc və ümrəyə birlikdə niyyət edərək ehrama girdiyini eşitmişəm". Bunu İbn Ömərə danışdıqda mənə: "Yalnız həcc niyyəti ilə ehrama gir!" dedi. Sonra Ənəs ilə rastlaşdım və ona İbn Ömərin dediklərini söylədim. Ənəs dedi: "Siz bizi uşaq sayırsınız? Allah Elçinin ﷺ birbaşa özündən: "Ümrə və həccə birlikdə niyyət etdim" dediyini eşitmişəm".

## ٥٠– التَّمَتُّعُ

## 50-ci fəsil: Təməttu həcci

٢٧٣٢– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا حُجَيْنُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا ، قَالَ : تَمَتَّعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ بِالْعُمْرَةِ إِلَى الْحَجِّ ، وَأَهْدَى وَسَاقَ مَعَهُ الْهَدْيَ بِذِي الْحُلَيْفَةِ ، وَبَدَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَهَلَّ بِالْعُمْرَةِ ، ثُمَّ أَهَلَّ بِالْحَجِّ ، وَتَمَتَّعَ النَّاسُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْعُمْرَةِ إِلَى الْحَجِّ ، فَكَانَ مِنَ النَّاسِ مَنْ أَهْدَى فَسَاقَ الْهَدْيَ ، وَمِنْهُمْ مَنْ لَمْ يُهْدِ ، فَلَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ قَالَ لِلنَّاسِ : مَنْ كَانَ مِنْكُمْ أَهْدَى ، فَإِنَّهُ لاَ يَ حِلُّ مِنْ شَيْءٍ حَرُمَ مِنْهُ ، حَتَّى يَقْضِيَ حَجَّهُ ، وَمَنْ لَمْ يَكُنْ أَهْدَى ، فَلْيَطُفْ بِالْبَيْتِ ، وَبِالصَّفَا وَالْمَرْوَةِ وَلْيُقَصِّرْ ، وَلْيَحْلِلْ ، ثُمَّ لِيُهِلَّ بِالْحَجِّ ، ثُمَّ لِيُهْدِ ، وَمَنْ لَمْ يَجِدْ هَدْيًا فَلْيَصُمْ ثَلاَثَةَ أَيَّامٍ فِي الْحَجِّ ، وَسَبْعَةً إِذَا رَجَعَ إِلَى أَهْلِهِ ، فَطَافَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ قَدِمَ مَكَّةَ ، وَاسْتَلَمَ الرُّكْنَ أَوَّلَ شَيْءٍ ، ثُمَّ خَبَّ ثَلاَثَةَ أَطْوَافٍ مِنَ السَّبْعِ ، وَمَشَى أَرْبَعَةَ أَطْوَافٍ ، ثُمَّ رَكَعَ حِينَ قَضَى طَوَافَهُ بِالْبَيْتِ فَصَلَّى عِنْدَ الْمَقَامِ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ فَانْصَرَفَ فَأَتَى الصَّفَا فَطَافَ بِالصَّفَا وَالْمَرْوَةِ سَبْعَةَ أَطْوَافٍ ، ثُمَّ لَمْ يَحِلَّ مِنْ شَيْءٍ حَرُمَ مِنْهُ حَتَّى قَضَى حَجَّهُ وَنَحَرَ هَدْيَهُ يَوْمَ النَّحْرِ ، وَأَفَاضَ فَطَافَ بِالْبَيْتِ ، ثُمَّ حَلَّ مِنْ كُلِّ شَيْءٍ حَرُمَ مِنْهُ ، وَفَعَلَ مِثْلَ مَا فَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَنْ أَهْدَى وَسَاقَ الْهَدْيَ مِنَ النَّاسِ.

2732. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: "Allah Elçisi ﷺ Vida həccində həcc və ümrəyə niyyət edərək təməttu həcci etdi. O özü ilə

qurban kəsəcəyi heyvanı da gətirmişdi. Zul-Huleyfədə ümrə etmək üçün ehrama girdikdən sonra həcc etmək üçün yenidən ehrama girdi. Camaat da Allah Elçisi ﷺ ilə birlikdə həcc və ümrə niyyəti ilə təməttu həcci etdilər. Camaatdan kimisi qurbanlıq gətirmişdi, kimisi də gətirməmişdi. Allah Elçisi ﷺ Məkkəyə gəldikdə camaata belə buyurdu: "İçinizdən kim qurbanını əvvəlcədən gətiribsə, həccini tamamlayana qədər ehramlıya haram olan şeylər ona da haramdır. Kim də qurbanını gətirməyibsə, Kəbəni təvaf etsin, Səfa və Mərva arasında səy etsin, başını qırxdırsın və ehramdan çıxsın, sonra həcc üçün yenidən ehrama girərək qurbanını gətirsin. Kim qurban tapa bilməsə, üç gün həcdə, yeddi gün də ailəsinin yanına qayıdandan sonra oruc tutsun". Allah Elçisi ﷺ Məkkəyə gəlib təvafını etdi. Əvvəlcə Qara daşa toxundu, sonra yeddi təvaf əsnasında ilk üç dövrəni sürətlə, qalan dördünü də adi addımlarla təvaf etdi. Təvafını bitirdikdən sonra İbrahim məqamında iki rükət namaz qıldı. Sonra salam verib Səfa təpəsinə gələrək Səfa və Mərva arasında yeddi səy etdi. Sonra həccini edib qurbanını kəsənə qədər ehramlı olana haram olan şeylərə diqqət etdi. İfadə təvafını edərək ehramdan çıxdı və ehramlıya haram olan şeylar ona halal oldu. Camaatdan əvvəlcədən qurban gətirənlər də Allah Elçisinin ﷺ etdiyi kimi etdilər".[1]

٢٧٣٣- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ حَرْمَلَةَ ، قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ الْمُسَيَّبِ ، يَقُولُ : حَجَّ عَلِيٌّ وَعُثْمَانُ فَلَمَّا كُنَّا بِبَعْضِ الطَّرِيقِ نَهَى عُثْمَانُ عَنِ التَّمَتُّعِ فَقَالَ عَلِيٌّ إِذَا رَأَيْتُمُوهُ قَدْ ارْتَحَلَ فَارْتَحِلُوا فَلَبَّى عَلِيٌّ وَأَصْحَابُهُ بِالْعُمْرَةِ ، فَلَمْ يَنْهَهُمْ عُثْمَانُ فَقَالَ عَلِيٌّ : أَلَمْ أُخْبَرْ أَنَّكَ تَنْهَى عَنِ التَّمَتُّعِ قَالَ : بَلَى ، قَالَ لَهُ عَلِيٌّ : أَلَمْ تَسْمَعْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، تَمَتَّعَ قَالَ : بَلَى.

2733. ...Rəvayət edilir ki, Səid ibn əl-Museyyib رحمه الله demişdir: "Əli və Osman həcc edirdilər. Yolda Osman təməttu həccini qadağan etdi. Əli dedi: "Onun yola düşdüyünü gördüyünüz vaxt siz də yola düşün". Əli və dostları ümrə etmək üçün ehrama girdilər, Osman isə onlara mane olmadı. Əli dedi: "Məgər sən təməttu həccini etməyi qadağan etmədinmi?" Osman dedi: "Bəli". Əli dedi: "Məgər sən Allah Elçisinin ﷺ təməttu həcci etdiyini eşitmədinmi?" Osman dedi: "Eşitmişəm".

[1] Hədisin "Allah Elçisi ﷺ Vida həccində həcc və ümrəyə niyyət edərək təməttu həcci etdi" hissəsi səhih deyil.

٢٧٣٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ اللهِ ابْنِ الْحَارِثِ بْنِ نَوْفَلِ بْنِ الْحَارِثِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ، أَنَّهُ حَدَّثَهُ أَنَّهُ سَمِعَ سَعْدَ بْنَ أَبِي وَقَّاصٍ ، وَالضَّحَّاكَ بْنَ قَيْسٍ ، عَامَ حَجَّ مُعَاوِيَةُ بْنُ أَبِي سُفْيَانَ وَهُمَا يَذْكُرَانِ التَّمَتُّعَ بِالْعُمْرَةِ إِلَى الْحَجِّ فَقَالَ الضَّحَّاكُ : لاَ يَصْنَعُ ذَلِكَ ، إِلاَّ مَنْ جَهِلَ أَمْرَ اللهِ تَعَالَى ؟ فَقَالَ سَعْدٌ : بِئْسَمَا قُلْتَ يَا ابْنَ أَخِي قَالَ الضَّحَّاكُ فَإِنَّ عُمَرَ بْنَ الْخَطَّابِ نَهَى عَنْ ذَلِكَ ، قَالَ سَعْدٌ : قَدْ صَنَعَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَصَنَعْنَاهَا مَعَهُ.

2734. ...Rəvayət edilir ki, Səd ibn Əbu Vaqqas ؓ ilə Dahhaq ibn Qeys Müaviyə ibn Əbu Süfyan ilə həcc etdiyi il təməttu həcci haqda belə deyilir: “Dahhak Sədə dedi: “Həcci bu şəkildə edənlər Uca Allahın əmrlərini bilməyənlərdir”. Səd dedi: “Yaxşı şey demədin, qardaşım oğlu!” Dahhak dedi: “Ömər təməttu həccini qadağan etmişdi”. Səd isə dedi: “Allah Elçisi ﷺ belə etdi, biz də eynisini etmişdik[1]”.[2]

٢٧٣٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ – وَاللَّفْظُ لَهُ – قَالاَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ عُمَارَةَ بْنِ عُمَيْرٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ أَبِي مُوسَى ، عَنْ أَبِي مُوسَى ، أَنَّهُ كَانَ يُفْتِي بِالْمُتْعَةِ ، فَقَالَ لَهُ رَجُلٌ : رُوَيْدَكَ بِبَعْضِ فُتْيَاكَ ، فَإِنَّكَ لاَ تَدْرِي مَا أَحْدَثَ أَمِيرُ الْمُؤْمِنِينَ فِي النُّسُكِ بَعْدُ حَتَّى لَقِيتُهُ فَسَأَلْتُهُ ، فَقَالَ عُمَرُ : قَدْ عَلِمْتُ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ فَعَلَهُ ، وَلَكِنْ كَرِهْتُ أَنْ يَظَلُّوا مُعَرِّسِينَ بِهِنَّ فِي الأَرَاكِ ، ثُمَّ يَرُوحُوا بِالْحَجِّ ، تَقْطُرُ رُؤُوسُهُمْ.

2735. ...Rəvayət edilir ki, Əbu Musa ؓ təməttu həccini etməyə icazə verirdi. Bir kişi ona dedi: “Fətvalarında ehtiyatlı ol! Yəqin ki, möminlərin əmirinin bu haqda yeni əmrini bilmirsən”. Əbu Musa Ömərin yanına gəldikdə Ömər dedi: “Mən Peyğəmbərin ﷺ belə etdiyini bilirəm, lakin Ərak deyilən yerdə kişilərin öz qadınları ilə yaxınlıq etdikdən sonra saçlarından su damcıları axa-axa həcc etmələri xoşuma gəlmir”.

٢٧٣٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ : أَنْبَأَنَا أَبِي ، قَالَ : أَنْبَأَنَا أَبُو حَمْزَةَ ، عَنْ مُطَرِّفٍ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَمِعْتُ عُمَرَ ، يَقُولُ : وَاللَّهِ إِنِّي لأَنْهَاكُمْ عَنِ الْمُتْعَةِ ، وَإِنَّهَا لَفِي كِتَابِ اللهِ وَلَقَدْ فَعَلَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَعْنِي الْعُمْرَةَ فِي الْحَجِّ.

2736. ...Rəvayət edilir ki, İbn Abbas ؓ demişdir: “Mən Ömərin belə dediyini eşitdim: “Vallahi, Allahın Kitabında olmasına və Allah Elçisinin ﷺ etdiyini bilməyimə rəğmən, mən təməttu həccini – ümrə və həcci birlikdə etməyi qadağan etdim”.

---

[1] Ömərin ؓ təməttu həccini qadağan etməsinin səbəbi növbəti hədisdə bildirilmişdir.
[2] Hədisin isnadı zəifdir.

٢٧٣٧- أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ هِشَامِ بْنِ حُجَيْرٍ ، عَنْ طَاوُوسٍ ، قَالَ : قَالَ مُعَاوِيَةُ لاِبْنِ عَبَّاسٍ : أَعَلِمْتَ أَنِّي قَصَّرْتُ مِنْ رَأْسِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِنْدَ الْمَرْوَةِ ؟ قَالَ : لاَ ، يَقُولُ ابْنُ عَبَّاسٍ : هَذَا مُعَاوِيَةُ يَنْهَى النَّاسَ عَنِ الْمُتْعَةِ ، وَقَدْ تَمَتَّعَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2737. ...Rəvayət edilir ki, Tavus ﵀ demişdir: "Müaviyə İbn Abbasa dedi: "Mərva təpəsində Allah Elçisinin ﷺ saçlarını qısaltdığını bilmirsənmi?" O dedi: "Xeyr". İbn Abbas deyərdi: "Bu Müaviyə Peyğəmbərin ﷺ təməttu həccini etdiyinə baxmayaraq, onu qadağan etmişdir".

٢٧٣٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ قَيْسٍ وَهُوَ ابْنُ مُسْلِمٍ ، عَنْ طَارِقِ بْنِ شِهَابٍ ، عَنْ أَبِي مُوسَى ، قَالَ : قَدِمْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ بِالْبَطْحَاءِ فَقَالَ : بِمَا أَهْلَلْتَ ؟ قُلْتُ : أَهْلَلْتُ بِإِهْلاَلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : هَلْ سُقْتَ مِنْ هَدْيٍ ؟ قُلْتُ : لاَ ، قَالَ : فَطُفْ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ حِلَّ فَطُفْتُ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ أَتَيْتُ امْرَأَةً مِنْ قَوْمِي فَمَشَطَتْنِي ، وَغَسَلَتْ رَأْسِي ، فَكُنْتُ أُفْتِي النَّاسَ بِذَلِكَ فِي إِمَارَةِ أَبِي بَكْرٍ ، وَإِمَارَةِ عُمَرَ ، وَإِنِّي لَقَائِمٌ بِالْمَوْسِمِ إِذْ جَاءَنِي رَجُلٌ فَقَالَ : إِنَّكَ لاَ تَدْرِي مَا أَحْدَثَ أَمِيرُ الْمُؤْمِنِينَ فِي شَأْنِ النُّسُكِ ، قُلْتُ : يَا أَيُّهَا النَّاسُ مَنْ كُنَّا أَفْتَيْنَاهُ بِشَيْءٍ فَلْيَتَّئِدْ ، فَإِنَّ أَمِيرَ الْمُؤْمِنِينَ قَادِمٌ عَلَيْكُمْ ، فَأْتَمُّوا بِهِ فَلَمَّا قَدِمَ قُلْتُ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ مَا هَذَا الَّذِي أَحْدَثْتَ فِي شَأْنِ النُّسُكِ ؟ قَالَ : إِنْ نَأْخُذْ بِكِتَابِ اللهِ عَزَّ وَجَلَّ ، فَإِنَّ اللهَ عَزَّ وَجَلَّ قَالَ : **{وَأَتِمُّوا الْحَجَّ وَالْعُمْرَةَ لِلَّهِ}** وَإِنْ نَأْخُذْ بِسُنَّةِ نَبِيِّنَا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَإِنَّ نَبِيَّنَا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمْ يَحِلَّ حَتَّى نَحَرَ الْهَدْيَ.

2738. ...Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: "Allah Elçisi ﷺ əl-Bətha deyilən yerdə olanda mən onun yanına gəldim. O mənə dedi: "Sən ehrama necə girdin?" Mən dedim: "Peyğəmbərin ﷺ girdiyi kimi". Peyğəmbər ﷺ dedi: "Özünlə qurban gətirmisən?" Mən: "Xeyr" dedim. O dedi: "Elə isə Kəbəni təvaf et, Səfa və Mərva arasında səy et, sonra da ehramdan çıx!" Mən də Kəbəni təvaf edib, Səfa və Mərva arasında səy etdikdən sonra tayfamızdan bir qadının yanına gəldim, o da saçlarımı düzəldib daradıqdan sonra başımı yudu. Sonralar Əbu Bəkr və Ömərin əmir olduqları dövrdə insanlara bu haqda Peyğəmbərdən ﷺ eşitdiyimə uyğun fətva verirdim. Bir dəfə həcc mövsümündə bir kişi yanıma gəlib mənə dedi: "Yəqin ki, möminlərin əmirinin həccə aid yeni əmrini bilmirsən". Mən də insanlara dedim: "Ey insanlar, mənim həccə aid dediklərimi etməkdə tələsməyin. Möminlərin əmiri gəldikdə onun dediyini edin!" Xəlifə gəldikdə dedim: "Ey möminlərin əmiri, həcc mövzusuna dair yeni əmriniz nədir?" Ömər dedi: "Əgər Allahın Kitabına baxsaq, orada Allah **"Allah üçün həcc və ümrəni tam yerinə yetirin..."** (əl-Bəqərə, 196) buyurur. Peyğəmbərin ﷺ sünnəsinə baxdıqda Peyğəmbər ﷺ buyurur:

“Ehramda olan insan Qurban kəsilənə qədər ona haram olan heç nəyi etmir”.

٢٧٣٩– أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ حَدَّثَنَا عُثْمَانُ بْنُ عُمَرَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ مُسْلِمٍ ، عَنْ مُحَمَّدِ بْنِ وَاسِعٍ ، عَنْ مُطَرِّفٍ ، قَالَ : قَالَ لِي عِمْرَانُ بْنُ حُصَيْنٍ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ تَمَتَّعَ وَتَمَتَّعْنَا مَعَهُ قَالَ فِيهَا قَائِلٌ بِرَأْيِهِ.

2739. ...Rəvayət edilir ki, Mutarrif ﵀ demişdir: “İmran ibn Husayn mənə dedi: “Allah Elçisi ﷺ təməttu həcci etdikdə biz onunla birlikdə təməttu həcci etmişdik. Ancaq bir adam var ki, ictihad edərək öz rəyi ilə hərəkət edir”.

### ٥١– تَرْكُ التَّسْمِيَةِ عِنْدَ الإِهْلاَلِ

### 51-ci fəsil: Ehrama girərkən “bəsmələ”ni[1] tərk etmək

٢٧٤٠– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ فَسَأَلْنَاهُ عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَدَّثَنَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَكَثَ بِالْمَدِينَةِ تِسْعَ حِجَجٍ ، ثُمَّ أُذِّنَ فِي النَّاسِ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَاجٍّ هَذَا الْعَامِ فَنَزَلَ الْمَدِينَةَ بَشَرٌ كَثِيرٌ كُلُّهُمْ يَلْتَمِسُ أَنْ يَأْتَمَّ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَيَفْعَلُ مَا يَفْعَلُ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لِخَمْسٍ بَقِينَ مِنْ ذِي الْقِعْدَةِ ، وَخَرَجْنَا مَعَهُ ، قَالَ جَابِرٌ : وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ أَظْهُرِنَا عَلَيْهِ ، يَنْزِلُ الْقُرْآنُ وَهُوَ يَعْرِفُ تَأْوِيلَهُ ، وَمَا عَمِلَ بِهِ مِنْ شَيْءٍ عَمِلْنَا ، فَخَرَجْنَا لاَ نَنْوِي إِلاَّ الْحَجَّ.

2740. ...Rəvayət edilir ki, Cəfər ibn Muhəmməd ﵀ demişdir: “Atam deyir ki, biz Cabir ibn Abdullahın yanına getdik və ona Peyğəmbərin ﷺ həcci haqda sual verdik. Cabir bizə danışdı ki, Allah Elçisi ﷺ Mədinədə doqquz il qaldıqdan sonra insanlara bu il həccə gedəcəyini elan etdirdi. Ona görə də Peyğəmbərlə ﷺ birlikdə həccə getmək üçün ətrafdan bir çox insan Mədinəyə gəlmişdi. Onlar Allah Elçisinin ﷺ etdiyini edəcəkdilər. Allah Elçisi ﷺ Zil-Qadə ayının sona çatmasına beş gün qalmış yola çıxdı. Biz də onunla birlikdə yola çıxdıq”. Cabir deyir: “Allah Elçisi ﷺ bizim aramızda ikən ona Quran nazil edilir, o da onu bizə izah edirdi. O nə edirdisə, biz də eynisini edirdik. Yola çıxarkən də niyyətimiz yalnız həcc etmək idi”.

٢٧٤١– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ – وَاللَّفْظُ لِمُحَمَّدٍ – قَالاَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا لاَ نَنْوِي إِلاَّ الْحَجَّ فَلَمَّا ، كُنَّا بِسَرِفَ حِضْتُ ، فَدَخَلَ عَلَيَّ

[1] “Bəsmələ” “Bismilləhir-Rahmənir-Rahim” (“Mərhəmətli və Rəhmli Allahın adı ilə”) sözünün qısaldılmış formasıdır.

رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَنَا أَبْكِي فَقَالَ : أَحِضْتِ قُلْتُ : نَعَمْ ، قَالَ : إِنَّ هَذَا شَيْءٌ كَتَبَهُ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى بَنَاتِ آدَمَ ، فَاقْضِي مَا يَقْضِي الْمُحْرِمُ ، غَيْرَ أَنْ لاَ تَطُوفِي بِالْبَيْتِ.

2741. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Biz yalnız həcc etmək niyyəti ilə çıxdıq və Sərif[1] deyilən yerə çatdıqda mən heyz oldum. Mən ağlayarkən Allah Elçisi ﷺ mənim yanıma gəldi və dedi: "Heyzmi oldun?" Mən də: "Bəli" dedim. O buyurdu: "Bu, Allahın ﷻ Adəm qızları üçün əzəldən müəyyən etdiyi bir işdir. Buna görə də sən, Evi (Kəbəni) təvaf etməkdən başqa hacıların yerinə yetirdiyini (həcc əməllərinin hamısını) yerinə yetir".

٥٢- الْحَجُّ بِغَيْرِ نِيَّةٍ يَقْصِدُهُ الْمُحْرِمُ

## 52-ci fəsil: Ehramlının niyyəti dilinə gətirmədən həcc etməsi

٢٧٤٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي قَيْسُ بْنُ مُسْلِمٍ ، قَالَ : سَمِعْتُ طَارِقَ بْنَ شِهَابٍ ، قَالَ : قَالَ أَبُو مُوسَى : أَقْبَلْتُ مِنَ الْيَمَنِ وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُنِيخٌ بِالْبَطْحَاءِ حَيْثُ حَجَّ ، فَقَالَ : أَحَجَجْتَ ؟ قُلْتُ : نَعَمْ ، قَالَ : كَيْفَ قُلْتَ ؟ قَالَ : قُلْتُ لَبَّيْكَ بِإِهْلاَلٍ كَإِهْلاَلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : فَطُفْ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ ، وَأَحِلَّ فَفَعَلْتُ ثُمَّ أَتَيْتُ امْرَأَةً فَفَلَتْ رَأْسِي ، فَجَعَلْتُ أُفْتِي النَّاسَ بِذَلِكَ ، حَتَّى كَانَ فِي خِلاَفَةِ عُمَرَ ، فَقَالَ لَهُ رَجُلٌ : يَا أَبَا مُوسَى رُوَيْدَكَ بَعْضَ فُتْيَاكَ فَإِنَّكَ لاَ تَدْرِي مَا أَحْدَثَ أَمِيرُ الْمُؤْمِنِينَ فِي النُّسُكِ بَعْدَكَ ، قَالَ أَبُو مُوسَى : يَا أَيُّهَا النَّاسُ مَنْ كُنَّا أَفْتَيْنَاهُ فَلْيَتَّئِدْ ، فَإِنَّ أَمِيرَ الْمُؤْمِنِينَ قَادِمٌ عَلَيْكُمْ ، فَأْتَمُّوا بِهِ ، وَقَالَ عُمَرُ : إِنْ نَأْخُذْ بِكِتَابِ اللهِ فَإِنَّهُ يَأْمُرُنَا بِالتَّمَامِ ، وَإِنْ نَأْخُذْ بِسُنَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَإِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لَمْ يَحِلَّ حَتَّى بَلَغَ الْهَدْيُ مَحِلَّهُ.

2742. ...Rəvayət edilir ki, Əbu Musa رضي الله عنه demişdir: "Yəməndən təzə gəlmişdim. Allah Elçisi ﷺ isə həcc etmək üçün yola çıxıb əl-Bətha deyilən yerdə idi və mənə dedi: "Həcc üçün niyyət etmisənmi?" Mən: "Bəli" dedim. O dedi: "(Niyyət etdikdə) nə dedin?" Mən dedim: "Peyğəmbər ﷺ nə üçün ehrama giribsə, mən də onun üçün ehrama girib niyyət etdim". Peyğəmbər ﷺ buyurdu: "Kəbəni təvaf et, Səfa və Mərva arasında səy et və ehramdan çıx!" Onun dediklərini etdim, qadınımın yanına gəldim, saçımı daradı. Ömərin xəlifəliyi dövrünə qədər insanlara həcc ilə əlaqəli suallara bu şəkildə fətva verirdim. Bir kişi mənə dedi: "Ey Əbu Musa, ehtiyatlı ol! Yəqin ki, möminlərin əmirinin həccə aid yeni əmrini bilmirsən". Mən də insanlara dedim: "Ey insanlar, mənim həccə aid dediklərimi etməkdə tələsməyin. Möminlərin əmiri gəldikdə onun dediyini edin!" Xəlifə gəldikdə dedim: "Ey möminlərin əmiri, həcc mövzusuna dair yeni əmriniz

[1] Sərif - Məkkənin on bir kilometrliyində yerləşən yerin adıdır.

nədir?" Ömər gəldikdə dedi: "Əgər Allahın Kitabına baxsaq, orada Allah **"Allah üçün həcc və ümrəni tam yerinə yetirin..."** (əl-Bəqərə, 196) buyurur. Peyğəmbərin ﷺ sünnəsinə baxdıqda Peyğəmbər ﷺ buyurur: "Qurban kəsilənə qədər ehramlı ehramdan çıxmırdı".

٢٧٤٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ فَسَأَلْنَاهُ عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَدَّثَنَا أَنَّ عَلِيًّا قَدِمَ مِنَ الْيَمَنِ بِهَدْيٍ ، وَسَاقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ هَدْيًا ، قَالَ لِعَلِيٍّ : بِمَا أَهْلَلْتَ ؟ قَالَ : قُلْتُ اللَّهُمَّ إِنِّي أُهِلُّ بِمَا أَهَلَّ بِهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَمَعِيَ الْهَدْيُ ، قَالَ : فَلاَ تَحِلَّ.

2743. ...Rəvayət edilir ki, Cəfər ibn Muhəmməd رحمه الله demişdir: "Atam deyir ki, biz Cabir ibn Abdullahın yanına getdik və ona Peyğəmbərin ﷺ həcci haqda sual verdik. Cabir bizə danışdı ki, Əli Yəməndən qurbanlıq bir heyvan gətirmişdi. Allah Elçisi ﷺ onu Mədinədən qurbanlıq kimi göndərdi. Bu arada Peyğəmbər ﷺ Əliyə dedi: "Ehrama necə girdin?" Əli dedi: "Allahım, Allah Elçisi ﷺ ehrama hansı niyyətlə girdisə, mən də o niyyətlə girdim" dedim, yanımda da qurbanım var". Peyğəmbər ﷺ buyurdu: "Elə isə ehramdan çıxma!"

٢٧٤٤- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : عَطَاءٌ ، قَالَ جَابِرٌ : قَدِمَ عَلِيٌّ مِنْ سِعَايَتِهِ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بِمَا أَهْلَلْتَ يَا عَلِيُّ ؟ قَالَ : بِمَا أَهَلَّ بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : فَاهْدِ ، وَامْكُثْ حَرَامًا كَمَا أَنْتَ قَالَ : وَأَهْدَى عَلِيٌّ لَهُ هَدْيًا.

2744. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Əli zəkat yığmaq işindən qayıtmışdı. Peyğəmbər ﷺ ona dedi: "Ehrama hansı niyyətlə girdin, ey Əli?" Əli dedi: "Peyğəmbər ﷺ ehrama girdiyi niyyətlə ehrama girdim". Peyğəmbər ﷺ buyurdu: "Elə isə qurbanı göndər və ehramlı olan vəziyyətdə qal". Əli də qurbanını göndərdi".

٢٧٤٥- أَخْبَرَنِي أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ مَعِينٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ قَالَ : كُنْتُ مَعَ عَلِيٍّ حِينَ أَمَّرَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْيَمَنِ فَأَصَبْتُ مَعَهُ أَوَاقِيَ ، فَلَمَّا قَدِمَ عَلِيٌّ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ عَلِيٌّ وَجَدْتُ فَاطِمَةَ قَدْ نَضَحَتِ الْبَيْتَ بِنَضُوحٍ قَالَ فَتَخَطَّيْتُهُ فَقَالَتْ لِي مَا لَكَ فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ أَمَرَ أَصْحَابَهُ فَأَحَلُّوا قَالَ قُلْتُ اِنِّي أَهْلَلْتُ بِإِهْلاَلِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ ، فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ لِي كَيْفَ صَنَعْتَ قُلْتُ إِنِّي أَهْلَلْتُ بِمَا أَهْلَلْتَ قَالَ : فَإِنِّي قَدْ سُقْتُ الْهَدْىَ وَقَرَنْتُ.

2745. ...Rəvayət edilir ki, əl-Bəra ؓ demişdir: “Peyğəmbər ﷺ Əlini Yəmənə əmir təyin etdiyi vaxt mən də Əlinin yanında idim. Ondan sonra mal-dövlətim çoxaldı. Əli Yəməndən Peyğəmbərin ﷺ yanına qayıtdı. Əli deyir: “Evə gəlib gördüm ki, Fatimə evin bütün künclərinə ətir vurub. Onun üstünə getdim. Fatimə dedi: “Sənə nə olub? Allah Elçisi ﷺ səhabələrinə belə etməyi əmr etdi. Onlar da ehramdan çıxıb belə etdilər”. Mən də: “Peyğəmbərin ﷺ niyyət etdiyinə niyyət edib ehrama girdim” deyib Peyğəmbərin ﷺ yanına gəldim. Peyğəmbər ﷺ mənə dedi: “Necə niyyət edərək ehrama girdin?” Mən dedim: “Sən nəyə niyyət etdinsə, mən də eyni cür niyyət etdim”. Peyğəmbər ﷺ buyurdu: “Elə isə mən qurban göndərdim və Qiran həccinə niyyət etdim”.

## ٥٣ – إِذَا أَهَلَّ بِعُمْرَةٍ هَلْ يَجْعَلُ مَعَهَا حَجًّا

## 53-cü fəsil: Ümrəyə niyyət edərək ehrama girən şəxs həcc edə bilərmi?

٢٧٤٦ – أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، أَنَّ ابْنَ عُمَرَ ، أَرَادَ الْحَجَّ عَامَ نَزَلَ الْحَجَّاجُ ، بِابْنِ الزُّبَيْرِ فَقِيلَ لَهُ : إِنَّهُ كَائِنٌ بَيْنَهُمْ قِتَالٌ ، وَأَنَا أَخَافُ أَنْ يَصُدُّوكَ ، قَالَ : لَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللهِ ، أُسْوَةٌ حَسَنَةٌ ، إِذًا أَصْنَعُ كَمَا صَنَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِنِّي أُشْهِدُكُمْ أَنِّي قَدْ أَوْجَبْتُ عُمْرَةً ثُمَّ خَرَجَ حَتَّى إِذَا كَانَ بِظَاهِرِ الْبَيْدَاءِ ، قَالَ : مَا شَأْنُ الْحَجِّ وَالْعُمْرَةِ إِلاَّ وَاحِدٌ أُشْهِدُكُمْ أَنِّي قَدْ أَوْجَبْتُ حَجًّا مَعَ عُمْرَتِي وَأَهْدَى هَدْيًا اشْتَرَاهُ بِقُدَيْدٍ ، ثُمَّ انْطَلَقَ يُهِلُّ بِهِمَا جَمِيعًا حَتَّى قَدِمَ مَكَّةَ فَطَافَ بِالْبَيْتِ ، وَبِالصَّفَا وَالْمَرْوَةِ ، وَلَمْ يَزِدْ عَلَى ذَلِكَ ، وَلَمْ يَنْحَرْ ، وَلَمْ يَحْلِقْ ، وَلَمْ يُقَصِّرْ ، وَلَمْ يَحِلَّ مِنْ شَيْءٍ حَرُمَ مِنْهُ حَتَّى كَانَ يَوْمُ النَّحْرِ فَنَحَرَ ، وَحَلَقَ فَرَأَى أَنْ قَدْ قَضَى طَوَافَ الْحَجِّ وَالْعُمْرَةِ بِطَوَافِهِ الأَوَّلِ ، وَقَالَ ابْنُ عُمَرَ : كَذَلِكَ فَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2746. ...Nafi ؒ rəvayət edir ki, Həccacın Məkkədə İbn əz-Zubeyri mühasirədə saxladığı vaxt İbn Ömər həcc etmək istədi. Mən də ona dedim: “Orada onların arasında döyüş gedir, ona görə sənin həcc etməyinə mane olacaqlarından qorxuram”. O dedi: “Allahın Elçisində sizin üçün gözəl nümunə var. O, nə edibsə, biz də onu edəcəyik. Mən ümrə edəcəyimə sizi şahid tuturam”. Sonra yola düşdü. əl-Beyda deyilən tərəfə gəldikdə: “Həcc də ümrə də eyni şeydir. Ona görə həcc ilə ümrəni birlikdə edəcəyəm” dedi və Qudeyddən aldığı qurbanı Məkkəyə göndərdi. Özü isə ümrə və həcc etmək üçün ehrama girib yola düşdü. Məkkəyə gəldikdə Kəbəni təvaf etdi, Səfa və Mərva arasında səy etdikdən sonra başqa heç nə etmədi. Nə qurban kəsdi, nə saçını qırxdı, nə də saçını qısaltdı. Bayram gününə qədər ehramlı olana haram olan heç nəyi etmədi. Bayram günü isə qurbanını kəsdi, başını qırxdırdı, həcc və ümrə təvafını bir dəfədə etdi. Sonra İbn Ömər dedi: “Allah Elçisi ﷺ belə etmişdir”.

٥٤– كَيْفَ التَّلْبِيَةُ

## 54-cü fəsil: Təlbiyə necə deyilir?

٢٧٤٧– أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : إِنَّ سَالِمًا ، أَخْبَرَنِي أَنَّ أَبَاهُ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُهِلُّ يَقُولُ : لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ ، لاَ شَرِيكَ لَكَ وَإِنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ كَانَ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَرْكَعُ بِذِي الْحُلَيْفَةِ رَكْعَتَيْنِ ، ثُمَّ إِذَا اسْتَوَتْ بِهِ النَّاقَةُ قَائِمَةً عِنْدَ مَسْجِدِ ذِي الْحُلَيْفَةِ ، أَهَلَّ بِهَؤُلاَءِ الْكَلِمَاتِ.

2747. ...Səlim ﷺ rəvayət edir ki, atası (İbn Ömər) demişdir: "Mən Allah Elçisinin ﷺ ehrama girərkən belə dediyini eşitdim: "Ləbbeyk, Alla:hummə ləbbeyk! Ləbbeyk lə: şəri:kə ləkə ləbbeyk! İnnəl-həmdə van-ni'mətə ləkə val-mulkə, lə: şəri:kə lək!"[1] Abdullah ibn Ömər belə deyərdi: "Allah Elçisi ﷺ Zul-Huleyfədə iki rükət namaz qıldı. Sonra dəvəsinin üstündə Zul-Huleyfə məscidinin yanında yuxarıda qeyd edilən kəlmələri deyərək ehrama girdi".

٢٧٤٨– أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ زَيْدًا ، وَأَبَا بَكْرٍ ابْنَيْ مُحَمَّدِ بْنِ زَيْدٍ أَنَّهُمَا ، سَمِعَا نَافِعًا ، يُحَدِّثُ عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ كَانَ يَقُولُ : لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ ، لاَ شَرِيكَ لَكَ.

2748. ...Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə deyirdi: "Ləbbeyk, Alla:hummə ləbbeyk! Ləbbeyk lə: şəri:kə ləkə ləbbeyk! İnnəl-həmdə van-ni'mətə ləkə val-mulkə, lə: şəri:kə lək!"

٢٧٤٩– أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، قَالَ : تَلْبِيَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ لَبَّيْكَ ، لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ ، لاَ شَرِيكَ لَكَ.

2749. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ təlbiyəni belə dedi: "Ləbbeyk, Alla:hummə ləbbeyk! Ləbbeyk lə: şəri:kə ləkə ləbbeyk! İnnəl-həmdə van-ni'mətə ləkə val-mulkə, lə: şəri:kə lək!"

٢٧٥٠– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا أَبُو بِشْرٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ ، قَالَ : كَانَتْ تَلْبِيَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ وَالْمُلْكَ ، لاَ شَرِيكَ لَكَ وَزَادَ فِيهِ ابْنُ عُمَرَ : لَبَّيْكَ لَبَّيْكَ وَسَعْدَيْكَ ، وَالْخَيْرُ فِي يَدَيْكَ ، وَالرَّغْبَاءُ إِلَيْكَ ، وَالْعَمَلُ.

---

[1] Tərcüməsi: Hüzurundayam, Allahım hüzurundayam! Hüzurundayam, Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir! Nemət və mülk Sənə məxsusdur! Sənin şərikin yoxdur!

2750. Ubeydullah ibn Abdullah ibn Ömər atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisinin ﷺ təlbiyə deməsi belə idi: "Ləbbeyk, Alla:hummə ləbbeyk. Ləbbeyk lə: şəri:kə ləkə ləbbeyk, innəl-həmdə van-nimətə ləkə val-mulkə, lə: şəri:kə lək!" İbn Ömər bu əlavəni etmişdir: "Ləbbeyk, ləbbeyk, va səadeyk, val-xayru fi: yədeyk, var-rağbə:u ileyk, val-aməl!"[1]

٢٧٥١- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ أَبَانَ بْنِ تَغْلِبَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، قَالَ : كَانَ مِنْ تَلْبِيَةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، لَبَّيْكَ لاَ شَرِيكَ لَكَ لَبَّيْكَ ، إِنَّ الْحَمْدَ وَالنِّعْمَةَ لَكَ.

2751. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Peyğəmbərin ﷺ təlbiyə deməsi belə idi: "Ləbbeyk, Alla:hummə ləbbeyk! Ləbbeyk lə: şəri:kə ləkə ləbbeyk, innəl-həmdə van-nimətə ləkə!"

٢٧٥٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْفَضْلِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : كَانَ مِنْ تَلْبِيَةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لَبَّيْكَ إِلَهَ الْحَقِّ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ أَعْلَمُ أَحَدًا أَسْنَدَ هَذَا ، عَنْ عَبْدِ اللهِ بْنِ الْفَضْلِ ، إِلاَّ عَبْدَ الْعَزِيزِ ، رَوَاهُ إِسْمَعِيلُ بْنُ أُمَيَّةَ عَنْهُ مُرْسَلاً.

2752. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Peyğəmbərin ﷺ təlbiyə deməsi belə idi: "Ləbbeyk, ilə:həl-haqq!"[2]

## ٥٥- رَفْعُ الصَّوْتِ بِالإِهْلاَلِ

## 55-ci fəsil: Təlbiyəni uca səslə demək

٢٧٥٣- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ خَلاَّدِ بْنِ السَّائِبِ ، عَنْ أَبِيهِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : جَاءَنِي جِبْرِيلُ فَقَالَ لِي : يَا مُحَمَّدُ مُرْ أَصْحَابَكَ أَنْ يَرْفَعُوا أَصْوَاتَهُمْ بِالتَّلْبِيَةِ.

2753. ...Xalləd ibn əs-Səib atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Cəbrail mənim yanıma gəldi və dedi: "Ey Muhəmməd, səhabələrinə əmr et ki, təlbiyəni uca səslə desinlər".

---

[1] Tərcüməsi: Hüzurundayam, hüzurundayam, əmrinə müntəzirəm! Xeyir bütünlüklə Sənin iki Əlindədir! Ümid və əməl Sənin üçündür!

[2] Tərcüməsi: Hüzurundayam, (ey) Haqq olan İlah!

٥٦- الْعَمَلُ فِي الإِهْلاَلِ

## 56-cı fəsil: Ehrama girdikdə edilən əməl

٢٧٥٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ السَّلاَمِ ، عَنْ خُصَيْفٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَهَلَّ فِي دُبُرِ الصَّلاَةِ.

2754. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namazdan sonra ehrama girdi.[1]

٢٧٥٥- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، أَنْبَأَنَا النَّضْرُ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَنَسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى الظُّهْرَ بِالْبَيْدَاءِ ثُمَّ رَكِبَ ، وَصَعِدَ جَبَلَ الْبَيْدَاءِ ، وَأَهَلَّ بِالْحَجِّ وَالْعُمْرَةِ حِينَ صَلَّى الظُّهْرَ.

2755. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ "əl-Beyda" adlı yerdə Zöhr namazını qıldı, miniyinə minib əl-Beyda dağına qalxdı. Zöhr namazını qıldıqdan sonra həcc və ümrə niyyəti ilə ehrama girdi".[2]

٢٧٥٦- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، قَالَ : أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، قَالَ : سَمِعْتُ جَعْفَرَ بْنَ مُحَمَّدٍ يُحَدِّثُ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ فِي حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا أَتَى ذَا الْحُلَيْفَةِ ، صَلَّى وَهُوَ صَامِتٌ حَتَّى أَتَى الْبَيْدَاءَ.

2756. ...Rəvayət edilir ki, Cabir ﷺ Peyğəmbərin ﷺ həcci haqda dedi ki, Peyğəmbər ﷺ Zul-Huleyfəyə gəldikdə namaz qıldı. əl-Beyda deyilən yerə gələnə qədər də susdu.

٢٧٥٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ حَاتِمِ بْنِ إِسْمَاعِيلَ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ سَالِمٍ ، أَنَّهُ سَمِعَ أَبَاهُ ، يَقُولُ : بَيْدَاؤُكُمْ هَذِهِ الَّتِي تَكْذِبُونَ فِيهَا عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَا أَهَلَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِلاَّ مِنْ مَسْجِدِ ذِي الْحُلَيْفَةِ.

2757. ...Rəvayət edilir ki, Səlim atasının ﷺ belə dediyini eşitmişdir: "Beyda adlı yerdə olan halınızla Allah Elçisini ﷺ inkar edirsiniz. Allah Elçisi ﷺ Zul-Huleyfə məscidindən başqa heç yerdə ehrama girmədi".

٢٧٥٨- أَخْبَرَنِي عِيسَى بْنُ إِبْرَاهِيمَ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ سَالِمَ بْنَ عَبْدِ اللهِ أَخْبَرَهُ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَرْكَبُ رَاحِلَتَهُ بِذِي الْحُلَيْفَةِ ثُمَّ يُهِلُّ ، حِينَ تَسْتَوِي بِهِ قَائِمَةً.

2758. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Mən Allah

---

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

Elçisini ﷺ Zul-Huleyfədə miniyinə minərkən gördüm. Miniyə qalxarkən təlbiyə gətirməyə başladı".

٢٧٥٩- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي صَالِحُ بْنُ كَيْسَانَ (ح) وَأَخْبَرَنِي مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ ، يَعْنِي ابْنَ يُوسُفَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ صَالِحِ بْنِ كَيْسَانَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّهُ كَانَ يُخْبِرُ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَهَلَّ حِينَ اسْتَوَتْ بِهِ رَاحِلَتُهُ.

2759. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ miniyinə minərkən təlbiyə gətirməyə başlayardı.

٢٧٦٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ عُبَيْدِ اللهِ ، وَابْنِ جُرَيْجٍ ، وَابْنِ إِسْحَاقَ ، وَمَالِكِ بْنُ أَنَسٍ ، عَنِ الْمَقْبُرِيِّ ، عَنْ عُبَيْدِ بْنِ جُرَيْجٍ ، قَالَ : قُلْتُ لِابْنِ عُمَرَ : رَأَيْتُكَ تُهِلُّ إِذَا اسْتَوَتْ بِكَ نَاقَتُكَ ، قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُهِلُّ إِذَا اسْتَوَتْ بِهِ نَاقَتُهُ وَانْبَعَثَتْ.

2760. ...Rəvayət edilir ki, Ubeyd ibn Cureyc ﷺ demişdir: "Mən İbn Ömərə dedim: "Dəvənin səni qaldırıb apararkən təlbiyə gətirdiyini gördüm". İbn Ömər dedi: "Mən də Allah Elçisinin ﷺ dəvə dikəlib yola düşdükdə təlbiyə gətirdiyini görmüşəm".

## ٥٧- إِهْلاَلُ النُّفَسَاءِ

## 57-ci fəsil: Nifaslı qadınların ehrama girməsi

٢٧٦١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، أَنْبَأَنَا اللَّيْثُ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : أَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تِسْعَ سِنِينَ ، لَمْ يَحُجَّ ، ثُمَّ أَذَّنَ فِي النَّاسِ بِالْحَجِّ ، فَلَمْ يَبْقَ أَحَدٌ يَقْدِرُ أَنْ يَأْتِيَ رَاكِبًا ، أَوْ رَاجِلاً إِلاَّ قَدِمَ ، فَتَدَارَكَ النَّاسُ لِيَخْرُجُوا مَعَهُ حَتَّى جَاءَ ذَا الْحُلَيْفَةِ فَوَلَدَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ ، فَأَرْسَلَتْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : اغْتَسِلِي ، وَاسْتَثْفِرِي بِثَوْبٍ ، ثُمَّ أَهِلِّي فَفَعَلَتْ مُخْتَصَرٌ.

2761. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Allah Elçisi ﷺ doqquz il həcc etməmişdi. Sonra insanlara həcc edəcəyini bildirdi. Minikli və piyada getməyə gücü çatan hər kəs Allah Elçisi ﷺ ilə birlikdə həcc etmək üçün Mədinəyə axışıb Allah Elçisi ﷺ ilə yola çıxdılar. Onlar Zul-Huleyfəyə çatdıqda Əsma bint Umeys Muhəmməd ibn Əbu Bəkri dünyaya gətirdi. Əsma Allah Elçisinə ﷺ xəbər göndərdikdə Allah Elçisi ﷺ buyurdu: "Qüsl al, bir bez parçadan istifadə et və ehrama gir!" Əsma da onun dediyini etdi".

٢٧٦٢– أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ رَضِيَ اللَّهُ عَنْهُ ، قَالَ : نَفِسَتْ أَسْمَاءُ بِنْتُ عُمَيْسٍ مُحَمَّدَ بْنَ أَبِي بَكْرٍ ، فَأَرْسَلَتْ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، تَسْأَلُهُ كَيْفَ تَفْعَلُ ؟ فَأَمَرَهَا أَنْ تَغْتَسِلَ ، وَتَسْتَثْفِرَ بِثَوْبِهَا ، وَتُهِلَّ.

2762. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: “Əsma bint Umeys Muhəmməd ibn Əbu Bəkri dünyaya gətirdi. Əsma Allah Elçisinə ﷺ ondan nə edəcəyi haqda soruşmaq üçün xəbər göndərdikdə Allah Elçisi ﷺ ona qüsl almağı, bir bez parçasından istifadə etməyi və ehrama girməyi əmr etdi.

٥٨– فِي الْمُهِلَّةِ بِالْعُمْرَةِ تَحِيضُ وَتَخَافُ فَوْتَ الْحَجِّ

## 58-ci fəsil: Ümrə niyyəti ilə ehramda olanın heyz olduqda həcci buraxmaqdan qorxması

٢٧٦٣– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : أَقْبَلْنَا مُهِلِّينَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِحَجٍّ مُفْرَدٍ ، وَأَقْبَلَتْ عَائِشَةُ مُهِلَّةً بِعُمْرَةٍ حَتَّى إِذَا كُنَّا بِسَرِفَ ، عَرَكَتْ حَتَّى إِذَا قَدِمْنَا طُفْنَا بِالْكَعْبَةِ ، وَبِالصَّفَا وَالْمَرْوَةِ ، فَأَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَنْ يَحِلَّ مِنَّا مَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ ، قَالَ : فَقُلْنَا حِلُّ مَاذَا ؟ قَالَ : الْحِلُّ كُلُّهُ فَوَاقَعْنَا النِّسَاءَ ، وَتَطَيَّبْنَا بِالطِّيبِ ، وَلَبِسْنَا ثِيَابَنَا وَلَيْسَ بَيْنَنَا وَبَيْنَ عَرَفَةَ إِلاَّ أَرْبَعُ لَيَالٍ ، ثُمَّ أَهْلَلْنَا يَوْمَ التَّرْوِيَةِ ، ثُمَّ دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى عَائِشَةَ فَوَجَدَهَا تَبْكِي ، فَقَالَ : مَا شَأْنُكِ ؟ فَقَالَتْ : شَأْنِي أَنِّي قَدْ حِضْتُ ، وَقَدْ حَلَّ النَّاسُ ، وَلَمْ أُحْلِلْ ، وَلَمْ أَطُفْ بِالْبَيْتِ ، وَالنَّاسُ يَذْهَبُونَ إِلَى الْحَجِّ الآنَ ، فَقَالَ : إِنَّ هَذَا أَمْرٌ كَتَبَهُ اللَّهُ عَلَى بَنَاتِ آدَمَ ، فَاغْتَسِلِي ، ثُمَّ أَهِلِّي بِالْحَجِّ فَفَعَلَتْ ، وَوَقَفَتِ الْمَوَاقِفَ حَتَّى إِذَا طَهُرَتْ طَافَتْ بِالْكَعْبَةِ ، وَبِالصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ قَالَ : قَدْ حَلَلْتِ مِنْ حَجَّتِكِ ، وَعُمْرَتِكِ جَمِيعًا فَقَالَتْ : يَا رَسُولَ اللهِ إِنِّي أَجِدُ فِي نَفْسِي أَنِّي لَمْ أَطُفْ بِالْبَيْتِ حَتَّى حَجَجْتُ ، قَالَ : فَاذْهَبْ بِهَا يَا عَبْدَ الرَّحْمَنِ فَأَعْمِرْهَا مِنَ التَّنْعِيمِ وَذَلِكَ لَيْلَةَ الْحَصْبَةِ.

2763. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: “İfrad həccini etmək üçün Allah Elçisi ﷺ ilə birlikdə idik. Aişə isə ehrama ümrə niyyəti ilə girmişdi və Sərif adlı yerə çatdıqda heyz oldu. Biz Kəbəni təvaf etdik, Səfa və Mərva arasında səy etdik. Allah Elçisi ﷺ bizə əmr edərək dedi: “Özü ilə qurban gətirməyənlər ehramdan çıxsınlar”. Biz dedik: “Hansı ehramdan?” O dedi: “Hamısından”. Biz də bundan sonra qadınlarımızla birlikdə olduq, gözəl ətirlərlə ətirləndik və paltarlarımızı geyindik. Arafaya getməyə yalnız dörd gecə qalmışdı. Tərviyə günü yenidən ehrama girdik. Allah Elçisi ﷺ Aişənin yanına gəldikdə onun ağladığını gördü və dedi: “Nə olub?” Aişə dedi: “Heyz olmuşam. Hamı ehramdan çıxdı, mən isə çıxmadım, təvaf etmədim. İndi hamı həcc etməyə gedir”. Allah Elçisi ﷺ buyurdu: “Bu, Allahın ﷻ Adəm qızları üçün əzəldən müəyyən etdiyi bir işdir. Buna görə də sən qüsl al və həcc niyəti ilə ehrama gir!” Aişə onun dediyi kimi etdi. Dayanılan yerlərdə dayandı, təmizləndikdən sonra

Kəbəni təvaf etdi, Səfa və Mərva arasında da səy etdi. Bütün bunlardan sonra Peyğəmbər ﷺ buyurdu: "Həccin də, ümrən də yerinə yetirildi". Aişə dedi: "Ey Allahın Elçisi, həcc edilənə qədər Kəbəni təvaf etmədiyimə görə özümdə naqislik hiss edirəm". Allah Elçisi ﷺ Əbu Abdur-Rahmənə (Əbu Bəkrə) buyurdu: "Minadan qayıtdığın gecə Tənim adlı yerdə ehrama girsin və ona ümrə elətdir!" Bu hadisə Minadan enəndə əl-Həsbə[1] günü baş vermişdir".

٢٧٦٤– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ بْنِ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ ، فَأَهْلَلْنَا بِعُمْرَةٍ ، ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ كَانَ مَعَهُ هَدْيٌ ، فَلْيُهْلِلْ بِالْحَجِّ مَعَ الْعُمْرَةِ ثُمَّ لاَ يَحِلَّ ، حَتَّى يَحِلَّ مِنْهُمَا جَمِيعًا ، فَقَدِمْتُ مَكَّةَ ، وَأَنَا حَائِضٌ ، فَلَمْ أَطُفْ بِالْبَيْتِ ، وَلاَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، فَشَكَوْتُ ذَلِكَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : انْقُضِي رَأْسَكِ ، وَامْتَشِطِي ، وَأَهِلِّي بِالْحَجِّ ، وَدَعِي الْعُمْرَةَ فَفَعَلْتُ ، فَلَمَّا قَضَيْتُ الْحَجَّ ، أَرْسَلَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَعَ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي بَكْرٍ إِلَى التَّنْعِيمِ ، فَاعْتَمَرْتُ ، قَالَ : هَذِهِ مَكَانُ عُمْرَتِكِ ، فَطَافَ الَّذِينَ أَهَلُّوا بِالْعُمْرَةِ بِالْبَيْتِ ، وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ حَلُّوا ، ثُمَّ طَافُوا طَوَافًا آخَرَ بَعْدَ أَنْ رَجَعُوا مِنْ مِنًى لِحَجِّهِمْ ، وَأَمَّا الَّذِينَ جَمَعُوا الْحَجَّ وَالْعُمْرَةَ ، فَإِنَّمَا طَافُوا طَوَافًا وَاحِدًا.

2764. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Vida həccində biz Allah Elçisi ﷺ ilə birlikdə yola çıxmışdıq. Biz ümrə niyyəti ilə ehrama girdik. Sonra Allah Elçisi ﷺ buyurdu: "Kim yanında qurbanlıq heyvan gətiribsə, həcc ilə birlikdə ümrəni də niyyət edərək ehrama girsin, ikisini də bitirməyənə qədər ehramdan çıxmasın". Məkkəyə gəldikdə mən heyz oldum. Nə Kəbəni təvaf edə bildim, nə də Səfa və Mərva arasında səy edə bildim. Bu vəziyyətdən Allah Elçisinə ﷺ şikayət etdikdə o belə dedi: "Hörükləri açıb saçını dara, həcc niyyəti ilə ehrama gir, ümrəni tərk et!" Mən onun dediklərini etdim, həcci bitirdikdən sonra Peyğəmbər ﷺ məni Abdur-Rahmən ibn Əbu Bəkrlə birlikdə Tənim adlı yerə göndərdi. Mən ümrəni oradan etdim. Abdur-Rahmən dedi: "Bura sənin ümrə edəcəyin yerdir". Sonra ümrə niyyəti ilə ehrama girənlər ümrə etmək üçün Kəbəni təvaf etdilər, Səfa və Mərva arasında da səy etdilər, sonra isə ehramdan çıxdılar. Sonra Minadan qayıdaraq həcc niyyətilə təvaf etdilər, həcc və ümrə niyyəti ilə birlikdə ehrama girənlər yalnız bir dəfə təvaf etdilər".

## ٥٩– الاِشْتِرَاطُ فِي الْحَجِّ

## 59-cu fəsil: Həcc edərkən niyyətdə şərt qoymaq

٢٧٦٥– أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا حَبِيبٌ ، عَنْ عَمْرِو بْنِ هَرِمٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ،

---

[1] əl-Həsbə - həccin axırıncı gününə deyilir.

وَعِكْرِمَةُ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ ضُبَاعَةَ أَرَادَتِ الْحَجَّ ، فَأَمَرَهَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنْ تَشْتَرِطَ ، فَفَعَلَتْ ، عَنْ أَمْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2765. ...İbn Abbas ﷺ rəvayət edir ki, bir dəfə Dubəa həcc etmək istədi Peyğəmbər ﷺ ona şərt qoyaraq həcc etmək əmrini verdi. O da Allah Elçisinin ﷺ əmrini yerinə yetirdi.[1]

٦٠- كَيْفَ يَقُولُ إِذَا اشْتَرَطَ

## 60-cı fəsil: Həcc edərkən niyyətdə şərt qoyanda nə deyilir?

٢٧٦٦- أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا أَبُو النُّعْمَانِ ، قَالَ : حَدَّثَنَا ثَابِتُ بْنُ يَزِيدَ الأَحْوَلُ ، قَالَ : حَدَّثَنَا هِلاَلُ بْنُ خَبَّابٍ ، قَالَ : سَأَلْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ ، عَنِ الرَّجُلِ يَحُجُّ يَشْتَرِطُ ؟ قَالَ : الشَّرْطُ بَيْنَ النَّاسِ فَحَدَّثْتُهُ ، حَدِيثَهُ يَعْنِي عِكْرِمَةَ فَحَدَّثَنِي ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ ضُبَاعَةَ بِنْتَ الزُّبَيْرِ بْنِ عَبْدِ الْمُطَّلِبِ أَتَتِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ إِنِّي أُرِيدُ الْحَجَّ فَكَيْفَ أَقُولُ ؟ قَالَ : قُولِي ، لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، وَمَحِلِّي مِنَ الأَرْضِ حَيْثُ تَحْبِسُنِي ، فَإِنَّ لَكِ عَلَى رَبِّكِ مَا اسْتَثْنَيْتِ.

2766. ...Rəvayət edilir ki, Hilal ibn Xabbab ﷺ demişdir: “Mən Səid ibn Cubeyrdən şərt ilə həcc edən adam haqda soruşdum. O dedi: “Şərt insanlar arasında olur”. Mən də ona İkrimənin hadisəsini danışdım. Səid İbn Abbasdan rəvayət etdi ki, bir dəfə Dubəa bint əz-Zubeyr ibn Abdul-Muttalib Peyğəmbərin ﷺ yanına gələrək dedi: “Ey Allahın Elçisi, mən həcc etmək istəyirəm, nə deməliyəm?” Allah Elçisi ﷺ buyurdu: “De: “Ləbbeyk, Alla:hummə ləbbeyk! Ehramdan çıxacağım yer həcc etməyimə mane olan hər hansı bir yerdir”. Rəbbinə belə bir şərt qoşmağın sənin üçün daha yaxşıdır”.

٢٧٦٧- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَنْبَأَنَا أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ طَاوُوسًا ، وَعِكْرِمَةَ ، يُخْبِرَانِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : جَاءَتْ ضُبَاعَةُ بِنْتُ الزُّبَيْرِ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ إِنِّي امْرَأَةٌ ثَقِيلَةٌ ، وَإِنِّي أُرِيدُ الْحَجَّ فَكَيْفَ تَأْمُرُنِي أَنْ أُهِلَّ ؟ قَالَ : أَهِلِّي وَاشْتَرِطِي ، إِنَّ مَحِلِّي حَيْثُ حَبَسْتَنِي.

2767. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Dubəa bint əz-Zubeyr Allah Elçisinin ﷺ yanına gələrək dedi: “Ey Allahın Elçisi, mən çəkisi ağır (kök) qadınam və həcc etmək istəyirəm. Ehrama girərkən mənə nə deməyi əmr edirsən?” Allah Elçisi ﷺ buyurdu: “De: “Həcc üçün ehrama girib çıxacağım yer, xəstəliyimə görə məni saxladığın yerdir”.

[1] Yəni “həcc üçün ehrama girib çıxacağım yer, xəstəliyimə görə məni saxladığın yerdir” niyyətini etmək. Növbəti hədislər bunu ətraflı izah edir.

٢٧٦٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، وَعَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى ضُبَاعَةَ فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، إِنِّي شَاكِيَةٌ ، وَإِنِّي أُرِيدُ الْحَجَّ ، فَقَالَ لَهَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : حُجِّي ، وَاشْتَرِطِي إِنَّ مَحِلِّي حَيْثُ تَحْبِسُنِي قَالَ إِسْحَاقُ : قُلْتُ لِعَبْدِ الرَّزَّاقِ : كِلاَهُمَا عَنْ عَائِشَةَ هِشَامٌ وَالزُّهْرِيُّ ؟ قَالَ : نَعَمْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ أَعْلَمُ أَحَدًا أَسْنَدَ هَذَا الْحَدِيثَ عَنِ الزُّهْرِيِّ غَيْرَ مَعْمَرٍ وَاللَّهُ سُبْحَانَهُ وَتَعَالَى أَعْلَمُ.

2768. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ Dubəanın yanına gəldi. Dubəa dedi: "Ey Allahın Elçisi, mənim xəstəliyim var və həcc etmək istəyirəm". Peyğəmbər ﷺ ona buyurdu: "Ehramdan çıxacağım yer xəstəliyimə görə məni saxladığın yerdir" niyyəti ilə şərt qoşaraq həcc et!"

## ٦١- مَا يَفْعَلُ مَنْ حُبِسَ عَنِ الْحَجِّ وَلَمْ يَكُنِ اشْتَرَطَ

## 61-ci fəsil: Şərtli niyyətlə həcci yarımçıq qalan nə etməlidir?

٢٧٦٩- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، قَالَ : كَانَ ابْنُ عُمَرَ يُنْكِرُ الاِشْتِرَاطَ فِي الْحَجِّ ، وَيَقُولُ : أَلَيْسَ حَسْبُكُمْ سُنَّةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِنْ حُبِسَ أَحَدُكُمْ عَنِ الْحَجِّ طَافَ بِالْبَيْتِ ، وَبِالصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ حَلَّ مِنْ كُلِّ شَيْءٍ حَتَّى يَحُجَّ عَامًا قَابِلاً ، وَيُهْدِي ، وَيَصُومُ ، إِنْ لَمْ يَجِدْ هَدْيًا.

2769. ...Rəvayət edilir ki, Səlim ﵁ demişdir: "İbn Ömər şərtli niyyət ilə həcc etməyi qəbul etməz və belə deyərdi: "Allah Elçisinin ﷺ sünnəsi sizə kifayət etmirmi? Əgər sizdən birinizin həcc etməsinə əngəl yaranarsa, Kəbəni təvaf etsin, Səfa və Mərva arasında səy etsin, gələn il yenidən həcc edənə qədər ehramdan çıxsın. Qurbanı varsa göndərsin, yoxdursa oruc tutsun".

٢٧٧٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ أَنَّهُ كَانَ يُنْكِرُ الاِشْتِرَاطَ فِي الْحَجِّ ، وَيَقُولُ : مَا حَسْبُكُمْ سُنَّةُ نَبِيِّكُمْ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِنَّهُ لَمْ يَشْتَرِطْ ، فَإِنْ حَبَسَ أَحَدَكُمْ حَابِسٌ ، فَلْيَأْتِ الْبَيْتَ فَلْيَطُفْ بِهِ ، وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، ثُمَّ لِيَحْلِقْ ، أَوْ يُقَصِّرْ ، ثُمَّ لِيُحْلِلْ ، وَعَلَيْهِ الْحَجُّ مِنْ قَابِلٍ.

2770. ...Səlim ﵁ rəvayət edir ki, atası (İbn Ömər) şərtli niyyət ilə həcc etməyi qəbul etməz və belə deyərdi: "Sizin Peyğəmbərin ﷺ sünnəsi sizə kifayət edir. O, yerinə yetirəcəyi həcdə qarşısına bir əngəlin çıxacağına qarşı bir şərt qoymamışdı. Əgər sizdən birinizin həcc etməsinə maneə yaranarsa, Kəbəyə gedib onu təvaf etsin, Səfa və Mərva arasında səy etdikdən sonra saçını qırxıb qısaltsın və ehramdan çıxsın. Həccini isə gələn il etsin".

### ٦٢- إِشْعَارُ الْهَدْيِ

### 62-ci fəsil: Qurbanlıq heyvanlara işarə qoyulması

٢٧٧١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ ثَوْرٍ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنِ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ (ح) وَأَنْبَأَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنِ الْمِسْوَرِ بْنِ مَخْرَمَةَ ، وَمَرْوَانَ بْنِ الْحَكَمِ قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ زَمَنَ الْحُدَيْبِيَةِ فِي بِضْعَ عَشْرَةَ مِئَةً مِنْ أَصْحَابِهِ حَتَّى إِذَا كَانُوا بِذِي الْحُلَيْفَةِ ، قَلَّدَ الْهَدْيَ ، وَأَشْعَرَ وَأَحْرَمَ بِالْعُمْرَةِ مُخْتَصَرٌ.

2771. ...Rəvayət edilir ki, əl-Misvər ibn Məxramə və Mərvan ibn əl-Həkəm ﷺ demişlər: “Allah Elçisi ﷺ Hudeybiyə vaxtı mindən çox səhabə ilə Məkkəyə doğru yola çıxdı və Zul-Huleyfəyə çatdıqda yanlarında olan qurbanlara işarə üçün boyunlarına ip keçirdilər və ümrə niyyəti ilə ehrama girdilər”.

٢٧٧٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنِي أَفْلَحُ بْنُ حُمَيْدٍ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَشْعَرَ بُدْنَهُ.

2772. ...Aişə رضي الله عنها rəvayət edir ki, Allah Elçisi ﷺ qurbanlıq dəvələrini işarələmişdir.

### ٦٣- أَيَّ الشِّقَّيْنِ يُشْعِرُ

### 63-cü fəsil: Qurbanlıq heyvanların hansı tərəfinə işarə qoyulur?

٢٧٧٣- أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، عَنْ هُشَيْمٍ ، عَنْ شُعْبَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي حَسَّانَ الأَعْرَجِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَشْعَرَ بُدْنَهُ مِنَ الْجَانِبِ الأَيْمَنِ ، وَسَلَتَ الدَّمَ عَنْهَا ، وَأَشْعَرَهَا.

2773. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ qurban kəsmək üçün ayrılan dəvələrin hörgüclərinin sağ tərəflərini bıçaqla bir az kəsərək qan axıtdı və o qanı da barmağı ilə yayaraq qurbanlıq olduğuna işarə etdi.

### ٦٤- بَابُ سَلْتِ الدَّمِ عَنِ الْبُدْنِ

### 64-cü fəsil: Heyvanların üzərindəki qan izinin onların qurbanlıq olduqlarına işarə olması

٢٧٧٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي حَسَّانَ الأَعْرَجِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا كَانَ بِذِي الْحُلَيْفَةِ ، أَمَرَ بِبَدَنَتِهِ فَأُشْعِرَ فِي سَنَامِهَا مِنَ الشِّقِّ الأَيْمَنِ ، ثُمَّ سَلَتَ عَنْهَا ، وَقَلَّدَهَا نَعْلَيْنِ فَلَمَّا

اسْتَوَتْ بِهِ عَلَى الْبَيْدَاءِ أَهَلَّ.

2774. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Zul-Huleyfəyə gəldikdə qurbanlıq bir dəvə ayrılmasını və dəvənin hörgücünün sağ tərəfinə qurbanlıq olmasını bildirmək üçün çərtərək bir (qan) işarəsinin və həmin qanın qurbanlıq olmasını bildirmək üçün qalmasını əmr etdi. Onun qurbanlıq olmasını bildirmək üçün dəvənin boynuna işarə üçün iki ayaqqabı bağladı və əl-Beyda deyilən yerə gələn kimi ehrama girdi.

٦٥- فتل القلائد

## 65-ci fəsil: Qurbanlıq heyvanların boyun ipləri

٢٧٧٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ وَعَمْرَةَ بِنْتِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَائِشَةَ أَنَّهَا قَالَتْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُهْدِي مِنَ الْمَدِينَةِ فَأَفْتِلُ قَلاَئِدَ هَدْيِهِ ، ثُمَّ لاَ يَجْتَنِبُ شَيْئًا مِمَّا يَجْتَنِبُهُ الْمُحْرِمُ

2775. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Allah Elçisi ﷺ Mədinədən qurbanlıq heyvan göndərdi. Mən də bu heyvanın qurbanlıq olduğunu bildirən və boynuna işarə üçün taxılan iplər hörərdim. O da ehramsız olan adamların etdiyini edərdi”.

٢٧٧٦- أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ الزَّعْفَرَانِيُّ ، قَالَ : أَنْبَأَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَيَبْعَثُ بِهَا ، ثُمَّ يَأْتِي مَا يَأْتِي الْحَلاَلُ قَبْلَ أَنْ يَبْلُغَ الْهَدْيُ مَحِلَّهُ.

2776. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ qurbanlıq heyvanlarının boynuna işarə üçün taxılan ipləri hörərdim. Allah Elçisi ﷺ qurbanıq heyvanlar göndərdiyi yerə çatana qədər ehramsız adam kimi olardı”.

٢٧٧٧- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا عَامِرٌ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنْ كُنْتُ لأَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ يُقِيمُ وَلاَ يُحْرِمُ.

2777. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ qurbanlıq heyvanlarının boynuna işarə üçün taxılan ipləri hörərdim. Allah Elçisi ﷺ ehrama girmədən gözləyərdi”.

٢٧٧٨– أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدٍ الضَّعِيفُ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ الْقَلاَئِدَ لِهَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَيُقَلِّدُ هَدْيَهُ ، ثُمَّ يَبْعَثُ بِهَا ، ثُمَّ يُقِيمُ لاَ يَجْتَنِبُ شَيْئًا مِمَّا يَجْتَنِبُهُ الْمُحْرِمُ.

2778. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ qurbanlıq heyvanlarının boynuna işarə üçün taxılan ipləri hörərdim. O da ipləri qurbanlıq heyvanlarının boyunlarına taxar və onları Məkkəyə göndərər, sonra isə ehramsız adam kimi olardı".

٢٧٧٩– أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ الزَّعْفَرَانِيُّ ، عَنْ عَبِيدَةَ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أَفْتِلُ قَلاَئِدَ الْغَنَمِ لِهَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ يَمْكُثُ حَلاَلاً.

2779. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ qurbanlıq heyvanlarının boynuna işarə üçün taxılan ipləri hördüyümü bilirəm. Peyğəmbər ﷺ də ehramsız halda gözləyərdi".

## ٦٦– مَا يُفْتَلُ مِنْهُ الْقَلاَئِدُ

## 66-cü fəsil: Qurbanlıq heyvanların boyun ipləri nədən hörülmüşdü?

٢٧٨٠– أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ الزَّعْفَرَانِيُّ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، يَعْنِي ابْنَ حَسَنٍ ، عَنِ ابْنِ عَوْنٍ ، عَنِ الْقَاسِمِ ، عَنْ أُمِّ الْمُؤْمِنِينَ ، قَالَتْ : أَنَا فَتَلْتُ تِلْكَ الْقَلاَئِدَ مِنْ عِهْنٍ كَانَ عِنْدَنَا ، ثُمَّ أَصْبَحَ فِينَا ، فَيَأْتِي مَا يَأْتِي الْحَلاَلُ مِنْ أَهْلِهِ ، وَمَا يَأْتِي الرَّجُلُ مِنْ أَهْلِهِ.

2780. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﵂ demişdir: "Mən qurbanlıq heyvanlarının boynuna işarə üçün taxılan ipləri bizdə olan yundan hörərdim. Peyğəmbər ﷺ bizim yanımızda sabahlayar, zövcələrinə münasibətdə bir kişi üçün halal olanları edərdi".

## ٦٧– تَقْلِيدُ الْهَدْيِ

## 67-ci fəsil: Qurbanlıq heyvana işarə qoyulması

٢٧٨١– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهَا قَالَتْ : يَا رَسُولَ اللهِ مَا شَأْنُ النَّاسِ قَدْ حَلُّوا بِعُمْرَةٍ وَلَمْ تَحْلِلْ أَنْتَ مِنْ عُمْرَتِكَ ؟ قَالَ : إِنِّي لَبَّدْتُ رَأْسِي وَقَلَّدْتُ هَدْيِي فَلاَ أَحِلُّ حَتَّى أَنْحَرَ.

2781. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Həfsa ﵂ demişdir: "Ey Allahın Elçisi! Bu insanlara nə olur? Nəyə görə sən ehramdan çıxmamış

onlar ehramdan çıxırlar?!" Peyğəmbər ﷺ buyurdu: "Mən uzun müddət ehramda olduğuma görə saçlarımı qırxdım, kəsəcəyim qurbana da işarə vurdum. Ona görə də qurban kəsənə qədər ehramda qalacağam".

٢٧٨٢- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذٌ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي حَسَّانَ الأَعْرَجِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا أَتَى ذَا الْحُلَيْفَةِ ، أَشْعَرَ الْهَدْيَ فِي جَانِبِ السَّنَامِ الأَيْمَنِ ، ثُمَّ أَمَاطَ عَنْهُ الدَّمَ ، وَقَلَّدَهُ نَعْلَيْنِ ، ثُمَّ رَكِبَ نَاقَتَهُ ، فَلَمَّا اسْتَوَتْ بِهِ الْبَيْدَاءَ ، لَبَّى وَأَحْرَمَ عِنْدَ الظُّهْرِ ، وَأَهَلَّ بِالْحَجِّ.

2782. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Zul-Huleyfəyə gəldikdə kəsəcəyi qurbanlıq dəvənin hörgücünün sağ tərəfinə qurbanlıq olmasını bildirmək üçün çərtərək işarə qoydu və boynuna ayaqqabı bağladı. Sonra dəvəsinə minərək yola düşdü və əl-Beyda deyilən yerə gələn kimi təlbiyə deyərək ehrama girdi və Zöhr vaxtı həcc etmək üçün niyyət etdi".

## ٦٨- تَقْلِيدُ الإِبِلِ
## 68-ci fəsil: Qurbanlıq dəvəyə işarə qoyulması

٢٧٨٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا قَاسِمٌ وَهُوَ ابْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَفْلَحُ ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : فَتَلْتُ قَلاَئِدَ بُدْنِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدَيَّ ، ثُمَّ قَلَّدَهَا ، وَأَشْعَرَهَا وَوَجَّهَهَا إِلَى الْبَيْتِ ، وَبَعَثَ بِهَا ، وَأَقَامَ فَمَا حَرُمَ عَلَيْهِ شَيْءٌ كَانَ لَهُ حَلاَلاً.

2783. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Mən Allah Elçisinin ﷺ qurban kəsmək üçün ayırdığı dəvələrin boyunlarına işarə üçün taxılan ipləri hörmüşdüm. Allah Elçisi ﷺ onları dəvələrin boyunlarına bağladı və başqa bir işarə də qoyub Kəbəyə tərəf göndərdi. Həmiçinin qurbanlıq heyvanlar göndərdiyi yerə çatana qədər o, ehramsız adam kimi idi".

٢٧٨٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : فَتَلْتُ قَلاَئِدَ بُدْنِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ لَمْ يُحْرِمْ ، وَلَمْ يَتْرُكْ شَيْئًا مِنَ الثِّيَابِ.

2784. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Mən Allah Elçisinin ﷺ qurban kəsmək üçün ayırdığı dəvələrin boyunlarına işarə üçün taxılan ipləri hörürdüm. Sonra Allah Elçisi ﷺ ehrama girmədi və paltarını da çıxarmadı".

### ٦٩- تَقْلِيدُ الْغَنَمِ

### 69-cu fəsil: Qurbanlıq qoyuna işarə qoyulması

٢٧٨٥- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : سَمِعْتُ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَنَمًا.

2785. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ qurban kəsmək üçün ayırdığı qoyunların boyunlarına işarə üçün taxılan ipləri hörərdim".

٢٧٨٦- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ يُهْدِي الْغَنَمَ.

2786. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ qurban kəsmək üçün qoyun da göndərərdi.

٢٧٨٧- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَهْدَى مَرَّةً غَنَمًا ، وَقَلَّدَهَا.

2787. ...Aişə ﵂ rəvayət edir ki, bir dəfə Allah Elçisi ﷺ qurban kəsmək üçün qoyunlar göndərmiş və boyunlarına işarə üçün iplər taxmışdı.

٢٧٨٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَنَمًا ، ثُمَّ لاَ يُحْرِمُ.

2788. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ qurban kəsmək üçün ayırdığı qoyunların boyunlarına işarə üçün taxılan ipləri hörərdim. Peyğəmbər ﷺ onları göndərənə qədər ehrama girməzdi".

٢٧٨٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَنَمًا ، ثُمَّ لاَ يُحْرِمُ.

2789. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ qurban kəsmək üçün ayırdığı qoyunların boyunlarına işarə üçün taxılan ipləri hörərdim. Peyğəmbər ﷺ onları göndərənə qədər ehrama girməzdi".

٢٧٩٠- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ عِيسَى ثِقَةٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ مُحَمَّدِ بْنِ جُحَادَةَ (ح) وَأَنْبَأَنَا عَبْدُ الْوَارِثِ بْنُ عَبْدِ الصَّمَدِ بْنِ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنِي أَبُو مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدُ بْنُ جُحَادَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنَّا نُقَلِّدُ الشَّاةَ ، فَيُرْسِلُ بِهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَلاَلاً لَمْ يُحْرِمْ مِنْ شَيْءٍ.

2790. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Biz qurban kəsilməsi üçün göndəriləcək qoyunların boyunlarına işarə üçün taxılan ipləri hörərdik. Allah Elçisi ﷺ ehrama girmədən onları (Məkkəyə) göndərərdi".

٧٠- تَقْلِيدُ الْهَدْيِ نَعْلَيْنِ

70-ci fəsil: Qurbanlıq heyvanın boynuna işarə üçün ayaqqabı asmaq

٢٧٩١- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ الدَّسْتَوَائِيُّ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي حَسَّانَ الأَعْرَجِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا أَتَى ذَا الْحُلَيْفَةِ أَشْعَرَ الْهَدْيَ مِنْ جَانِبِ السَّنَامِ الأَيْمَنِ ، ثُمَّ أَمَاطَ عَنْهُ الدَّمَ ، ثُمَّ قَلَّدَهُ نَعْلَيْنِ ، ثُمَّ رَكِبَ نَاقَتَهُ ، فَلَمَّا اسْتَوَتْ بِهِ الْبَيْدَاءَ أَحْرَمَ بِالْحَجِّ ، وَأَحْرَمَ عِنْدَ الظُّهْرِ ، وَأَهَلَّ بِالْحَجِّ.

2791. ...İbn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Zul-Huleyfəyə gəldikdə qurbanlıq dəvələrin hörgüclərinin sağ tərəfini bir az kəsərək işarə qoydu. Sonra qanı dayandırdı və qurbanlıq olduğunu bildirmək üçün dəvənin boynuna iki ayaqqabı asdı. Sonra öz dəvəsinə minərək Zöhr vaxtı əl-Beyda deyilən yerə gəldi. Orada həcc niyyəti ilə ehrama girdi və həcc təlbiyəsini dedi".

٧١- هَلْ يُحْرِمُ إِذَا قَلَّدَ

71-ci fəsil: Qurbanlıq göndərdikdə ehrama girmək lazımdırmı?

٢٧٩٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، أَنَّهُمْ كَانُوا إِذَا كَانُوا حَاضِرِينَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْمَدِينَةِ ، بَعَثَ بِالْهَدْيِ ، فَمَنْ شَاءَ أَحْرَمَ ، وَمَنْ شَاءَ تَرَكَ.

2792. ...Cabir ﵁ rəvayət edir ki, onlar Allah Elçisi ﷺ ilə birlikdə Mədinədə idilər. Allah Elçisi ﷺ qurban kəsiləcək heyvanını göndərdi və kimisi ehrama girdi, kimisi də girmədi.

٧٢- هَلْ يُوجِبُ تَقْلِيدُ الْهَدْيِ إِحْرَامًا

72-ci fəsil: Qurbanlıq göndərənin ehrama girməsi vacibdirmi?

٢٧٩٣- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ،

قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدَيَّ ، ثُمَّ يُقَلِّدُهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدِهِ ، ثُمَّ يَبْعَثُ بِهَا مَعَ أَبِي ، فَلاَ يَدَعُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَيْئًا أَحَلَّهُ اللهُ عَزَّ وَجَلَّ لَهُ ، حَتَّى يَنْحَرَ الْهَدْيَ.

2793. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ göndərəcəyi qurbanlıq heyvanların boyunlarına taxmaq üçün ipləri əlimlə hörərdim. Sonra Allah Elçisi ﷺ onları öz əlləri ilə bağlayar və sonra onları atamla (Məkkəyə) göndərərdi. Qurban kəsənə qədər Allahın ona halal etdiyi şeyləri də haram saymazdı".[1]

٢٧٩٤- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، وَقُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ لاَ يَجْتَنِبُ شَيْئًا مِمَّا يَجْتَنِبُهُ الْمُحْرِمُ.

2794. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ göndərəcəyi qurbanlıq heyvanların boyunlarına taxmaq üçün ipləri hörərdim. O, ehramlının çəkindiyi şeylərdən çəkinməzdi (ehrama girməzdi)".

٢٧٩٥- أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : سَمِعْتُ عَبْدَ الرَّحْمَنِ بْنَ الْقَاسِمِ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، قَالَ : قَالَتْ عَائِشَةُ : كُنْتُ أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلاَ يَجْتَنِبُ شَيْئًا وَلاَ نَعْلَمُ الْحَجَّ يُحِلُّهُ ، إِلاَّ الطَّوَافُ بِالْبَيْتِ.

2795. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ göndərəcəyi qurbanlıq heyvanların boyunlarına taxmaq üçün ipləri hörərdim. O, ehramlıya qadağan olmuş şeylərdən çəkinməzdi. Biz onun Kəbəni təvaf etməsindən həcc etdiyini bilərdik".

٢٧٩٦- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنْ كُنْتُ لأَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَيَخْرُجُ بِالْهَدْيِ مُقَلَّدًا ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُقِيمٌ مَا يَمْتَنِعُ مِنْ نِسَائِهِ.

2796. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mən Allah Elçisinin ﷺ göndərəcəyi qurbanlıq heyvanların boyunlarına taxmaq üçün ipləri hörərdim. Allah Elçisi ﷺ qurbanlığın boynunda işarə taxılmış halda onları yola çıxarar, özü isə icazə verilən işləri edər, hətta zövcələri ilə yaxınlıq da edərdi".

[1] Yəni "hələ ehrama girməz, ona görə də adi adam nə edərdisə, onu edərdi".

٢٧٩٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : لَقَدْ رَأَيْتُنِي أَفْتِلُ قَلاَئِدَ هَدْيِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْغَنَمِ ، فَيَبْعَثُ بِهَا ، ثُمَّ يُقِيمُ فِينَا حَلاَلاً.

2797. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Mənim Allah Elçisinin ﷺ qurbanlıq qoyunu (Məkkəyə) göndərdiyini və o qoyunun boyun iplərini hördüyümü xatırlayardım. Qoyunların boyun iplərini taxdıqdan sonra heyvanı göndərər, özü isə ehrama girmədən yanımızda qalardı".

٧٣- سَوْقُ الْهَدْيِ

73-cü fəsil: Qurbanlıq heyvanın əvvəlcədən göndərilməsi

٢٧٩٨- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبُ بْنُ إِسْحَاقَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ سَمِعَهُ يُحَدِّثُ ، عَنْ جَابِرٍ ، أَنَّهُ سَمِعَهُ يُحَدِّثُ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَاقَ هَدْيًا فِي حَجِّهِ.

2798. ...Cabir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ qurbanlıq heyvanını həcc etməzdən qabaq göndərmişdir.

٧٤- رُكُوبُ الْبَدَنَةِ

74-cü fəsil: Qurbanlıq dəvəyə minmək

٢٧٩٩- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَأَى رَجُلاً يَسُوقُ بَدَنَةً ، قَالَ : ارْكَبْهَا قَالَ : يَا رَسُولَ اللهِ إِنَّهَا بَدَنَةٌ ، قَالَ : ارْكَبْهَا ، وَيْلَكَ فِي الثَّانِيَةِ ، أَوْ فِي الثَّالِثَةِ.

2799. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişinin qurbanını (Məkkəyə) göndərdiyini və özünün də piyada getdiyini gördü və ona: "Dəvəyə min!" dedi. O da dedi: "Ey Allahın Elçisi, axı o qurban kəsilmək üçündür". Allah Elçisi ﷺ: "Onu min, ay biçarə!" deyərək bunu iki və ya üç dəfə təkrarladı.

٢٨٠٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى رَجُلاً يَسُوقُ بَدَنَةً ، فَقَالَ : ارْكَبْهَا قَالَ : إِنَّهَا بَدَنَةٌ ، قَالَ : ارْكَبْهَا قَالَ : إِنَّهَا بَدَنَةٌ ، قَالَ فِي الرَّابِعَةِ : ارْكَبْهَا ، وَيْلَكَ.

2800. ...Ənəs rəvayət edir ki, Allah Elçisi ﷺ bir kişinin qurbanını (Məkkəyə) göndərdiyini (və özünün də piyada getdiyini) gördü və ona: "Onu min!" dedi. O da dedi: "Axı o qurban kəsilmək üçündür". Allah Elçisi ﷺ yenə:

"Onu min!" O da dedi: "Axı o qurban kəsilmək üçündür". Allah Elçisi ﷺ dördüncü dəfə dedi: "Onu min, ay biçarə!"

٧٥- رُكُوبُ الْبَدَنَةِ لِمَنْ جَهَدَهُ الْمَشْيُ

75-ci fəsil: Piyada gedərək yorulanın qurbanlıq dəvəyə minə bilməsi

٢٨٠١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأَى رَجُلاً يَسُوقُ بَدَنَةً ، وَقَدْ جَهَدَهُ الْمَشْيُ ، قَالَ : ارْكَبْهَا قَالَ : إِنَّهَا بَدَنَةٌ ، قَالَ : ارْكَبْهَا ، وَإِنْ كَانَتْ بَدَنَةً.

2801. ...Ənəs ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ bir kişinin qurbanını (Məkkəyə) göndərdiyini və özünün də piyada getdiyini gördü və ona: "Onu min!" dedi. O da: "Axı o qurban kəsilmək üçündür" dedi. Allah Elçisi ﷺ yenə: "Qurbanlıq olsa da onu min!"- dedi.

٧٦- رُكُوبُ الْبَدَنَةِ بِالْمَعْرُوفِ

76-cı fəsil: Yaxşı işlər üçün qurbanlıq dəvəyə minilməsi

٢٨٠٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، قَالَ : سَمِعْتُ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَسْأَلُ عَنْ رُكُوبِ الْبَدَنَةِ فَقَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : ارْكَبْهَا بِالْمَعْرُوفِ إِذَا أُلْجِئْتَ إِلَيْهَا حَتَّى تَجِدَ ظَهْرًا.

2802. ...Rəvayət edilir ki, Əbuz-Zubeyr ؓ demişdir: "Mən Cabir ibn Abdullahın qurbanlıq dəvəyə minmək haqda Allah Elçisindən ﷺ soruşduğunu eşitdim. Allah Elçisi ﷺ buyurdu: "Başqa bir minik tapana qədər məcburiyyət qarşısında minmək olar".

٧٧- إِبَاحَةُ فَسْخِ الْحَجِّ بِعُمْرَةٍ لِمَنْ لَمْ يَسُقِ الْهَدْيَ

77-ci fəsil: Qurbanlıq dəvəni Məkkəyə göndərməyənin həcci ümrə niyyətinə çevirməsi

٢٨٠٣- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، عَنْ جَرِيرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَلاَ نُرَى إِلاَّ الْحَجَّ ، فَلَمَّا قَدِمْنَا مَكَّةَ طُفْنَا بِالْبَيْتِ ، أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَنْ لَمْ يَكُنْ سَاقَ الْهَدْيَ ، أَنْ يَحِلَّ فَحَلَّ مَنْ لَمْ يَكُنْ سَاقَ الْهَدْيَ وَنِسَاؤُهُ لَمْ يَسُقْنَ فَأَحْلَلْنَ ، قَالَتْ عَائِشَةُ : فَحِضْتُ فَلَمْ أَطُفْ بِالْبَيْتِ ، فَلَمَّا كَانَتْ لَيْلَةُ الْحَصْبَةِ ، قُلْتُ : يَا رَسُولَ اللهِ ، يَرْجِعُ النَّاسُ بِعُمْرَةٍ وَحَجَّةٍ ، وَأَرْجِعُ أَنَا بِحَجَّةٍ ، قَالَ : أَوَ مَا كُنْتِ طُفْتِ لَيَالِيَ قَدِمْنَا مَكَّةَ قُلْتُ : لاَ ، قَالَ : فَاذْهَبِي مَعَ أَخِيكِ إِلَى التَّنْعِيمِ ، فَأَهِلِّي بِعُمْرَةٍ ، ثُمَّ مَوْعِدُكِ مَكَانُ كَذَا ، وَكَذَا.

2803. ...Rəvayət edilir ki, Aişə ؓ demişdir: "Biz Allah Elçisi ﷺ ilə yalnız

həcc etmək niyyəti ilə yola çıxdıq. Məkkəyə gəldikdə Kəbəni təvaf etdik. Allah Elçisi ﷺ qurbanlıq heyvan göndərməyənlərin ehramdan çıxmasını buyurdu. Bu səbəbdən qurbanlıq göndərməyənlər ehramdan çıxdılar. Peyğəmbərin ﷺ zövcələri də qurbanlıq heyvan göndərməmişdilər. Ona görə onlar da ehramdan çıxdılar". Aişə deyir: "Mən heyzli olduğum üçün təvaf edə bilməmişdim. Minadan geri qayıdan gecə Allah Elçisinə ﷺ dedim: "Ey Allahın Elçisi! Hamı həcc və ümrə edib qayıdır, mən isə yalnız həcc etmişəm". Peyğəmbər ﷺ buyurdu: "Məkkəyə gəldiyimiz gecə təvaf etməmişdin?" Mən də: "Xeyr" dedim. Allah Elçisi ﷺ buyurdu: "Elə isə qardaşınla birlikdə "ət-Tənim" deyilən yerə get, ümrə niyyəti ilə ehrama gir, ümrədə edilməsi lazım olan şeyləri et və yanımıza qayıt".

٢٨٠٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ يَحْيَى ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لاَ نُرَى إِلاَّ أَنَّهُ الْحَجُّ ، فَلَمَّا دَنَوْنَا مِنْ مَكَّةَ ، أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَنْ كَانَ مَعَهُ هَدْيٌ أَنْ يُقِيمَ عَلَى إِحْرَامِهِ ، وَمَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ أَنْ يَحِلَّ.

2804. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: "Biz yalnız həcc etmək niyyəti ilə Allah Elçisi ﷺ ilə yola çıxdıq. Məkkəyə gəldikdə Kəbəni təvaf etdik. Allah Elçisi ﷺ qurbanlıq heyvanı yanında olanlara ehramda qalmalarını, qurbanlıq heyvanı olmayanların isə ehramdan çıxmalarını buyurdu".

٢٨٠٥- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَطَاءٌ ، عَنْ جَابِرٍ ، قَالَ : أَهْلَلْنَا أَصْحَابَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْحَجِّ خَالِصًا لَيْسَ مَعَهُ غَيْرُهُ خَالِصًا وَحْدَهُ ، فَقَدِمْنَا مَكَّةَ صَبِيحَةَ رَابِعَةٍ ، مَضَتْ مِنْ ذِي الْحِجَّةِ ، فَأَمَرَنَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : أَحِلُّوا ، وَاجْعَلُوهَا عُمْرَةً فَبَلَغَهُ عَنَّا أَنَّا نَقُولُ : لَمَّا لَمْ يَكُنْ بَيْنَنَا وَبَيْنَ عَرَفَةَ إِلاَّ خَمْسٌ ، أَمَرَنَا أَنْ نَحِلَّ فَنَرُوحَ إِلَى مِنًى ، وَمَذَاكِيرُنَا تَقْطُرُ مِنَ الْمَنِيِّ ، فَقَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَخَطَبَنَا ، فَقَالَ : فَقَدْ بَلَغَنِي الَّذِي قُلْتُمْ ، وَإِنِّي لأَبَرُّكُمْ وَأَتْقَاكُمْ ، وَلَوْلاَ الْهَدْيُ لَحَلَلْتُ ، وَلَوِ اسْتَقْبَلْتُ مِنْ أَمْرِي ، مَا اسْتَدْبَرْتُ مَا أَهْدَيْتُ قَالَ : وَقَدِمَ عَلِيٌّ مِنَ الْيَمَنِ فَقَالَ : بِمَا أَهْلَلْتَ ؟ قَالَ بِمَا أَهَلَّ بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : فَأَهْدِ ، وَامْكُثْ حَرَامًا كَمَا أَنْتَ قَالَ وَقَالَ سُرَاقَةُ بْنُ مَالِكِ بْنِ جُعْشُمٍ : يَا رَسُولَ اللهِ ، أَرَأَيْتَ عُمْرَتَنَا هَذِهِ لِعَامِنَا هَذَا أَوْ لِلأَبَدِ ؟ قَالَ : هِيَ لِلأَبَدِ.

2805. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Allah Elçisinin ﷺ səhabələri olaraq yalnız həcc etmək niyyəti ilə ehrama girdik. Zil-Hiccənin dördüncü səhəri Məkkəyə gəldik. Allah Elçisi ﷺ ehramdan çıxmağımızı buyurdu və həcc niyyətimizi ümrə niyyəti ilə dəyişməyi əmr etdi. Arafaya çıxmağımıza beş gün qalmışdı ki, ehrama girib Minaya getməyimizi əmr etdi. (Zövcələrimizdən ayrı qaldığımıza görə) cinsiyyət üzvümüzdən məzi gəlirdi. Bu əsnada Peyğəmbər ﷺ qalxaraq bizə bir xütbə dedi: "Danışdıqlarınız mənə

çatdı. Mən sizin aranızda Allaha ən çox itaət edən və yolunu Allahın Kitabı ilə getməyə çalışanınızam. Əgər qurbanlığımı (Məkkəyə) göndərməsəydim, mən də ehramdan çıxardım. Belə olacağını bilsəydim, qurbanlığı göndərməzdim". Bu vaxt Əli Yəməndən qayıtmışdı. Peyğəmbər ﷺ ona dedi: "Ehram hansı niyyətlə girdin?" O da: "Allah Elçisi ﷺ hansı niyyətlə ehrama girdisə, mən də o niyyətlə ehrama girdim"- dedi. Peyğəmbər ﷺ buyurdu: "Qurbanlıq heyvanını göndər və indi olduğun kimi ehramlı olaraq qal". Bu vaxt Suraqa ibn Malik ibn Cuşum dedi: "Ey Allahın Elçisi! Bu şəkildə edilən ümrə yalnız bu il üçün belədir, yoxsa həmişə belə olacaq?" Peyğəmbər ﷺ buyurdu: "Həmişə belə olacaq".

٢٨٠٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الْمَلِكِ ، عَنْ طَاوُوسٍ ، عَنْ سُرَاقَةَ بْنِ مَالِكِ بْنِ جُعْشُمٍ ، أَنَّهُ قَالَ : يَا رَسُولَ اللهِ أَرَأَيْتَ عُمْرَتَنَا هَذِهِ لِعَامِنَا أَمْ لأَبَدٍ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هِيَ لأَبَدٍ.

2806. ...Rəvayət edilir ki, bir dəfə Suraqa ibn Malik ibn Cuşum ﵁ dedi: "Ey Allahın Elçisi! Bu şəkildə edilən ümrə yalnız bu il üçün belədir, yoxsa həmişə belə olacaq?" Allah Elçisi ﷺ buyurdu: "Həmişə belə olacaq".

٢٨٠٧- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ عَبْدَةَ ، عَنْ ابْنِ أَبِي عَرُوبَةَ ، عَنْ مَالِكِ بْنِ دِينَارٍ ، عَنْ عَطَاءٍ ، قَالَ : قَالَ سُرَاقَةُ : تَمَتَّعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَتَمَتَّعْنَا مَعَهُ ، فَقُلْنَا : أَلَنَا خَاصَّةً أَمْ لأَبَدٍ ؟ قَالَ : بَلْ لأَبَدٍ.

2807. ...Rəvayət edilir ki, Suraqa ﵁ demişdir: "Allah Elçisi ﷺ təməttu həcci etdikdə biz də təməttu həcci etdik. Biz ona dedik: "Bu şəkildə xüsusi haldır, yoxsa həmişə belə olacaq?" Allah Elçisi ﷺ buyurdu: "Xeyr, həmişə belə olacaq".

٢٨٠٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْعَزِيزِ وَهُوَ الدَّرَاوَرْدِيُّ ، عَنْ رَبِيعَةَ بْنِ أَبِي عَبْدِ الرَّحْمَنِ ، عَنِ الْحَارِثِ بْنِ بِلاَلٍ ، عَنْ أَبِيهِ ، قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ أَفَسْخُ الْحَجِّ لَنَا خَاصَّةً أَمْ لِلنَّاسِ عَامَّةً ؟ قَالَ : بَلْ لَنَا خَاصَّةً.

2808. ...Haris ibn Bilal atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Peyğəmbərə ﷺ dedim: "Ey Allahın Elçisi, həcc niyyəti ilə başlayıb bunu ümrəyə çevirmək yalnız bizə aiddir, yoxsa bütün insanlara?" Peyğəmbər ﷺ buyurdu: "Yalnız bizə xasdır".

٢٨٠٩- أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، وَعَيَّاشٌ الْعَامِرِيُّ ، عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي ذَرٍّ ، فِي مُتْعَةِ الْحَجِّ قَالَ : كَانَتْ لَنَا رُخْصَةً.

2809. ...İbrahim ət-Teymi atasından ﷺ rəvayət edir ki, Əbu Zərr təməttu həcci haqda demişdir: "Bu yalnız bizə icazəlidir".[1]

٢٨١٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالاَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ عَبْدَ الْوَارِثِ بْنَ أَبِي حَنِيفَةَ ، قَالَ : سَمِعْتُ إِبْرَاهِيمَ التَّيْمِيَّ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : فِي مُتْعَةِ الْحَجِّ لَيْسَتْ لَكُمْ ، وَلَسْتُمْ مِنْهَا فِي شَيْءٍ ، إِنَّمَا كَانَتْ رُخْصَةً لَنَا ، أَصْحَابَ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2810. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: "Təməttu həcci yalnız sizə xas deyil, (bütün insanlara xasdır), lakin həcc niyyəti ilə başladılan ibadətin ümrə niyyətinə dəyişdirilməsi yalnız Muhəmmədin ﷺ səhabələrinə xasdır".

٢٨١١- أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ ، قَالَ : أَنْبَأَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ إِبْرَاهِيمَ التَّيْمِيِّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : كَانَتْ الْمُتْعَةُ رُخْصَةً لَنَا.

2811. ...İbrahim ət-Teymi atasından ﷺ rəvayət edir ki, Əbu Zərr demişdir: "Təməttu həcci yalnız bizə icazəlidir".

٢٨١٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلُ بْنُ مُهَلْهِلٍ ، عَنْ بَيَانٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي الشَّعْثَاءِ ، قَالَ : كُنْتُ مَعَ إِبْرَاهِيمَ النَّخَعِيِّ ، وَإِبْرَاهِيمَ التَّيْمِيِّ فَقُلْتُ : لَقَدْ هَمَمْتُ أَنْ أَجْمَعَ الْعَامَ الْحَجَّ وَالْعُمْرَةَ ، فَقَالَ إِبْرَاهِيمُ : لَوْ كَانَ أَبُوكَ لَمْ يَهُمَّ بِذَلِكَ ، قَالَ : وَقَالَ إِبْرَاهِيمُ التَّيْمِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : إِنَّمَا كَانَتِ الْمُتْعَةُ لَنَا خَاصَّةً.

2812. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Əbu əş-Şə'səi ﷺ demişdir: "Bir dəfə İbrahim ən-Nəxainin və İbrahim ət-Teyminin yanında idim. Mən dedim: "Bu il həcc ilə ümrəni birləşdirməyə qərar vermişəm". İbrahim dedi: "Atan olsaydı, belə etməzdi". Sonra İbrahilm ət-Teymi atasından rəvayət edərək Əbu Zərin belə dediyini buyurdu: "Təməttu həcci yalnız bizə icazəlidir".

٢٨١٣- أَخْبَرَنَا عَبْدُ الأَعْلَى بْنُ وَاصِلِ بْنِ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، عَنْ وُهَيْبِ بْنِ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانُوا يُرَوْنَ أَنَّ الْعُمْرَةَ ، فِي أَشْهُرِ الْحَجِّ مِنْ أَفْجَرِ الْفُجُورِ فِي الأَرْضِ ، وَيَجْعَلُونَ الْمُحَرَّمَ صَفَرَ ، وَيَقُولُونَ : إِذَا بَرَأَ الدَّبَرْ ، وَعَفَا الْوَبَرْ ، وَانْسَلَخَ صَفَرْ – أَوْ قَالَ : دَخَلَ صَفَرْ – فَقَدْ حَلَّتِ الْعُمْرَةُ لِمَنِ اعْتَمَرْ ، فَقَدِمَ النَّبِيُّ

[1] Yəni cahiliyyət dövründə ərəblər həcc aylarında ümrə edilməsini qadağan edirdilər. İslamda isə bu icazəlidir. Hədisdə qəsd də həcc aylarında ümrənin icazəli olmasını göstərməkdir.

صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ صَبِيحَةَ رَابِعَةٍ مُهِلِّينَ بِالْحَجِّ فَأَمَرَهُمْ أَنْ يَجْعَلُوهَا عُمْرَةً فَتَعَاظَمَ ذَلِكَ عِنْدَهُمْ ، فَقَالُوا : يَا رَسُولَ اللهِ أَيُّ الْحِلِّ ؟ قَالَ : الْحِلُّ كُلُّهُ.

2813. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Cahiliyyə vaxtı həcc aylarında ümrə etmək yer üzündə edilən pisliklərin ən pisi sayılırdı. Ona görə də Muhərrəm ayının yerini Səfər ayı ilə dəyişdirir və deyirdilər: "Dəvələrin yaraları sağalıb tükləri çıxdıqda və Səfər ayı girdikdə ümrə etmək istəyən edə bilər". Peyğəmbər ﷺ və səhabələri Məkkəyə gəldikdə həcc niyyəti ilə ehrama girdiklərinin dördüncü günün səhəri Peyğəmbər ﷺ onlara həcc niyyətlərini ümrə ilə dəyişdirmələrini əmr etdi. Bu, onlar üçün böyük bir hadisə idi, ona görə belə dedilər: "Ey Allahın Elçisi, ehramdan necə çıxaq?" Peyğəmbər ﷺ buyurdu: "Ehramdan tam çıxın!"

٢٨١٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مُسْلِمٍ وَهُوَ الْقُرِّيُّ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : أَهَلَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْعُمْرَةِ ، وَأَهَلَّ أَصْحَابُهُ بِالْحَجِّ ، وَأَمَرَ مَنْ لَمْ يَكُنْ مَعَهُ الْهَدْيُ ، أَنْ يَحِلَّ ، وَكَانَ فِيمَنْ لَمْ يَكُنْ مَعَهُ الْهَدْيُ طَلْحَةُ بْنُ عُبَيْدِ اللهِ ، وَرَجُلٌ آخَرُ فَأَحَلاَّ.

2814. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ ümrə niyyəti ilə ehrama girdi. Səhabələri isə ehrama həcc niyyəti ilə girdilər. Sonra yanında qurbanlıq heyvan gətirməyənlərə ehramdan çıxmağı əmr etdi. Təlhə ibn Ubeydullah və başqa bir nəfər də qurbanlıq heyvan gətirməyənlərdən idilər. Onlar da ehramdan çıxdılar".

٢٨١٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : هَذِهِ عُمْرَةٌ اسْتَمْتَعْنَاهَا ، فَمَنْ لَمْ يَكُنْ عِنْدَهُ هَدْيٌ ، فَلْيَحِلَّ الْحِلَّ كُلَّهُ ، فَقَدْ دَخَلَتِ الْعُمْرَةُ فِي الْحَجِّ.

2815. ...İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Bu, ümrədir. Ümrə ilə həcci birləşdirdik. Kim yanında qurbanlıq heyvan gətirməyibsə, ehramdan tam şəkildə çıxsın. Beləliklə də ümrə həccin tərkibinə girmiş oldu".

## ٧٨- مَا يَجُوزُ لِلْمُحْرِمِ أَكْلُهُ مِنَ الصَّيْدِ

## 78-ci fəsil: Ehramda olan ov əti yeyə bilərmi?

٢٨١٦- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي النَّضْرِ ، عَنْ نَافِعٍ مَوْلَى أَبِي قَتَادَةَ ، عَنْ أَبِي قَتَادَةَ ، أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى إِذَا كَانَ بِبَعْضِ طَرِيقِ مَكَّةَ تَخَلَّفَ مَعَ أَصْحَابٍ لَهُ مُحْرِمِينَ ، وَهُوَ غَيْرُ مُحْرِمٍ ، وَرَأَى حِمَارًا وَحْشِيًّا فَاسْتَوَى عَلَى فَرَسِهِ ، ثُمَّ

سَأَلَ أَصْحَابَهُ أَنْ يُنَاوِلُوهُ سَوْطَهُ ، فَأَبَوْا فَسَأَلَهُمْ رُمْحَهُ فَأَبَوْا فَأَخَذَهُ ، ثُمَّ شَدَّ عَلَى الْحِمَارِ فَقَتَلَهُ فَأَكَلَ مِنْهُ بَعْضُ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبَى بَعْضُهُمْ ، فَأَدْرَكُوا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَسَأَلُوهُ عَنْ ذَلِكَ ؟ فَقَالَ : إِنَّمَا هِيَ طُعْمَةٌ أَطْعَمَكُمُوهَا اللَّهُ عَزَّ وَجَلَّ.

2816. ...Əbu Qatədə ﵁ rəvayət edir ki, Məkkəyə gedərkən yolda Allah Elçisi ﷺ ilə birlikdə idim. Səhabələrdən bəziləri ehramlı, bəziləri isə ehramsız idi. Mən də ehramsız olanlardan idim. Bir çöleşşəyini gördüm və atımla ona yönəldim. Yoldaşlarımdan qamçımı mənə uzatmalarını istədim, lakin vermədilər. Nizəmi də istədim, onu da vermədilər. Belə olduqda nizəmi özüm götürüb çöleşşəyinə atdım və onu öldürdüm. Bu heyvanın ətindən bəzi səhabələr yedilər, bəziləri isə yemədilər. Məsələni Allah Elçisinə ﷺ xəbər verdikdə buyurdu: “O, Allahın ﷿ sizə nəsib etdiyi nemətdir”.

٢٨١٧- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ الْمُنْكَدِرِ ، عَنْ مُعَاذِ بْنِ عَبْدِ الرَّحْمَنِ التَّيْمِيِّ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنَّا مَعَ طَلْحَةَ بْنِ عُبَيْدِ اللهِ وَنَحْنُ مُحْرِمُونَ ، فَأُهْدِيَ لَهُ طَيْرٌ وَهُوَ رَاقِدٌ ، فَأَكَلَ بَعْضُنَا ، وَتَوَرَّعَ بَعْضُنَا ، فَاسْتَيْقَظَ طَلْحَةُ فَوَفَّقَ مَنْ أَكَلَهُ ، وَقَالَ : أَكَلْنَاهُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2817. ...Muaz ibn Abdur-Rahmən ət-Teymi atasının ﵀ belə dediyini rəvayət etmişdir: “Mən Təlhə ibn Ubeydullah ilə birlikdə idim. Hamımız ehramda idik. Təlhə yatdığı vaxt hədiyyə olaraq ona bir quş gətirildi. Bu quşun ətindən oradakıların bir qismi yedi, bir qismi isə o əti yeməkdən ehtiyat etdi. Bu əsnada Təlhə oyandı və o ətin yeyilə biləcəyini bildirərək dedi: “Biz Allah Elçisi ﷺ ilə ondan yemişdik”.

٢٨١٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ بْنِ الْحَارِثِ ، عَنْ عِيسَى بْنِ طَلْحَةَ ، عَنْ عُمَيْرِ بْنِ سَلَمَةَ الضَّمْرِيِّ أَنَّهُ أَخْبَرَهُ ، عَنِ الْبَهْزِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ يُرِيدُ مَكَّةَ وَهُوَ مُحْرِمٌ حَتَّى إِذَا كَانُوا بِالرَّوْحَاءِ إِذَا حِمَارُ وَحْشٍ عَقِيرٌ ، فَذُكِرَ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : ودَعُوهُ فَإِنَّهُ يُوشِكُ أَنْ يَأْتِيَ صَاحِبُهُ فَجَاءَ الْبَهْزِيُّ وَهُوَ صَاحِبُهُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ صَلَّى اللَّهُ عَلَيْكَ وَسَلَّمَ شَأْنَكُمْ بِهَذَا الْحِمَارِ ، فَأَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَبَا بَكْرٍ فَقَسَّمَهُ بَيْنَ الرِّفَاقِ ، ثُمَّ مَضَى حَتَّى إِذَا كَانَ بِالأُثَايَةِ ، بَيْنَ الرُّوَيْثَةِ وَالْعَرْجِ ، إِذَا ظَبْيٌ حَاقِفٌ فِي ظِلٍّ وَفِيهِ سَهْمٌ ، فَزَعَمَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَمَرَ رَجُلاً يَقِفُ عِنْدَهُ لاَ يُرِيبُهُ أَحَدٌ مِنَ النَّاسِ ، حَتَّى يُجَاوِزَهُ.

2818. ...əl-Bəhzi ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Məkkəyə getmək üçün ehramlı olaraq yola çıxdı. ər-Ravha adlı yerə çatdıqda qıçı qırılmış bir çöleşşəyi gördülər. Bunu Allah Elçisinə ﷺ xəbər verdikdə o buyurdu: “Ona dəyməyin, indi yiyəsi gələr”. Sonra əl-Bəhzi Allah Elçisinin ﷺ yanına gəldi,

çöleşşəyinin yiyəsi o idi. əl-Bəhzi dedi: "Ey Allahın Elçisi, bu çöleşşəyini götür, sənin olsun". Allah Elçisi ﷺ də Əbu Bəkrə çöleşşəyini yoldaşları arasında paylaşdırmağı əmr etdi. Sonra bir az getdilər və ər-Ruveysə ilə əl-Arc deyilən yerlərin arasında olan Usayə adlı yerə gəldilər. Baxıb gördülər ki, oxla vurulmuş bir ceyran kölgədə inildəyir. Allah Elçisi ﷺ bir nəfərin ceyrana yaxınlaşmasını və hamı onun yanından keçənə qədər onu hürkütməmələrini istədi".

٧٩- مَا لاَ يَجُوزُ لِلْمُحْرِمِ أَكْلُهُ مِنَ الصَّيْدِ

79-cu fəsil: Ehramda olan ov əti yeyə bilməzmi?

٢٨١٩- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنِ الصَّعْبِ بْنِ جَثَّامَةَ أَنَّهُ أَهْدَى لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِمَارَ وَحْشٍ ، وَهُوَ بِالأَبْوَاءِ - أَوْ بِوَدَّانَ - فَرَدَّهُ عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا رَأَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا فِي وَجْهِي ؟ قَالَ : أَمَا إِنَّهُ لَمْ نَرُدَّهُ عَلَيْكَ ، إِلاَّ أَنَّا حُرُمٌ.

2819. ...əs-Sabi ibn Cusəmə ؓ rəvayət edir ki, mən "əl-Əbva" və ya "Vəddan" deyilən yerdə Allah Elçisinə ﷺ bir çöleşşəyini hədiyyə etmişdim. Lakin Allah Elçisi ﷺ bunu qəbul etmədi. O, üzümdən mənim kədərləndiyimi gördükdə buyurdu: "Ehramlı olduğuma görə rədd etdim, yoxsa qəbul edərdim".

٢٨٢٠- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ صَالِحِ بْنِ كَيْسَانَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ الصَّعْبِ بْنِ جَثَّامَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَقْبَلَ حَتَّى إِذَا كَانَ بِوَدَّانَ رَأَى حِمَارَ وَحْشٍ فَرَدَّهُ عَلَيْهِ ، وَقَالَ : إِنَّا حُرُمٌ لاَ نَأْكُلُ الصَّيْدَ.

2820. ...əs-Sab ibn Cusəmə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ Vəddana gəldikdə çöleşşəyini gördü və onu yeməyə yaxınlaşmadı. O buyurdu: "Biz ehramlıyıq, ona görə ov əti yemirik".

٢٨٢١- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا قَيْسُ بْنُ سَعْدٍ ، عَنْ عَطَاءٍ ، أَنَّ ابْنَ عَبَّاسٍ ، قَالَ لِزَيْدِ بْنِ أَرْقَمَ : مَا عَلِمْتَ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أُهْدِيَ لَهُ عُضْوُ صَيْدٍ ، وَهُوَ مُحْرِمٌ فَلَمْ يَقْبَلْهُ ، قَالَ : نَعَمْ.

2821. ...Əta ؒ rəvayət edir ki, İbn Abbas ؓ Zeyd ibn Ərqama dedi: "Peyğəmbərə ﷺ ov ətindən yemək təklif edildikdə ehramlı olduğuna görə imtina etdiyini bilirdinmi?" Zeyd də: "Bəli" dedi".

٢٨٢١م- أَخْبَرَنِي عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : سَمِعْتُ يَحْيَى ، وَسَمِعْتُ أَبَا عَاصِمٍ ، قَالاَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي الْحَسَنُ بْنُ مُسْلِمٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَدِمَ زَيْدُ بْنُ أَرْقَمَ فَقَالَ لَهُ ابْنُ عَبَّاسٍ يَسْتَذْكِرُهُ كَيْفَ أَخْبَرْتَنِي عَنْ لَحْمِ صَيْدٍ أُهْدِيَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ حَرَامٌ ؟ قَالَ : نَعَمْ ، أَهْدَى لَهُ رَجُلٌ عُضْوًا مِنْ لَحْمِ صَيْدٍ فَرَدَّهُ ، وَقَالَ : إِنَّا لاَ نَأْكُلُ ، إِنَّا حُرُمٌ.

2821m. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Zeyd ibn Ərqam gəldikdə İbn Abbas ﷺ ona yuxarıda deyilənləri xatırladaraq dedi: "Allah Elçisinin ﷺ ehramlı ikən ov ətinin ona hədiyyə edilməsi haqda mənə xəbər vermişdin". Zeyd dedi: "Bəli, ona bir nəfər ov ətindən bir hissəni yemək üçün hədiyyə etmişdi, lakin Peyğəmbər ﷺ onu qəbul etməmiş və belə buyurmuşdu: "Biz bunu yeyə bilmərik, çünki ehramlıyıq".

٢٨٢٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنِ الْحَكَمِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : أَهْدَى الصَّعْبُ بْنُ جَثَّامَةَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رِجْلَ حِمَارِ وَحْشٍ تَقْطُرُ دَمًا ، وَهُوَ مُحْرِمٌ وَهُوَ بِقُدَيْدٍ ، فَرَدَّهَا عَلَيْهِ.

2822. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ ehramlı ikən əs-Sab ibn Cusəmə Qudəd adlı yerdə ona vəhşi eşşəyin qanı axan halda budunu gətirdi, lakin Peyğəmbər ﷺ onu qəbul etmədi".

٢٨٢٣- أَخْبَرَنَا يُوسُفُ بْنُ حَمَّادٍ الْمَعْنِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ بْنُ حَبِيبٍ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، وَحَبِيبٌ ، وَهُوَ ابْنُ أَبِي ثَابِتٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ الصَّعْبَ بْنَ جَثَّامَةَ ، أَهْدَى لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِمَارًا ، وَهُوَ مُحْرِمٌ فَرَدَّهُ عَلَيْهِ.

2823. ...İbn Abbas ﷺ rəvayət edir ki, əs-Sab ibn Cusəmə Peyğəmbər ﷺ ehramlı ikən ona vəhşi eşşək əti hədiyyə etdi, lakin Peyğəmbər ﷺ onu qəbul etmədi.

## ٨٠- إِذَا ضَحِكَ الْمُحْرِمُ فَفَطِنَ الْحَلاَلُ لِلصَّيْدِ فَقَتَلَهُ أَيَأْكُلُهُ أَمْ لاَ ؟

## 80-ci fəsil: Başqasının ovladığı ətdən ehramlı olan yeyə bilər, yoxsa yox?

٢٨٢٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَتَادَةَ ، قَالَ : انْطَلَقَ أَبِي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ الْحُدَيْبِيَةِ ، فَأَحْرَمَ أَصْحَابُهُ وَلَمْ يُحْرِمْ فَبَيْنَمَا أَنَا مَعَ أَصْحَابِي ضَحِكَ بَعْضُهُمْ إِلَى بَعْضٍ ، فَنَظَرْتُ فَإِذَا حِمَارُ وَحْشٍ فَطَعَنْتُهُ فَاسْتَعَنْتُهُمْ فَأَبَوْا أَنْ يُعِينُونِي فَأَكَلْنَا مِنْ لَحْمِهِ ، وَخَشِينَا أَنْ نُقْتَطَعَ ، فَطَلَبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُرَفِّعُ فَرَسِي ، شَأْوًا وَأَسِيرُ شَأْوًا ، فَلَقِيتُ رَجُلاً مِنْ غِفَارٍ فِي جَوْفِ اللَّيْلِ ، فَقُلْتُ : أَيْنَ تَرَكْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : تَرَكْتُهُ وَهُوَ قَائِلٌ بِالسُّقْيَا فَلَحِقْتُهُ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّ أَصْحَابَكَ يَقْرَؤُونَ عَلَيْكَ السَّلاَمَ وَرَحْمَةَ اللهِ ، وَإِنَّهُمْ قَدْ خَشُوا أَنْ يُقْتَطَعُوا دُونَكَ ، فَانْتَظِرْهُمْ ، فَانْتَظَرَهُمْ فَقُلْتُ : يَا رَسُولَ اللهِ إِنِّي أَصَبْتُ حِمَارَ وَحْشٍ ، وَعِنْدِي مِنْهُ ، فَقَالَ لِلْقَوْمِ : كُلُوا ، وَهُمْ مُحْرِمُونَ.

2824. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Qatədə ﵀ demişdir: “Atam Hudeybiyyə ilində Allah Elçisi ﷺ ilə birlikdə yola çıxmışdı. Yoldaşları ehrama girmişdilər, atam isə girməmişdi. Atam deyir: “Bu arada mən dostlarımla birlikdə olanda onlardan bir qismi digərlərinə baxaraq gülüşdülər. Bir də baxdım ki, çöleşşəyi! Heyvanı yaraladım, yoldaşlarımdan kömək istədim, lakin mənə kömək etmək istəmədilər. Heyvanın ətindən yedik, lakin qorxduq, ona görə Allah Elçisinə ﷺ çatmaq üçün atımı gah çapdım, gah da adi halda sürməyə başladım. Gecə vaxtı Ğifar qəbiləsindən olan bir adamla rastlaşdım və ona dedim: “Sən Allah Elçisini ﷺ harada tərk etdin?” O dedi: “O, günorta vaxtı əs-Sufyada yatmışdı”. Beləcə, Peyğəmbərə ﷺ çatdım və dedim: “Ey Allahın Elçisi, səhabələrin sənə Allahın salamını və rəhmətini diləyirlər. Onlar düşmən tərəfindən səninlə aralarının kəsilməsindən narahatdırlar”. Dolayı şəkildə onun səhabələrini gözləməsini dedim. O da səhabələrini gözləməyə başladı. Mən dedim: “Ey Allahın Elçisi, mən vəhşi bir eşşək ovladım, yanımda da ondan bir az var”. Peyğəmbər ﷺ orada olanlara: “Yeyin!” dedi. Onların hamısı ehramda idi.

٢٨٢٥- أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ النَّسَائِيُّ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدٌ وَهُوَ ابْنُ الْمُبَارَكِ الصُّورِيُّ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ وَهُوَ ابْنُ سَلاَّمٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ أَبِي قَتَادَةَ ، أَنَّ أَبَاهُ ، أَخْبَرَهُ أَنَّهُ غَزَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَزْوَةَ الْحُدَيْبِيَةِ ، قَالَ : فَأَهَلُّوا بِعُمْرَةٍ غَيْرِي ، فَاصْطَدْتُ حِمَارَ وَحْشٍ ، فَأَطْعَمْتُ أَصْحَابِي مِنْهُ وَهُمْ مُحْرِمُونَ ، ثُمَّ أَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَنْبَأْتُهُ أَنَّ عِنْدَنَا مِنْ لَحْمِهِ فَاضِلَةً ، فَقَالَ : كُلُوهُ وَهُمْ مُحْرِمُونَ.

2825. ...Abdullah ibn Əbu Qatədə ﵀ rəvayət edir ki, atası Allah Elçisi ﷺ ilə birlikdə Hudeybiyyə döyüşündə idi. Atası deyir: “Məndən başqa hamı ümrə niyyəti ilə ehrama girmişdi. Mən bir çöleşşəyini ovlayaraq dostlarım ehramlı olmalarına baxmayaraq onlara yedirtdim. Sonra Allah Elçisinin ﷺ yanına gəldim və bu haqda ona məlumat verərək dedim: “Yanımda o ətdən var”. Peyğəmbər ﷺ orada olanlara: “Yeyin!” dedi. Onların hamısı ehramda idi.

### ٨١- إِذَا أَشَارَ الْمُحْرِمُ إِلَى الصَّيْدِ فَقَتَلَهُ الْحَلاَلُ

### 81-ci fəsil: Əgər ehramlı olan ova işarə edərsə, o ət ona halaldırmı?

٢٨٢٦- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي عُثْمَانُ بْنُ عَبْدِ اللهِ بْنِ مَوْهَبٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ أَبِي قَتَادَةَ ، يُحَدِّثُ عَنْ أَبِيهِ ، أَنَّهُمْ كَانُوا فِي مَسِيرٍ لَهُمْ ، بَعْضُهُمْ مُحْرِمٌ وَبَعْضُهُمْ لَيْسَ بِمُحْرِمٍ ، قَالَ : فَرَأَيْتُ حِمَارَ

وَحْشٍ فَرَكِبْتُ فَرَسِي ، وَأَخَذْتُ الرُّمْحَ فَاسْتَعَنْتُهُمْ فَأَبَوْا أَنْ يُعِينُونِي ، فَاخْتَلَسْتُ سَوْطًا مِنْ بَعْضِهِمْ ، فَشَدَدْتُ عَلَى الْحِمَارِ فَأَصَبْتُهُ ، فَأَكَلُوا مِنْهُ فَأَشْفَقُوا ، قَالَ : فَسُئِلَ عَنْ ذَلِكَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : هَلْ أَشَرْتُمْ أَوْ أَعَنْتُمْ ؟ قَالُوا : لاَ ، قَالَ : فَكُلُوا.

2826. ...Abdullah ibn Əbu Qatədə ﵄ rəvayət edir ki, bir dəfə atası yolda olarkən onların bir qismi ehramlı, bir qismi də ehramsız idi. Atası deyir: "Mən də bir çöleşşəyini görüb atıma mindim, nizəni götürüb dostlarımdan kömək istədim, lakin onlar mənə kömək etmədilər. Birinin nizəsini gizlincə götürdüm və çöleşşəyinə yaxınlaşıb ona atdım. Onu vurduqdan sonra onun ətindən ehtiyat edərək yedilər. Vəziyyəti Allah Elçisindən ﷺ soruşdular. Allah Elçisi ﷺ buyurdu: "Ovu ona göstərdinizmi və ya ovlamaq üçün ona yardım etdinizmi?" Onlar da: "Xeyr" dedilər. Onda Allah Elçisi ﷺ buyurdu: "Elə isə yeyin".

٢٨٢٧- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَمْرٍو ، عَنِ الْمُطَّلِبِ ، عَنْ جَابِرٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : صَيْدُ الْبَرِّ لَكُمْ حَلاَلٌ مَا لَمْ تَصِيدُوهُ ، أَوْ يُصَادَ لَكُمْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : عَمْرُو بْنُ أَبِي عَمْرٍو لَيْسَ بِالْقَوِيِّ فِي الْحَدِيثِ ، وَإِنْ كَانَ قَدْ رَوَى عَنْهُ مَالِكٌ.

2827. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Özünüz ovlamadığınız və sizin üçün ovlanmadığı müddətdə quruda yaşayan ov ətindən yeyə bilərsiniz".[1]

٨٢- مَا يَقْتُلُ الْمُحْرِمُ مِنَ الدَّوَابِّ قَتْلُ الْكَلْبِ الْعَقُورِ

## 82-ci fəsil: Ehramlı olan heyvanlardan quduz iti öldürə bilərmi?

٢٨٢٨- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ لَيْسَ عَلَى الْمُحْرِمِ فِي قَتْلِهِنَّ جُنَاحٌ : الْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْعَقْرَبُ ، وَالْفَأْرَةُ ، وَالْكَلْبُ الْعَقُورُ.

2828. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Ehramlının bu beş heyvanı öldürməsi günah deyil: qarğa, çalağan, əqrəb, siçovul və quduz it".

٨٣- قَتْلُ الْحَيَّةِ

## 83-cü fəsil: Ehramlının ilan öldürməsi

٢٨٢٩- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ

[1] Hədis zəifdir.

عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ يَقْتُلُهُنَّ الْمُحْرِمُ : الْحَيَّةُ ، وَالْفَأْرَةُ ، وَالْحِدَأَةُ ، وَالْغُرَابُ الأَبْقَعُ ، وَالْكَلْبُ الْعَقُورُ.

2829. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ehramlı bu beş heyvanı öldürə bilər: ilan, siçovul, çalağan, qarğa və quduz it".

٨٤- قَتْلُ الْفَأْرَةِ

84-cü fəsil: Ehramlının siçovul öldürməsi

٢٨٣٠- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَذِنَ فِي قَتْلِ خَمْسٍ مِنَ الدَّوَابِّ لِلْمُحْرِمِ : الْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْفَأْرَةُ ، وَالْكَلْبُ الْعَقُورُ ، وَالْعَقْرَبُ.

2830. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ ehramlının bu beş heyvanı öldürməsinə icazə vermişdir: qarğa, çalağan, siçovul quduz it və əqrəb".

٨٥- قَتْلُ الْوَزَغِ

85-ci fəsil: Ehramlının kərtənkələ öldürməsi

٢٨٣١- أَخْبَرَنِي أَبُو بَكْرِ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ مُحَمَّدِ بْنِ عَرْعَرَةَ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، أَنَّ امْرَأَةً دَخَلَتْ عَلَى عَائِشَةَ وَبِيَدِهَا عُكَّازٌ ، فَقَالَتْ : مَا هَذَا ؟ فَقَالَتْ : لِهَذِهِ الْوَزَغِ لأَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَدَّثَنَا أَنَّهُ لَمْ يَكُنْ شَيْءٌ إِلاَّ يُطْفِئُ ، عَلَى إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ إِلاَّ هَذِهِ الدَّابَّةُ فَأَمَرَنَا بِقَتْلِهَا ، وَنَهَى عَنْ قَتْلِ الْجِنَّانِ ، إِلاَّ ذَا الطُّفْيَتَيْنِ ، وَالأَبْتَرَ ، فَإِنَّهُمَا يَطْمِسَانِ الْبَصَرَ ، وَيُسْقِطَانِ مَا فِي بُطُونِ النِّسَاءِ.

2831. ...Səid ibn əl-Museyyib ﵁ rəvayət etmişdir ki, bir qadın əlində əsa ilə Aişənin yanına gəldi. Aişə dedi: "Bu nədir?" Qadın dedi: "Bu, kərtənkələ öldürmək üçündür, çünki Allahın Peyğəmbəri ﷺ bizə bir hədis danışmışdı. Belə ki İbrahim oda atıldıqda bütün heyvanlar onu söndürməyə çalışmışlar, ancaq bu heyvanın odu söndürməkdə səyi olmamışdır. Ona görə də Peyğəmbər onun öldürülməsini əmr etmişdi. Həmçinin qısa quyruqlu ilanın və nəsli kəsilmiş ilanların[1] öldürülməsini qadağan etdi. O ikisi insanların gözlərini kor edir və qadınların bətnlərindəki uşaqları salırlar".

[1] Yəni nəsli kəsilməkdə olan, gec-gec rastlanan ilanlar.

## ٨٦- قَتْلُ الْعَقْرَبِ

## 86-cı fəsil: Ehramlının əqrəb öldürməsi

٢٨٣٢- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ أَبُو قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، قَالَ : أَخْبَرَنِي نَافِعٌ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ مِنَ الدَّوَابِّ لاَ جُنَاحَ عَلَى مَنْ قَتَلَهُنَّ – أَوْ فِي قَتْلِهِنَّ – وَهُوَ حَرَامٌ : الْحِدَأَةُ ، وَالْفَأْرَةُ ، وَالْكَلْبُ الْعَقُورُ ، وَالْعَقْرَبُ ، وَالْغُرَابُ.

2832. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ehramlının bu beş heyvanı öldürməsi günah deyil: çalağan, siçovul, quduz it, əqrəb və qarğa".

## ٨٧- قَتْلُ الْحِدَأَةِ

## 87-ci fəsil: Ehramlının çalağanı öldürməsi

٢٨٣٣- أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : أَنْبَأَنَا أَيُّوبُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : قَالَ رَجُلٌ : يَا رَسُولَ اللهِ مَا نَقْتُلُ مِنَ الدَّوَابِّ إِذَا أَحْرَمْنَا ؟ قَالَ : خَمْسٌ لاَ جُنَاحَ عَلَى مَنْ قَتَلَهُنَّ : الْحِدَأَةُ ، وَالْغُرَابُ ، وَالْفَأْرَةُ ، وَالْعَقْرَبُ ، وَالْكَلْبُ الْعَقُورُ.

2833. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Bir kişi dedi: "Ey Allahın Elçisi, ehramlı olduqda hansı heyvanı öldürə bilərik?" Peyğəmbər ﷺ belə buyurdu: "Bu beş heyvanı öldürmək günah deyil: çalağan, qarğa, siçovul, əqrəb və quduz it".

## ٨٨- قَتْلُ الْغُرَابِ

## 88-ci fəsil: Ehramlının qarğanı öldürməsi

٢٨٣٤- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُئِلَ مَا يَقْتُلُ الْمُحْرِمُ ؟ قَالَ : يَقْتُلُ الْعَقْرَبَ ، وَالْفُوَيْسِقَةَ ، وَالْحِدَأَةَ ، وَالْغُرَابَ ، وَالْكَلْبَ الْعَقُورَ.

2834. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbərə ﷺ ehramlının nəyi öldürməyə icazə verilməsi haqda sual verildi. Peyğəmbər ﷺ buyurdu: "Əqrəbi, daşıyıcı olan siçovulu, çalağanı, qarğanı və quduz iti öldürmək olar".

٢٨٣٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسٌ مِنَ الدَّوَابِّ لاَ جُنَاحَ فِي قَتْلِهِنَّ عَلَى مَنْ قَتَلَهُنَّ فِي الْحَرَمِ وَالإِحْرَامِ : الْفَأْرَةُ ، وَالْحِدَأَةُ ، وَالْغُرَابُ ، وَالْعَقْرَبُ ، وَالْكَلْبُ الْعَقُورُ.

2835. ...Səlim atasının رضي الله عنه belə dediyini rəvayət etmişdir: “Peyğəmbər ﷺ belə buyurdu: “Haram ərazisində ehramlının belə bu beş heyvanı öldürməsi günah deyil: siçovul, çalağan, qarğa, əqrəb və quduz it”.

## ٨٩- مَا لاَ يَقْتُلُهُ الْمُحْرِمُ

## 89-cu fəsil: Ehramlı nəyi öldürə bilər?

٢٨٣٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي ابْنُ جُرَيْجٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُبَيْدِ بْنِ عُمَيْرٍ ، عَنْ ابْنِ أَبِي عَمَّارٍ ، قَالَ : سَأَلْتُ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، عَنِ الضَّبُعِ فَأَمَرَنِي بِأَكْلِهَا قُلْتُ : أَصَيْدٌ هِيَ ؟ قَالَ : نَعَمْ قُلْتُ : أَسَمِعْتَهُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : نَعَمْ.

2836. ...Rəvayət edilir ki, İbn Əbu Əmmar رضي الله عنه demişdir: “Mən Cabir ibn Abdullahdan kaftar haqda soruşdum. O da kaftar ətinin yeyilməsinin icazəli olmasını söylədi. Mən dedim: “Onu ovlamaq olar?” O dedi: “Bəli”. Mən dedim: “Sən bunu Allah Elçisindən ﷺ eşitmisən?” O da: “Bəli” dedi”.

## ٩٠- الرُّخْصَةُ فِي النِّكَاحِ لِلْمُحْرِمِ

## 90-cı fəsil: Ehramlının evlənə bilməsi rüsxəti

٢٨٣٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ وَهُوَ ابْنُ عَبْدِ الرَّحْمَنِ الْعَطَّارُ ، عَنْ عَمْرٍو وَهُوَ ابْنُ دِينَارٍ ، قَالَ : سَمِعْتُ أَبَا الشَّعْثَاءِ يُحَدِّثُ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : تَزَوَّجَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَيْمُونَةَ ، وَهُوَ مُحْرِمٌ.

2837. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ Məymunə ilə ehramlı ikən evlənmişdir”.

٢٨٣٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ دِينَارٍ ، أَنَّ أَبَا الشَّعْثَاءِ حَدَّثَهُ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَكَحَ حَرَامًا.

2838. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ ehramlı ikən evlənmişdir.

٢٨٣٩- أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يُونُسَ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ حُمَيْدٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَزَوَّجَ مَيْمُونَةَ ، وَهُمَا مُحْرِمَانِ.

2839. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ Məymunə ilə ikisi də ehramlı ikən evlənmişdir.

٢٨٤٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْحَاقَ الصَّاغَانِيُّ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ حُمَيْدٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَزَوَّجَ مَيْمُونَةَ ، وَهُوَ مُحْرِمٌ.

2840. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Məymunə ilə ehramlı ikən evlənmişdir.

٢٨٤١- أَخْبَرَنِي شُعَيْبُ بْنُ شُعَيْبِ بْنِ إِسْحَاقَ ، وَصَفْوَانُ بْنُ عَمْرٍو الْحِمْصِيُّ ، قَالاَ : حَدَّثَنَا أَبُو الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، عَنِ ابْنِ عَبَّاسٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، تَزَوَّجَ مَيْمُونَةَ ، وَهُوَ مُحْرِمٌ.

2841. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Məymunə ilə ehramlı ikən evlənmişdir.

### ٩١- النَّهْيُ عَنْ ذَلِكَ

### 91-ci fəsil: Ehramlı ikən evlənməyin qadağan olunması

٢٨٤٢- أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ نُبَيْهِ بْنِ وَهْبٍ ، أَنَّ أَبَانَ بْنَ عُثْمَانَ ، قَالَ : سَمِعْتُ عُثْمَانَ بْنَ عَفَّانَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَنْكِحُ الْمُحْرِمُ ، وَلاَ يَخْطُبُ ، وَلاَ يُنْكِحُ.

2842. ...Rəvayət edilir ki, Osman ibn Əffan ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ehramda olan nə evlənə bilər, nə qız istəmək məqsədilə danışa bilər, nə də başqasının nikahını kəsə bilər".

٢٨٤٣- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ مَالِكٍ ، أَخْبَرَنِي نَافِعٌ ، عَنْ نُبَيْهِ بْنِ وَهْبٍ ، عَنْ أَبَانَ بْنِ عُثْمَانَ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ نَهَى أَنْ يَنْكِحَ الْمُحْرِمُ ، أَوْ يُنْكِحَ ، أَوْ يَخْطُبَ.

2843. ...Əban ibn Osman atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ehramlıya evlənməyi, qız istəmək məqsədilə danışmağı və başqasının nikahını kəsməsini qadağan etmişdir.

٢٨٤٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، عَنْ سُفْيَانَ ، عَنْ أَيُّوبَ بْنِ مُوسَى ، عَنْ نُبَيْهِ بْنِ وَهْبٍ ، قَالَ : أَرْسَلَ عُمَرُ بْنُ عُبَيْدِ اللهِ بْنِ مَعْمَرٍ إِلَى أَبَانَ بْنِ عُثْمَانَ يَسْأَلُهُ أَيَنْكِحُ الْمُحْرِمُ ؟ فَقَالَ أَبَانُ : إِنَّ عُثْمَانَ بْنَ عَفَّانَ حَدَّثَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَنْكِحُ الْمُحْرِمُ ، وَلاَ يَخْطُبُ.

2844. ...Rəvayət edilir ki, Nubeyh ibn Vəhb ﷺ demişdir: "Ömər ibn Ubeydullah ibn Mə'mər Əban ibn Osmana ehramlının kiminsə kəbinini kəsməsinin icazəli olub-olmadığını öyrənmək üçün adam göndərdi. Əban

dedi: “Osman ibn Əffan dedi ki, Peyğəmbər ﷺ belə buyurdu: “Ehramlı olan nə başqasının nikahını kəsə bilər, nə də başqasından qız istəyə bilər”.

## ٩٢- الْحِجَامَةُ لِلْمُحْرِمِ

## 92-ci fəsil: Ehramlının qan aldırması

٢٨٤٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ عَطَاءٍ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ احْتَجَمَ ، وَهُوَ مُحْرِمٌ.

2845. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ ehramlı ikən qan aldırmışdır.

٢٨٤٦- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ طَاوُوسٍ ، وَعَطَاءٌ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ احْتَجَمَ ، وَهُوَ مُحْرِمٌ.

2846. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ ehramlı ikən qan aldırmışdır.

٢٨٤٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : أَنْبَأَنَا عَمْرُو بْنُ دِينَارٍ ، قَالَ : سَمِعْتُ عَطَاءً ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : احْتَجَمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ ثُمَّ قَالَ بَعْدُ : أَخْبَرَنِي طَاوُوسٌ ، عَنْ ابْنِ عَبَّاسٍ يَقُولُ : احْتَجَمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مُحْرِمٌ.

2847. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ ehramlı ikən qan aldırmışdır”.

## ٩٣- حِجَامَةُ الْمُحْرِمِ مِنْ عِلَّةٍ تَكُونُ بِهِ

## 93-cü fəsil: Ehramlı hansısa bir səbəbə görə qan aldırması

٢٨٤٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبُو الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ احْتَجَمَ وَهُوَ مُحْرِمٌ مِنْ وَثْءٍ كَانَ بِهِ.

2848. ...Cabir رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ bir ehtiyacına görə ehramlı ikən qan aldırmışdır.

٩٤- حِجَامَةُ الْمُحْرِمِ عَلَى ظَهْرِ الْقَدَمِ

94-cü fəsil: Ehramlının ayağının üstündən qan aldırması

٢٨٤٩- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ احْتَجَمَ وَهُوَ مُحْرِمٌ عَلَى ظَهْرِ الْقَدَمِ مِنْ وَثْءٍ كَانَ بِهِ.

2849. ...Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir ehtiyacına görə ehramlı ikən ayağında olan qançırın[1] üstündən qan aldırmışdır.

٩٥- حِجَامَةُ الْمُحْرِمِ وَسَطَ رَأْسِهِ

95-ci fəsil: Ehramlının başının ortasından qan aldırması

٢٨٥٠- أَخْبَرَنِي هِلاَلُ بْنُ بِشْرٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ خَالِدٍ وَهُوَ ابْنُ عَثْمَةَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ بِلاَلٍ ، قَالَ : قَالَ عَلْقَمَةُ بْنُ أَبِي عَلْقَمَةَ ، أَنَّهُ سَمِعَ الأَعْرَجَ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ ابْنَ بُحَيْنَةَ يُحَدِّثُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ احْتَجَمَ وَسَطَ رَأْسِهِ وَهُوَ مُحْرِمٌ ، بِلَحْيِ جَمَلٍ مِنْ طَرِيقِ مَكَّةَ.

2850. ...Abdullah ibn Buheynə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Məkkəyə gedən yolun üstündə "Ləhyi Cəməl" adlı yerdə ehramlı ikən başının ortasından qan aldırmışdır.

٩٦- فِي الْمُحْرِمِ يُؤْذِيهِ الْقَمْلُ فِي رَأْسِهِ

96-cı fəsil: Ehramlının başında olan bitə görə əziyyət çəkməsi

٢٨٥١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَبْدِ الْكَرِيمِ بْنِ مَالِكٍ الْجَزَرِيِّ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ، أَنَّهُ كَانَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُحْرِمًا ، فَآذَاهُ الْقَمْلُ فِي رَأْسِهِ فَأَمَرَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنْ يَحْلِقَ رَأْسَهُ ، وَقَالَ : صُمْ ثَلاَثَةَ أَيَّامٍ ، أَوْ أَطْعِمْ سِتَّةَ مَسَاكِينَ ، مُدَّيْنِ مُدَّيْنِ أَوِ انْسُكْ شَاةً ، أَيَّ ذَلِكَ فَعَلْتَ أَجْزَأَ عَنْكَ.

2851. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﷺ ehramlı ikən Allah Elçisinin ﷺ yanında idi. O, başında olan bitlərdən əziyyət çəkirdi. Allah Elçisi ﷺ ona başını keçəl etdirməyi əmr etdi və buyurdu: "Üç gün oruc tut və ya altı kasıbı iki mudd ərzaq verərək yedirt, ya da bir qoyun kəs. Bunlardan hansını etsən, əvəzini ödəmiş olarsan".

---

[1] Qançır – zərbədən, soyuqdan və başaqa səbəblərdən əmələ gələn və dərinin altında qalan laxtalanmış qana deyilir.

٢٨٥٢- أَخْبَرَنِي أَحْمَدُ بْنُ سَعِيدٍ الرِّبَاطِيُّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ عَبْدِ اللهِ وَهُوَ الدَّشْتَكِيُّ ، قَالَ : أَنْبَأَنَا عَمْرٌو وَهُوَ ابْنُ أَبِي قَيْسٍ ، عَنِ الزُّبَيْرِ وَهُوَ ابْنُ عَدِيٍّ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ، قَالَ : أَحْرَمْتُ ، فَكَثُرَ قَمْلُ رَأْسِي ، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَتَانِي ، وَأَنَا أَطْبُخُ قِدْرًا لأَصْحَابِي فَمَسَّ رَأْسِي بِإِصْبَعِهِ ، فَقَالَ : انْطَلِقْ فَاحْلِقْهُ ، وَتَصَدَّقْ عَلَى سِتَّةِ مَسَاكِينَ.

2852. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﷺ demişdir: "Mən ehramlı idim və başımda bit çoxalmışdı. Məsələ Peyğəmbərə ﷺ çatdıqda mənim yanıma gəldi. Bu vaxt mən qazanla yoldaşlarıma yemək bişirirdim. Peyğəmbər ﷺ başımı məsh etdi və buyurdu: "Get, başını keçəl elətdir və altı kasıbı yedirt".

٩٧- غَسْلُ الْمُحْرِمِ بِالسِّدْرِ إِذَا مَاتَ

## 97-ci fəsil: Ehramlı vəfat etdikdə onu sidr ilə qüsl etmək

٢٨٥٣- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا أَبُو بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَجُلاً كَانَ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَوَقَصَتْهُ نَاقَتُهُ وَهُوَ مُحْرِمٌ ، فَمَاتَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ ، وَسِدْرٍ ، وَكَفِّنُوهُ فِي ثَوْبَيْهِ ، وَلاَ تُمِسُّوهُ بِطِيبٍ ، وَلاَ تُخَمِّرُوا رَأْسَهُ ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا.

2853. ...İbn Abbas ﷺ rəvayət edir ki, bir kişi Peyğəmbərlə ﷺ birlikdə idi. O, ehramda olduğu halda dəvəsindən yıxıldı və boynu sınaraq öldü. Allah Elçisi ﷺ buyurdu: "Onu su və sidr ilə qüsl edin, iki (ehram) parçası ilə kəfənləyin və ona ətir vurmayın. Başını isə örtməyin, çünki o, Qiyamət günü təlbiyə deyərək diriləcək".

٩٨- فِي كَمْ يُكَفَّنُ الْمُحْرِمُ إِذَا مَاتَ

## 98-ci fəsil: Ehramlı vəfat etdikdə ona neçə parça kəfən istifadə olunur?

٢٨٥٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَجُلاً مُحْرِمًا صُرِعَ عَنْ نَاقَتِهِ ، فَأُوقِصَ ذُكِرَ أَنَّهُ قَدْ مَاتَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ وَسِدْرٍ ، وَكَفِّنُوهُ فِي ثَوْبَيْنِ ، ثُمَّ قَالَ : عَلَى إِثْرِهِ خَارِجًا رَأْسُهُ ، قَالَ : وَلاَ تُمِسُّوهُ طِيبًا ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا قَالَ شُعْبَةُ : فَسَأَلْتُهُ بَعْدَ عَشْرِ سِنِينَ ، فَجَاءَ بِالْحَدِيثِ كَمَا كَانَ يَجِيءُ بِهِ إِلاَّ أَنَّهُ قَالَ : وَلاَ تُخَمِّرُوا وَجْهَهُ ، وَرَأْسَهُ.

2854. ...İbn Abbas ﷺ rəvayət edir ki, bir kişi Peyğəmbərlə ﷺ birlikdə idi. O, ehramlı olduğu halda dəvəsindən yıxıldı və boynu sınaraq öldü. Peyğəmbər ﷺ buyurdu: "Onu su və sidr ilə qüsl edin, iki (ehram) parçası ilə kəfənləyin. Başını örtməyin və ətir də vurmayın, çünki o, Qiyamət günü təlbiyə deyərək diriləcək". Ravi Şubə deyir: "Bu hədisi mənə danışandan

on il sonra Bişrdən soruşduqda ilk dəfə söylədiyi kimi söylədi. Bir yerdə fərq var idi, oda "üzünü və başını örtməyin" sözü idi".

٩٩- النَّهْيُ عَنْ أَنْ يُحَنَّطَ الْمُحْرِمُ إِذَا مَاتَ

99-cu fəsil: Ehramlı vəfat etdikdə ona ətir vurmağın qadağan edilməsi

٢٨٥٥- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : بَيْنَا رَجُلٌ وَاقِفٌ بِعَرَفَةَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ وَقَعَ مِنْ رَاحِلَتِهِ فَأَقْعَصَهُ - أَوْ قَالَ فَأَقْعَصَتْهُ - فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ وَسِدْرٍ ، وَكَفِّنُوهُ فِي ثَوْبَيْنِ ، وَلاَ تُحَنِّطُوهُ ، وَلاَ تُخَمِّرُوا رَأْسَهُ ، فَإِنَّ اللهَ عَزَّ وَجَلَّ يَبْعَثُهُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا.

2855. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Bir kişi Allah Elçisi ﷺ ilə birlikdə Arafada[1] idi. O, birdən miniyindən yıxıldı və boynu sınaraq öldü. Peyğəmbər ﷺ buyurdu: "Onu su və sidr ilə qüsl edin, iki (ehram) parçası ilə kəfənləyin, ətir vurmayın və başını da örtməyin. Şübhəsiz, Allah ﷻ onu Qiyamət günü diriltdikdə o, təlbiyə deyərək diriləcək".

٢٨٥٦- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنِ الْحَكَمِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : وَقَصَتْ رَجُلاً مُحْرِمًا نَاقَتُهُ ، فَقَتَلَتْهُ ، فَأُتِيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : اغْسِلُوهُ ، وَكَفِّنُوهُ ، وَلاَ تُغَطُّوا رَأْسَهُ ، وَلاَ تُقَرِّبُوهُ طِيبًا ، فَإِنَّهُ يُبْعَثُ يُهِلُّ.

2856. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Bir kişi ehramlı ikən dəvəsindən yıxılıb ölmüşdü. Peyğəmbərə ﷺ bu xəbər çatdıqda buyurdu: "Onu qüsl edin, kəfənləyin, başını örtməyin və ətir vurmayın, çünki o, təlbiyə deyərək diriləcək".

١٠٠- النَّهْيُ عَنْ أَنْ يُخَمَّرَ وَجْهُ الْمُحْرِمِ ، وَرَأْسُهُ إِذَا مَاتَ

100-cü fəsil: Ehramlı adam öldükdə onun üzünün və başının örtülməsinin qadağan olması

٢٨٥٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا خَلَفٌ ، يَعْنِي ابْنَ خَلِيفَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَجُلاً كَانَ حَاجًّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَنَّهُ لَفَظَهُ بَعِيرُهُ فَمَاتَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُغَسَّلُ ، وَيُكَفَّنُ فِي ثَوْبَيْنِ ، وَلاَ يُغَطَّى رَأْسُهُ ، وَوَجْهُهُ ، فَإِنَّهُ يَقُومُ يَوْمَ الْقِيَامَةِ مُلَبِّيًا.

2857. ...İbn Abbas ﵄ rəvayət edir ki, bir kişi Allah Elçisi ﷺ ilə birlikdə həcc edirdi. Həmin kişi dəvədən yıxılaraq vəfat etdi. Allah Elçisi ﷺ dedi:

---

[1] Arafa - Məkkədən 25 km aralıda yerləşən vahənin adıdır. Zil-Hiccə ayının doqquzuncu günü zəvvarlar orada qalırlar.

“Onu yuyun, ehram paltarları ilə kəfənləyin, lakin başını və üzünü örtməyin. Çünki o, Qiyamət günü təlbiyə gətirərək duracaq”.

### ١٠١- النَّهْيُ عَنْ تَخْمِيرِ رَأْسِ الْمُحْرِمِ إِذَا مَاتَ

### 101-ci fəsil: Ehramlı adam öldükdə onun başının örtülməsinin qadağan olması

٢٨٥٨- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ إِسْحَاقَ ، قَالَ : أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ دِينَارٍ ، أَنَّ سَعِيدَ بْنَ جُبَيْرٍ ، أَخْبَرَهُ أَنَّ ابْنَ عَبَّاسٍ ، أَخْبَرَهُ قَالَ : أَقْبَلَ رَجُلٌ حَرَامًا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَخَرَّ مِنْ فَوْقِ بَعِيرِهِ ، فَوُقِصَ وَقْصًا فَمَاتَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوهُ بِمَاءٍ ، وَسِدْرٍ ، وَأَلْبِسُوهُ ثَوْبَيْهِ ، وَلاَ تُخَمِّرُوا رَأْسَهُ ، فَإِنَّهُ يَأْتِي يَوْمَ الْقِيَامَةِ يُلَبِّي.

2858. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Bir kişi Allah Elçisi ﷺ ilə birlikdə həcc edirdi. Həmin kişi dəvənin üstündən yıxılaraq boynu sındı və vəfat etdi. Allah Elçisi ﷺ buyurdu: “Onu su və sidr ilə yuyun, ehram paltarları ilə kəfənləyin, lakin başını örtməyin. Çünki o, Qiyamət günü təlbiyə gətirərək duracaq”.

### ١٠٢- فِيمَنْ أُحْصِرَ بِعَدُوٍّ

### 102-ci fəsil: Həccə getməyə düşmən mane olarsa nə etməli?

٢٨٥٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا جُوَيْرِيَةُ ، عَنْ نَافِعٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَبْدِ اللهِ ، وَسَالِمَ بْنَ عَبْدِ اللهِ ، أَخْبَرَاهُ أَنَّهُمَا كَلَّمَا عَبْدَ اللهِ بْنَ عُمَرَ ، لَمَّا نَزَلَ الْجَيْشُ بِابْنِ الزُّبَيْرِ قَبْلَ أَنْ يُقْتَلَ ، فَقَالاَ : لاَ يَضُرُّكَ أَنْ لاَ تَحُجَّ الْعَامَ ، إِنَّا نَخَافُ أَنْ يُحَالَ بَيْنَنَا وَبَيْنَ الْبَيْتِ ، قَالَ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَالَ كُفَّارُ قُرَيْشٍ دُونَ الْبَيْتِ ، فَنَحَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هَدْيَهُ ، وَحَلَقَ رَأْسَهُ ، وَأُشْهِدُكُمْ أَنِّي قَدْ أَوْجَبْتُ عُمْرَةً إِنْ شَاءَ اللَّهُ ، أَنْطَلِقُ فَإِنْ خُلِّيَ بَيْنِي وَبَيْنَ الْبَيْتِ طُفْتُ ، وَإِنْ حِيلَ بَيْنِي وَبَيْنَ الْبَيْتِ فَعَلْتُ مَا فَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنَا مَعَهُ ، ثُمَّ سَارَ سَاعَةً ، ثُمَّ قَالَ : فَإِنَّمَا شَأْنُهُمَا وَاحِدٌ ، أُشْهِدُكُمْ أَنِّي قَدْ أَوْجَبْتُ حَجَّةً مَعَ عُمْرَتِي ، فَلَمْ يَحْلِلْ مِنْهُمَا حَتَّى أَحَلَّ يَوْمَ النَّحْرِ وَأَهْدَى.

2859. ...Abdullah ibn Abdullah və Səlim ibn Abdullah ﵏ rəvayət edirlər ki, İbn əz-Zubeyr öldürülməmişdən qabaq Məkkə mühasirədə olduqda Abdullah ibn Ömərə dedik: “Bu il həcc etməməyin sənə zərər verməz, çünki Kəbəni təvaf etməyimizə əngəl çıxmağından qorxuruq”. O da belə buyurdu: “Biz Allah Elçisi ﷺ ilə birlidə yola çıxmışdıq. Qureyş kafirləri Kəbəni ziyarət etməyimizə mane oldular. Allah Elçisi ﷺ də qurbanını kəsdi və başını qırxdı. Siz də şahid olun ki, mən, Allahın izni ilə ümrə etməyi özümə vacib edib gedirəm. Əgər Kəbəni təvaf etməyə maneə olmazsa,

təvaf edəcəyəm. Kəbə ilə mənim aramda bir maneə çıxsa, Allah Elçisinin ﷺ etdiyi kimi edəcəyəm”. Bir qədər yeridikdən sonra belə dedi: “Onlar ikisi də (ümrə və həcc) birdir. Şahid olun ki, ümrə ilə birlikdə həcc də edəcəyəm”. Sonra İbn Ömər Qurban bayramı gününə və qurbanını kəsənə qədər ehramdan çıxmadı”.

٢٨٦٠– أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ وَهُوَ ابْنُ حَبِيبٍ ، عَنِ الْحَجَّاجِ الصَّوَّافِ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ الْحَجَّاجِ بْنِ عَمْرٍو الأَنْصَارِيِّ ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ عَرِجَ أَوْ كُسِرَ فَقَدْ حَلَّ وَعَلَيْهِ حَجَّةٌ أُخْرَى فَسَأَلْتُ ابْنَ عَبَّاسٍ ، وَأَبَا هُرَيْرَةَ ، عَنْ ذَلِكَ فَقَالاَ : صَدَقَ.

2860. ...İkrimə ﵁ rəvayət edir ki, Həccac ibn Amr əl-Ənsari Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: “Kim topal olar və ya ayağı sınarsa, ehramdan çıxar və gələn il həcc edər”. Mən İbn Abbas və Əbu Hureyradan bu haqda soruşdum, onlar: “Doğru söylədi” dedilər.[1]

٢٨٦١– أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ حَجَّاجِ بْنِ الصَّوَّافِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ الْحَجَّاجِ بْنِ عَمْرٍو ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ كُسِرَ أَوْ عَرِجَ فَقَدْ حَلَّ وَعَلَيْهِ حَجَّةٌ أُخْرَى وَسَأَلْتُ ابْنَ عَبَّاسٍ ، وَأَبَا هُرَيْرَةَ ، فَقَالاَ : صَدَقَ ، وَقَالَ شُعَيْبٌ ، فِي حَدِيثِهِ : وَعَلَيْهِ الْحَجُّ مِنْ قَابِلٍ.

2861. ...İkrimə ﵁ rəvayət edir ki, Həccac ibn Amr Peyğəmbərin ﷺ belə buyurduğunu rəvayət etmişdir: “Kimin ayağı sınar və ya topal olarsa, ehramdan çıxar və gələn il həcc edər”. Mən İbn Abbas və Əbu Hureyradan bu haqda soruşdum, onlar: “Doğru söylədi” dedilər. Ravi rəvayətində: “Növbəti il yenidən həcc edər” demişdir.

## ١٠٣– دُخُولُ مَكَّةَ
## 103-cü fəsil: Məkkəyə daxil olmaq

٢٨٦٢– أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : أَنْبَأَنَا سُوَيْدٌ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ عُقْبَةَ ، قَالَ : حَدَّثَنِي نَافِعٌ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ حَدَّثَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَنْزِلُ بِذِي طُوًى يَبِيتُ بِهِ حَتَّى يُصَلِّيَ صَلاَةَ الصُّبْحِ حِينَ يَقْدَمُ إِلَى مَكَّةَ ، وَمُصَلَّى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَلِكَ ، عَلَى أَكَمَةٍ غَلِيظَةٍ ، لَيْسَ فِي الْمَسْجِدِ الَّذِي بُنِيَ ، ثَمَّ وَلَكِنْ أَسْفَلَ مِنْ ذَلِكَ عَلَى أَكَمَةٍ خَشِنَةٍ غَلِيظَةٍ.

---

[1] Yəni bir adam həcc əsnasında bir xəstəliyə tutularsa, ehramdan çıxa bilər və qalan müddət ərzində sağalıb həcc ayinlərini yerinə yetirməyi çatdıra bilməzsə, həcci gələn il etməyə mükəlləf olur.

2862. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Məkkəyə gəldikdə "Zu-Tuva" deyilən yerdə gecələdi və Sübh namazını da orada qıldı. Namaz qıldığı yer indiki məscidin yeri deyildi, sərt və bir az hündür bir yer idi. İndiki məscidin aşağı hissəsində olan çətin yer idi.

## ١٠٤- دُخُولُ مَكَّةَ لَيْلاً

## 104-cü fəsil: Məkkəyə gecə daxil olmaq

٢٨٦٣- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، عَنْ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي مُزَاحِمُ بْنُ أَبِي مُزَاحِمٍ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ عَبْدِ اللهِ ، عَنْ مُحَرِّشٍ الْكَعْبِيِّ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، خَرَجَ لَيْلاً مِنَ الْجِعِرَّانَةِ حِينَ مَشَى مُعْتَمِرًا ، فَأَصْبَحَ بِالْجِعِرَّانَةِ كَبَائِتٍ حَتَّى إِذَا زَالَتِ الشَّمْسُ ، خَرَجَ عَنِ الْجِعِرَّانَةِ فِي بَطْنِ سَرِفَ ، حَتَّى جَامَعَ الطَّرِيقَ طَرِيقَ الْمَدِينَةِ ، مِنْ سَرِفَ.

2863. ...Muhərriş əl-Kə'bi ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə vaxtı Ciranədən çıxdı və piyada gedərək ümrə etdi. Ciranədə gecələdikdən sonra günəş qərbə doğru meyl etdikdə oradan çıxdı və "Bətni Şərif" deyilən yol ilə gedərək Səriflə Mədinə yolunun birləşdiyi yerə qədər gəldi.

٢٨٦٤- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ سُفْيَانَ ، عَنْ إِسْمَعِيلَ بْنِ أُمَيَّةَ ، عَنْ مُزَاحِمٍ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ عَبْدِ اللهِ بْنِ خَالِدِ بْنِ أُسَيْدٍ ، عَنْ مُحَرِّشٍ الْكَعْبِيِّ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مِنَ الْجِعِرَّانَةِ لَيْلاً ، كَأَنَّهُ سَبِيكَةُ فِضَّةٍ ، فَاعْتَمَرَ ، ثُمَّ أَصْبَحَ بِهَا كَبَائِتٍ.

2864. ...Muhərriş əl-Kə'bi ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə vaxtı Ciranədən çıxdı. O, sanki gümüş top kimi parıldayırdı. Ümrə edib Ciranəyə qayıtdı, elə bil ki, elə orada gecələmişdi.

## ١٠٥- مِنْ أَيْنَ يَدْخُلُ مَكَّةَ

## 105-cü fəsil: Məkkəyə haradan daxil olurlar?

٢٨٦٥- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : حَدَّثَنِي نَافِعٌ ، عَنْ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ مَكَّةَ مِنَ الثَّنِيَّةِ الْعُلْيَا الَّتِي بِالْبَطْحَاءِ ، وَخَرَجَ مِنَ الثَّنِيَّةِ السُّفْلَى.

2865. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Bətha deyilən yerin yuxarı tərəfindən Məkkəyə daxil oldu, çıxanda da Bəthanın aşağı tərəfindən çıxdı.

١٠٦- دُخُولُ مَكَّةَ بِاللِّوَاءِ

## 106-cı fəsil: Məkkəyə bayraqla girmək

٢٨٦٦- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ عَمَّارٍ الدُّهْنِيِّ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ رَضِيَ اللَّهُ عَنْهُ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ مَكَّةَ ، وَلِوَاؤُهُ أَبْيَضُ.

2866. ...Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkəyə daxil olduqda onun bayrağı ağ rəngdə idi.

١٠٧- دُخُولُ مَكَّةَ بِغَيْرِ إِحْرَامٍ

## 107-ci fəsil: Məkkəyə ehramsız girmək

٢٨٦٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ مَكَّةَ وَعَلَيْهِ الْمِغْفَرُ ، فَقِيلَ ابْنُ خَطَلٍ مُتَعَلِّقٌ بِأَسْتَارِ الْكَعْبَةِ فَقَالَ : اقْتُلُوهُ.

2867. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkəyə daxil olduqda (başında) dəbilqə[1] var idi. Ona İbn Xatalın Kəbənin örtüyündən yapışıb[2] (aman dilədiyi) xəbər verildikdə Peyğəmbər ﷺ: "Öldürün onu!"– deyə buyurdu.

٢٨٦٨- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الزُّبَيْرِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ مَكَّةَ عَامَ الْفَتْحِ وَعَلَى رَأْسِهِ الْمِغْفَرُ.

2868. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Fəth ilində[3] Məkkəyə daxil olduqda başında dəbilqə var idi.

٢٨٦٩- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ عَمَّارٍ ، قَالَ : حَدَّثَنِي أَبُو الزُّبَيْرِ الْمَكِّيُّ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ يَوْمَ فَتْحِ مَكَّةَ ، وَعَلَيْهِ عِمَامَةٌ سَوْدَاءُ بِغَيْرِ إِحْرَامٍ.

2869. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ fəth günü Məkkəyə günü başında qara sarıq, özü də ehramsız olaraq daxil olmuşdur.

---

[1] Dəbilqə - döyüşdə başı qorumaq üçün geyilən dəmir papağa deyilir.
[2] Bu adam əvvəllər İslam dinini qəbul etmiş, sonra da Peyğəmbər ﷺ onu ənsardan olan iki səhabə ilə birlikdə zəkat yığmağa göndərmişdi. Lakin o, naxələflik edib səhabəni öldürmüş və dinindən dönərək küfrə qayıtmışdı. Bundan əlavə onun oxuyan iki kənizi var imiş ki, bu kənizlər öz mahnıları ilə Peyğəmbəri ﷺ ələ salırdılar. Elə bu səbəbdən də Peyğəmbər ﷺ onu və onun kənizlərini öldürməyi əmr etmişdi.
[3] Burada hicrətin səkkizinci ili – Məkkənin fəth edildiyi il nəzərdə tutulur.

### ١٠٨– الْوَقْتُ الَّذِي وَافَى فِيهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ

### 108-ci fəsil: Peyğəmbərin ﷺ Məkkəyə gəldiyi vaxt

٢٨٧٠– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا حَبَّانُ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ أَبِي الْعَالِيَةِ الْبَرَّاءِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ لِصُبْحِ رَابِعَةٍ وَهُمْ يُلَبُّونَ بِالْحَجِّ ، فَأَمَرَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنْ يَحِلُّوا.

2870. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ və səhabələri həcc üçün ehrama girdikləri dördüncü günü Məkkəyə gəldilər. Allah Elçisi ﷺ onlara ehramdan çıxmalarını əmr etdi".

٢٨٧١– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ يَحْيَى بْنِ كَثِيرٍ أَبُو غَسَّانَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي الْعَالِيَةِ الْبَرَّاءِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَرْبَعٍ مَضَيْنَ مِنْ ذِي الْحِجَّةِ وَقَدْ أَهَلَّ بِالْحَجِّ ، فَصَلَّى الصُّبْحَ بِالْبَطْحَاءِ ، وَقَالَ : مَنْ شَاءَ أَنْ يَجْعَلَهَا عُمْرَةً فَلْيَفْعَلْ.

2871. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Zil-Hiccə ayının dördündə gəldi və həcc üçün ehrama girdi. Sübh namazını əl-Bətha deyilən yerdə qıldı və buyurdu: "Kim istəyirsə ümrə etsin".

٢٨٧٢– أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : عَطَاءٌ : قَالَ جَابِرٌ : قَدِمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ صَبِيحَةَ رَابِعَةٍ مَضَتْ مِنْ ذِي الْحِجَّةِ.

2872. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Peyğəmbər ﷺ Məkkəyə Zil-Hiccə ayının dördündə gəlmişdir".

### ١٠٩– إِنْشَادُ الشِّعْرِ فِي الْحَرَمِ وَالْمَشْيُ بَيْنَ يَدَيِ الإِمَامِ

### 109-cu fəsil: Ehramlı ikən imamın önündə gedərək kafirlərə meydan oxuyaraq şeir demək

٢٨٧٣– أَخْبَرَنَا أَبُو عَاصِمٍ خُشَيْشُ بْنُ أَصْرَمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا ثَابِتٌ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ مَكَّةَ فِي عُمْرَةِ الْقَضَاءِ وَعَبْدُ اللهِ بْنُ رَوَاحَةَ يَمْشِي بَيْنَ يَدَيْهِ وَهُوَ يَقُولُ :

خَلُّوا بَنِي الْكُفَّارِ عَنْ سَبِيلِهِ ... الْيَوْمَ نَضْرِبْكُمْ عَلَى تَنْزِيلِهِ

ضَرْبًا يُزِيلُ الْهَامَ عَنْ مَقِيلِهِ ... وَيُذْهِلُ الْخَلِيلَ عَنْ خَلِيلِهِ

فَقَالَ لَهُ عُمَرُ : يَا ابْنَ رَوَاحَةَ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَفِي حَرَمِ اللهِ عَزَّ وَجَلَّ ، تَقُولُ الشِّعْرَ قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَلِّ عَنْهُ ، فَلَهُوَ أَسْرَعُ فِيهِمْ مِنْ نَضْحِ النَّبْلِ.

2873. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qəza ümrəsi etmək üçün Məkkəyə girərkən Abdullah ibn Ravaha onun önündə gedərək belə deyirdi:
“Çəkilin kafir övladları onun yolundan,
Bu gün onun gəlməsi ilə sizi vuracağıq,
Başı boyundan ayıran zərbə,
Dostu dostdan ayıran zərbə”.
Ömər ona dedi: “Ey İbn Ravaha! Həm Allah Elçisinin ﷺ qarşısında gedirsən, həm də Allahın ﷻ Haramında (Məkkədə) şeir oxuyursan”. Peyğəmbər ﷺ ona dedi: “Onunla işin olmasın! Onun dediyi düşmənə ox yarasından daha təsirlidir”.

### ١١٠- حُرْمَةُ مَكَّةَ

### 110-cu fəsil: Məkkənin müqəddəsliyi

٢٨٧٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، عَنْ جَرِيرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ الْفَتْحِ : هَذَا الْبَلَدُ حَرَّمَهُ اللَّهُ يَوْمَ خَلَقَ السَّمَوَاتِ وَالأَرْضَ ، فَهُوَ حَرَامٌ بِحُرْمَةِ اللهِ إِلَى يَوْمِ الْقِيَامَةِ لاَ يُعْضَدُ شَوْكُهُ وَلاَ يُنَفَّرُ صَيْدُهُ ، وَلاَ يَلْتَقِطُ لُقَطَتَهُ ، إِلاَّ مَنْ عَرَّفَهَا ، وَلاَ يُخْتَلَى خَلاَهُ قَالَ : الْعَبَّاسُ يَا رَسُولَ اللهِ إِلاَّ الإِذْخِرَ فَذَكَرَ كَلِمَةً مَعْنَاهَا إِلاَّ الإِذْخِرَ.

2874. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ Fəth günü[1] buyurdu: “Bu şəhər Allahın göyləri və yeri yaratdığı gündən bəri haram olan (müqəddəs) bir yerdir. Bu səbəblə də Qiyamətə qədər Allahın əmri ilə bura haram olan (müqəddəs) yerdir. Onun tikanları yolunmaz, ov heyvanları qovulmaz, tapılan şeylər yalnız yiyəsi tapılıb ona verilməsi üçün götürülə bilər. Bitkiləri də yolunmaz”. Abbas dedi: “Ey Allahın Elçisi, izxir[2] otunu bu qadağalara daxil etmə!” O da izxir otunun yolunaraq toplanmasına icazə verdi”.

### ١١١- تَحْرِيمُ الْقِتَالِ فِيهِ

### 111-ci fəsil: Məkkədə döyüşməyin haram olması

٢٨٧٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ فَتْحِ مَكَّةَ : إِنَّ هَذَا الْبَلَدَ حَرَامٌ ، حَرَّمَهُ اللَّهُ عَزَّ وَجَلَّ ، لَمْ يَحِلَّ فِيهِ الْقِتَالُ ، لأَحَدٍ قَبْلِي ، وَأُحِلَّ لِي سَاعَةً مِنْ نَهَارٍ ، فَهُوَ حَرَامٌ بِحُرْمَةِ اللهِ عَزَّ وَجَلَّ.

---

[1] Yəni Məkkənin fəth olunduğu gün.
[2] İzxir - ətirli qamış bitkisinə deyilir.

2875. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ Məkkənin Fəthi günü buyurdu: “Bu şəhər haram olan (müqəddəs) yerdir. Onu Allah ﷻ haram etmişdir. Orada döyüşmək məndən qabaq heç kimə halal olmadı, mənə isə günün bir qismində halal edildi. O, Allahın ﷿ müqəddəsliyi ilə haram edilmişdir”.

٢٨٧٦- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِي شُرَيْحٍ ، أَنَّهُ قَالَ : لِعَمْرِو بْنِ سَعِيدٍ وَهُوَ يَبْعَثُ الْبُعُوثَ إِلَى مَكَّةَ ائْذَنْ لِي أَيُّهَا الأَمِيرُ أُحَدِّثْكَ قَوْلاً ، قَامَ بِهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْغَدَ مِنْ يَوْمِ الْفَتْحِ سَمِعَتْهُ أُذُنَايَ وَوَعَاهُ قَلْبِي ، وَأَبْصَرَتْهُ عَيْنَايَ حِينَ تَكَلَّمَ بِهِ حَمِدَ اللَّهَ ، وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ مَكَّةَ حَرَّمَهَا اللَّهُ وَلَمْ يُحَرِّمْهَا النَّاسُ ، وَلاَ يَحِلُّ لاِمْرِئٍ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الآخِرِ ، أَنْ يَسْفِكَ بِهَا دَمًا ، وَلاَ يَعْضُدَ بِهَا شَجَرًا ، فَإِنْ تَرَخَّصَ أَحَدٌ لِقِتَالِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِيهَا فَقُولُوا لَهُ : إِنَّ اللَّهَ أَذِنَ لِرَسُولِهِ ، وَلَمْ يَأْذَنْ لَكُمْ ، وَإِنَّمَا أَذِنَ لِي فِيهَا سَاعَةً مِنْ نَهَارٍ ، وَقَدْ عَادَتْ حُرْمَتُهَا الْيَوْمَ كَحُرْمَتِهَا بِالأَمْسِ ، وَلْيُبَلِّغِ الشَّاهِدُ الْغَائِبَ.

2876. ...Rəvayət edilir ki, Əbu Şureyh ﵀ demişdir: “Amr ibn Səid Məkkəyə əsgər göndərərkən Əbu Şureyh ona dedi: “Ey əmir, icazə ver Məkkənin fəthinin sonrakı günü Allah Elçisinin ﷺ buyurduğu və qulaqlarımla eşitdiyim, qəlbimlə əzbərlədiyim, gözlərimlə gördüyüm bir kəlamlarını sənə xatırladım. O, Allaha həmd etdikdən və Ona tərif dedikdən sonra belə buyurmuşdur: “Həqiqətən, Məkkəni insanlar deyil, Allah müqəddəsləşdirmişdir. Allaha və Axirət gününə iman gətirən kimsəyə orada qan tökməsi və ağacları kəsməsi halal deyil. Kimsə çıxıb Allah Elçisinin ﷺ orada döyüşməsini dəlil gətirsə, ona deyin: “Öz elçisinə Allah izin verdi, sizə ki izin verməyib”. Mənə günün bir qismində döyüşməyə izin verilmişdir. Dünənki müqəddəsliyi isə yenidən geri qayıtmışdır. Burada olanlar bunu olmayanlara çatdırsın”.

## ١١٢- حُرْمَةُ الْحَرَمِ

## 112-ci fəsil: Məkkənin müqəddəsliyi

٢٨٧٧- أَخْبَرَنَا عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، أَخْبَرَنِي أَبِي ، عَنِ الزُّهْرِيِّ ، أَخْبَرَنِي سُحَيْمٌ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَغْزُو هَذَا الْبَيْتَ جَيْشٌ فَيُخْسَفُ بِهِمْ بِالْبَيْدَاءِ.

2877. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bu Evə doğru bir ordu hücum edəcək, lakin “əl-Beyda”[1] adlı yerdə yerə batırılacaq”.

[1] əl-Beyda - Mədinə şəhərinin 10 kilometrliyində olan yerin adıdır.

٢٨٧٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِدْرِيسَ أَبُو حَاتِمٍ الرَّازِيُّ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ حَفْصِ بْنِ غِيَاثٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ مِسْعَرٍ ، قَالَ : أَخْبَرَنِي طَلْحَةُ بْنُ مُصَرِّفٍ ، عَنْ أَبِي مُسْلِمٍ الأَغَرِّ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَنْتَهِي الْبُعُوثُ عَنْ غَزْوِ هَذَا الْبَيْتِ ، حَتَّى يُخْسَفَ بِجَيْشٍ مِنْهُمْ.

2878. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Bu Evi ələ keçirmək üçün bir çox ordular hücum edəcək. Onlardan biri yerə batırılacaq".

٢٨٧٩- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ دَاوُدَ الْمِصِّيصِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ مُحَمَّدِ بْنِ سَابِقٍ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ السَّلاَمِ ، عَنِ الدَّالاَنِيِّ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ سَالِمِ بْنِ أَبِي الْجَعْدِ ، عَنْ أَخِيهِ ، قَالَ : حَدَّثَنِي ابْنُ أَبِي رَبِيعَةَ ، عَنْ حَفْصَةَ بِنْتِ عُمَرَ ، قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُبْعَثُ جُنْدٌ إِلَى هَذَا الْحَرَمِ فَإِذَا كَانُوا بِبَيْدَاءَ مِنَ الأَرْضِ ، خُسِفَ بِأَوَّلِهِمْ وَآخِرِهِمْ ، وَلَمْ يَنْجُ أَوْسَطُهُمْ قُلْتُ : أَرَأَيْتَ إِنْ كَانَ فِيهِمْ مُؤْمِنُونَ ، قَالَ : تَكُونُ لَهُمْ قُبُورًا.

2879. ...Rəvayət edilir ki, Həfsa bint Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Bu Haram olan Evə (Məkəyə) doğru ordu hücum edəcək, lakin "əl-Beyda" adlı yerdə birinciləri və axırıncıları yerə batırılacaq. Onların ortada olanları da xilas olmayacaq". Mən dedim: "Onların arasında möminlər olsa, necə olacaq?" Allah Elçisi ﷺ buyurdu: "Ora onlar üçün qəbir olacaq".[1]

٢٨٨٠- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ عِيسَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أُمَيَّةَ بْنِ صَفْوَانَ بْنِ عَبْدِ اللهِ بْنِ صَفْوَانَ ، سَمِعَ جَدَّهُ ، يَقُولُ : حَدَّثَتْنِي حَفْصَةُ ، أَنَّهُ قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيَؤُمَّنَّ هَذَا الْبَيْتَ جَيْشٌ يَغْزُونَهُ ، حَتَّى إِذَا كَانُوا بِبَيْدَاءَ مِنَ الأَرْضِ ، خُسِفَ بِأَوْسَطِهِمْ ، فَيُنَادِي أَوَّلُهُمْ وَآخِرُهُمْ ، فَيُخْسَفُ بِهِمْ جَمِيعًا ، وَلاَ يَنْجُو إِلاَّ الشَّرِيدُ الَّذِي يُخْبِرُ عَنْهُمْ فَقَالَ لَهُ رَجُلٌ : أَشْهَدُ عَلَيْكَ أَنَّكَ مَا كَذَبْتَ عَلَى جَدِّكَ ، وَأَشْهَدُ عَلَى جَدِّكَ أَنَّهُ مَا كَذَبَ عَلَى حَفْصَةَ ، وَأَشْهَدُ عَلَى حَفْصَةَ أَنَّهَا لَمْ تَكْذِبْ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2880. ...Rəvayət edilir ki, Həfsa ﷺ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Bu Evi (Kəbəni) ələ keçirmək üçün bir ordu hücum edəcək, lakin "əl-Beyda" adlı yerdə ordunun mərkəzində olanlar yerə batırılacaq. Öndə və arxada olanlar qışqırışacaqlar, lakin hamısı yerin dibinə batırılacaq. Yalnız bir nəfər qaçan, xəbər verən olaraq xilas olacaq". Ravi dedi: "Mən inanıram ki, sən bu hədisi rəvayət edərkən babandan eşitmədiyin bir şeyi danışmazsan və inanıram ki, baban da Həfsadan eşitmədiyini danışmaz. Həmçinin Həfsa da Peyğəmbərin ﷺ adından yalan danışmaz".

---

[1] Hədis zəifdir.

١١٣- مَا يُقْتَلُ فِي الْحَرَمِ مِنَ الدَّوَابِّ

## 113-cü fəsil: Məkkədə heyvanlardan hansını öldürmək haram deyil?

٢٨٨١- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسُ فَوَاسِقَ يُقْتَلْنَ فِي الْحِلِّ وَالْحَرَمِ : الْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْكَلْبُ الْعَقُورُ ، وَالْعَقْرَبُ ، وَالْفَأْرَةُ.

2881. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş növ zərərverici heyvan haramda da öldürülə bilər. Bunlar qarğa, çalağan (qırğı), quduzlaşmış it, əqrəb və sıçovuldur".

١١٤- قَتْلُ الْحَيَّةِ فِي الْحَرَمِ

## 114-cü fəsil: Haramda ilan öldürmək

٢٨٨٢- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، سَمِعْتُ سَعِيدَ بْنَ الْمُسَيَّبِ يُحَدِّثُ ، عَنْ عَائِشَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ فَوَاسِقَ يُقْتَلْنَ فِي الْحِلِّ وَالْحَرَمِ : الْحَيَّةُ ، وَالْكَلْبُ ، الْعَقُورُ ، وَالْغُرَابُ الأَبْقَعُ ، وَالْحِدَأَةُ ، وَالْفَأْرَةُ.

2882. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş növ zərərverici heyvan haramda da öldürülə bilər. Bunlar, ilan, quduz it, ala qarğa, çalağan (qırğı) və sıçovuldur".

٢٨٨٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ حَفْصِ بْنِ غِيَاثٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْخَيْفِ مِنْ مِنًى ، حَتَّى **نَزَلَتْ {وَالْمُرْسَلاَتِ عُرْفًا}** فَخَرَجَتْ حَيَّةٌ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْتُلُوهَا ، فَابْتَدَرْنَاهَا ، فَدَخَلَتْ فِي جُحْرِهَا.

2883. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Bir dəfə mən Minada Xayf məscidində Allah Elçisi ﷺ ilə birlikdə idim. Bu əsnada **"And olsun xeyirlə göndərilənlərə"** (əl-Mursələt surəsi) nazil oldu və ilan peyda oldu. Allah Elçisi ﷺ buyurdu: "Öldürün onu!" Biz qaçıb onu vurmaq istədikdə, o, yuvasına girdi".

٢٨٨٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ أَبِي عُبَيْدَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةَ عَرَفَةَ ، الَّتِي قَبْلَ يَوْمِ عَرَفَةَ فَإِذَا حِسُّ الْحَيَّةِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اقْتُلُوهَا فَدَخَلَتْ شَقَّ جُحْرٍ ، فَأَدْخَلْنَا عُودًا ، فَقَلَعْنَا بَعْضَ الْجُحْرِ ، فَأَخَذْنَا سَعَفَةً ، فَأَضْرَمْنَا فِيهَا نَارًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَقَاهَا اللَّهُ شَرَّكُمْ ، وَوَقَاكُمْ شَرَّهَا.

2884. ...Əbu Ubeydə atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Arafa günündən bir gün əvvəl gecə vaxtı Allah Elçisi ﷺ ilə birlikdə idim. Birdən bir ilan gördüm və Allah Elçisi ﷺ buyurdu: “Öldürün onu!” İlan da o dəqiqə bir deşiyə girdi. Biz də xurma yarpaqlarını yandıraraq o deşiyə tüstü verməyə başladıq və həmin deşiyə od vurduq. Allah Elçisi ﷺ buyurdu: “Allah onu sizin şərinizdən, sizi isə onun şərindən qorudu”.

١١٥- قَتْلُ الْوَزَغِ

115-ci fəsil: Kərtənkələni öldürmək

٢٨٨٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الْحَمِيدِ بْنُ جُبَيْرِ بْنِ شَيْبَةَ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أُمِّ شَرِيكٍ ، قَالَتْ : أَمَرَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِقَتْلِ الأَوْزَاغِ.

2885. ...Rəvayət edilir ki, Ummu Şərik ﵂ demişdir: “Allah Elçisi ﷺ bizə kərtənkələ öldürməyi əmr etdi”.

٢٨٨٦- أَخْبَرَنَا وَهْبُ بْنُ بَيَانٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي مَالِكٌ ، وَيُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْوَزَغُ الْفُوَيْسِقُ.

2886. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kərtənkələ zərərli heyvandır”.

١١٦- بَابُ قَتْلِ الْعَقْرَبِ

116-cı fəsil: Əqrəbi öldürmək

٢٨٨٧- أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ خَالِدٍ الرَّقِّيُّ الْقَطَّانُ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : ابْنُ جُرَيْجٍ ، أَخْبَرَنِي أَبَانُ بْنُ صَالِحٍ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ عُرْوَةَ أَخْبَرَهُ ، أَنَّ عَائِشَةَ قَالَتْ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسٌ مِنَ الدَّوَابِّ كُلُّهُنَّ فَاسِقٌ يُقْتَلْنَ فِي الْحِلِّ وَالْحَرَمِ : الْكَلْبُ الْعَقُورُ ، وَالْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْعَقْرَبُ ، وَالْفَأْرَةُ.

2887. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbər ﷺ belə buyurdu: “Beş heyvan var ki, hamısı zərərvericidir. Hər yerdə və haram ərazisində öldürülə bilər. Onlar quduz it, ala qarğa, çalağan (qırğı), əqrəb və sıçovuldur”.

١١٧- قَتْلُ الْفَأْرَةِ فِي الحَرَمِ

## 117-ci fəsil: Haram ərazisində sıçovul öldürmək

٢٨٨٨- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، أَنَّ عَائِشَةَ ، قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسٌ مِنَ الدَّوَابِّ كُلُّهَا فَاسِقٌ يُقْتَلْنَ فِي الحَرَمِ : الْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْكَلْبُ الْعَقُورُ ، وَالْفَأْرَةُ ، وَالْعَقْرَبُ.

2888. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Beş heyvan var ki, hamısı zərərvericidir. Onlar haram ərazisində öldürülə bilər. Onlar ala qarğa, quduz it, çalağan (qırğı), sıçovul və əqrəbdir".

٢٨٨٩- أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ سَالِمَ بْنَ عَبْدِ اللهِ ، أَخْبَرَهُ أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ قَالَ : قَالَتْ حَفْصَةُ - زَوْجُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسٌ مِنَ الدَّوَابِّ لاَ حَرَجَ عَلَى مَنْ قَتَلَهُنَّ : الْعَقْرَبُ ، وَالْغُرَابُ ، وَالْحِدَأَةُ ، وَالْفَأْرَةُ ، وَالْكَلْبُ الْعَقُورُ.

2889. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Həfsa ﵂ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Beş heyvan var ki, onları öldürmək qadağan deyil. Onlar əqrəb, ala qarğa, çalağan (qırğı), sıçovul və quduz itdir".

١١٨- قَتْلُ الْحِدَأَةِ فِي الحَرَمِ

## 118-ci fəsil: Haram ərazisində çalağanın öldürülməsi

٢٨٩٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ فَوَاسِقَ يُقْتَلْنَ فِي الْحِلِّ وَالْحَرَمِ : الْحِدَأَةُ ، وَالْغُرَابُ ، وَالْفَأْرَةُ ، وَالْعَقْرَبُ ، وَالْكَلْبُ الْعَقُورُ قَالَ : عَبْدُ الرَّزَّاقِ وَذَكَرَ بَعْضُ أَصْحَابِنَا أَنَّ مَعْمَرًا كَانَ يَذْكُرُهُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، وَعَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2890. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş heyvan var ki, onları Haram ərazisində öldürmək halaldır. Onlar çalağan (qırğı), ala qarğa, sıçovul, əqrəb və quduz itdir".

١١٩- قَتْلُ الْغُرَابِ فِي الْحَرَمِ

## 119-cu fəsil: Haram ərazisində ala qarğanın öldürülməsi

٢٨٩١- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدَةَ ، قَالَ : أَنْبَأَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ وَهُوَ ابْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : قَالَ رَسُولُ

اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَمْسُ فَوَاسِقَ يُقْتَلْنَ فِي الْحَرَمِ : الْعَقْرَبُ ، وَالْفَأْرَةُ ، وَالْغُرَابُ ، وَالْكَلْبُ الْعَقُورُ ، وَالْحِدَأَةُ.

2891. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Beş heyvan var ki, onlar Haram ərazisində öldürülür. Onlar əqrəb, sıçovul, ala qarğa, quduz it və çalağandır".

١٢٠– النَّهْيُ أَنْ يُنَفَّرَ صَيْدُ الْحَرَمِ

120-ci fəsil: Haram ərazisində heyvanları ürkütməyin qadağan olması

٢٨٩٢– أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : هَذِهِ مَكَّةُ ، حَرَّمَهَا اللهُ عَزَّ وَجَلَّ يَوْمَ خَلَقَ السَّمَوَاتِ وَالأَرْضَ ، لَمْ تَحِلَّ لأَحَدٍ قَبْلِي ، وَلاَ لأَحَدٍ بَعْدِي ، وَإِنَّمَا أُحِلَّتْ لِي سَاعَةً مِنْ نَهَارٍ ، وَهِيَ سَاعَتِي هَذِهِ حَرَامٌ بِحَرَامِ ، اللهِ إِلَى يَوْمِ الْقِيَامَةِ ، لاَ يُخْتَلَى خَلاَهَا ، وَلاَ يُعْضَدُ شَجَرُهَا ، وَلاَ يُنَفَّرُ صَيْدُهَا ، وَلاَ تَحِلُّ لُقَطَتُهَا إِلاَّ لِمُنْشِدٍ فَقَامَ الْعَبَّاسُ وَكَانَ رَجُلاً مُجَرِّبًا ، فَقَالَ : إِلاَّ الإِذْخِرَ فَإِنَّهُ لِبُيُوتِنَا وَقُبُورِنَا ، فَقَالَ : إِلاَّ الإِذْخِرَ.

2892. ...İbn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Bu, Məkkədir. Allah ﷻ onu göyləri və yeri yaratdığı gün haram (müqəddəs) etmişdir. Məndən qabaq bura heç kimə halal olmayıb və məndən sonra da heç kimə halal olmayacaq. Mənə də ancaq günün bir qismində halal edilmişdir. Bu saatdan Qiyamətə qədər bura haramdır. Buranın bitkiləri yolunmaz, ağacları kəsilməz, ov heyvanları ürküdülməz, itən əşya isə yalnız yiyəsi tapılmaq üçün götürülə bilər". Abbas ayağa qalxdı - o cəsur adam idi - və dedi: "Ey Allahın Elçisi, izxir otunu bu qadağalara daxil etmə! Biz onu evlərimizdə və qəbirlərdə istifadə edirik". O da: "İzxirdən başqa" deyərək onun yolunaraq toplanmasına icazə verdi".

١٢١– اسْتِقْبَالُ الْحَجِّ

121-ci fəsil: Hacıları qarşılamaq

٢٨٩٣– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الْمَلِكِ بْنِ زَنْجُويَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ سُلَيْمَانَ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، قَالَ : دَخَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ فِي عُمْرَةِ الْقَضَاءِ وَابْنُ رَوَاحَةَ بَيْنَ يَدَيْهِ يَقُولُ :

خَلُّوا بَنِي الْكُفَّارِ عَنْ سَبِيلِهِ ... الْيَوْمَ نَضْرِبْكُمْ عَلَى تَأْوِيلِهِ

ضَرَبًا يُزِيلُ الْهَامَ عَنْ مَقِيلِهِ ... وَيُذْهِلُ الْخَلِيلَ عَنْ خَلِيلِهِ

قَالَ عُمَرُ : يَا ابْنَ رَوَاحَةَ فِي حَرَمِ اللهِ ، وَبَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، تَقُولُ هَذَا الشِّعْرَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَلِّ عَنْهُ ، فَوَالَّذِي نَفْسِي بِيَدِهِ ، لَكَلاَمُهُ أَشَدُّ عَلَيْهِمْ مِنْ وَقْعِ النَّبْلِ.

2893. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Peyğəmbər ﷺ qəza ümrəsi

etmək üçün Məkkəyə girərkən İbn Ravaha onun önündə gedərək belə deyirdi:
“Çəkilin, kafir övladları, onun yolundan,
Bugün Onun gəlməsi ilə sizi vuracağıq -
Başı boyundan ayıran zərbə,
Dostu dostdan ayıran zərbə”.
Ömər ona dedi: “Ey İbn Ravaha! Həm Allahın ﷻ Haramındasan, həm də Allah Elçisinin ﷺ qarşısında gedərək şeir oxuyursan”. Peyğəmbər ﷺ ona dedi: “Onunla işin olmasın! Canım Əlində Olana and olsun ki, onun dediyi düşmənə ox yarasından daha ağırdır”.

٢٨٩٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا قَدِمَ مَكَّةَ ، اسْتَقْبَلَهُ أُغَيْلِمَةُ بَنِي هَاشِمٍ قَالَ : فَحَمَلَ وَاحِدًا بَيْنَ يَدَيْهِ ، وَآخَرَ خَلْفَهُ.

2894. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Məkkəyə gəldikdə Bəni Hişam tayfasının kiçikləri onu qarşıladılar. Peyğəmbər ﷺ də onlardan birini miniyinin önünə, digərini isə arxasına mindirdi.

### ١٢٢- تَرْكُ رَفْعِ الْيَدَيْنِ عِنْدَ رُؤْيَةِ الْبَيْتِ

### 122-ci fəsil: Ev (Kəbə) görsəndikdə əlləri yuxarıya qaldırmağın tərk edilməsi

٢٨٩٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ أَبَا قَزَعَةَ الْبَاهِلِيَّ ، يُحَدِّثُ ، عَنِ الْمُهَاجِرِ الْمَكِّيِّ ، قَالَ : سُئِلَ جَابِرُ بْنُ عَبْدِ اللهِ عَنِ الرَّجُلِ يَرَى الْبَيْتَ أَيَرْفَعُ يَدَيْهِ ، قَالَ : مَا كُنْتُ أَظُنُّ أَحَدًا يَفْعَلُ هَذَا إِلاَّ الْيَهُودَ ، حَجَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمْ نَكُنْ نَفْعَلُهُ.

2895. ...Rəvayət edilir ki, əl-Muhacir əl-Məkki رحمه الله demişdir: “Cabir ibn Abdullahdan Kəbəni gördükdə əlləri qaldırmaq haqda soruşdular. O dedi: “Bunu ancaq yəhudilər edirlər. Biz Allah Elçisi ﷺ ilə birlikdə həcc etdik, lakin belə etmədik”.[1]

### ١٢٣- الدُّعَاءُ عِنْدَ رُؤْيَةِ الْبَيْتِ

### 123-cü fəsil: Kəbə evini gördükdə dua etmək

٢٨٩٦- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنِي عُبَيْدُ اللهِ بْنُ أَبِي يَزِيدَ ، أَنَّ عَبْدَ

[1] Hədis zəifdir.

الرَّحْمَنِ بْنَ طَارِقِ بْنِ عَلْقَمَةَ ، أَخْبَرَهُ عَنْ أُمِّهِ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ إِذَا جَاءَ مَكَانًا فِي دَارِ يَعْلَى اسْتَقْبَلَ ، الْقِبْلَةَ وَدَعَا.

2896. ...Abdur-Rahmən ibn Tariq ibn Alqamə anasından ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ "Daru-Yalə" deyilən yerə gəldikdə qibləyə doğru dönər və dua edərdi.[1]

### ١٢٤- فَضْلُ الصَّلاَةِ فِي الْمَسْجِدِ الْحَرَامِ

### 124-cü fəsil: Məscidul-Haramda (Məkkə məscidində) namaz qılmağın fəziləti

٢٨٩٧- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ مُوسَى بْنِ عَبْدِ اللهِ الْجُهَنِيِّ ، قَالَ : سَمِعْتُ نَافِعًا ، يَقُولُ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ عُمَرَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : صَلاَةٌ فِي مَسْجِدِي أَفْضَلُ مِنْ أَلْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ مِنَ الْمَسَاجِدِ إِلاَّ الْمَسْجِدَ الْحَرَامَ قَالَ : أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ أَعْلَمُ أَحَدًا رَوَى هَذَا الْحَدِيثَ عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ غَيْرَ مُوسَى الْجُهَنِيِّ وَخَالَفَهُ ابْنُ جُرَيْجٍ وَغَيْرُهُ.

2897. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Mənim məscidimdə qılınan namaz Məscidul-Haramdan başqa digər məscidlərdə qılınan min namazdan üstündür".

٢٨٩٨- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، وَمُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : إِسْحَاقُ ، أَنْبَأَنَا وَقَالَ مُحَمَّدٌ ، حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : سَمِعْتُ نَافِعًا ، يَقُولُ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ عَبْدِ اللهِ بْنِ مَعْبَدِ بْنِ عَبَّاسٍ ، حَدَّثَهُ أَنَّ مَيْمُونَةَ زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : صَلاَةٌ فِي مَسْجِدِي هَذَا ، أَفْضَلُ مِنْ أَلْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ مِنَ الْمَسَاجِدِ ، إِلاَّ الْمَسْجِدَ الْكَعْبَةَ.

2898. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Məymunə demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Mənim bu məscidimdə qılınan namaz Kəbə məscidindən başqa digər məscidlərdə qılınan min namazdan üstündür".

٢٨٩٩- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : سَمِعْتُ أَبَا سَلَمَةَ ، قَالَ : سَأَلْتُ الأَغَرَّ عَنْ هَذَا الْحَدِيثِ فَحَدَّثَ الأَغَرُّ أَنَّهُ ، سَمِعَ أَبَا هُرَيْرَةَ ، يُحَدِّثُ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةٌ فِي مَسْجِدِي هَذَا ، أَفْضَلُ مِنْ أَلْفِ صَلاَةٍ فِيمَا سِوَاهُ مِنَ الْمَسَاجِدِ ، إِلاَّ الْكَعْبَةَ.

[1] Hədis zəifdir.

2899. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Mənim bu məscidimdə qılınan namaz, Kəbədən başqa digər məscidlərdə qılınan min namazdan üstündür”.

١٢٥- بِنَاءُ الْكَعْبَةِ

## 125-ci fəsil: Kəbənin inşası

٢٩٠٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ مُحَمَّدِ بْنِ أَبِي بَكْرٍ الصِّدِّيقِ ، أَخْبَرَ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَلَمْ تَرَيْ أَنَّ قَوْمَكِ حِينَ بَنَوْا الْكَعْبَةَ اقْتَصَرُوا عَنْ قَوَاعِدِ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ فَقُلْتُ : يَا رَسُولَ اللهِ أَلاَ تَرُدُّهَا عَلَى قَوَاعِدِ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ ؟ قَالَ : لَوْلاَ حِدْثَانُ قَوْمِكِ بِالْكُفْرِ قَالَ : عَبْدُ اللهِ بْنُ عُمَرَ لَئِنْ كَانَتْ عَائِشَةُ سَمِعَتْ هَذَا مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَا أُرَى تَرْكَ اسْتِلاَمِ الرُّكْنَيْنِ اللَّذَيْنِ يَلِيَانِ الْحِجْرَ إِلاَّ أَنَّ الْبَيْتَ لَمْ يُتَمَّمْ عَلَى قَوَاعِدِ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ.

2900. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Məgər görmürsənmi, qövmün Kəbəni inşa etdikdə İbrahimin ﷺ qoyduğu əsaslardan daha dar inşa etmişlər?!” Mən dedim: “Ey Allahın Elçisi, onu İbrahimin ﷺ əsasları üzərinə qaytara bilməzsənmi?” Peyğəmbər ﷺ buyurdu: “Əgər qövmüm küfrdən təzə çıxmasaydı, bunu edərdim”. Abdullah ibn Ömər dedi: “Əgər Aişə bu sözləri Allah Elçisindən ﷺ eşitməsəydi, əl-Hicrdən sonrakı iki yerə əl sürtməyi tərk etməyi Ev (Kəbə) İbrahimin ﷺ qoyduğu əsaslar üzərinə qayıdana qədər icazəli görməzdim”.

٢٩٠١- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ ، وَأَبُو مُعَاوِيَةَ قَالاَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَوْلاَ حَدَاثَةُ عَهْدِ قَوْمِكِ بِالْكُفْرِ ، لَنَقَضْتُ الْبَيْتَ فَبَنَيْتُهُ عَلَى أَسَاسِ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ ، وَجَعَلْتُ لَهُ خَلْفًا فَإِنَّ قُرَيْشًا لَمَّا بَنَتِ الْبَيْتَ اسْتَقْصَرَتْ.

2901. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Əgər qövmün küfrdən təzə çıxmasaydı, Kəbəni İbrahimin ﷺ əsasları üzərinə tikərdim və arxa tərəfinə də bir qapı əlavə edərdim, çünki Qureyş Evi (Kəbəni) tikərkən əsaslarını daha dar etmişdir”.

٢٩٠٢- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، عَنْ خَالِدٍ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، أَنَّ أُمَّ الْمُؤْمِنِينَ ، قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْلاَ أَنَّ قَوْمِي - وَفِي حَدِيثِ مُحَمَّدٍ قَوْمَكِ - حَدِيثُ عَهْدٍ بِجَاهِلِيَّةٍ لَهَدَمْتُ الْكَعْبَةَ ، وَجَعَلْتُ لَهَا بَابَيْنِ فَلَمَّا مَلَكَ ابْنُ الزُّبَيْرِ ، جَعَلَ لَهَا بَابَيْنِ.

2902. ...Rəvayət edilir ki, möminlərin Anası ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Əgər qövmüm cahiliyyədən təzə çıxmasaydı, Kəbəni

söküb ona iki qapı əlavə edərək yenidən tikərdim”. İbn əz-Zubeyrin vaxtında Kəbəyə iki qapı qoyulmuşdu”.

٢٩٠٣– أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرُ بْنُ حَازِمٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ رُومَانَ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لَهَا : يَا عَائِشَةُ لَوْلاَ أَنَّ قَوْمَكِ حَدِيثُ عَهْدٍ بِجَاهِلِيَّةٍ ، لأَمَرْتُ بِالْبَيْتِ ، فَهُدِمَ فَأَدْخَلْتُ فِيهِ مَا أُخْرِجَ مِنْهُ ، وَأَلْزَقْتُهُ بِالأَرْضِ ، وَجَعَلْتُ لَهُ بَابَيْنِ : بَابًا شَرْقِيًّا ، وَبَابًا غَرْبِيًّا ، فَإِنَّهُمْ قَدْ عَجَزُوا عَنْ بِنَائِهِ ، فَبَلَغْتُ بِهِ أَسَاسَ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ قَالَ : فَذَلِكَ الَّذِي حَمَلَ ابْنَ الزُّبَيْرِ عَلَى هَدْمِهِ قَالَ : يَزِيدُ وَقَدْ شَهِدْتُ ابْنَ الزُّبَيْرِ حِينَ هَدَمَهُ وَبَنَاهُ ، وَأَدْخَلَ فِيهِ مِنَ الْحِجْرِ وَقَدْ رَأَيْتُ أَسَاسَ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ حِجَارَةً كَأَسْنِمَةِ الإِبِلِ مُتَلاَحِكَةً.

2903. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ona buyurdu: “Ey Aişə, əgər qövmün cahiliyyə adətlərindən yeni çıxmasaydı, Kəbəni söküb ətrafında qalan yerləri də ona əlavə edib, şərqə və qərbə tərəf hərəsinə bir qapı qoydurardım, çünki onların buna imkanları yox idi”. İbn əz-Zubeyr Peyğəmbərin ﷺ bu sözünə əsaslanaraq Kəbəni sökmüşdü. Ravi Yəzid deyir: “Kəbənin sökülməsinə mən də şahid olmuşdum, bünövrəsində İbrahimin ﷺ qoyduğu daşları gördüm, bir-birinə girmiş dəvə hörgücü kimi idi. Beləliklə, Hicrin bir qismini içinə daxil etmişdi”.

٢٩٠٤– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ زِيَادِ بْنِ سَعْدٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُخَرِّبُ الْكَعْبَةَ ذُو السُّوَيْقَتَيْنِ مِنَ الْحَبَشَةِ.

2904. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kəbəni Həbəşistandan olan nazik ayaqlı bir nəfər dağıdacaq”.

## ١٢٦– دُخُولُ الْبَيْتِ

## 126-cı fəsil: Kəbəyə daxil olmaq

٢٩٠٥– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّهُ انْتَهَى إِلَى الْكَعْبَةِ وَقَدْ دَخَلَهَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبِلاَلٌ ، وَأُسَامَةُ بْنُ زَيْدٍ ، وَأَجَافَ عَلَيْهِمْ عُثْمَانُ بْنُ طَلْحَةَ الْبَابَ فَمَكَثُوا فِيهَا مَلِيًّا ، ثُمَّ فَتَحَ الْبَابَ ، فَخَرَجَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَرَكِبْتُ الدَّرَجَةَ ، وَدَخَلْتُ الْبَيْتَ فَقُلْتُ : أَيْنَ صَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالُوا : هَا هُنَا وَنَسِيتُ أَنْ أَسْأَلَهُمْ كَمْ صَلَّى فِي الْبَيْتِ.

2905. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ Kəbəyə gəldikdə artıq Peyğəmbər ﷺ, Bilal və Usamə ibn Zeyd ora daxil olmuşdular. Osman ibn Təlhə Kəbənin qapısını bağladı. İçəridə uzun müddət qaldıqdan sonra qapını açdılar. Allah Elçisi ﷺ bayıra çıxdı. Mən də nərdivanlarla çıxıb

Kəbəyə girdim və dedim: "Peyğəmbər ﷺ harada namaz qıldı?" Mənə dedilər: "Orada". Amma neçə rükət qılmasını soruşmağı unutmuşdum".

٢٩٠٦– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا ابْنُ عَوْنٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْبَيْتَ وَمَعَهُ الْفَضْلُ بْنُ عَبَّاسٍ وَأُسَامَةُ بْنُ زَيْدٍ وَعُثْمَانُ بْنُ طَلْحَةَ وَبِلاَلٌ فَأَجَافُوا عَلَيْهِمُ الْبَابَ ، فَمَكَثَ فِيهِ مَا شَاءَ اللَّهُ ، ثُمَّ خَرَجَ قَالَ ابْنُ عُمَرَ : كَانَ أَوَّلُ مَنْ لَقِيتُ بِلاَلاً قُلْتُ : أَيْنَ صَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : مَا بَيْنَ الأُسْطُوَانَتَيْنِ.

2906. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ əl-Fədl ibn Abbas, Usamə ibn Zeyd, Osman ibn Təlhə və Bilal Kəbəyə daxil oldular. Sonra qapını bağladılar. Onlar Allahın istədiyi qədər orada qaldıqdan sonra çıxdılar. Mənim ilk qarşılaşdığım şəxs Bilal idi. Ona dedim: "Peyğəmbər ﷺ harada namaz qıldı?" O dedi: "İki sütunun arasında".

### ١٢٧– مَوْضِعُ الصَّلاَةِ فِي الْبَيْتِ

### 127-ci fəsil: Kəbədə qılınan namazın yeri

٢٩٠٧– أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا السَّائِبُ بْنُ عُمَرَ ، قَالَ : حَدَّثَنِي ابْنُ أَبِي مُلَيْكَةَ ، أَنَّ ابْنَ عُمَرَ ، قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْكَعْبَةَ وَدَنَا خُرُوجُهُ وَوَجَدْتُ شَيْئًا ، فَذَهَبْتُ ، وَجِئْتُ سَرِيعًا ، فَوَجَدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَارِجًا ، فَسَأَلْتُ بِلاَلاً أَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْكَعْبَةِ ؟ قَالَ : نَعَمْ ، رَكْعَتَيْنِ بَيْنَ السَّارِيَتَيْنِ.

2907. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ Kəbəyə daxil oldu, çıxması yaxınlaşdıqda içimə bir hiss gəldi və tez ora getdim. Allah Elçisini ﷺ çıxanda gördüm. Bilaldan soruşdum: "Allah Elçisi ﷺ Kəbədə namaz qıldımı?" O dedi: "Bəli, o, iki sütunun arasında iki rükət namaz qıldı".

٢٩٠٨– أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سَيْفُ بْنُ سُلَيْمَانَ ، قَالَ : سَمِعْتُ مُجَاهِدًا ، يَقُولُ : أُتِيَ ابْنُ عُمَرَ فِي مَنْزِلِهِ فَقِيلَ هَذَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ دَخَلَ الْكَعْبَةَ فَأَقْبَلْتُ ، فَأَجِدُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ خَرَجَ وَأَجِدُ بِلاَلاً عَلَى الْبَابِ قَائِمًا فَقُلْتُ : يَا بِلاَلُ أَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْكَعْبَةِ ؟ قَالَ : نَعَمْ قُلْتُ : أَيْنَ ؟ قَالَ : مَا بَيْنَ هَاتَيْنِ الأُسْطُوَانَتَيْنِ رَكْعَتَيْنِ ، ثُمَّ خَرَجَ فَصَلَّى رَكْعَتَيْنِ فِي وَجْهِ الْكَعْبَةِ.

2908. ...Rəvayət edilir ki, Seyf ibn Süleyman رحمه الله demişdir: "Mən Mücahidin belə dediyini eşitdim: "İbn Ömər evində olanda bir nəfər gələrək dedi: "Allah Elçisi ﷺ Kəbəyə girdi". İbn Ömər qalxıb Kəbəyə gəldi. Allah Elçisi ﷺ artıq çıxmışdı. İbn Ömər deyir: "Mən qapıda Bilal ilə qarşılaşdım və ona dedim: "Ey Bilal, Allah Elçisi ﷺ Kəbədə namaz qıldımı?" O dedi: "Bəli".

Mən dedim: "Hansı tərəfdə?" O dedi: "Bu iki sütunun arasında iki rükət namaz qıldı". İbn Ömər də Kəbəyə doğru iki rükət namaz qıldı".

٢٩٠٩– أَخْبَرَنَا حَاجِبُ بْنُ سُلَيْمَانَ الْمَنْبِجِيُّ ، عَنِ ابْنِ أَبِي رَوَّادٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، قَالَ : دَخَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْكَعْبَةَ ، فَسَبَّحَ فِي نَوَاحِيهَا ، وَكَبَّرَ ، وَلَمْ يُصَلِّ ، ثُمَّ خَرَجَ فَصَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ ، ثُمَّ قَالَ : هَذِهِ الْقِبْلَةُ.

2909. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﷺ demişdir: "Allah Elçisi ﷺ Kəbəyə daxil oldu və Kəbənin künclərində Allahı təsbih edib təkbir dedi, lakin namaz qılmadı. Sonra oradan çıxıb İbrahim məqamının arxasında iki rükət namaz qıldı və buyurdu: "Bu, qiblədir".[1]

## ١٢٨– الْحِجْرُ
## 128-ci fəsil: Hicr[2]

٢٩١٠– أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ أَبِي زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، قَالَ : ابْنُ الزُّبَيْرِ ، سَمِعْتُ عَائِشَةَ تَقُولُ : إِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَوْلاَ أَنَّ النَّاسَ حَدِيثٌ عَهْدُهُمْ بِكُفْرٍ ، وَلَيْسَ عِنْدِي مِنَ النَّفَقَةِ مَا يُقَوِّي عَلَى بِنَائِهِ ، لَكُنْتُ أَدْخَلْتُ فِيهِ مِنَ الْحِجْرِ خَمْسَةَ أَذْرُعٍ ، وَجَعَلْتُ لَهُ بَابًا يَدْخُلُ النَّاسُ مِنْهُ ، وَبَابًا يَخْرُجُونَ مِنْهُ.

2910. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "Əgər insanlar küfrdən yeni qurtulmuş olmasaydılar və maddi cəhətdən imkanım olsaydı, beş zira olan Hicri də Kəbənin ərazisinə daxil edib yenidən tikərdim. Həmçinin insanların birindən girib digərindən çıxacaqları iki qapı da əlavə edərdim".

٢٩١١– أَخْبَرَنَا أَحْمَدُ بْنُ سَعِيدٍ الرِّبَاطِيُّ ، قَالَ : حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا قُرَّةُ بْنُ خَالِدٍ ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ عَمَّتِهِ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ قَالَتْ : حَدَّثَتْنَا عَائِشَةُ ، قَالَتْ : قُلْتُ يَا رَسُولَ اللهِ أَلاَ أَدْخُلُ الْبَيْتَ ؟ قَالَ : ادْخُلِي الْحِجْرَ فَإِنَّهُ مِنَ الْبَيْتِ.

2911. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən dedim: "Ey Allahın Elçisi, Kəbəyə girməyim?" O buyurdu: "Hicrə gir, çünki ora da Kəbədən sayılır".

---

[1] Hədisdə "İbrahim məqamının" hissəsi səhih deyil.
[2] Hicr - Kəbəyə bitişik yarımdairə şəklində hörülmüş, hündür olmayan divarla Kəbənin arasındakı yerin adıdır. Bu yerə Hatim də deyilir.

١٢٩- الصَّلَاةُ فِي الْحِجْرِ

129-cu fəsil: Hicrdə namaz qılmaq

٢٩١٢- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي عَلْقَمَةُ بْنُ أَبِي عَلْقَمَةَ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كُنْتُ أُحِبُّ أَنْ أَدْخُلَ الْبَيْتَ ، فَأُصَلِّيَ فِيهِ ، فَأَخَذَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدِي ، فَأَدْخَلَنِي الْحِجْرَ فَقَالَ : إِذَا أَرَدْتِ دُخُولَ الْبَيْتِ فَصَلِّي هَا هُنَا ، فَإِنَّمَا هُوَ قِطْعَةٌ مِنَ الْبَيْتِ ، وَلَكِنَّ قَوْمَكِ اقْتَصَرُوا حَيْثُ بَنَوْهُ.

2912. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bir dəfə Kəbəyə girib orada namaz qılmaq istədim. Allah Elçisi ﷺ də əlimdən tutub Hicrə daxil etdi və buyurdu: "Kəbəyə daxil olmaq istədikdə burada namaz qıl, çünki bura Kəbənin bir hissəsidir. Sənin qövmün Kəbəni tikərkən ərazisini qısaltmış (və Hicri kənarda qoymuşdur)".

١٣٠- التَّكْبِيرُ فِي نَوَاحِي الْكَعْبَةِ

130-cu fəsil: Kəbənin künclərində təkbir etmək

٢٩١٣- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَمْرٍو ، أَنَّ ابْنَ عَبَّاسٍ ، قَالَ : لَمْ يُصَلِّ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْكَعْبَةِ ، وَلَكِنَّهُ كَبَّرَ فِي نَوَاحِيهِ.

2913. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ Kəbəyə girdikdə orada namaz qılmamış, yalnız künclərində təkbir etmişdir".

١٣١- الذِّكْرُ وَالدُّعَاءُ فِي الْبَيْتِ

131-ci fəsil: Kəbədə zikr və dua etmək

٢٩١٤- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ أَبِي سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَطَاءٌ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، أَنَّهُ دَخَلَ هُوَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْبَيْتَ فَأَمَرَ بِلاَلاً فَأَجَافَ الْبَابَ وَالْبَيْتُ إِذْ ذَاكَ عَلَى سِتَّةِ أَعْمِدَةٍ ، فَمَضَى حَتَّى إِذَا كَانَ بَيْنَ الأُسْطُوَانَتَيْنِ اللَّتَيْنِ تَلِيَانِ بَابَ الْكَعْبَةِ ، جَلَسَ ، فَحَمِدَ اللهَ ، وَأَثْنَى عَلَيْهِ ، وَسَأَلَهُ وَاسْتَغْفَرَهُ ، ثُمَّ قَامَ حَتَّى أَتَى مَا اسْتَقْبَلَ مِنْ دُبُرِ الْكَعْبَةِ فَوَضَعَ ، وَجْهَهُ ، وَخَدَّهُ عَلَيْهِ ، وَحَمِدَ اللهَ ، وَأَثْنَى عَلَيْهِ ، وَسَأَلَهُ ، وَاسْتَغْفَرَهُ ، ثُمَّ انْصَرَفَ إِلَى كُلِّ رُكْنٍ مِنْ أَرْكَانِ الْكَعْبَةِ فَاسْتَقْبَلَهُ بِالتَّكْبِيرِ ، وَالتَّهْلِيلِ ، وَالتَّسْبِيحِ ، وَالثَّنَاءِ عَلَى اللهِ ، وَالْمَسْأَلَةِ ، وَالاِسْتِغْفَارِ ، ثُمَّ خَرَجَ ، فَصَلَّى رَكْعَتَيْنِ مُسْتَقْبِلَ وَجْهِ الْكَعْبَةِ ، ثُمَّ انْصَرَفَ فَقَالَ : هَذِهِ الْقِبْلَةُ ، هَذِهِ الْقِبْلَةُ.

2914. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵁ və Allah Elçisi ﷺ Kəbəyə daxil oldu. Allah Elçisi ﷺ Bilala qapının bağlanmasını əmr etdi. Bilal qapını bağladı. Kəbənin içində altı sütun var idi. Allah Elçisi ﷺ Kəbənin qapısına yaxın olan iki sütun arasına gəlib oturdu. O, Allaha həmd-səna və Ona

təriflər dedikdən sonra Allahdan bəzi şeylər istədi və Ondan bağışlanma dilədi. Sonra ayağa durub Kəbənin hər bir küncündə təkbir[1], təhlil[2], təsbih[3] edərək Allaha həmd-səna etdi, Ona dua edib bağışlanma dilədi. Sonra salam verdi və oradan çıxdı. Sonra Kəbəyə yönələrək iki rükət namaz qıldı və çevrilib: "Qiblə budur! Qiblə budur!" dedi".

### ١٣٢– وَضْعُ الصَّدْرِ ، وَالْوَجْهِ عَلَى مَا اسْتُقْبِلَ مِنْ دُبُرِ الْكَعْبَةِ
### 132-ci fəsil: Kürəyini və üzünü Kəbəyə söykəmək

٢٩١٥– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْمَلِكِ ، عَنْ عَطَاءٍ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، قَالَ : دَخَلْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْبَيْتَ ، فَجَلَسَ ، فَحَمِدَ اللَّهَ ، وَأَثْنَى عَلَيْهِ ، وَكَبَّرَ ، وَهَلَّلَ ، ثُمَّ مَالَ إِلَى مَا بَيْنَ يَدَيْهِ مِنَ الْبَيْتِ فَوَضَعَ صَدْرَهُ عَلَيْهِ ، وَخَدَّهُ ، وَيَدَيْهِ ، ثُمَّ كَبَّرَ ، وَهَلَّلَ ، وَدَعَا ، فَعَلَ ذَلِكَ بِالأَرْكَانِ كُلِّهَا ، ثُمَّ خَرَجَ فَأَقْبَلَ عَلَى الْقِبْلَةِ وَهُوَ عَلَى الْبَابِ ، فَقَالَ : هَذِهِ الْقِبْلَةُ ، هَذِهِ الْقِبْلَةُ.

2915. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵁ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə Kəbəyə daxil oldum. O oturdu, Allaha həmd-səna dedi, təkbir və təhlil etdi. Sonra önə doğru əyildi, sinəsini, yanağını və əllərini Kəbənin divarına dayadı. Sonra təkbir edib "Lə iləhə illəllah" dedikdən sonra dua etdi. Bu etdiyini Kəbənin bütün künclərində etdi. Sonra bayıra çıxıb Kəbənin qapısında qibləyə çevrilərək: "Qiblə budur! Qiblə budur!" buyurdu".

### ١٣٣– مَوْضِعُ الصَّلاَةِ مِنَ الْكَعْبَةِ
### 133-cü fəsil: Kəbəyə doğru qılınan namazın yeri

٢٩١٦– أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ عَبْدِ الْمَلِكِ ، عَنْ عَطَاءٍ ، عَنْ أُسَامَةَ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْبَيْتِ صَلَّى رَكْعَتَيْنِ فِي قُبُلِ الْكَعْبَةِ ، ثُمَّ قَالَ : هَذِهِ الْقِبْلَةُ.

2916. ...Rəvayət edilir ki, Usamə ﵁ demişdir: "Allah Elçisi ﷺ Kəbədən çıxıb Kəbənin qarşısında iki rükət namaz qıldı, sonra: "Qiblə budur!" deyə buyurdu".

٢٩١٧– أَخْبَرَنَا أَبُو عَاصِمٍ خُشَيْشُ بْنُ أَصْرَمَ النَّسَائِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، قَالَ :

---
[1] "Allahu Əkbər" demək.
[2] "Lə iləhə illəllah" demək.
[3] "Subhən-Allah" demək.

سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ أَخْبَرَنِي أُسَامَةُ بْنُ زَيْدٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ الْبَيْتَ فَدَعَا فِي نَوَاحِيهِ كُلِّهَا ، وَلَمْ يُصَلِّ فِيهِ حَتَّى خَرَجَ مِنْهُ ، فَلَمَّا خَرَجَ ، رَكَعَ رَكْعَتَيْنِ فِي قُبُلِ الْكَعْبَةِ.

2917. ...Usamə ibn Zeyd ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Kəbəyə daxil oldu və bütün künclərində dua etdi, lakin çıxana qədər orada namaz qılmadı. Çıxdıqda isə Kəbənin qapısında iki rükət namaz qıldı.

٢٩١٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنِي السَّائِبُ بْنُ عُمَرَ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ السَّائِبِ ، عَنْ أَبِيهِ ، أَنَّهُ كَانَ يَقُودُ ابْنَ عَبَّاسٍ وَيُقِيمُهُ عِنْدَ الشُّقَّةِ الثَّالِثَةِ مِمَّا يَلِي الرُّكْنَ الَّذِي يَلِي الْحَجَرَ مِمَّا يَلِي الْبَابَ ، فَقَالَ ابْنُ عَبَّاسٍ أَمَا أُنْبِئْتَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي هَاهُنَا فَيَقُولُ : نَعَمْ ، فَيَتَقَدَّمُ فَيُصَلِّي.

2918. ...Muhəmməd ibn Abdullah ibn əs-Səib atasından ﵄ rəvayət edir ki, İbn Abbasın gözləri görmədiyinə görə ona kömək edirdim. Kəbənin qapısından və Həcərul-Əsvəd (Qara daş) küncündən sonra gələn üçüncü sütunun arasına gəldikdə İbn Abbas dedi: "Allah Elçisinin ﷺ burada namaz qıldığını bilirdinmi?" Abdullah ibn əs-Səib dedi: "Bəli, oraya daxil olar və namaz qılardı".[1]

## ١٣٤- ذِكْرُ الْفَضْلِ فِي الطَّوَافِ بِالْبَيْتِ

## 134-cü fəsil: Kəbəni təvaf etdikdə deyilən fəzilətli zikrlər

٢٩١٩- أَنْبَأَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَطَاءٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُبَيْدِ بْنِ عُمَيْرٍ ، أَنَّ رَجُلاً قَالَ : يَا أَبَا عَبْدِ الرَّحْمَنِ مَا أَرَاكَ تَسْتَلِمُ إِلاَّ هَذَيْنِ الرُّكْنَيْنِ ؟ قَالَ : إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّ مَسْحَهُمَا : يَحُطَّانِ الْخَطِيئَةَ وَسَمِعْتُهُ يَقُولُ : مَنْ طَافَ سَبْعًا ، فَهُوَ كَعِدْلِ رَقَبَةٍ.

2919. ...Rəvayət edilir ki, bir kişi Abdullah ibn Ubeyd ibn Umeyrə ﵄ dedi: "Ey Əbu Abdur-Rahmən, bu küncə əl sürtməyin səbəbi nədir?" O dedi: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Bu iki küncə əl sürtmək günahları silib aparır". Həmçinin onun belə dediyini eşitmişəm: "Kim Kəbəni yeddi dəfə təvaf edərsə, bir qul azad etmiş kimidir".

## ١٣٥- الْكَلاَمُ فِي الطَّوَافِ

## 135-ci fəsil: Kəbəni təvaf etdikdə deyilən sözlər

٢٩٢٠- أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي سُلَيْمَانُ الأَحْوَلُ ، أَنَّ طَاوُوسًا ، أَخْبَرَهُ ،

[1] Hədis zəifdir.

عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّ وَهُوَ يَطُوفُ بِالْكَعْبَةِ بِإِنْسَانٍ ، يَقُودُهُ إِنْسَانٌ بِخِزَامَةٍ فِي أَنْفِهِ ، فَقَطَعَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِيَدِهِ ، ثُمَّ أَمَرَهُ أَنْ يَقُودَهُ بِيَدِهِ.

2920. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Kəbəni təvaf etdikdə bir adamın digərinin burnuna bir şey bağlayıb təvaf etdirdiyini gördü, həmin şeyi əli ilə qopardı və gözləri görməyən həmin adamın əlindən tutaraq təvaf etdirməsini əmr etdi.

٢٩٢١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنِي سُلَيْمَانُ الأَحْوَلُ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : مَرَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِرَجُلٍ يَقُودُهُ رَجُلٌ بِشَيْءٍ ذَكَرَهُ فِي نَذْرٍ ، فَتَنَاوَلَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَطَعَهُ ، قَالَ : إِنَّهُ نَذْرٌ.

2921. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ bir adamın digərini burnundan bağlatdıraraq Kəbəni təvaf etdirdiyini gördü. Həmin adam belə etməyi nəzir etmişdi. Peyğəmbər ﷺ ona yaxınlaşdı və onun burnundakını qopardı və: "Nəzir budur!" buyurdu".[1]

### ١٣٦- إِبَاحَةُ الْكَلاَمِ فِي الطَّوَافِ

### 136-cı fəsil: Kəbəni təvaf etdikdə danışmaq

٢٩٢٢- أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي الْحَسَنُ بْنُ مُسْلِمٍ (ح) وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، عَنِ الْحَسَنِ بْنِ مُسْلِمٍ ، عَنْ طَاوُوسٍ ، عَنْ رَجُلٍ ، أَدْرَكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الطَّوَافُ بِالْبَيْتِ صَلاَةٌ ، فَأَقِلُّوا مِنَ الْكَلاَمِ اللَّفْظُ لِيُوسُفَ. خَالَفَهُ حَنْظَلَةُ بْنُ أَبِي سُفْيَانَ.

2922. ...Tavus ﷺ bir kişidən rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kəbəni təvaf etmək namaz qılmaq kimidir, ona görə də təvaf əsnasında az danışın".

٢٩٢٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا الشَّيْبَانِيُّ ، عَنْ حَنْظَلَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنْ طَاوُوسٍ ، قَالَ : قَالَ عَبْدُ اللهِ بْنُ عُمَرَ : أَقِلُّوا الْكَلاَمَ فِي الطَّوَافِ ، فَإِنَّمَا أَنْتُمْ فِي الصَّلاَةِ.

2923. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: "Təvaf əsnasında az danışın, çünki siz namazda sayılırsınız".

[1] Hədisin sonunda "Nəzir budur!" hissəsi səhih deyil.

١٣٧- إِبَاحَةُ الطَّوَافِ فِي كُلِّ الأَوْقَاتِ

## 137-ci fəsil: Bütün vaxtlarda təvaf edilə bilər

٢٩٢٤- أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو الزُّبَيْرِ ، عَنْ عَبْدِ اللهِ بْنِ بَابَاهَ ، عَنْ جُبَيْرِ بْنِ مُطْعِمٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَا بَنِي عَبْدِ مَنَافٍ ، لاَ تَمْنَعُنَّ أَحَدًا طَافَ بِهَذَا الْبَيْتِ ، وَصَلَّى أَيَّ سَاعَةٍ شَاءَ مِنْ لَيْلٍ أَوْ نَهَارٍ.

2924. ...Cubeyr ibn Mutim ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ey Abdi-Mənaf oğulları! Gecənin və gündüzün istənilən hansı vaxtı olursa olsun, bu Evi (Kəbəni) təvaf etməyə və namaz qılmağa heç kimə mane olmayın!"

١٣٨- كَيْفَ طَوَافُ الْمَرِيضِ

## 138-ci fəsil: Xəstənin təvafı necədir?

٢٩٢٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ نَوْفَلٍ ، عَنْ عُرْوَةَ ، عَنْ زَيْنَبَ بِنْتِ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : شَكَوْتُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، إِنِّي أَشْتَكِي ، فَقَالَ : طُوفِي مِنْ وَرَاءِ النَّاسِ ، وَأَنْتِ رَاكِبَةٌ فَطُفْتُ ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي إِلَى جَنْبِ الْبَيْتِ يَقْرَأُ بِالطُّورِ وَكِتَابٍ مَسْطُورٍ.

2925. ...Rəvayət edilir ki, Ummu Sələmə ﷺ demişdir: "Mən Allah Elçisinə ﷺ narahat olduğumu bildirdim. O da buyurdu: "Camaatın arxası ilə minik üzərində təvaf et!" Mən də Allah Elçisinin ﷺ dediyi kimi etdim. Allah Elçisi ﷺ də Kəbənin yanında namaz qılaraq **"And olsun Tur dağına! And olsun yazılmış Kitaba!"** (ət-Tur" surəsini) oxuyurdu".

١٣٩- طَوَافُ الرِّجَالِ مَعَ النِّسَاءِ

## 139-cu fəsil: Qadınların kişilərlə birlikdə təvaf etmələri

٢٩٢٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عَبْدَةَ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : يَا رَسُولَ اللهِ مَا طُفْتُ طَوَافَ الْخُرُوجِ ؟ فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا أُقِيمَتِ الصَّلاَةُ فَطُوفِي عَلَى بَعِيرِكِ مِنْ وَرَاءِ النَّاسِ عُرْوَةُ لَمْ يَسْمَعْهُ مِنْ أُمِّ سَلَمَةَ.

2926. ...Rəvayət edilir ki, Ummu Sələmə ﷺ demişdir: "Mən dedim: "Ey Allahın Elçisi, çıxış təvafını etməmişəm". Peyğəmbər ﷺ buyurdu: "Namaz qılınana qədər dəvənin üzərində camaatın ardı ilə təvafını et".

٢٩٢٧- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الأَسْوَدِ ، عَنْ عُرْوَةَ ، عَنْ زَيْنَبَ بِنْتِ أُمِّ سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، أَنَّهَا قَدِمَتْ مَكَّةَ وَهِيَ مَرِيضَةٌ ، فَذَكَرَتْ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : طُوفِي مِنْ وَرَاءِ الْمُصَلِّينَ وَأَنْتِ رَاكِبَةٌ قَالَتْ : فَسَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ عِنْدَ الْكَعْبَةِ يَقْرَأُ وَالطُّورِ.

2927. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ xəstələnmiş vəziyyətdə Məkkəyə gəlmişdi. Məsələni Allah Elçisinə ﷺ xəbər verdikdə o buyurdu: "Camaatın arxası ilə minikdə təvaf et". Ummu Sələmə deyir: "Allah Elçisi ﷺ Kəbənin yanında namaz qılır və "ət-Tur" surəsini oxuyurdu".

## ١٤٠- الطَّوَافُ بِالْبَيْتِ عَلَى الرَّاحِلَةِ

## 140-cu fəsil: Minikdə təvaf etmək

٢٩٢٨- أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ وَهُوَ ابْنُ إِسْحَاقَ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : طَافَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ حَوْلَ الْكَعْبَةِ عَلَى بَعِيرٍ يَسْتَلِمُ الرُّكْنَ بِمِحْجَنِهِ.

2928. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ Vida həccində Kəbəni minik üzərində təvaf etdi. Əlindəki əsa ilə küncə işarə edirdi".

## ١٤١- طَوَافُ مَنْ أَفْرَدَ الْحَجَّ

## 141-ci fəsil: Yalnız həcc edənin təvafı

٢٩٢٩- أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا سُوَيْدٌ وَهُوَ ابْنُ عَمْرٍو الْكَلْبِيُّ ، عَنْ زُهَيْرٍ ، قَالَ : حَدَّثَنَا بَيَانٌ ، أَنَّ وَبَرَةَ ، حَدَّثَهُ قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ عُمَرَ وَسَأَلَهُ رَجُلٌ أَطُوفُ بِالْبَيْتِ وَقَدْ أَحْرَمْتُ بِالْحَجِّ ؟ قَالَ : وَمَا يَمْنَعُكَ ؟ قَالَ : رَأَيْتُ عَبْدَ اللهِ بْنَ عَبَّاسٍ يَنْهَى عَنْ ذَلِكَ وَأَنْتَ أَعْجَبُ إِلَيْنَا مِنْهُ ، قَالَ : رَأَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَحْرَمَ بِالْحَجِّ فَطَافَ بِالْبَيْتِ ، وَسَعَى بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ.

2929. ...Rəvayət edilir ki, Vəbra ﵁ demişdir: "Bir kişinin Abdullah ibn Ömərə belə sual verdiyini eşitdim: "Həcc üçün ehrama girdiyim halda təvaf edə bilərəmmi?" İbn Ömər dedi: "Buna nə maneə var ki?" O kişi də dedi: "Abdullah ibn Abbasın bunu qadağan etdiyini gördüm. Bu mövzuda sənin fikrin bizə daha xoş gəlir". İbn Ömər dedi: "Biz Allah Elçisinin ﷺ həcc üçün ehrama girdiyini gördük, Kəbəni də təvaf etmiş, Səfa və Mərva arasında da səy etmişdi".

١٤٢- طَوَافُ مَنْ أَهَلَّ بِعُمْرَةٍ

## 142-ci fəsil: Yalnız ümrə üçün ehrama girənin təvafı

٢٩٣٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، قَالَ : سَمِعْتُ ابْنَ عُمَرَ ، وَسَأَلْنَاهُ عَنْ رَجُلٍ قَدِمَ مُعْتَمِرًا ، فَطَافَ بِالْبَيْتِ ، وَلَمْ يَطُفْ بَيْنَ الصَّفَا ، وَالْمَرْوَةِ ، أَيَأْتِي أَهْلَهُ ؟ قَالَ : لَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَطَافَ سَبْعًا ، وَصَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ ، وَطَافَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، وَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللهِ أُسْوَةٌ حَسَنَةٌ.

2930. ...Rəvayət edilir ki, Amr ﷺ demişdir: "Biz İbn Ömərdən soruşduq: "Ümrə edən Kəbəni təvaf edib Səfa və Mərva arasında səy etməyən kişi öz zövcəsi ilə yata bilərmi?" İbn Ömər dedi: "Allah Elçisi ﷺ Məkkəyə gəldiyi vaxt yeddi dəfə təvaf etdi. Sonra İbrahim məqamının arxasında iki rükət namaz qıldı və Səfa ilə Mərva arasında səy etdi. Şübhəsiz ki, Allah Elçisində ﷺ sizin üçün ən gözəl nümunə var".

١٤٣- كَيْفَ يَفْعَلُ مَنْ أَهَلَّ بِالْحَجِّ وَالْعُمْرَةِ ، وَلَمْ يَسُقِ الْهَدْيَ

## 143-cü fəsil: Həcc və ümrəni birlikdə etmək istəyən qurban gətirməyibsə, nə etməlidir?

٢٩٣١- أَخْبَرَنَا أَحْمَدُ بْنُ الأَزْهَرِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ الأَنْصَارِيُّ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَنَسٍ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَخَرَجْنَا مَعَهُ ، فَلَمَّا بَلَغَ ذَا الْحُلَيْفَةِ ، صَلَّى الظُّهْرَ ، ثُمَّ رَكِبَ رَاحِلَتَهُ ، فَلَمَّا اسْتَوَتْ بِهِ عَلَى الْبَيْدَاءِ ، أَهَلَّ بِالْحَجِّ وَالْعُمْرَةِ جَمِيعًا ، فَأَهْلَلْنَا مَعَهُ ، فَلَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ ، وَطُفْنَا ، أَمَرَ النَّاسَ أَنْ يَحِلُّوا ، فَهَابَ الْقَوْمُ ، فَقَالَ لَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَوْلاَ أَنَّ مَعِي الْهَدْيَ ، لأَحْلَلْتُ فَحَلَّ الْقَوْمُ حَتَّى حَلُّوا إِلَى النِّسَاءِ ، وَلَمْ يَحِلَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَلَمْ يُقَصِّرْ إِلَى يَوْمِ النَّحْرِ.

2931. Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ həcc ziyarət üçün çıxdı, biz də onunla birlikdə idik. Zul-Huleyfəyə çatanda Zöhr namazını qıldı. Sonra miniyinə minərək əl-Beydaya gəldikdə həcc və ümrə üçün ehrama girdi. Biz də ehrama girdik. Allah Elçisi ﷺ Məkkəyə gəldikdə təvaflarımızı etdik. Allah Elçisi ehramdan çıxmağımızı əmr etdi. Camaat isə bundan çəkindi. Camaatın çəkindiyini gördükdə Allah Elçisi ﷺ buyurdu: "Əgər yanımda qurbanım olmasaydı, mən də ehramdan çıxardım". İnsanlar ehramdan çıxdılar, hətta zövcələri ilə yatdılar. Allah Elçisi ﷺ qurban gününə qədər ehramdan çıxmadı və saçını da qısaltmadı".[1]

[1] Hədis zəifdir.

## ١٤٤- طَوَافُ الْقَارِنِ

## 144-cü fəsil: Qiran həcc edənin təvafı

٢٩٣٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ بْنِ مُوسَى ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ قَرَنَ الْحَجَّ وَالْعُمْرَةَ ، فَطَافَ طَوَافًا وَاحِدًا ، وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُهُ.

2932. ...Nafi ﷺ rəvayət edir ki, İbn Ömər həcc ilə ümrəni birləşdirərək bir təvaf etdi və dedi: "Mən Allah Elçisinin ﷺ də belə etdiyini görmüşəm".

٢٩٣٣- أَخْبَرَنَا عَلِيُّ بْنُ مَيْمُونٍ الرَّقِّيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ السَّخْتِيَانِيِّ ، وَأَيُّوبُ بْنُ مُوسَى ، وَإِسْمَعِيلُ بْنُ أُمَيَّةَ ، وَعُبَيْدُ اللهِ بْنُ عُمَرَ ، عَنْ نَافِعٍ ، قَالَ : خَرَجَ عَبْدُ اللهِ بْنُ عُمَرَ فَلَمَّا أَتَى ذَا الْحُلَيْفَةِ ، أَهَلَّ بِالْعُمْرَةِ ، فَسَارَ قَلِيلاً ، فَخَشِيَ أَنْ يُصَدَّ عَنِ الْبَيْتِ فَقَالَ : إِنْ صُدِدْتُ ، صَنَعْتُ كَمَا صَنَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : وَاللهِ مَا سَبِيلُ الْحَجِّ إِلاَّ سَبِيلُ الْعُمْرَةِ ، أُشْهِدُكُمْ أَنِّي قَدْ أَوْجَبْتُ مَعَ عُمْرَتِي حَجًّا فَسَارَ حَتَّى أَتَى قُدَيْدًا فَاشْتَرَى مِنْهَا هَدْيًا ، ثُمَّ قَدِمَ مَكَّةَ ، فَطَافَ بِالْبَيْتِ سَبْعًا ، وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَلَ.

2933. ...Rəvayət edilir ki, Nafi ﷺ demişdir: "Abdullah ibn Ömər ümrə etmək üçün yola çıxdı və Zul-Huleyfəyə çatdıqda ehrama girdi. Bir az yol getdikdən sonra Kəbənin təvaf edilməsinə maneə olunmasından qorxdu və belə dedi: "Əgər Kəbəni təvaf etməyimə mane olunsa, Allah Elçisinin ﷺ etdiyi kimi edərəm. Həcc və ümrə ikisi də eynidir. Şahid olun ki, ümrə ilə həcci birlikdə etməyə qərar verdim". Bir az yeridikdən sonra Qudeydə adlı yerə gəlib oradan bir qurban aldı. Məkkəyə gəldi, Kəbəni yeddi dəfə təvaf etdikdən sonra Səfa və Mərva arasında səy etdi və belə dedi: "Mən Allah Elçisinin ﷺ də belə etdiyini görmüşəm".

٢٩٣٤- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ مَهْدِيٍّ ، أَخْبَرَنِي هَانِئُ بْنُ أَيُّوبَ ، عَنْ طَاوُوسٍ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، طَافَ ، طَوَافًا وَاحِدًا.

2934. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir dəfə təvaf etdi.

## ١٤٥- ذِكْرُ الْحَجَرِ الأَسْوَدِ

## 145-ci fəsil: Qara daş (Həcərul-Əsvəd) haqda

٢٩٣٥- أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ دَاوُدَ ، عَنْ حَمَّادِ بْنِ سَلَمَةَ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْحَجَرُ الأَسْوَدُ مِنَ الْجَنَّةِ.

2935. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Qara daş (Həcərul-Əsvəd) Cənnətdən gətirilmişdir".

### ١٤٦- اسْتِلاَمُ الْحَجَرِ الأَسْوَدِ

### 146-cı fəsil: Qara daşa əl sürtmək

٢٩٣٦- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ الأَعْلَى ، عَنْ سُوَيْدِ بْنِ غَفَلَةَ ، أَنَّ عُمَرَ ، قَبَّلَ الْحَجَرَ ، وَالْتَزَمَهُ ، وَقَالَ : رَأَيْتُ أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِكَ ، حَفِيًّا.

2936. ...Suveyd ibn Ğafələ ﷺ rəvayət edir ki, Ömər qara daşı (Həcərul-Əsvədi) öpərək ona əllərini sürtdü və belə dedi: "Mən Əbul-Qasimin səni öpdüyünü gördüm, ona görə öpürəm".

### ١٤٧- تَقْبِيلُ الْحَجَرِ

### 147-ci fəsil: Qara daşı öpmək

٢٩٣٧- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، وَجَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَابِسِ بْنِ رَبِيعَةَ ، قَالَ : رَأَيْتُ عُمَرَ جَاءَ إِلَى الْحَجَرِ فَقَالَ : إِنِّي لأَعْلَمُ أَنَّكَ حَجَرٌ ، وَلَوْلاَ أَنِّي رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُقَبِّلُكَ ، مَا قَبَّلْتُكَ ثُمَّ دَنَا مِنْهُ ، فَقَبَّلَهُ.

2937. ...Rəvayət edilir ki, Abis ibn Rabia ﷺ demişdir: "Mən Ömərin qara daşın yanına gəldiyini gördüm. O dedi: "Mən bilirəm ki, sən bir daşsan. Əgər Allah Elçisinin ﷺ səni öpdüyünü görməsəydim, mən də öpməzdim". Sonra yaxınlaşıb onu öpdü".

### ١٤٨- كَيْفَ يُقَبِّلُ

### 148-ci fəsil: Qara daşı necə öpmək lazımdır?

٢٩٣٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنْ حَنْظَلَةَ ، قَالَ : رَأَيْتُ طَاوُوسًا يَمُرُّ بِالرُّكْنِ ، فَإِنْ وَجَدَ عَلَيْهِ زِحَامًا مَرَّ ، وَلَمْ يُزَاحِمْ ، وَإِنْ رَآهُ خَالِيًا ، قَبَّلَهُ ثَلاَثًا ، ثُمَّ قَالَ : رَأَيْتُ ابْنَ عَبَّاسٍ ، فَعَلَ مِثْلَ ذَلِكَ ، وَقَالَ ابْنُ عَبَّاسٍ : رَأَيْتُ عُمَرَ بْنَ الْخَطَّابِ ، فَعَلَ مِثْلَ ذَلِكَ ، ثُمَّ قَالَ : إِنَّكَ حَجَرٌ ، لاَ تَنْفَعُ وَلاَ تَضُرُّ ، وَلَوْلاَ أَنِّي رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَبَّلَكَ ، مَا قَبَّلْتُكَ ، ثُمَّ قَالَ : عُمَرُ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَعَلَ مِثْلَ ذَلِكَ.

2938. ...Rəvayət edilir ki, Hənzələ ﷺ demişdir: "Mən Tavusu qara daşı ziyarət edərkən gördüm. Camaat çox olardısa yanından keçərdi, camaat az olanda onu üç dəfə öpər və belə deyərdi: "Mən İbn Abbasın eynilə belə

etdiyini gördüm. İbn Abbas da Ömər ibn əl-Xattabın belə etdiyini gördüyünü və belə dediyini söyləmişdir: "Sən faydası və zərəri olmayan bir daşsan. Allah Elçisinin ﷺ səni öpdüyünü görməsəydim, səni öpməzdim". Sonra Ömər belə dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm".[1]

١٤٩- كَيْفَ يَطُوفُ أَوَّلَ مَا يَقْدَمُ وَعَلَى أَيِّ شِقَّيْهِ يَأْخُذُ إِذَا اسْتَلَمَ الْحَجَرَ

## 149-cu fəsil: Qara daşa əl sürtmək və təvaf etmək necə başlanır?

٢٩٣٩- أَخْبَرَنَا عَبْدُ الأَعْلَى بْنُ وَاصِلِ بْنِ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ سُفْيَانَ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، قَالَ : لَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ ، دَخَلَ الْمَسْجِدَ فَاسْتَلَمَ الْحَجَرَ ، ثُمَّ مَضَى عَلَى يَمِينِهِ ، فَرَمَلَ ثَلاَثًا ، وَمَشَى أَرْبَعًا ، ثُمَّ أَتَى الْمَقَامَ فَقَالَ : **{وَاتَّخِذُوا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى}** فَصَلَّى رَكْعَتَيْنِ ، وَالْمَقَامُ بَيْنَهُ وَبَيْنَ الْبَيْتِ ثُمَّ أَتَى الْبَيْتَ بَعْدَ الرَّكْعَتَيْنِ ، فَاسْتَلَمَ الْحَجَرَ ، ثُمَّ خَرَجَ إِلَى الصَّفَا.

2939. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ Məkkəyə gəldikdə məscidə daxil oldu və qara daşa əl sürtdü. Sonra qara daşın sağ tərəfindən təvaf etməyə başladı. Təvafın ilk üç dövrəsini iti addımlarla, son dörd dövrəsini isə adi addımlarla keçdi. Sonra İbrahim məqamına gələrək: **"İbrahimin durduğu yeri namazgah edin"** (əl-Bəqərə, 125) deyərək iki rükət namaz qıldı. Namaz qılanda İbrahim məqamı onunla Kəbə arasında idi. İki rükət qıldıqdan sonra Kəbəyə gələrək yenidən qara daşı öpdü. Sonra Səfa təpəsinə çıxdı".

١٥٠- كَمْ يَسْعَى

## 150-ci fəsil: Neçə təvafda iti addımlar atılır?

٢٩٤٠- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ نَافِعٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، كَانَ يَرْمُلُ الثَّلاَثَ ، وَيَمْشِي الأَرْبَعَ ، وَيَزْعُمُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَفْعَلُ ذَلِكَ.

2940. ...Nafi ﷺ rəvayət edir ki, Abdullah ibn Ömər təvafın ilk üç dövrənsini sürətli yerişlə, sonrakı dörd dövrəni isə yerişlə tamamlayar və Allah Elçisinin ﷺ də belə etdiyini deyərdi.

١٥١- كَمْ يَمْشِي

## 151-ci fəsil: Neçə təvafda adi addımlar atılır?

٢٩٤١- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

[1] Hədisin isnadı zəifdir.

كَانَ إِذَا طَافَ فِي الْحَجِّ وَالْعُمْرَةِ أَوَّلَ مَا يَقْدَمُ ، فَإِنَّهُ يَسْعَى ثَلاَثَةَ أَطْوَافٍ ، وَيَمْشِي أَرْبَعًا ، ثُمَّ يُصَلِّي سَجْدَتَيْنِ ، ثُمَّ يَطُوفُ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ.

2941. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ həcc və ümrə təvafının hər ikisində də ilk üç dövrəni sürətlə və sərt şəkildə, sonrakı dövrələrdə isə adi addımlarla təvaf edərdi. İki rükət namaz qıldıqdan sonra Səfa və Mərva arasında səy edərdi.

### ١٥٢- الْخَبَبُ فِي الثَّلاَثَةِ مِنَ السَّبْعِ

### 152-ci fəsil: Yeddi təvafdan üçü sürətli olmalıdır

٢٩٤٢- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرٍو ، وَسُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ يَقْدَمُ مَكَّةَ ، يَسْتَلِمُ الرُّكْنَ الأَسْوَدَ ، أَوَّلَ مَا يَطُوفُ يَخُبُّ ثَلاَثَةَ أَطْوَافٍ مِنَ السَّبْعِ.

2942. ...Səlim atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Məkkəyə gəldikdə qara daşa əl vurar və edəcəyi yeddi təvafın ilk üçünü sürətlə yeriyərək edərdi".

### ١٥٣- الرَّمَلُ فِي الْحَجِّ وَالْعُمْرَةِ

### 153-cü fəsil: Həcc və ümrədə daş atmaq

٢٩٤٣- أَخْبَرَنِي مُحَمَّدٌ ، وَعَبْدُ الرَّحْمَنِ ، ابْنَا عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ قَالاَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، عَنْ أَبِيهِ ، عَنْ كَثِيرِ بْنِ فَرْقَدٍ ، عَنْ نَافِعٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، كَانَ يَخُبُّ فِي طَوَافِهِ حِينَ يَقْدَمُ فِي حَجٍّ أَوْ عُمْرَةٍ ثَلاَثًا ، وَيَمْشِي أَرْبَعًا ، قَالَ : وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ ذَلِكَ.

2943. ...Nafi ﷺ rəvayət edir ki, Abdullah ibn Ömər həcc və ümrəd zamanı hər təvafda ilk üç dövrəni sürətlə yeriyər, sonrakı dörd dövrəni isə adi yerişlə edər və Allah Elçisinin ﷺ belə etdiyini deyərdi.

### ١٥٤- الرَّمَلُ مِنَ الْحِجْرِ إِلَى الْحِجْرِ

### 154-cü fəsil: Təvaf qara daşda başlayıb qara daşda qurtarır

٢٩٤٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَمَلَ مِنَ الْحِجْرِ إِلَى الْحِجْرِ حَتَّى انْتَهَى إِلَيْهِ ثَلاَثَةَ أَطْوَافٍ.

2944. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Mən Allah

Elçisinin ﷺ qara daşda başlayıb qara daşda qurtararaq təvafın ilk üç dövrəsini sürətlə yeridiyini görmüşəm".

### ١٥٥– الْعِلَّةُ الَّتِي مِنْ أَجْلِهَا سَعَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْبَيْتِ

### 155-ci fəsil: Peyğəmbər ﷺ Kəbəni təvaf etdikdə ilk üç dövrəni sürətlə edərdi

٢٩٤٥– أَخْبَرَنِي مُحَمَّدُ بْنُ سُلَيْمَانَ ، عَنْ حَمَّادِ بْنِ زَيْدٍ ، عَنْ أَيُّوبَ ، عَنِ ابْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : لَمَّا قَدِمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ مَكَّةَ قَالَ الْمُشْرِكُونَ : وَهَنَتْهُمْ حُمَّى يَثْرِبَ ، وَلَقُوا مِنْهَا شَرًّا ، فَأَطْلَعَ اللهُ نَبِيَّهُ عَلَيْهِ الصَّلاَةُ وَالسَّلاَمُ عَلَى ذَلِكَ فَأَمَرَ أَصْحَابَهُ أَنْ يَرْمُلُوا ، وَأَنْ يَمْشُوا مَا بَيْنَ الرُّكْنَيْنِ وَكَانَ الْمُشْرِكُونَ مِنْ نَاحِيَةِ الْحِجْرِ فَقَالُوا : لَهَؤُلاَءِ أَجْلَدُ مِنْ كَذَا.

2945. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ və səhabələri Məkkəyə gəldikdə müşriklər dedilər: "Mədinənin qızdırması bunlara xoş təsir etmədiyinə görə zəifləyiblər". Allah da bunu Peyğəmbərinə ﷺ xəbər verdi. Allah Elçisi ﷺ də səhabələrinə müşriklərin olduğu qara daş tərəfdən keçərkən (sağ çiyinlərini açaraq) sürətlə yeriməyi buyurdu. Müşriklər dedilər: "Bunlar əvvəlkindən daha qüvvətli olublar".

٢٩٤٦– أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنِ الزُّبَيْرِ بْنِ عَرَبِيٍّ ، قَالَ : سَأَلَ رَجُلٌ ابْنَ عُمَرَ ، عَنِ اسْتِلاَمِ الْحَجَرِ ؟ ، فَقَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُهُ ، وَيُقَبِّلُهُ فَقَالَ الرَّجُلُ : أَرَأَيْتَ إِنْ زُحِمْتُ عَلَيْهِ أَوْ غُلِبْتُ عَلَيْهِ ؟ فَقَالَ ابْنُ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا : اجْعَلْ أَرَأَيْتَ بِالْيَمَنِ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُهُ ، وَيُقَبِّلُهُ.

2946. ...Rəvayət edilir ki, əz-Zubeyr ibn Arabi رضي الله عنه demişdir: "Bir kişi İbn Ömərdən soruşdu: "Qara daşı necə salamlayım?" O da buyurdu: "Mən Allah Elçisinin ﷺ qara daşı salamlayarkən və öpərkən gördüm". Kişi dedi: "Adam çox olsa və yaxınlaşa bilməsəm necə?" İbn Ömər dedi: "Yəməndən gələnlər haqda bir düşün! Əlbəttə ki adam çox olacaq. Mən Allah Elçisinin ﷺ bəzən qara daşı öpdüyünü, bəzən də salamladığını görmüşəm".

### ١٥٦– اسْتِلاَمُ الرُّكْنَيْنِ فِي كُلِّ طَوَافٍ

### 156-ci fəsil: Hər təvafda Kəbənin iki küncünə salam verilməsi

٢٩٤٧– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ أَبِي رَوَّادٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ يَسْتَلِمُ الرُّكْنَ الْيَمَانِيَ ، وَالْحَجَرَ فِي كُلِّ طَوَافٍ.

2947. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ hər təvafda həm Yəmən küncünə,[1] həm də qara daşa salam verərdi.

٢٩٤٨- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ لاَ يَسْتَلِمُ إِلاَّ الْحَجَرَ وَالرُّكْنَ الْيَمَانِيَ.

2948. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ yanız Yəmən küncünə və qara daşa salam verərdi.

## ١٥٧- مَسْحُ الرُّكْنَيْنِ الْيَمَانِيَيْنِ

## 157-ci fəsil: Yəmən rüknündə olan hər iki küncün də məsh edilməsi

٢٩٤٩- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : لَمْ أَرَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَمْسَحُ مِنَ الْبَيْتِ ، إِلاَّ الرُّكْنَيْنِ الْيَمَانِيَيْنِ.

2949. ...Səlim atanın ﵁ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ Kəbənin yalnız Yəmən küncü tərəfdə olan iki küncü məsh edərdi.

## ١٥٨- تَرْكُ اسْتِلاَمِ الرُّكْنَيْنِ الآخَرَيْنِ

## 158-ci fəsil: Kəbənin son iki küncünə toxunmamaq

٢٩٥٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ عُبَيْدِ اللهِ ، وَابْنُ جُرَيْجٍ ، وَمَالِكٌ ، عَنِ الْمَقْبُرِيِّ ، عَنْ عُبَيْدِ بْنِ جُرَيْجٍ ، قَالَ : قُلْتُ لاِبْنِ عُمَرَ رَأَيْتُكَ لاَ تَسْتَلِمُ مِنَ الأَرْكَانِ إِلاَّ هَذَيْنِ الرُّكْنَيْنِ الْيَمَانِيَيْنِ ، قَالَ : لَمْ أَرَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُ إِلاَّ هَذَيْنِ الرُّكْنَيْنِ مُخْتَصَرٌ.

2950. Rəvayət edilir ki, Ubeyd ibn Cureyc ﵀ demişdir: “Mən İbn Ömərə dedim: “Mən sənin Yəmən tərəfdə olan künclərdən başqa heç bir küncə toxunmadığını görürəm”. Abdullah dedi: “Allah Elçisinin ﷺ bu iki küncdən başqa yerə toxunmadığına görə belə edirəm”.

٢٩٥١- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرٍو ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : لَمْ يَكُنْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُ مِنْ أَرْكَانِ الْبَيْتِ ، إِلاَّ الرُّكْنَ الأَسْوَدَ ، وَالَّذِي يَلِيهِ مِنْ نَحْوِ دُورِ الْجُمَحِيِّينَ.

[1] “Yəmən küncü” və ya “Yəmən rüknü” – Kəbənin Yəmən tərəfə düşən küncünə deyilir.

2951. ...Səlim atasının ﵁ belə dediyini rəvayət edir: “Allah Elçisi ﷺ Kəbənin künclərindən yalnız qara daş olan küncə və Cumahilərin evləri tərəfdə olan küncə toxunardı”.

٢٩٥٢- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ نَافِعٍ ، قَالَ : قَالَ عَبْدُ اللهِ رَضِيَ اللَّهُ عَنْهُ مَا تَرَكْتُ اسْتِلاَمَ هَذَيْنِ الرُّكْنَيْنِ مُنْذُ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُهُمَا الْيَمَانِيَ ، وَالْحَجَرَ فِي شِدَّةٍ ، وَلاَ رَخَاءٍ.

2952. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ bu iki küncə toxunmasını gördüyümdən bu yana basabas vaxtı və boşluq olduqda onlara toxunmağı heç vaxt tərk etmədim”.

٢٩٥٣- أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : مَا تَرَكْتُ اسْتِلاَمَ الْحَجَرِ فِي رَخَاءٍ ، وَلاَ شِدَّةٍ ، مُنْذُ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَلِمُهُ.

2953. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Mən Allah Elçisinin ﷺ qara daş olan küncə toxunmasını gördüyümdən bu yana basabas vaxtı və boşluq olduqda onlara toxunmağı heç vaxt tərk etmədim”.

### ١٥٩- اسْتِلاَمُ الرُّكْنِ بِالْمِحْجَنِ

### 159-cu fəsil: Qara daşı salamlama əsa ilə də edilir

٢٩٥٤- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، وَسُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، طَافَ فِي حَجَّةِ الْوَدَاعِ ، عَلَى بَعِيرٍ يَسْتَلِمُ الرُّكْنَ بِمِحْجَنٍ.

2954. ...Abdullah ibn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Vida həccində dəvəsinin üzərində əsası ilə qara daşı salamlayaraq təvaf etdi.

### ١٦٠- الإِشَارَةُ إِلَى الرُّكْنِ

### 160-cı fəsil: Qara daşa işarə etmək

٢٩٥٥- أَخْبَرَنَا بِشْرُ بْنُ هِلاَلٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ خَالِدٍ ، عَنْ عِكْرِمَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ يَطُوفُ بِالْبَيْتِ عَلَى رَاحِلَتِهِ ، فَإِذَا انْتَهَى إِلَى الرُّكْنِ أَشَارَ إِلَيْهِ.

2955. Abdullah ibn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Kəbəni miniyinin üzərində təvaf edən zaman qara daşın səmtinə çatdıqda işarə edərdi.

١٦١– قَوْلُهُ عَزَّ وَجَلَّ {خُذُوا زِينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ}

161-ci fəsil: Allahın ﷻ bu kəlamı: **"Məscidlərə gedərkən gözəl geyimlərinizi geyinin"**. (əl-Əraf, 31)

٢٩٥٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَلَمَةَ ، قَالَ : سَمِعْتُ مُسْلِمًا الْبَطِينَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانَتِ الْمَرْأَةُ تَطُوفُ بِالْبَيْتِ وَهِيَ عُرْيَانَةٌ تَقُولُ :
الْيَوْمَ يَبْدُو بَعْضُهُ أَوْ كُلُّهُ ... وَمَا بَدَا مِنْهُ فَلاَ أُحِلُّهُ
قَالَ : فَنَزَلَتْ {يَا بَنِي آدَمَ خُذُوا زِينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ}.

2956. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Bir qadın Kəbəni lüt təvaf edər və belə deyərdi:
"Bu gün onun bir hissəsi və ya hamısı görünəcək,
Bundan sonra isə görünən tərəfi haram ediləcək".
Sonra bu ayələr nazil oldu: **"Məscidlərə gedərkən gözəl geyimlərinizi geyinin"**. (əl-Əraf, 31)".

٢٩٥٧– أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنِ ابْنِ شِهَابٍ ، أَنَّ حُمَيْدَ بْنَ عَبْدِ الرَّحْمَنِ ، أَخْبَرَهُ ، أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُ أَنَّ أَبَا بَكْرٍ بَعَثَهُ فِي الْحَجَّةِ الَّتِي أَمَّرَهُ عَلَيْهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَبْلَ حَجَّةِ الْوَدَاعِ فِي رَهْطٍ يُؤَذِّنُ فِي النَّاسِ ، أَلاَ لاَ يَحُجَّنَّ بَعْدَ الْعَامِ مُشْرِكٌ ، وَلاَ يَطُوفُ بِالْبَيْتِ عُرْيَانٌ.

2957. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Vida həccindən qabaq Əbu Bəkri həcdə əmir təyin etdiyi il, o ildən etibarən heç bir müşrikin həcc etməyəcəyini və lüt təvaf edə bilməyəcəyini insanlara bildirmək üçün məni bir dəstə ilə Məkkəyə göndərdi".

٢٩٥٨– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، وَعُثْمَانُ بْنُ عُمَرَ ، قَالاَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْمُغِيرَةِ ، عَنِ الشَّعْبِيِّ ، عَنِ الْمُحَرَّرِ بْنِ أَبِي هُرَيْرَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : جِئْتُ مَعَ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ حِينَ بَعَثَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى أَهْلِ مَكَّةَ بِبَرَاءَةَ ، قَالَ : مَا كُنْتُمْ تُنَادُونَ ؟ قَالَ : كُنَّا نُنَادِي إِنَّهُ لاَ يَدْخُلُ الْجَنَّةَ ، إِلاَّ نَفْسٌ مُؤْمِنَةٌ ، وَلاَ يَطُوفُ بِالْبَيْتِ عُرْيَانٌ ، وَمَنْ كَانَ بَيْنَهُ وَبَيْنَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَهْدٌ ، فَأَجَلُهُ أَوْ أَمَدُهُ إِلَى أَرْبَعَةِ أَشْهُرٍ ، فَإِذَا مَضَتِ الأَرْبَعَةُ أَشْهُرٍ ، فَإِنَّ اللهَ بَرِيءٌ مِنَ الْمُشْرِكِينَ ، وَرَسُولُهُ ، وَلاَ يَحُجُّ بَعْدَ الْعَامِ مُشْرِكٌ ، فَكُنْتُ أُنَادِي حَتَّى صَحِلَ صَوْتِي.

2958. ...əl-Muhərrar ibn Əbu Hureyra ﷺ atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ Əli ibn Əbu Talibi Məkkəlilərə "Bəraə" (ət-Tövbə) surəsini eşitdirmək üçün göndərdikdə mən Əlinin yanında idim". Ravi dedi: "Siz nəyi elan edirdiniz?" Əbu Hureyra dedi: "Biz, mömin olmayanın Cənnətə girməyəcəyini, Kəbənin lüt təvaf edilməyəcəyini, kimin

Allah Elçisi ﷺ ilə əhdi varsa, o əhdin müddəti bitənə qədər əhdə vəfa ediləcəyini, əhdi olmayana dörd ay vaxt veriləcəyini, Allah və Onun Elçisinin ﷺ müşriklərdən uzaq olmasını, bu ildən sonra heç bir müşrikin həcc etməyəcəyini səsimiz batana qədər elan etdik".

### ١٦٢- أَيْنَ يُصَلِّي رَكْعَتَيِ الطَّوَافِ

### 162-ci fəsil: İki rükət olan təvaf namazı harada qılınır?

٢٩٥٩- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ كَثِيرِ بْنِ كَثِيرٍ ، عَنْ أَبِيهِ ، عَنِ الْمُطَّلِبِ بْنِ أَبِي وَدَاعَةَ ، قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، حِينَ فَرَغَ مِنْ سُبُعِهِ ، جَاءَ حَاشِيَةَ الْمَطَافِ ، فَصَلَّى رَكْعَتَيْنِ ، وَلَيْسَ بَيْنَهُ وَبَيْنَ الطَّوَّافِينَ أَحَدٌ.

2959. ...Rəvayət edilir ki, Muttalib ibn Əbu Vədəa رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ yeddi dövrədən ibarət təvaf etdiyini, təvaf ətrafına çəkilib iki rükət namaz qıldığını gördüm. Onunla təvaf edənlər arasında heç bir maneə yox idi".[1]

٢٩٦٠- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، قَالَ : ، يَعْنِي ابْنَ عُمَرَ قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَطَافَ بِالْبَيْتِ سَبْعًا ، وَصَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ ، وَطَافَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، وَقَالَ : **{لَقَدْ كَانَ لَكُمْ فِي رَسُولِ اللهِ أُسْوَةٌ حَسَنَةٌ}**.

2960. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ Məkkəyə gəldikdə Kəbəni yeddi dəfə təvaf etdi və İbrahim məqamının arxasında iki rükət namaz qıldı. Onunla təvaf edənlər arasında heç bir maneə yox idi. Sonra Səfa və Mərvada səy etmək üçün çıxdı və buyurdu: **"Allah Elçisi ﷺ sizə... gözəl nümunədir"** (əl-Əhzab, 21).

### ١٦٣- الْقَوْلُ بَعْدَ رَكْعَتَيِ الطَّوَافِ

### 163-cü fəsil: Təvaf namazından sonra deyilən söz

٢٩٦١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ قَالَ : طَافَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْبَيْتِ سَبْعًا ، رَمَلَ مِنْهَا ثَلاَثًا ، وَمَشَى أَرْبَعًا ، ثُمَّ قَامَ عِنْدَ الْمَقَامِ فَصَلَّى رَكْعَتَيْنِ ، ثُمَّ قَرَأَ ، **{وَاتَّخِذُوا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى}** وَرَفَعَ صَوْتَهُ يُسْمِعُ النَّاسَ ، ثُمَّ انْصَرَفَ فَاسْتَلَمَ ، ثُمَّ ذَهَبَ فَقَالَ : نَبْدَأُ بِمَا بَدَأَ اللَّهُ بِهِ ، فَبَدَأَ بِالصَّفَا ، فَرَقِيَ عَلَيْهَا ، حَتَّى بَدَا لَهُ الْبَيْتُ ، فَقَالَ ثَلاَثَ مَرَّاتٍ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ ، يُحْيِي وَيُمِيتُ ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، فَكَبَّرَ اللَّهَ وَحَمِدَهُ ، ثُمَّ دَعَا بِمَا قُدِّرَ لَهُ ، ثُمَّ نَزَلَ مَاشِيًا ، حَتَّى تَصَوَّبَتْ قَدَمَاهُ فِي بَطْنِ الْمَسِيلِ ، فَسَعَى حَتَّى صَعِدَتْ قَدَمَاهُ ، ثُمَّ مَشَى حَتَّى أَتَى الْمَرْوَةَ ، فَصَعِدَ فِيهَا ، ثُمَّ بَدَا لَهُ الْبَيْتُ ، فَقَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَحْدَهُ لاَ

[1] Hədis zəifdir.

شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، قَالَ ذَلِكَ ثَلَاثَ مَرَّاتٍ : ثُمَّ ذَكَرَ اللَّهَ ، وَسَبَّحَهُ ، وَحَمِدَهُ ، ثُمَّ دَعَا عَلَيْهَا بِمَا شَاءَ اللَّهُ فَعَلَ هَذَا حَتَّى فَرَغَ مِنَ الطَّوَافِ.

2961. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Allah Elçisi ﷺ Kəbəni yeddi dəfə təvaf etdi. Bunun ilk üç dövrəsini yeyin şəkildə, sonrakı dörd dövrəsini isə adi addımlarla etdi. Sonra İbrahim məqamının yanında durub iki rükət namaz qıldı, sonra da: **“İbrahimin durduğu yeri namazgah edin”** (əl-Bəqərə, 125) ayəsini insanlara eşitdirmək üçün səsini qaldırdı. Sonra dönüb Kəbəni salamladı. Sonra (Səfaya) gedərək belə buyurdu: “Mən Allahın başladığından başlayıram”. Sonra Səfanın Kəbə görünəcək yerinə gəlib üç dəfə buyurdu: “Lə ilə:hə illəllah, vahdəhu lə şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu, yuhyi va yumi:tu va huvə alə: kulli şey in qadi:r!”[1] Allaha təkbir və təhmid etdikdən sonra bacardığı qədər dua etdi. Sonra yeriyərək təpədən aşağı düşdü. Bətnil-Məsəl adlı yerə gəldikdə sürətlə yeriməyə başladı və yenidən Mərvaya doğru yeriməyə başladı. Mərva təpəsinə çıxıb oradan Kəbə görünəcək yerdə: “Lə ilə:hə illəllah, vahdəhu lə şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r!”[2] dedi və bunu üç dəfə təkrarladı. Sonra Allahı zikr etdi, Onu təkbir və təhmid edərək Allahın istədiyi qədər dua etdi. Təvafı tamamlayana qədər bu şəkildə davam etdi”.

٢٩٦٢- أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، طَافَ سَبْعًا رَمَلَ ثَلَاثًا ، وَمَشَى أَرْبَعًا ، ثُمَّ قَرَأَ : **{وَاتَّخِذُوا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى}** ، فَصَلَّى سَجْدَتَيْنِ ، وَجَعَلَ الْمَقَامَ بَيْنَهُ وَبَيْنَ الْكَعْبَةِ ، ثُمَّ اسْتَلَمَ الرُّكْنَ ، ثُمَّ خَرَجَ ، فَقَالَ : إِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَائِرِ اللهِ ، فَابْدَؤُوا بِمَا بَدَأَ اللَّهُ بِهِ.

2962. ...Cabir ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Kəbəni yeddi dəfə təvaf etdi. Bunun ilk üç dövrəsini yeyin şəkildə, sonrakı dörd dövrəsini isə adi addımlarla etdi. Sonra bu ayəni: **“İbrahimin durduğu yeri namazgah edin”** (əl-Bəqərə, 125) oxudu, sonra iki səcdə etdi (iki rükət namaz qıldı). İbrahim məqamı onunla Kəbənin arasında idi. Sonra qara daşı salamlayaraq Səfa təpəsinə çıxdı və buyurdu: **“Həqiqətən, Səfa və Mərva Allahın nişanələrindəndir”** (əl-Bəqərə, 158). Mən də Allahın başladığından başlayıram”.

---

[1] Tərcüməsi: Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O dirildir və öldürür! O, hər şeyə Qadirdir!

[2] Tərcüməsi: Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir!

١٦٤- الْقِرَاءَةُ فِي رَكْعَتَيِ الطَّوَافِ

164-cü fəsil: Təvaf namazında nə oxunur?

٢٩٦٣- أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرِ بْنِ دِينَارٍ ، عَنِ الْوَلِيدِ ، عَنْ مَالِكٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمَّا انْتَهَى إِلَى مَقَامِ إِبْرَاهِيمَ قَرَأَ : **{وَاتَّخِذُوا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى}** فَصَلَّى رَكْعَتَيْنِ ، فَقَرَأَ فَاتِحَةَ الْكِتَابِ ، وَ**{قُلْ يَا أَيُّهَا الْكَافِرُونَ}**، وَ**{قُلْ هُوَ اللَّهُ أَحَدٌ}** ثُمَّ عَادَ إِلَى الرُّكْنِ فَاسْتَلَمَهُ ، ثُمَّ خَرَجَ إِلَى الصَّفَا.

2963. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ İbrahim məqamına yaxınlaşdıqda **"İbrahimin durduğu yeri namazgah edin"** (əl-Bəqərə, 125) ayəsini oxudu, sonra iki rükət namaz qıldı. "əl-Fatihə" surəsi ilə **"De: "Ey kafirlər!"** (əl-Kəfirun) və **"De: O Allah təkdir!"** (əl-İxlas) surələrini oxudu, sonra qara daşın salamladı, sonra da Səfa təpəsinə çıxdı.

١٦٥- الشُّرْبُ مِنْ زَمْزَمَ

165-ci fəsil: Zəmzəm suyundan içmək

٢٩٦٤- أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا عَاصِمٌ ، وَمُغِيرَةُ (ح) وَأَنْبَأَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا عَاصِمٌ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، شَرِبَ مِنْ مَاءِ زَمْزَمَ وَهُوَ قَائِمٌ.

2964. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ayaq üstə Zəmzəm suyundan içdi.

١٦٦- الشُّرْبُ مِنْ زَمْزَمَ قَائِمًا

166-cı fəsil: Zəmzəm suyundan ayaq üstə içmək

٢٩٦٥- أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ عَاصِمٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : سَقَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ زَمْزَمَ ، فَشَرِبَهُ وَهُوَ قَائِمٌ.

2965. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Mən Zəmzəm suyundan Allah Elçisinə ﷺ süzdüm, o da suyu ayaq üstə içdi".

١٦٧- ذِكْرُ خُرُوجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الصَّفَا مِنَ الْبَابِ الَّذِي يُخْرَجُ مِنْهُ

167-ci fəsil: Təvafdan çıxdıqda Səfa qapısından çıxaraq Səfaya gəlmək

٢٩٦٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، قَالَ : سَمِعْتُ ابْنَ عُمَرَ ، يَقُولُ : لَمَّا قَدِمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَكَّةَ ، طَافَ بِالْبَيْتِ سَبْعًا ، ثُمَّ صَلَّى خَلْفَ الْمَقَامِ رَكْعَتَيْنِ ، ثُمَّ خَرَجَ إِلَى الصَّفَا مِنَ الْبَابِ

الَّذِي يُخْرَجُ مِنْهُ ، فَطَافَ بِالصَّفَا وَالْمَرْوَةِ قَالَ : شُعْبَةُ ، وَأَخْبَرَنِي أَيُّوبُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ ابْنِ عُمَرَ أَنَّهُ قَالَ : سُنَّةٌ.

2966. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ Məkkəyə gəldikdə Kəbəni yeddi dəfə təvaf etdi və İbrahim məqamının arxasında iki rükət namaz qıldı. Oradan Səfaya gedən qapıdan Səfa təpəsinə çıxdı və Səfa və Mərvada səy etdi”. İbn Ömər dedi: “Bu, sünnədir”.

١٦٨- ذِكْرُ الصَّفَا وَالْمَرْوَةِ

## 168-ci fəsil: Səfa və Mərvada deyilən zikr

٢٩٦٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، قَالَ : قَرَأْتُ عَلَى عَائِشَةَ **{فَلاَ جُنَاحَ}** عَلَيْهِ أَنْ يَطَّوَّفَ بِهِمَا قُلْتُ : مَا أُبَالِي ، أَنْ لاَ أَطُوفَ بَيْنَهُمَا فَقَالَتْ : بِئْسَ مَا قُلْتَ : إِنَّمَا كَانَ نَاسٌ مِنْ أَهْلِ الْجَاهِلِيَّةِ لاَ يَطُوفُونَ بَيْنَهُمَا ، فَلَمَّا كَانَ الإِسْلاَمُ وَنَزَلَ الْقُرْآنُ **{إِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَائِرِ اللَّهِ}** الآيَةَ فَطَافَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَطُفْنَا مَعَهُ فَكَانَتْ سُنَّةً.

2967. ...Rəvayət edilir ki, Urva رحمه الله demişdir: “Mən Aişəyə: “**Bu iki dağ arasında səy etməsində ona heç bir günah yoxdur”** (əl-Bəqərə, 158) bu ayəni oxuyaraq onların arasında səy etməyəcəm”- dedim. Aişə dedi: “Sənin dediyin necə də pisdir”. Mən dedim: “Pis olan nə dedim ki?” O dedi: “İnsanlar cahiliyyət dövründə onları səy etməzdilər. İslam gəldikdə Quranda olan bu ayə nazil oldu: **“Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir...”** (əl-Bəqərə, 158)**.** Allah Elçisi ﷺ orada səy etdi, biz də onunla birlikdə səy etdik, çünki bu, sünnədir”.

٢٩٦٨- أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ ، عَنْ قَوْلِ اللهِ عَزَّ وَجَلَّ **{فَلاَ جُنَاحَ عَلَيْهِ أَنْ يَطَّوَّفَ بِهِمَا}** فَوَاللهِ مَا عَلَى أَحَدٍ جُنَاحٌ أَنْ لاَ يَطُوفَ بِالصَفَا وَالْمَرْوَةِ ، قَالَتْ عَائِشَةُ : بِئْسَمَا قُلْتَ يَا ابْنَ أُخْتِي إِنَّ هَذِهِ الآيَةَ لَوْ كَانَتْ كَمَا أَوَّلْتَهَا ، كَانَتْ فَلاَ جُنَاحَ عَلَيْهِ أَنْ لاَ يَطَّوَّفَ بِهِمَا ، وَلَكِنَّهَا نَزَلَتْ فِي الأَنْصَارِ قَبْلَ أَنْ يُسْلِمُوا ، كَانُوا يُهِلُّونَ لِمَنَاةَ الطَّاغِيَةِ الَّتِي كَانُوا يَعْبُدُونَ عِنْدَ الْمُشَلَّلِ ، وَكَانَ مَنْ أَهَلَّ لَهَا يَتَحَرَّجُ أَنْ يَطُوفَ بِالصَّفَا وَالْمَرْوَةِ ، فَلَمَّا سَأَلُوا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ ؟ أَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ ، **{إِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَائِرِ اللهِ}** فَمَنْ حَجَّ الْبَيْتَ أَوِ اعْتَمَرَ فَلاَ جُنَاحَ عَلَيْهِ أَنْ يَطَّوَّفَ بِهِمَا ثُمَّ قَدْ سَنَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، الطَّوَافَ بَيْنَهُمَا ، فَلَيْسَ لأَحَدٍ أَنْ يَتْرُكَ الطَّوَافَ بِهِمَا.

2968. ...Rəvayət edilir ki, Urva رحمه الله demişdir: “Mən Aişədən Uca Allahın: **“Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir. Kim evi** (Kəbəni) **həcc və ya ümrə niyyəti ilə ziyarət edərsə, bunları təvaf etməsində ona heç bir günah olmaz...”** (əl-Bəqərə, 158) sözü haqqında soruşdum və “Allaha and olsun ki, Səfa və Mərvanı təvaf etməyən kimsəyə

günah yoxdur"– dedim. Aişə dedi: "Sənin dediyin necə də pisdir, ey bacım oğlu! Əgər bu ayə sənin dediyin kimi təfsir olunsaydı, şübhəsiz ki, onları təvaf etməmək günah sayılmazdı. Lakin bu ayə ənsar barəsində nazil olmuşdur. Onlar İslam dinini qəbul etməmişdən əvvəl tapındıqları Mənat adlı bütü ziyarət etmək məqsədilə Müşəlləl deyilən yerdən yola düşərdilər. Hər kim Mənatı ziyarət etmək məqsədilə ora gələrdisə, Səfa və Mərvanı təvaf etməyi özünə günah hesab edərdi. Onlar bu haqda Allah Elçisindən ﷺ soruşduqda Allah ﷻ bu ayəni nazil etdi: **"Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir..."** (əl-Bəqərə, 158)**.** Kim həcc və ümrə edərsə, onların arasında səy etmək günah deyil. Sonra Allah Elçisi ﷺ hər iki təpə arasında səy etməyi sünnə etdi və o zamandan bu yana bu sünnəni heç kim tərk etmədi".

٢٩٦٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ خَرَجَ مِنَ الْمَسْجِدِ وَهُوَ يُرِيدُ الصَّفَا ، وَهُوَ يَقُولُ : نَبْدَأُ بِمَا بَدَأَ اللَّهُ بِهِ.

2969. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Mən Allah Elçisinin ﷺ məsciddən çıxıb Səfaya qalxdıqda: "Biz də Allahın başladığından başlayırıq" dediyini eşitmişəm".

٢٩٧٠– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنَا جَابِرٌ ، قَالَ : خَرَجَ رَسُولُ اللهِ إِلَى الصَّفَا وَقَالَ : نَبْدَأُ بِمَا بَدَأَ اللَّهُ بِهِ ، ثُمَّ قَرَأَ : **{إِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَائِرِ اللَّهِ}**.

2970. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Allah Elçisi ﷺ Səfaya çıxdıqda belə buyurdu: "Biz də Allahın başladığından başlayırıq" və bu ayəni oxudu: "**Həqiqətən, Səfa və Mərvə Allahın qoyduğu nişanələrdəndir..."** (əl-Bəqərə, 158)".

## ١٦٩– مَوْضِعُ الْقِيَامِ عَلَى الصَّفَا

## 169-cu fəsil: Səfa təpəsində durmaq üçün yer

٢٩٧١– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنَا جَابِرٌ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَقِيَ عَلَى الصَّفَا ، حَتَّى إِذَا نَظَرَ إِلَى الْبَيْتِ كَبَّرَ.

2971. ...Cabir رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ Səfa təpəsinə çıxdı və Kəbəni görə biləcəyi yerə gəldikdə təkbir etdi.

١٧٠- التَّكْبِيرُ عَلَى الصَّفَا

170-ci fəsil: Səfa təpəsinin üstündə "Allahu Əkbər" demək

٢٩٧٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ إِذَا وَقَفَ عَلَى الصَّفَا يُكَبِّرُ ثَلاَثًا ، وَيَقُولُ : لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ يَصْنَعُ ذَلِكَ ثَلاَثَ مَرَّاتٍ ، وَيَدْعُو ، وَيَصْنَعُ ، عَلَى الْمَرْوَةِ مِثْلَ ذَلِكَ.

2972. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Səfa təpəsində dayandıqda üç dəfə təkbir edər və üç dəfə: "Lə ilə:hə illəllah, vahdəhu lə şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r!" deyərək dua edərdi. Mərva təpəsində də eyni şeyi edərdi.

١٧١- التَّهْلِيلُ عَلَى الصَّفَا

171-ci fəsil: Səfa təpəsinin üstündə "lə iləhə illəllah" demək

٢٩٧٣- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، قَالَ : أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، أَنَّهُ سَمِعَ أَبَاهُ ، يُحَدِّثُ ، أَنَّهُ سَمِعَ جَابِرًا عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثُمَّ وَقَفَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عَلَى الصَّفَا يُهَلِّلُ اللهَ عَزَّ وَجَلَّ ، وَيَدْعُو بَيْنَ ذَلِكَ.

2973. ...Cabir ﷺ Peyğəmbərin ﷺ həcc etməsindən danışarkən Allah Elçisinin ﷺ Səfa təpəsində dayandığını və Allaha ﷻ "Səndən başqa ibadətə layiq məbud yoxdur" dediyini və bu təpələrin arasında dua etdiyini demişdir.

١٧٢- الذِّكْرُ وَالدُّعَاءُ عَلَى الصَّفَا

172-ci fəsil: Səfa təpəsinin üstündə zikr etmək

٢٩٧٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنْ ابْنِ الْهَادِ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، قَالَ : طَافَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْبَيْتِ سَبْعًا رَمَلَ مِنْهَا ثَلاَثًا ، وَمَشَى أَرْبَعًا ، ثُمَّ قَامَ عِنْدَ الْمَقَامِ ، فَصَلَّى رَكْعَتَيْنِ ، وَقَرَأَ : **{وَاتَّخِذُوا مِنْ مَقَامِ إِبْرَاهِيمَ مُصَلًّى}** ، وَرَفَعَ صَوْتَهُ يُسْمِعُ النَّاسَ ، ثُمَّ انْصَرَفَ فَاسْتَلَمَ ، ثُمَّ ذَهَبَ ، فَقَالَ : نَبْدَأُ بِمَا بَدَأَ اللهُ بِهِ ، فَبَدَأَ بِالصَّفَا ، فَرَقِيَ عَلَيْهَا حَتَّى بَدَا لَهُ الْبَيْتُ وَقَالَ ثَلاَثَ مَرَّاتٍ : لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ ، يُحْيِي وَيُمِيتُ ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، وَكَبَّرَ اللهَ وَحَمِدَهُ ، ثُمَّ دَعَا بِمَا قُدِّرَ لَهُ ، ثُمَّ نَزَلَ مَاشِيًا حَتَّى تَصَوَّبَتْ قَدَمَاهُ فِي بَطْنِ الْمَسِيلِ ، فَسَعَى حَتَّى صَعِدَتْ قَدَمَاهُ ، ثُمَّ مَشَى حَتَّى أَتَى الْمَرْوَةَ ، فَصَعِدَ فِيهَا ، ثُمَّ بَدَا لَهُ الْبَيْتُ ، فَقَالَ : لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ

الْمُلْكُ وَلَهُ الْحَمْدُ ، وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، قَالَ : ذَلِكَ ثَلَاثَ مَرَّاتٍ ، ثُمَّ ذَكَرَ اللَّهَ وَسَبَّحَهُ وَحَمِدَهُ ، ثُمَّ دَعَا عَلَيْهَا بِمَا شَاءَ اللَّهُ فَعَلَ هَذَا حَتَّى فَرَغَ مِنَ الطَّوَافِ.

2974. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ Kəbəni yeddi dəfə təvaf etdi. Bunun ilk üç dövrəsini sürətlə, sonrakı dörd dövrəsini isə adi addımlarla etdi. Sonra İbrahim məqamında dayandı və iki rükət namaz qıldı. Sonra bu ayəni: **"İbrahimin durduğu yeri namazgah edin"** (əl-Bəqərə, 125) oxudu və insanların eşitməsi üçün səsini qaldırdı. Sonra qara daşa tərəf dönüb onu salamladı. Sonra Səfa təpəsinə doğru getdi və buyurdu: "Biz Allahın başladığından başlayırıq". Sonra Səfa təpəsindən başladı və Kəbə görünən yerə gələrək üç dəfə dedi: "Lə ilə:hə illəllah, vahdəhu lə şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu, yuhyi va yumi:tu va huvə alə: kulli şey in qadi:r!"[1] Sonra Allaha təkbir dedi və Ona həmd etdi. Sonra bacardığı qədər dua etdi. Sonra yeriyərək aşağı endi. Bətnil-Məsil deyilən yerə gələnə qədər sürətlə yeridi. Sonra yenidən Mərva təpəsinə qədər adi addımlarla yeridi. Mərvaya gəldikdə Kəbəni görə biləcək bir yerə çıxıb üç dəfə: "Lə ilə:hə illəllah, vahdəhu lə şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r!"[2] Sonra Allahı zikr etdi, Onu təsbih etdi və Ona həmd etdi. Sonra Allahın istədiyi qədər Allaha dua etdi. Beləcə səy etməyi bitirənə qədər davam etdi".

١٧٣- الطَّوَافُ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ عَلَى الرَّاحِلَةِ

173-cü fəsil: Səfa və Mərva arasında miniklə səy etmək

٢٩٧٥- أَخْبَرَنِي عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : أَنْبَأَنَا شُعَيْبٌ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : طَافَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ عَلَى رَاحِلَتِهِ بِالْبَيْتِ وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ لِيَرَاهُ النَّاسُ ، وَلِيُشْرِفَ ، وَلِيَسْأَلُوهُ إِنَّ النَّاسَ غَشُوهُ.

2975. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Peyğəmbər ﷺ Vida həccində insanlar çox olduqda Kəbəni təvaf etməyi və Səfa və Mərva arasında səy etməyi insanların görməsi, həcc haqda soruşmaları və nəyi necə etməyi görmələri üçün minik üzərində etdi".

---

[1] Tərcüməsi: Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! Dirildir və öldürür! O, hər şeyə Qadirdir!
[2] Tərcüməsi: Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir!

١٧٤- الْمَشْيُ بَيْنَهُمَا

## 174-cü fəsil: Səfa və Mərva arasında yerimək

٢٩٧٦- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ كَثِيرِ بْنِ جُمْهَانَ ، قَالَ : رَأَيْتُ ابْنَ عُمَرَ يَمْشِي بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ فَقَالَ : إِنْ أَمْشِي فَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْشِي ، وَإِنْ أَسْعَى فَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْعَى.

2976. ...Rəvayət edilir ki, Kəsir ibn Cumhan ﵀ demişdir: "Mən İbn Ömərin Səfa və Mərva arasında yeridiyini gördüm. O dedi: "Əgər yeriyirəmsə, deməli Allah Elçisinin ﷺ yeridiyini görmüşəm. Əgər səy edirəmsə, deməli Allah Elçisinin ﷺ səy etdiyini görmüşəm".

٢٩٧٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ : أَنْبَأَنَا الثَّوْرِيُّ ، عَنْ عَبْدِ الْكَرِيمِ الْجَزَرِيِّ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ قَالَ : رَأَيْتُ ابْنَ عُمَرَ ذَكَرَ نَحْوَهُ إِلاَّ أَنَّهُ قَالَ : وَأَنَا شَيْخٌ كَبِيرٌ.

2977. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﵀: "Mən İbn Ömərin... gördüm" dedi və yuxarıda olan hədisi rəvayət etdi.

١٧٥- الرَّمَلُ بَيْنَهُمَا

## 175-ci fəsil: Səfa və Mərva arasında sürətlə yerimək

٢٩٧٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا صَدَقَةُ بْنُ يَسَارٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : سَأَلُوا ابْنَ عُمَرَ هَلْ رَأَيْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَمَلَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ؟ فَقَالَ : كَانَ فِي جَمَاعَةٍ مِنَ النَّاسِ ، فَرَمَلُوا ، فَلاَ أُرَاهُمْ ، رَمَلُوا إِلاَّ بِرَمَلِهِ.

2978. ...Rəvayət edilir ki, əz-Zuhri ﵀ demişdir: "İbn Ömərdən soruşdular: "Sən Allah Elçisinin ﷺ Səfa və Mərva arasında səy etdiyini görmüsənmi?" İbn Ömər dedi: "Camaatın arasında Peyğəmbər ﷺ səy etdiyinə görə səy edənlər var idi".[1]

١٧٦- السَّعْيُ بَيْنَ الصَّفَا وَالمرْوَةِ

## 176-cı fəsil: Səfa və Mərva arasında səy etmək

٢٩٧٩- أَخْبَرَنَا أَبُو عَمَّارٍ الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عَطَاءٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : إِنَّمَا سَعَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ ، لِيُرِيَ الْمُشْرِكِينَ قُوَّتَهُ.

---

[1] Hədisin isnadı zəifdir.

2979. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ Səfa və Mərva arasında səy etməyi müşriklərə gücünü göstərmək üçün etmişdi".

١٧٧- السَّعْيُ فِي بَطْنِ الْمَسِيلِ

177-ci fəsil: "Bətnil-Məsəl" adlı yerdə səy etmək

٢٩٨٠- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ بُدَيْلٍ ، عَنِ الْمُغِيرَةِ بْنِ حَكِيمٍ ، عَنْ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ عَنِ امْرَأَةٍ قَالَتْ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَسْعَى فِي بَطْنِ الْمَسِيلِ ، وَيَقُولُ : لاَ يُقْطَعُ الْوَادِي إِلاَّ شَدًّا.

2980. ...Safiyyə bint Şeybə ﷺ bir qadının belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ "Bətnil-Məsəl" adlı yerdə səy etdiyini və belə buyurduğunu gördüm: "Bu vadini ancaq sürətlə yeriyərək keçmək lazımdır".

١٧٨- مَوْضِعُ الْمَشْيِ

178-ci fəsil: Kəbəni ziyarət etdikdə adi addımlarla yeriməyin yeri

٢٩٨١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ رَضِيَ اللَّهُ عَنْهُمَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ إِذَا نَزَلَ مِنَ الصَّفَا ، مَشَى حَتَّى إِذَا انْصَبَّتْ قَدَمَاهُ فِي بَطْنِ الْوَادِي سَعَى حَتَّى يَخْرُجَ مِنْهُ.

2981. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Səfa təpəsindən düşdükdə adi yerişlə yeriyər, (Səfa və Mərva arasında olan) "Bətnil-Vadi" (çuxur olan yerə) gəldikdə sürətlə yeriyər, sonra yenidən adi addımlarla yeriməyə başlayardı.

١٧٩- مَوْضِعُ الرَّمَلِ

179-cu fəsil: Kəbəni ziyarət etdikdə sürətlə yeriməyin yeri

٢٩٨٢- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ سُفْيَانَ ، عَنْ جَعْفَرٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، قَالَ : لَمَّا تَصَوَّبَتْ قَدَمَا رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي بَطْنِ الْوَادِي ، رَمَلَ حَتَّى خَرَجَ مِنْهُ.

2982. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ Səfa və Mərva arasında olan "Bətnil-Vadi" (çuxur olan yerə) gəldikdə oradan çıxana qədər sürətlə yeriyərdi".

٢٩٨٣- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي قَالَ ، حَدَّثَنَا جَابِرٌ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، نَزَلَ يَعْنِي عَنِ الصَّفَا حَتَّى إِذَا انْصَبَّتْ قَدَمَاهُ فِي الْوَادِي ، رَمَلَ حَتَّى إِذَا صَعِدَ مَشَى.

2983. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Səfadan düşüb (Səfa və Mərva arasında olan) çuxur olan yerə gəldikdə sürətlə yeriyər, sonra yenidən adi addımlarla yeriməyə başlayardı.

## ١٨٠- مَوْضِعُ الْقِيَامِ عَلَى الْمَرْوَةِ

## 180-ci fəsil: Mərva təpəsində ayaq üstə durmağın yeri

٢٩٨٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ أَتَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَرْوَةَ ، فَصَعِدَ فِيهَا ، ثُمَّ بَدَا لَهُ الْبَيْتُ فَقَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، قَالَ : ذَلِكَ ثَلاَثَ مَرَّاتٍ ثُمَّ ذَكَرَ اللَّهَ وَسَبَّحَهُ ، وَحَمِدَهُ ، ثُمَّ دَعَا بِمَا شَاءَ اللَّهُ فَعَلَ هَذَا حَتَّى فَرَغَ مِنَ الطَّوَافِ.

2984. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Mərva təpəsinə qalxdı, sonra Kəbə görünən yerə gəlib belə dua etdi: "Lə ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r!" Cabir deyir: "Bu sözləri üç dəfə təkrarladıqdan sonra Allahı zikr edib Onu təsbih və Ona həmd etdi. Sonra Allahın istədiyi qədər dua etdi və səyi qurtarana qədər belə etdi".

## ١٨١- التَّكْبِيرُ عَلَيْهَا

## 181-ci fəsil: Mərva təpəsində "təkbir" etmək

٢٩٨٥- أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : أَنْبَأَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَهَبَ إِلَى الصَّفَا فَرَقِيَ عَلَيْهَا حَتَّى بَدَا لَهُ الْبَيْتُ ، ثُمَّ وَحَّدَ اللَّهَ عَزَّ وَجَلَّ ، وَكَبَّرَ ، وَقَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ يُحْيِي وَيُمِيتُ وَهُوَ ، عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، ثُمَّ مَشَى حَتَّى إِذَا انْصَبَّتْ قَدَمَاهُ ، سَعَى حَتَّى إِذَا صَعِدَتْ قَدَمَاهُ مَشَى حَتَّى أَتَى الْمَرْوَةَ فَفَعَلَ عَلَيْهَا كَمَا فَعَلَ عَلَى الصَّفَا حَتَّى قَضَى طَوَافَهُ.

2985. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Səfa təpəsinə doğru getdi və Kəbə görünən yerə çıxana qədər ora dırmaşdı, sonra Allahı ﷻ təkləşdirərək təkbir etdi və belə dua etdi: "Lə ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu, yuhyi və yumi:tu va huvə alə kulli şey in qadi:r!" Cabir deyir: "Bu sözləri üç dəfə təkrarladıqdan sonra Allahı zikr edib Onu təsbih və Ona həmd etdi. Sonra Allahın istədiyi qədər

dua etdi və səyi qurtarana qədər belə etdi". Sonra Səfa ilə Mərva arasında yeriməyə başladı. Vadinin çökək olan yerinə çatdıqda sürətləndi. Sonra Mərva təpəsinə gələnə qədər adi addımlarla yeridi. Səy etməyi bitirənə qədər belə etdi.

١٨٢- كَمْ طَوَافُ الْقَارِنِ وَالْمُتَمَتِّعِ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ

## 182-ci fəsil: Qiran və təməttu həccini edənlər Səfa və Mərva arasında səyi necə etməlidirlər?

٢٩٨٦- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرًا ، يَقُولُ : لَمْ يَطُفِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ بَيْنَ الصَّفَا وَالْمَرْوَةِ إِلاَّ طَوَافًا وَاحِدًا.

2986. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Peyğəmbər ﷺ və səhabələri Səfa və Mərva arasında bir dəfə səy etmişdilər".[1]

١٨٣- أَيْنَ يُقَصِّرُ الْمُعْتَمِرُ

## 183-cü fəsil: Ümrə edən saçını harada qısaldır?

٢٩٨٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي الْحَسَنُ بْنُ مُسْلِمٍ ، أَنَّ طَاوُوسًا ، أَخْبَرَهُ أَنَّ ابْنَ عَبَّاسٍ أَخْبَرَهُ ، عَنْ مُعَاوِيَةَ ، أَنَّهُ قَصَّرَ عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِشْقَصٍ فِي عُمْرَةٍ عَلَى الْمَرْوَةِ.

2987. ...Müaviyə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ümrə etdikdə Mərva təpəsində saçını "mişkas" (oxun iti ucu və ya enli qayçı) ilə qısaltmışdır.

٢٩٨٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ مُعَاوِيَةَ ، قَالَ : قَصَّرْتُ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمَرْوَةِ بِمِشْقَصٍ أَعْرَابِيٍّ.

2988. ...Rəvayət edilir ki, Müaviyə ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ Mərva təpəsində ikən bədəvilərin "mişkas" (oxun iti ucu və ya enli qayçı) ilə onun saçını qısaltdım".

[1] Yəni dörd dəfə gedib üç dəfə qayıtmaqla Səfa və Mərva arasında bunların hamısını bir gediş olaraq səy etmişlər.

### ١٨٤- كَيْفَ يُقَصِّرُ

### 184-cü fəsil: Saç necə qısaldılır?

٢٩٨٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ قَيْسِ بْنِ سَعْدٍ ، عَنْ عَطَاءٍ ، عَنْ مُعَاوِيَةَ ، قَالَ : أَخَذْتُ مِنْ أَطْرَافِ شَعْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِشْقَصٍ كَانَ مَعِي بَعْدَ مَا طَافَ بِالْبَيْتِ وَبِالصَّفَا وَالْمَرْوَةِ فِي أَيَّامِ الْعَشْرِ قَالَ : قَيْسٌ وَالنَّاسُ يُنْكِرُونَ هَذَا عَلَى مُعَاوِيَةَ.

2989. ...Rəvayət edilir ki, Muaviyə ﵁ demişdir: “Mən (Zil-Hiccə ayının) onuncu günü Allah Elçisi ﷺ Kəbəni və Səfa və Mərva təpələrini təvaf etdikdən sonra yanımda olan “mişqas” (oxun ucu və ya enli qayçı) ilə onun saçlarının ucunu kəsdim”. Ravi Qeys deyir: “Müaviyənin Peyğəmbərin ﷺ saçını kəsməsini insanlar xoş görmədilər”.[1]

### ١٨٥- مَا يَفْعَلُ مَنْ أَهَلَّ بِالْحَجِّ وَأَهْدَى

### 185-ci fəsil: Həcc üçün ehrama girib qurban göndərən nə etməlidir?

٢٩٩٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، عَنْ يَحْيَى وَهُوَ ابْنُ آدَمَ عَنْ سُفْيَانَ وَهُوَ ابْنُ عُيَيْنَةَ قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لاَ نُرَى إِلاَّ الْحَجَّ ، قَالَتْ : فَلَمَّا أَنْ طَافَ بِالْبَيْتِ وَبَيْنَ الصَّفَا وَالْمَرْوَةِ قَالَ : مَنْ كَانَ مَعَهُ هَدْيٌ فَلْيُقِمْ عَلَى إِحْرَامِهِ ، وَمَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ ، فَلْيَحْلِلْ.

2990. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə yalnız həcc etmək üçün yola çıxdıq. Kəbəni və Səfa və Mərva təpələrini təvaf etdikdən sonra Peyğəmbər ﷺ buyurdu: “Yanında qurbanı olanlar ehramlı olaraq qalsın, qurbanı olmayanlar isə ehramdan çıxsın”.

### ١٨٦- مَا يَفْعَلُ مَنْ أَهَلَّ بِعُمْرَةٍ وَأَهْدَى

### 186-cı fəsil: Ümrə üçün ehrama girib qurban göndərən nə etməlidir?

٢٩٩١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : أَنْبَأَنَا سُوَيْدٌ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ ، فَمِنَّا مَنْ أَهَلَّ بِالْحَجِّ ، وَمِنَّا مَنْ أَهَلَّ بِعُمْرَةٍ وَأَهْدَى ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَهَلَّ بِعُمْرَةٍ وَلَمْ يُهْدِ فَلْيَحْلِلْ ، وَمَنْ أَهَلَّ بِعُمْرَةٍ فَأَهْدَى فَلاَ يَحِلَّ ، وَمَنْ أَهَلَّ بِحَجَّةٍ فَلْيُتِمَّ حَجَّهُ قَالَتْ عَائِشَةُ : وَكُنْتُ مِمَّنْ أَهَلَّ بِعُمْرَةٍ.

2991. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə

[1] Hədis zəifdir.

Vida həccini etmək üçün yola çıxdıq. Bir qismimiz həcc üçün, bir qismimiz isə ümrə üçün ehrama girmişdi. Allah Elçisi ﷺ buyurdu: "Ümrə üçün ehrama girib qurbanı olmayanlar ehramdan çıxsınlar, qurbanı olanlar isə ehramlı qalsınlar. Həcc üçün ehrama girənlər həclərini tamamlasınlar". Aişə deyir: "Mən ehrama ümrə üçün girmişdim".

٢٩٩٢– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو هِشَامٍ ، قَالَ : حَدَّثَنَا وُهَيْبُ بْنُ خَالِدٍ ، عَنْ مَنْصُورِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أُمِّهِ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، قَالَتْ : قَدِمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُهِلِّينَ بِالْحَجِّ ، فَلَمَّا دَنَوْنَا مِنْ مَكَّةَ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ لَمْ يَكُنْ مَعَهُ هَدْيٌ فَلْيَحْلِلْ ، وَمَنْ كَانَ مَعَهُ هَدْيٌ فَلْيُقِمْ عَلَى إِحْرَامِهِ قَالَتْ : وَكَانَ مَعَ الزُّبَيْرِ هَدْيٌ ، فَأَقَامَ عَلَى إِحْرَامِهِ ، وَلَمْ يَكُنْ مَعِي هَدْيٌ فَأَحْلَلْتُ ، فَلَبِسْتُ ثِيَابِي وَتَطَيَّبْتُ مِنْ طِيبِي ، ثُمَّ جَلَسْتُ إِلَى الزُّبَيْرِ فَقَالَ : اسْتَأْخِرِي عَنِّي ، فَقُلْتُ : أَتَخْشَى أَنْ أَثِبَ عَلَيْكَ.

2992. ...Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr رضي الله عنها demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə həcc etmək üçün yola çıxdıq. Məkkəyə yaxınlaşdıqda Allah Elçisi ﷺ belə buyurdu: "Yanında qurbanı olmayanlar ehramdan çıxsın, qurbanı olanlar isə ehramlı olaraq qalsın". Əsma deyir: "əz-Zubeyrin yanında qurbanı var idi, ona görə də ehramlı idi. Mənim isə qurbanım yox idi deyə ehramdan çıxdım, paltarımı geyinib ətirləndikdən sonra əz-Zubeyrin yanında oturdum. əz-Zubeyr dedi: "Məndən uzaq dur!" Mən dedim: "Paltarımın sənə dəyməsindən qorxursan?!"

## ١٨٧– الْخُطْبَةُ قَبْلَ يَوْمِ التَّرْوِيَةِ

## 187-ci fəsil: Tərviyə[1] günündən qabaq xütbə demək

٢٩٩٣– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : قَرَأْتُ عَلَى أَبِي قُرَّةَ مُوسَى بْنِ طَارِقٍ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ عُثْمَانَ بْنِ خُثَيْمٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، حِينَ رَجَعَ مِنْ عُمْرَةِ الْجِعِرَّانَةِ بَعَثَ أَبَا بَكْرٍ عَلَى الْحَجِّ فَأَقْبَلْنَا مَعَهُ ، حَتَّى إِذَا كَانَ بِالْعَرْجِ ثَوَّبَ بِالصُّبْحِ ، ثُمَّ اسْتَوَى لِيُكَبِّرَ فَسَمِعَ الرَّغْوَةَ خَلْفَ ظَهْرِهِ ، فَوَقَفَ عَلَى التَّكْبِيرِ ، فَقَالَ : هَذِهِ رَغْوَةُ نَاقَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْجَدْعَاءِ ، لَقَدْ بَدَا لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْحَجِّ فَلَعَلَّهُ أَنْ يَكُونَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَنُصَلِّيَ مَعَهُ ، فَإِذَا عَلِيٌّ عَلَيْهَا ، فَقَالَ لَهُ أَبُو بَكْرٍ : أَمِيرٌ أَمْ رَسُولٌ ؟ قَالَ : لاَ بَلْ رَسُولٌ ، أَرْسَلَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِبَرَاءَةَ أَقْرَؤُهَا عَلَى النَّاسِ فِي مَوَاقِفِ الْحَجِّ ، فَقَدِمْنَا مَكَّةَ فَلَمَّا كَانَ قَبْلَ التَّرْوِيَةِ بِيَوْمٍ ، قَامَ أَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ فَخَطَبَ النَّاسَ فَحَدَّثَهُمْ عَنْ مَنَاسِكِهِمْ حَتَّى إِذَا فَرَغَ قَامَ عَلِيٌّ رَضِيَ اللَّهُ عَنْهُ فَقَرَأَ عَلَى النَّاسِ بَرَاءَةٌ حَتَّى خَتَمَهَا ، ثُمَّ خَرَجْنَا مَعَهُ حَتَّى إِذَا كَانَ يَوْمُ عَرَفَةَ قَامَ أَبُو بَكْرٍ فَخَطَبَ النَّاسَ فَحَدَّثَهُمْ عَنْ مَنَاسِكِهِمْ ، حَتَّى إِذَا فَرَغَ قَامَ عَلِيٌّ فَقَرَأَ عَلَى النَّاسِ بَرَاءَةٌ حَتَّى خَتَمَهَا ، ثُمَّ كَانَ يَوْمُ النَّحْرِ فَأَفَضْنَا ، فَلَمَّا رَجَعَ أَبُو بَكْرٍ خَطَبَ النَّاسَ فَحَدَّثَهُمْ عَنْ إِفَاضَتِهِمْ ، وَعَنْ نَحْرِهِمْ ، وَعَنْ مَنَاسِكِهِمْ ، فَلَمَّا فَرَغَ قَامَ عَلِيٌّ فَقَرَأَ عَلَى النَّاسِ بَرَاءَةٌ حَتَّى خَتَمَهَا ، فَلَمَّا كَانَ يَوْمُ النَّفْرِ الأَوَّلُ ، قَامَ أَبُو بَكْرٍ فَخَطَبَ النَّاسَ فَحَدَّثَهُمْ كَيْفَ يَنْفِرُونَ ، وَكَيْفَ يَرْمُونَ ، فَعَلَّمَهُمْ

---

[1] Tərviyə – Zil-Hiccə ayının səkkizinci gününə deyilir.

مَناسِكَهُمْ ، فَلَمَّا فَرَغَ ، قَامَ عَلِيٌّ فَقَرَأَ بَرَاءَةٌ عَلَى النَّاسِ حَتَّى خَتَمَهَا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : ابْنُ خُثَيْمٍ ، لَيْسَ بِالْقَوِيِّ فِي الْحَدِيثِ ، وَإِنَّمَا أَخْرَجْتُ هَذَا لِئَلاَّ يُجْعَلَ ابْنُ جُرَيْجٍ ، عَنْ أَبِي الزُّبَيْرِ وَمَا كَتَبْنَاهُ إِلاَّ عَنْ إِسْحَاقَ بْنِ إِبْرَاهِيمَ ، وَيَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ ، لَمْ يَتْرُكْ حَدِيثَ ابْنِ خُثَيْمٍ ، وَلاَ عَبْدِ الرَّحْمَنِ ، إِلاَّ أَنَّ عَلِيَّ بْنَ الْمَدِينِيِّ ، قَالَ : ابْنُ خُثَيْمٍ مُنْكَرُ الْحَدِيثِ ، وَكَأَنَّ عَلِيَّ بْنَ الْمَدِينِيِّ خُلِقَ لِلْحَدِيثِ.

2993. ...Cabir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ əl-Ciran ümrəsini[1] edib qayıtdıqda Əbu Bəkri həccə göndərdi. Mən də onun yanında idim. əl-Arc deyilən yerə gəldikdə Sübh namazını qılmaq üçün dayandıq. Təkbir edib namaza başladıqda arxada bir dəvə səsi eşitdi, namaza başlamadı və dedi: “Bu səs Allah Elçisinin ﷺ dəvəsi əl-Cidanın səsidir. Bəlkə Allah Elçisi ﷺ həccə gəlib. Əgər odursa, namazı birlikdə qılarıq”. Baxıb gördük ki, bu, Əlidir. Əbu Bəkr ona dedi: “Əmir olaraq gəlmisən, yoxsa elçi?” O da: “Xeyr, elçi. Allah Elçisi ﷺ məni insanlar həcdə durduqdları əsnada “Bəraə” (ət-Tövbə) surəsini onlara çatdırmağım üçün göndərdi”. Biz Məkkəyə gəldik və tərviyə günündən bir gün qabaq (Zil-Hiccənin 8-ci günü) Əbu Bəkr ayağa durub insanlara xütbə verdi və onlara həcdə ediləcək əməlləri xatırlatdı. Xütbəsini bitirdikdə Əli ayağa qalxdı və insanlara “Bəraə” (ət-Tövbə) surəsini sonuna qədər oxudu. Sonra biz birlikdə Arafa günü çıxdıq və Əbu Bəkr insanlara həccin ərkanlarından bəhs etdi. Sonra Əli ayağa qalxdı və insanlara “Bəraə” surəsini sonuna qədər oxudu. Sonra qurban kəsilən gün camaatın arasından keçib həcdən qayıdanda Əbu Bəkr insanlara xütbə verdi və həcdə edilənlərdən, qurbanların kəsilməsindən və həcc ərkanlarından bəhs etdi. Xütbəni bitirdikdə Əli ayağa qalxdı və insanlara “Bəraə” surəsini sonuna qədər oxudu. Bayram günü olduqda ərkanları yerinə yetirdik. Əbu Bəkr də ərkanları yerinə yetirdikdə insanlara daha bir xütbə verdi. İfada təvafından, qurbandan və digər ərkanlardan bəhs etdi. Danışığını bitirdikdə Əli ayağa qalxdı və insanlara “Bəraə” surəsini sonuna qədər oxudu. Qurban kəsilən gündən sonrakı gün Əbu Bəkr qalxıb insanlara xütbə verdi, necə qayıdacaqlarını, şeytana daşı necə atacaqlarını və digər ərkanları öyrətdi. Danışığını bitirdikdən sonra Əli ayağa qalxdı və insanlara “Bəraə” surəsini sonuna qədər oxudu.[2]

---

[1] Ciran ümrəsi – hicrətin 8-ci ilində Peyğəmbərin ﷺ Huneyn döyüşündən qayıtdıqdan sonra etdiyi ümrəyə deyilir. Bu ümrəni Peyğəmbər ﷺ və səhabələri Məkkə və Taif arasında yerləşən “Ciran” adlı yerdən etdiklərinə görə belə adlanır.

[2] Hədisin isnadı zəifdir.

## ١٨٨- الْمُتَمَتِّعُ مَتَى يُهِلُّ بِالْحَجِّ
## 188-ci fəsil: Təməttu həcci edən ehramdan nə vaxt çıxır?

٢٩٩٤- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ ، قَالَ : قَدِمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَرْبَعٍ مَضَيْنَ مِنْ ذِي الْحِجَّةِ فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحِلُّوا وَاجْعَلُوهَا عُمْرَةً فَضَاقَتْ بِذَلِكَ صُدُورُنَا ، وَكَبُرَ عَلَيْنَا ، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا أَيُّهَا النَّاسُ أَحِلُّوا ، فَلَوْلاَ الْهَدْيُ الَّذِي مَعِي لَفَعَلْتُ مِثْلَ الَّذِي تَفْعَلُونَ ، فَأَحْلَلْنَا حَتَّى وَطِئْنَا النِّسَاءَ ، وَفَعَلْنَا مَا يَفْعَلُ الْحَلاَلُ ، حَتَّى إِذَا كَانَ يَوْمُ التَّرْوِيَةِ ، وَجَعَلْنَا مَكَّةَ بِظَهْرٍ لَبَّيْنَا بِالْحَجِّ.

2994. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Zil-Hiccə ayının dördündə Allah Elçisi ﷺ ilə birlikdə yola düşdük. Peyğəmbər ﷺ buyurdu: “Ehramdan çıxın və həcc üçün başladığınız ibadəti ümrəyə dəyişdirin”. Bu bizə ağır gəldi. Vəziyyət Peyğəmbərə ﷺ çatdıqda buyurdu: “Ey insanlar, ehramdan çıxın, əgər mənim yanımda qurbanım olmasaydı, sizin etdiyiniz kimi mən də ehramdan çıxardım”. Beləcə biz ehramımızdan çıxdıq və hətta zövcələrimizlə yaxınlıq etdik. Zil-Hiccənin səkkizinci gününə qədər ehramsız birinin edə biləcəyi hər şeyi etdik. Tərviyə günü yenidən ehrama girərək həcc üçün təlbiyə gətirməyə başladıq”.

## ١٨٩- مَا ذُكِرَ فِي مِنًى
## 189-cu fəsil: Minada nə zikrlər edilir?

٢٩٩٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، حَدَّثَنِي مَالِكٌ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَلْحَلَةَ الدُّؤَلِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ عِمْرَانَ الأَنْصَارِيِّ ، عَنْ أَبِيهِ ، قَالَ : عَدَلَ إِلَيَّ عَبْدُ اللهِ بْنُ عُمَرَ ، وَأَنَا نَازِلٌ ، تَحْتَ سَرْحَةٍ بِطَرِيقِ مَكَّةَ ، فَقَالَ : مَا أَنْزَلَكَ تَحْتَ هَذِهِ الشَّجَرَةِ ؟ فَقُلْتُ : أَنْزَلَنِي ظِلُّهَا قَالَ عَبْدُ اللهِ : فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كُنْتَ بَيْنَ الأَخْشَبَيْنِ مِنْ مِنًى ، وَنَفَخَ بِيَدِهِ نَحْوَ الْمَشْرِقِ ، فَإِنَّ هُنَاكَ وَادِيًا يُقَالُ لَهُ السُّرَّبَةُ – وَفِي حَدِيثِ الْحَارِثِ ، يُقَالُ لَهُ : السُّرَرُ – بِهِ سَرْحَةٌ سُرَّ تَحْتَهَا سَبْعُونَ نَبِيًّا.

2995. ...Muhəmməd ibn İmran əl-Ənsari atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Mən Məkkəyə gedən yolda böyük bir ağacın altında oturarkən Abdullah ibn Ömər mənə dedi: “Niyə bu ağacın altında oturmusan?” Mən də: “Kölgələnmək üçün” dedim. Abdullah dedi: “Allah Elçisi ﷺ belə buyurmuşdu: “Minada iki ağacın arasında oturduğunuz zaman – günçıxan tərəfə işarə edərək – bu tərəfdə bir vadi var ki, adına əs-Surrabə deyilir. Onun altından yetmiş peyğəmbər keçib”.[1]

---

[1] Hədis zəifdir.

٢٩٩٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمِ بْنِ نُعَيْمٍ ، قَالَ : أَنْبَأَنَا سُوَيْدٌ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَبْدِ الْوَارِثِ ثِقَةٌ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ الأَعْرَجُ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ التَّيْمِيِّ ، عَنْ رَجُلٍ مِنْهُمْ يُقَالُ لَهُ : عَبْدُ الرَّحْمَنِ بْنُ مُعَاذٍ ، قَالَ : خَطَبَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى ، فَفَتَحَ اللهُ أَسْمَاعَنَا حَتَّى إِنْ كُنَّا لَنَسْمَعُ مَا يَقُولُ وَنَحْنُ فِي مَنَازِلِنَا ، فَطَفِقَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُعَلِّمُهُمْ مَنَاسِكَهُمْ حَتَّى بَلَغَ الْجِمَارَ فَقَالَ : بِحَصَى الْخَذْفِ وَأَمَرَ الْمُهَاجِرِينَ أَنْ يَنْزِلُوا فِي مُقَدَّمِ الْمَسْجِدِ ، وَأَمَرَ الأَنْصَارَ أَنْ يَنْزِلُوا فِي مُؤَخَّرِ الْمَسْجِدِ.

2996. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Muaz ﷺ demişdir: “Allah Elçisi ﷺ Minada xütbə verdi. Həmin vaxt Allah qulaqlarımızı açmışdı və biz olduğumuz yerdə deyilənlərin hamısını eşidirdik. Peyğəmbər ﷺ həcdə edilməsi lazım olan hər şeyi, atılacaq daşların ölçüsünü belə bildirdi. Mühacirlərə məscidin ön tərəfində, ənsara da onlardan arxada durmalarını buyurdu”.

### ١٩٠- أَيْنَ يُصَلِّي الإِمَامُ الظُّهْرَ يَوْمَ التَّرْوِيَةِ

### 190-cı fəsil: Tərviyə günü imam Zöhr namazını harada qılır?

٢٩٩٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، وَعَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالاَ : حَدَّثَنَا إِسْحَاقُ الأَزْرَقُ ، عَنْ سُفْيَانَ الثَّوْرِيِّ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ رُفَيْعٍ ، قَالَ : سَأَلْتُ أَنَسَ بْنَ مَالِكٍ ، فَقُلْتُ : أَخْبِرْنِي بِشَيْءٍ عَقَلْتَهُ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَيْنَ صَلَّى الظُّهْرَ يَوْمَ التَّرْوِيَةِ ؟ قَالَ : بِمِنًى فَقُلْتُ : أَيْنَ صَلَّى الْعَصْرَ يَوْمَ النَّفْرِ ؟ قَالَ : بِالأَبْطَحِ.

2997. ...Rəvayət edilir ki, Abdul-Əziz ibn Rufey ﷺ demişdir: “Mən Ənəs ibn Malikdən soruşdum: “Tərviyə günü Allah Elçisinin ﷺ Zöhr namazını harada qıldığı haqda mənə məlumat verə bilərsənmi?” O dedi: “Minada” Mən dedim: “Bəs Qurban günündən sonrakı gündə Əsr namazını harada qıldı?” O dedi: “Əbtahda”.

### ١٩١- الْغُدُوُّ مِنْ مِنًى إِلَى عَرَفَةَ

### 191-ci fəsil: Minadan Arafaya nə vaxt getmək lazımdır?

٢٩٩٨- أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ الأَنْصَارِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي سَلَمَةَ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : غَدَوْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ مِنًى إِلَى عَرَفَةَ ، فَمِنَّا الْمُلَبِّي ، وَمِنَّا الْمُكَبِّرُ.

2998. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Minadan Arafaya duha vaxtı getmişdik, kimimiz təlbiyə, kimimiz də təkbir edirdik”.

٢٩٩٩– أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي سَلَمَةَ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : غَدَوْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى عَرَفَاتٍ ، فَمِنَّا الْمُلَبِّي ، وَمِنَّا الْمُكَبِّرُ.

2999. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Arafaya duha vaxtı getmişdik. Yolda kimimiz təlbiyə, kimimiz də təkbir edirdi”.

## ١٩٢– التَّكْبِيرُ فِي الْمَسِيرِ إِلَى عَرَفَةَ

## 192-ci fəsil: Arafaya gedən yolda təkbir etmək

٣٠٠٠– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْمُلاَئِيُّ يَعْنِي أَبَا نُعَيْمٍ الْفَضْلَ بْنَ دُكَيْنٍ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ أَبِي بَكْرٍ الثَّقَفِيُّ ، قَالَ : قُلْتُ لأَنَسٍ ، وَنَحْنُ غَادِيَانِ مِنْ مِنًى إِلَى عَرَفَاتٍ : مَا كُنْتُمْ تَصْنَعُونَ فِي التَّلْبِيَةِ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي هَذَا الْيَوْمِ ؟ قَالَ : كَانَ الْمُلَبِّي يُلَبِّي ، فَلاَ يُنْكَرُ عَلَيْهِ ، وَيُكَبِّرُ الْمُكَبِّرُ ، فَلاَ يُنْكَرُ عَلَيْهِ.

3000. ...Rəvayət edilir ki, Muhəmməd ibn Əbu Bəkr əs-Səqafi ﵀ demişdir: “Biz səhər vaxtı Minadan Arafaya gedərkən Ənəsə dedim: “Siz bu gün Allah Elçisi ﷺ ilə birlikdə necə təlbiyə gətirirdiniz?” O dedi: “Təlbiyə deyən təlbiyə deyirdi, heç kim də ona etiraz etmirdi. Təkbir edən də təkbir edirdi, ona da etiraz edən yox idi”.

## ١٩٣– التَّلْبِيَةُ فِيهِ

## 193-cü fəsil: Arafaya gedən yolda təlbiyə etmək

٣٠٠١– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ رَجَاءٍ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ عُقْبَةَ ، عَنْ مُحَمَّدِ بْنِ أَبِي بَكْرٍ وَهُوَ الثَّقَفِيُّ ، قَالَ : قُلْتُ لأَنَسٍ ، غَدَاةَ عَرَفَةَ : مَا تَقُولُ فِي التَّلْبِيَةِ فِي هَذَا الْيَوْمِ ؟ قَالَ : سِرْتُ هَذَا الْمَسِيرَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابِهِ ، وَكَانَ مِنْهُمُ الْمُهِلُّ ، وَمِنْهُمُ الْمُكَبِّرُ ، فَلاَ يُنْكِرُ أَحَدٌ مِنْهُمْ عَلَى صَاحِبِهِ.

3001. ...Rəvayət edilir ki, Muhəmməd ibn Əbu Bəkr əs-Səqafi ﵀ demişdir: “Arafa günü səhər vaxtı Ənəsə dedim: “Siz bu gün təlbiyə dedikdə nə söyləyirdiniz?” O dedi: “Mən bu yolçuluğu Allah Elçisi ﷺ və onun səhabələri ilə birgə getdim. Onlardan təlbiyə deyən də, təkbir edən də var idi. Onlardan heç kim öz dostuna etiraz etməzdi”.

## ١٩٤– مَا ذُكِرَ فِي يَوْمِ عَرَفَةَ

## 194-cü fəsil: Arafa günü hansı zikrlər edilir?

٣٠٠٢– أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، عَنْ أَبِيهِ ، عَنْ قَيْسِ بْنِ مُسْلِمٍ ، عَنْ طَارِقِ بْنِ شِهَابٍ ، قَالَ

: قَالَ يَهُودِيٌّ لِعُمَرَ : لَوْ عَلَيْنَا نَزَلَتْ هَذِهِ الآيَةُ لاَتَّخَذْنَاهُ عِيدًا **{الْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ}** قَالَ عُمَرُ : قَدْ عَلِمْتُ الْيَوْمَ الَّذِي أُنْزِلَتْ فِيهِ ، وَاللَّيْلَةَ الَّتِي أُنْزِلَتْ : لَيْلَةَ الْجُمُعَةِ ، وَنَحْنُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِعَرَفَاتٍ.

3002. ...Rəvayət edilir ki, Tariq ibn Şihab ﵁ demişdir: "Bir yəhudi Ömərə belə dedi: "Bu ayə **"Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və din olaraq sizin üçün İslamı bəyənib seçdim"** (əl-Maidə, 3) bizə nazil olsaydı, (həmin günü) bayram edərdik". Ömər dedi: "Mən bu ayənin nazil olduğu günü də, gecəni də bilirəm. Bu ayə Allah Elçisinə ﷺ cümə gecəsi Arafada nazil olanda biz onun yanında olanda idik".

٣٠٠٣- أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي مَخْرَمَةُ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ يُونُسَ ، عَنْ ابْنِ الْمُسَيَّبِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا مِنْ يَوْمٍ أَكْثَرَ مِنْ أَنْ يُعْتِقَ اللهُ عَزَّ وَجَلَّ فِيهِ عَبْدًا أَوْأَمَةً مِنَ النَّارِ مِنْ يَوْمِ عَرَفَةَ ، وَإِنَّهُ لَيَدْنُو ، ثُمَّ يُبَاهِي بِهِمُ الْمَلاَئِكَةَ ، وَيَقُولُ : مَا أَرَادَ هَؤُلاَءِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : يُشْبِهُ أَنْ يَكُونَ يُونُسَ بْنَ يُوسُفَ الَّذِي رَوَى عَنْهُ مَالِكٌ وَاللهُ تَعَالَى أَعْلَمُ.

3003. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Allahın ﷻ oddan Arafa gündəki qədər çox qul azad etdiyi başqa bir gün yoxdur. Həqiqətən, o gün (Allah dünya səmasına) yaxınlaşır və mələklərin qarşısında (Arafada olanlarla) öyünərək buyurur: "Bunlar nə istəyirlər?"

### ١٩٥- النَّهْيُ عَنْ صَوْمِ يَوْمِ عَرَفَةَ

### 195-ci fəsil: Arafa günü oruc tutmağın qadağan edilməsi

٣٠٠٤- أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ وَهُوَ ابْنُ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ عَلِيٍّ ، قَالَ : سَمِعْتُ أَبِي ، يُحَدِّثُ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ يَوْمَ عَرَفَةَ وَيَوْمَ النَّحْرِ وَأَيَّامَ التَّشْرِيقِ عِيدُنَا أَهْلَ الإِسْلاَمِ ، وَهِيَ أَيَّامُ أَكْلٍ وَشُرْبٍ.

3004. ...Uqbə ibn Amir ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, Arafa günü, Qurban kəsilən gün və təşriq günləri biz müsəlmanların bayram günləridir. Həmin günlər yeyib-içmək günləridir".

### ١٩٦- الرَّوَاحُ يَوْمَ عَرَفَةَ

### 196-cı fəsil: Arafa günü yavaş getmək

٣٠٠٥- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : أَخْبَرَنِي أَشْهَبُ ، قَالَ : أَخْبَرَنِي مَالِكٌ ، أَنَّ ابْنَ شِهَابٍ ، حَدَّثَهُ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ

اللهِ ، قَالَ : كَتَبَ عَبْدُ الْمَلِكِ بْنُ مَرْوَانَ إِلَى الْحَجَّاجِ بْنِ يُوسُفَ يَأْمُرُهُ أَنْ لاَ يُخَالِفَ ابْنَ عُمَرَ ، فِي أَمْرِ الْحَجِّ ، فَلَمَّا كَانَ يَوْمُ عَرَفَةَ ، جَاءَهُ ابْنُ عُمَرَ ، حِينَ زَالَتِ الشَّمْسُ وَأَنَا مَعَهُ ، فَصَاحَ عِنْدَ سُرَادِقِهِ : أَيْنَ هَذَا ؟ فَخَرَجَ إِلَيْهِ الْحَجَّاجُ وَعَلَيْهِ مِلْحَفَةٌ مُعَصْفَرَةٌ ، فَقَالَ لَهُ : مَا لَكَ يَا أَبَا عَبْدِ الرَّحْمَنِ ؟ قَالَ : الرَّوَاحَ إِنْ كُنْتَ تُرِيدُ السُّنَّةَ ، فَقَالَ لَهُ : هَذِهِ السَّاعَةَ فَقَالَ لَهُ : نَعَمْ ، فَقَالَ : أُفِيضُ عَلَيَّ مَاءً ثُمَّ أَخْرُجُ إِلَيْكَ ، فَانْتَظَرَهُ حَتَّى خَرَجَ فَسَارَ بَيْنِي وَبَيْنَ أَبِي ، فَقُلْتُ : إِنْ كُنْتَ تُرِيدُ أَنْ تُصِيبَ السُّنَّةَ ، فَأَقْصِرِ الْخُطْبَةَ ، وَعَجِّلِ الْوُقُوفَ ، فَجَعَلَ يَنْظُرُ إِلَى ابْنِ عُمَرَ كَيْمَا يَسْمَعَ ذَلِكَ مِنْهُ ، فَلَمَّا رَأَى ذَلِكَ ابْنُ عُمَرَ ، قَالَ : صَدَقَ.

3005. ...Rəvayət edilir ki, Səlim ibn Abdullah ﵁ demişdir: “Abdul-Məlik ibn Mərvan Həccac ibn Yusufa məktub yazaraq həcc ilə əlaqəli məsələlərdə İbn Ömərə müxalif olmamağı tapşırdı. Arafa günü günəş batmağa meyl etdikdə İbn Ömər onun yanına gəldi. Mən də onun yanında idim. Onun çadırına yaxınlaşdıqda İbn Ömər bərkdən dedi: “O haradadır?” Həccac sarı rəngli cübbədə çadırdan çıxıb dedi: “Nə olub, ey Əbu Abdur-Rahmən?” İbn Ömər dedi: “Əgər sünnə ilə getmək istəyirsənsə, gəl Arafaya!” Həccac ona dedi: “Bu saatda?” İbn Ömər dedi: “Bəli”. Həccac dedi: “Qoy yuyunum, gəlim gedək”. O gələnə qədər İbn Ömər onu gözlədi, Həccac gəldikdə mənimlə atamın arasında getməyə başladı. Mən ona dedim: “Əgər sünnəyə tabe olmaq istəyirsənsə, xütbəni qısa de, dayanmağa tələs”. Həccac İbn Ömərin bu məsələdə bir şey deyib-deməyəcəyinə baxdı. İbn Ömər də: “Doğru söylədi”- dedi”.

## ١٩٧- التَّلْبِيَةُ بِعَرَفَةَ

## 197-ci fəsil: Arafada təlbiyə etmək

٣٠٠٦- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ الأَوْدِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ مَخْلَدٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ صَالِحٍ ، عَنْ مَيْسَرَةَ بْنِ حَبِيبٍ ، عَنِ الْمِنْهَالِ بْنِ عَمْرٍو ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، قَالَ : كُنْتُ مَعَ ابْنِ عَبَّاسٍ ، بِعَرَفَاتٍ ، فَقَالَ : مَا لِي لاَ أَسْمَعُ النَّاسَ يُلَبُّونَ ؟ قُلْتُ : يَخَافُونَ مِنْ مُعَاوِيَةَ ، فَخَرَجَ ابْنُ عَبَّاسٍ ، مِنْ فُسْطَاطِهِ ، فَقَالَ : لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ ، لَبَّيْكَ فَإِنَّهُمْ قَدْ تَرَكُوا السُّنَّةَ مِنْ بُغْضِ عَلِيٍّ.

3006. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﵁ demişdir: “Bir dəfə İbn Abbasla birlikdə Arafada idim. İbn Abbas dedi: “Nəyə görə insanların təlbiyə dediklərini eşitmirəm?” Mən dedim: “Çünki Müaviyədən qorxurlar”. İbn Abbas çadırından çıxıb: “Ləbbeyk, Alla:hummə ləbbeyk, ləbbeykə...” deyərək təlbiyə gətirməyə başladı və dedi: “Əliyə qəzəbli olduqlarına görə sünnəni tərk etmişlər”.

١٩٨- الْخُطْبَةُ بِعَرَفَةَ قَبْلَ الصَّلاَةِ

198-ci fəsil: Arafada namazdan qabaq xütbə vermək

٣٠٠٧- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، عَنْ سَلَمَةَ بْنِ نُبَيْطٍ ، عَنْ أَبِيهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ عَلَى جَمَلٍ أَحْمَرَ بِعَرَفَةَ قَبْلَ الصَّلاَةِ.

3007. ...Sələmə ibn Nubeyt atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisinin ﷺ qırmızı dəvənin üstündə namazdan qabaq xütbə verdiyini görmüşəm".

١٩٩- الْخُطْبَةُ يَوْمَ عَرَفَةَ عَلَى النَّاقَةِ

199-cu fəsil: Arafada dəvənin üstündə xütbə vermək

٣٠٠٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنِ ابْنِ الْمُبَارَكِ ، عَنْ سَلَمَةَ بْنِ نُبَيْطٍ ، عَنْ أَبِيهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَخْطُبُ يَوْمَ عَرَفَةَ عَلَى جَمَلٍ أَحْمَرَ.

3008. ...Sələmə ibn Nubeyt atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Allah Elçisini ﷺ qırmızı dəvənin üstündə xütbə verən görmüşəm".

٢٠٠- قَصْرُ الْخُطْبَةِ بِعَرَفَةَ

200-cü fəsil: Arafada deyilən xütbəni qısa etmək

٣٠٠٩- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، أَخْبَرَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، جَاءَ إِلَى الْحَجَّاجِ بْنِ يُوسُفَ يَوْمَ عَرَفَةَ حِينَ زَالَتِ الشَّمْسُ وَأَنَا مَعَهُ ، فَقَالَ : الرَّوَاحَ إِنْ كُنْتَ تُرِيدُ السُّنَّةَ ، فَقَالَ : هَذِهِ السَّاعَةَ قَالَ : نَعَمْ ، قَالَ سَالِمٌ : فَقُلْتُ لِلْحَجَّاجِ : إِنْ كُنْتَ تُرِيدُ أَنْ تُصِيبَ الْيَوْمَ السُّنَّةَ فَأَقْصِرِ الْخُطْبَةَ ، وَعَجِّلِ الصَّلاَةَ ، فَقَالَ عَبْدُ اللهِ بْنُ عُمَرَ : صَدَقَ.

3009. ...Səlim ibn Abdullah ﵀ rəvayət edir ki, Abdullah ibn Ömər Arafa günü günəş batmağa doğru meyl etdikdə Həccac ibn Yusufun yanına gələrək dedi: "Əgər sünnəyə müvafiq olmaq istəyirsənsə, (Arafaya) gəl!" Mən də orada idim. Həccac dedi: "Bu saatda?" İbn Ömər: "Bəli"- dedi. Mən Həccaca dedim: "Əgər bu gün yenə sünnəyə müvafiq olmaq istəyirsənsə, xütbəni qısa et, namazı da tez qıl!" Abdullah ibn Ömər məni təsdiq edrək: "Doğru söylədi" dedi".

٢٠١- الْجَمْعُ بَيْنَ الظُّهْرِ وَالْعَصْرِ بِعَرَفَةَ

201-ci fəsil: Arafada Zöhr namazı ilə Əsr namazını birləşdirmək

٣٠١٠- أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ خَالِدٍ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ عُمَارَةَ بْنِ عُمَيْرٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يُصَلِّي الصَّلاَةَ لِوَقْتِهَا إِلاَّ بِجَمْعٍ وَعَرَفَاتٍ.

3010. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Allah Elçisi ﷺ Arafadakı namazlardan başqa bütün namazları vaxtında qılardı".

٢٠٢- رَفْعُ الْيَدَيْنِ فِي الدُّعَاءِ بِعَرَفَةَ

202-ci fəsil: Arafada dua etdikdə əlləri qaldırmaq

٣٠١١- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ هُشَيْمٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ ، عَنْ عَطَاءٍ ، قَالَ : قَالَ أُسَامَةُ بْنُ زَيْدٍ : كُنْتُ رَدِيفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِعَرَفَاتٍ ، فَرَفَعَ يَدَيْهِ يَدْعُو ، فَمَالَتْ بِهِ نَاقَتُهُ ، فَسَقَطَ خِطَامُهَا فَتَنَاوَلَ الْخِطَامَ بِإِحْدَى يَدَيْهِ ، وَهُوَ رَافِعٌ يَدَهُ الأُخْرَى.

3011. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵁ demişdir: "Arafada Peyğəmbərin ﷺ miniyinin arxasında idim. O, dua edərkən əllərini qaldırmışdı. Dəvə başını hərəkət etdirdikdə yüyənlər əlindən düşmüş, bir əlini yuxarı qaldırdığı halda digər əli ilə yüyəni (yuxarı qaldırdığı tərəfdə) tuturdu".

٣٠١٢- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَتْ قُرَيْشٌ تَقِفُ بِالْمُزْدَلِفَةِ ، وَيُسَمَّوْنَ الْحُمْسَ ، وَسَائِرُ الْعَرَبِ تَقِفُ بِعَرَفَةَ ، فَأَمَرَ اللَّهُ تَبَارَكَ وَتَعَالَى نَبِيَّهُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَقِفَ بِعَرَفَةَ ، ثُمَّ يَدْفَعُ مِنْهَا ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{ثُمَّ أَفِيضُوا مِنْ حَيْثُ أَفَاضَ النَّاسُ}**.

3012. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Qureyş tayfası Müzdəlifədə Hums deyilən yerdə, digər ərəb tayfaları isə Arafada dururdu. Bərəkəti bol və uca olan Allah Öz Peyğəmbərinə ﷺ Arafada durmağı əmr etdi və bu halı dəyişdirdi. Allah ﷻ da bu ayəni nazil etdi: **"Sonra insanların axışıb gəldiyi yerdən siz də gəlin..."** (əl-Bəqərə ,199)".

٣٠١٣- أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ مُحَمَّدِ بْنِ جُبَيْرِ بْنِ مُطْعِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : أَضْلَلْتُ بَعِيرًا لِي ، فَذَهَبْتُ أَطْلُبُهُ بِعَرَفَةَ يَوْمَ عَرَفَةَ ، فَرَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاقِفًا ، فَقُلْتُ : مَا شَأْنُ هَذَا إِنَّمَا هَذَا مِنَ الْحُمْسِ.

3013. ...Muhəmməd ibn Cubeyr ibn Mutim atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən dəvəmi itirmişdim və Arafa günü onu axtarmağa getmişdim. Allah Elçisinin ﷺ orada durduğunu gördüm”. Ravi Muhəmməd atasından soruşdu: “Onun durduğu yer hara idi?” Atası dedi: “Ora əl-Hums idi”.

٣٠١٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَمْرِو بْنِ عَبْدِ اللهِ بْنِ صَفْوَانَ ، أَنَّ يَزِيدَ بْنَ شَيْبَانَ ، قَالَ : كُنَّا وُقُوفًا بِعَرَفَةَ مَكَانًا بَعِيدًا مِنَ الْمَوْقِفِ ، فَأَتَانَا ابْنُ مِرْبَعٍ الأَنْصَارِيُّ ، فَقَالَ : إِنِّي رَسُولُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَيْكُمْ ، يَقُولُ : كُونُوا عَلَى مَشَاعِرِكُمْ ، فَإِنَّكُمْ عَلَى إِرْثٍ مِنْ إِرْثِ أَبِيكُمْ إِبْرَاهِيمَ عَلَيْهِ السَّلاَمُ.

3014. ...Rəvayət edilir ki, Yəzid ibn Şaban ﵁ demişdir: “Biz Arafada olarkən durmalı olduğumuz yerdən uzaqda idik. İbn Mirbə əl-Ənsari bizim yanımıza gələrək dedi: “Məni sizin yanınıza Allah Elçisi ﷺ göndərdi və buyurdu: “Durmalı olduğumuz yerdə durun, çünki atanız İbrahimin ﵇ varisisiniz”.

٣٠١٥- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ ، فَسَأَلْنَاهُ عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَحَدَّثَنَا أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : عَرَفَةُ كُلُّهَا مَوْقِفٌ.

3015. ...Cəfər ibn Muhəmməd atasının ﵀ belə dediyini rəvayət etmişdir: “Biz Cabir ibn Abdullahın yanına gələrək ondan Peyğəmbərin ﷺ həcci haqda soruşduq. O dedi: “Allahın Peyğəmbəri ﷺ buyurdu: “Bütün Arafa dayanmaq üçün yerdir”.

## ٢٠٣- فَرْضُ الْوُقُوفِ بِعَرَفَةَ
## 203-cü fəsil: Arafada durmağın vacib olması

٣٠١٦- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ بُكَيْرِ بْنِ عَطَاءٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَعْمَرَ ، قَالَ : شَهِدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَتَاهُ نَاسٌ ، فَسَأَلُوهُ عَنِ الْحَجِّ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْحَجُّ عَرَفَةُ ، فَمَنْ أَدْرَكَ لَيْلَةَ عَرَفَةَ قَبْلَ طُلُوعِ الْفَجْرِ مِنْ لَيْلَةِ جَمْعٍ ، فَقَدْ تَمَّ حَجُّهُ.

3016. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yamər ﵁ demişdir: “Camaatın Allah Elçisinin ﷺ yanına gələrək həclə əlaqəli suallar verdiyinə şahid oldum. Allah Elçisi ﷺ onlara buyurdu: “Həcc Arafadır. Kim günəş çıxmazdan qabaq Arafada olarsa, həcci tam sayılır”.

٣٠١٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : حَدَّثَنَا حِبَّانُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، قَالَ : أَفَاضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ عَرَفَاتٍ ، وَرِدْفُهُ أُسَامَةُ بْنُ زَيْدٍ ، فَجَالَتْ بِهِ النَّاقَةُ وَهُوَ رَافِعٌ يَدَيْهِ لاَ تُجَاوِزَانِ رَأْسَهُ ، فَمَا زَالَ يَسِيرُ عَلَى هِينَتِهِ حَتَّى انْتَهَى إِلَى جَمْعٍ.

3017. ...Rəvayət edilir ki, əl-Fədl ibn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Arafadan qayıdarkən Usamə ibn Zeyd onun miniyinin tərkində idi. Dəvə çox sürətli gedirdi, o da əlini yuxarı qaldırmışdı. Amma əli başından yuxarıda deyildi. Bu minvalla Müzdəlifədə olan topluma gəlib çatdılar".

٣٠١٨- أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يُونُسَ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ قَيْسِ بْنِ سَعْدٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَاسٍ ، أَنَّ أُسَامَةَ بْنَ زَيْدٍ ، قَالَ : أَفَاضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ عَرَفَةَ وَأَنَا رَدِيفُهُ ، فَجَعَلَ يَكْبَحُ رَاحِلَتَهُ حَتَّى أَنَّ ذِفْرَاهَا لَيَكَادُ يُصِيبُ قَادِمَةَ الرَّحْلِ وَهُوَ يَقُولُ : يَا أَيُّهَا النَّاسُ ، عَلَيْكُمْ بِالسَّكِينَةِ وَالْوَقَارِ ، فَإِنَّ الْبِرَّ لَيْسَ فِي إِيضَاعِ الإِبِلِ.

3018. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﷺ demişdir: "Allah Elçisi ﷺ Arafadan qayıdarkən mən onun miniyinin tərkində idim. O, dəvənin yüyənini tez-tez çəkirdi deyə dəvənin qulaqları yüyənə toxunurdu. Allah Elçisi ﷺ belə deyirdi: "Ey insanlar, sükunət içində və vüqarlı olun! Həqiqətən, yaxşılıq dəvələri sürətli sürməkdə deyil".

٢٠٤- الأَمْرُ بِالسَّكِينَةِ فِي الإِفَاضَةِ مِنْ عَرَفَةَ

## 204-cü fəsil: Arafadan qayıdarkən sükunət içində olmağın əmr edilməsi

٣٠١٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا مُحْرِزُ بْنُ الْوَضَّاحِ ، عَنْ إِسْمَعِيلَ ، يَعْنِي ابْنَ أُمَيَّةَ ، عَنْ أَبِي غَطَفَانَ بْنِ طَرِيفٍ ، حَدَّثَهُ أَنَّهُ سَمِعَ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : لَمَّا دَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَنَقَ نَاقَتَهُ حَتَّى أَنَّ رَأْسَهَا لَيَمَسُّ وَاسِطَةَ رَحْلِهِ ، وَهُوَ يَقُولُ لِلنَّاسِ : السَّكِينَةَ السَّكِينَةَ عَشِيَّةَ عَرَفَةَ.

3019. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Arafadan qayıdarkən dəvəsinin yüyənini tez-tez çəkirdi deyə dəvənin başı yüyənə toxunurdu. Allah Elçisi ﷺ insanlara belə deyirdi: "Sükunət içində olun! Sükunət içində olun ki, axşama kimi Arafada dayana bilək!

٣٠٢٠- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ أَبِي مَعْبَدٍ ، مَوْلَى ابْنِ عَبَّاسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، وَكَانَ رَدِيفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ فِي عَشِيَّةِ عَرَفَةَ وَغَدَاةِ جَمْعٍ لِلنَّاسِ حِينَ دَفَعُوا : عَلَيْكُمُ السَّكِينَةَ وَهُوَ كَافٌّ نَاقَتَهُ ، حَتَّى إِذَا دَخَلَ مُحَسِّرًا ، وَهُوَ مِنْ مِنًى ، قَالَ : عَلَيْكُمْ بِحَصَى الْخَذْفِ الَّذِي يُرْمَى بِهِ ، فَلَمْ يَزَلْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُلَبِّي ، حَتَّى رَمَى الْجَمْرَةَ.

3020. ...əl-Fədl ibn Abbas ﷺ rəvayət edir ki, o, Allah Elçisinin ﷺ miniyinin tərkində idi. Allah Elçisi ﷺ buyurdu: “Arafa günü axşamdan səhərə qədər Müzdəlifədə dayanılacaq. Sükunətdə olun!” Allah Elçisi ﷺ dəvəsinin yüyənini tez-tez dartırdı. Minada olan Muhassir vadisinə gəldikdə buyurdu: “Sütunlarda atacağınız daşları yığmağa başlayın!” Beləcə, sütunlarda daş atmanı bitirənə qədər təlbiyə etməyi tərk etmədi.

٣٠٢١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : أَفَاضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَلَيْهِ السَّكِينَةُ ، وَأَمَرَهُمْ بِالسَّكِينَةِ ، وَأَوْضَعَ فِي وَادِي مُحَسِّرٍ ، وَأَمَرَهُمْ أَنْ يَرْمُوا الْجَمْرَةَ بِمِثْلِ حَصَى الْخَذْفِ.

3021. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Allah Elçisi ﷺ (Arafadan) qayıtdıqda sükunətdə qayıdır, insanlara da sükunətdə olmağı əmr edirdi. Muhassir vadisinə gəldikdə bir qədər sürətini artırdı və insanlara sütunlarda istifadə etmək üçün kiçik daşlar yığmağı əmr etdi”.

٣٠٢٢- أَخْبَرَنِي أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَفَاضَ مِنْ عَرَفَةَ ، وَجَعَلَ يَقُولُ : السَّكِينَةَ عِبَادَ اللهِ يَقُولُ بِيَدِهِ هَكَذَا ، وَأَشَارَ أَيُّوبُ ، بِبَاطِنِ كَفِّهِ إِلَى السَّمَاءِ.

3022. ...Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Arafadan qayıdarkən: “Sükunətdə olun, ey Allahın qulları!”- deyir və əli ilə onlara işarə edirdi. Ravi Əyyub: “Ovcunu səmaya çevirərək”- dedi.

### ٢٠٥- كَيْفَ السَّيْرُ مِنْ عَرَفَةَ

### 205-ci fəsil: Arafadan necə qayıtmaq lazımdır?

٣٠٢٣- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، أَنَّهُ سُئِلَ عَنْ مَسِيرِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي حَجَّةِ الْوَدَاعِ ، قَالَ : كَانَ يَسِيرُ الْعَنَقَ ، فَإِذَا وَجَدَ فَجْوَةً نَصَّ وَالنَّصُّ : فَوْقَ الْعَنَقِ.

3023. ...Rəvayət edilir ki, Usamə ibn Zeyddən ﷺ Allah Elçisinin ﷺ Vida həccindən necə qayıtması haqda soruşuldu. Usamə dedi: “Miniyini sürətli olmağa yaxın şəkildə sürər, yol daha rahat olduqda miniyini sürətləndirərdi”.

٢٠٦- النُّزُولُ بَعْدَ الدَّفْعِ مِنْ عَرَفَةَ

## 206-cı fəsil: Arafadan qayıtdıqda harada dayanmaq lazımdır?

٣٠٢٤- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَيْثُ أَفَاضَ مِنْ عَرَفَةَ مَالَ إِلَى الشِّعْبِ ، قَالَ : فَقُلْتُ لَهُ : أَتُصَلِّي الْمَغْرِبَ ؟ قَالَ : الْمُصَلَّى أَمَامَكَ.

3024. ...Usamə ibn Zeyd ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Arafadan qayıtdıqda əş-Şib adlı yerə tərəf gedirdi. Usamə ona dedi: "Məğrib namazını qılacaqsan?" Peyğəmbər ﷺ buyurdu: "Namaz qılınacaq yer qabaqdadır".

٣٠٢٥- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، عَنْ كُرَيْبٍ ، عَنْ أُسَامَةَ بْنِ زَيْدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَزَلَ الشِّعْبَ الَّذِي يَنْزِلُهُ الأُمَرَاءُ فَبَالَ ، ثُمَّ تَوَضَّأَ وُضُوءًا خَفِيفًا ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصَّلاَةَ ؟ قَالَ : الصَّلاَةُ أَمَامَكَ فَلَمَّا أَتَيْنَا الْمُزْدَلِفَةَ لَمْ يَحُلَّ آخِرُ النَّاسِ حَتَّى صَلَّى.

3025. ...Usamə ibn Zeyd ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ (səfərdə) əmirlərin gecələdiyi əş-Şib adlı yerdə gecələmişdi. Subaşına çıxdıqdan sonra yüngül dəstəmaz aldı. Usamə deyir: "Mən ona dedim: "Ey Allahın Elçisi, namaz qılacaqsan?" O dedi: "Namaz irəlidə qılınacaq". Biz də Müzdəlifəyə gəldikdə namaz qılmaq üçün camaatın hamısının gəlməsini gözlədik".

٢٠٧- الْجَمْعُ بَيْنَ الصَّلاَتَيْنِ بِالْمُزْدَلِفَةِ

## 207-ci fəsil: Müzdəlifədə iki namazı birləşdirmək

٣٠٢٦- أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، عَنْ حَمَّادٍ ، عَنْ يَحْيَى ، عَنْ عَدِيِّ بْنِ ثَابِتٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي أَيُّوبَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمَعَ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ بِجَمْعٍ.

3026. ...Əbu Əyyub ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Məğrib və İşa namazlarını birləşdirib qıldı.

٣٠٢٧- أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا ، قَالَ : حَدَّثَنَا مُصْعَبُ بْنُ الْمِقْدَامِ ، عَنْ دَاوُدَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنِ ابْنِ مَسْعُودٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، جَمَعَ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ بِجَمْعٍ.

3027. ...İbn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Məğrib və İşa namazlarını birləşdirib qıldı.

٣٠٢٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ ابْنِ أَبِي ذِئْبٍ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، جَمَعَ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ بِجَمْعٍ بِإِقَامَةٍ وَاحِدَةٍ ، لَمْ يُسَبِّحْ بَيْنَهُمَا ، وَلاَ عَلَى إِثْرِ كُلِّ وَاحِدَةٍ مِنْهُمَا.

3028. ...Səlim atasından rəvayət edir ki, Allah Elçisi ﷺ Məğrib və İşa namazlarını bir iqamə ilə birləşdirib qıldı. Onların arasında zikr etmədi və onlardan başqa heç nə qılmadı.

٣٠٢٩- أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ عُبَيْدَ اللهِ بْنَ عَبْدِ اللهِ ، أَخْبَرَهُ أَنَّ أَبَاهُ ، قَالَ : جَمَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ الْمَغْرِبِ وَالْعِشَاءِ ، لَيْسَ بَيْنَهُمَا سَجْدَةٌ ، صَلَّى الْمَغْرِبَ ثَلاَثَ رَكَعَاتٍ ، وَالْعِشَاءَ رَكْعَتَيْنِ وَكَانَ عَبْدُ اللهِ بْنُ عُمَرَ ، يَجْمَعُ كَذَلِكَ حَتَّى لَحِقَ بِاللهِ عَزَّ وَجَلَّ.

3029. ...Ubeydullah ibn Abdullah atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ Məğrib ilə İşa namazlarını birləşdirdi. Onların ikisinin arasında əlavə namaz qılmadı. Məğrib namazını üç rükət, İşa namazını iki rükət qıldı. Abdullah ibn Ömər də Allaha ﷻ qovuşana qədər bu iki namazı (Arafadan qayıdarkən) birləşdirib qıldı”.

٣٠٣٠- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سَلَمَةَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَغْرِبَ وَالْعِشَاءَ بِجَمْعٍ بِإِقَامَةٍ وَاحِدَةٍ.

3030. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ Məğrib və İşa namazlarını birləşdirərək bir iqamə ilə qıldı”.

٣٠٣١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : أَنْبَأَنَا حِبَّانُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عُقْبَةَ ، أَنَّ كُرَيْبًا ، قَالَ : سَأَلْتُ أُسَامَةَ بْنَ زَيْدٍ ، وَكَانَ رِدْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَشِيَّةَ عَرَفَةَ ، فَقُلْتُ : كَيْفَ فَعَلْتُمْ ؟ قَالَ : أَقْبَلْنَا نَسِيرُ حَتَّى بَلَغْنَا الْمُزْدَلِفَةَ ، فَأَنَاخَ ، فَصَلَّى الْمَغْرِبَ ، ثُمَّ بَعَثَ إِلَى الْقَوْمِ ، فَأَنَاخُوا فِي مَنَازِلِهِمْ ، فَلَمْ يَحُلُّوا حَتَّى صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعِشَاءَ الآخِرَةَ ، ثُمَّ حَلَّ النَّاسُ فَنَزَلُوا ، فَلَمَّا أَصْبَحْنَا انْطَلَقْتُ عَلَى رِجْلَيَّ فِي سُبَّاقِ قُرَيْشٍ ، وَرَدِفَهُ الْفَضْلُ.

3031. ...Rəvayət edilir ki, Kureyb ﷺ demişdir: “Mən Arafa günü Allah Elçisinin ﷺ tərkində olan Usamə ibn Zeyddən soruşdum: “Siz həmin vaxt nə edirdiniz?” O dedi: “Yeriyərək Müzdəlifəyə qədər getdik, Allah Elçisi ﷺ orada gecələdi. Məğrib namazını qılıb camaatın da gecələməsi üçün xəbər göndərdi. Allah Elçisi ﷺ İşa namazını qılana qədər camaatın gəlməsi davam etdi. Camaatın gəlməsi dayandıqda, hamısı birlikdə orada gecələdilər. Səhər olduqda Qureyşin ilk yola çıxanları ilə birlikdə mən də çıxdım. Bu əsnada Allah Elçisinin ﷺ miniyinin tərkində əl-Fədl var idi”.

## ٢٠٨- تَقْدِيمُ النِّسَاءِ وَالصِّبْيَانِ إِلَى مَنَازِلِهِمْ بِمُزْدَلِفَةَ

## 208-ci fəsil: Qadınların və uşaqların Müzdəlifədən tez çıxması

٣٠٣٢- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ أَبِي يَزِيدَ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : أَنَا مِمَّنْ قَدَّمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةَ الْمُزْدَلِفَةِ فِي ضَعَفَةِ أَهْلِهِ.

3032. ...Rəvayət edilir ki, İbn Abbas ﷻ demişdir: “Müzdəlifə gecəsi Allah Elçisi ﷺ ailəsini və zəif olanları bir az tez yola salmışdı. Mən də onların arasında idim”.

٣٠٣٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كُنْتُ فِيمَنْ قَدَّمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةَ الْمُزْدَلِفَةِ فِي ضَعَفَةِ أَهْلِهِ.

3033. ...Rəvayət edilir ki, İbn Abbas ﷻ demişdir: “Müzdəlifə gecəsi Allah Elçisi ﷺ ailəsini və zəif olanları bir az tez yola salanda mən də onların arasında idim”.

٣٠٣٤- أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَاصِمٍ ، وَعَفَّانُ ، وَسُلَيْمَانُ ، عَنْ شُعْبَةَ ، عَنْ مُشَاشٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَمَرَ ضَعَفَةَ بَنِي هَاشِمٍ أَنْ يَنْفِرُوا مِنْ جَمْعٍ بِلَيْلٍ.

3034. ...əl-Fədl ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Bəni Haşim tayfasından zəif olanların Müzdəlifə gecəsi yola salınmalarını əmr etmişdir.

٣٠٣٥- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : حَدَّثَنَا عَطَاءٌ ، عَنْ سَالِمِ بْنِ شَوَّالٍ ، أَنَّ أُمَّ حَبِيبَةَ ، أَخْبَرَتْهُ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَمَرَهَا أَنْ تُغَلِّسَ مِنْ جَمْعٍ إِلَى مِنًى.

3035. ...Ummu Həbibə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ona Müzdəlifədən Minaya gedərkən ala-qaranlıqda yola çıxmağı əmr etdi.

٣٠٣٦- أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلَاءِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، عَنْ سَالِمِ بْنِ شَوَّالٍ ، عَنْ أُمِّ حَبِيبَةَ ، قَالَتْ : كُنَّا نُغَلِّسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمُزْدَلِفَةِ إِلَى مِنًى.

3036. ...Rəvayət edilir ki, Ummu Həbibə ﷺ demişdir: “Allah Elçisinin ﷺ dövründə Müzdəlifədən Minaya getmək üçün ala-qaranlıqda yola çıxdıq”.

٢٠٩- الرُّخْصَةُ لِلنِّسَاءِ فِي الإِفَاضَةِ مِنْ جَمْعٍ قَبْلَ الصُّبْحِ

## 209-ci fəsil: Qadınların sübhdən qabaq Müzdəlifədən çıxmalarının rüsxəti

٣٠٣٧- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنِ الْقَاسِمِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : إِنَّمَا أَذِنَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِسَوْدَةَ فِي الإِفَاضَةِ قَبْلَ الصُّبْحِ مِنْ جَمْعٍ لأَنَّهَا كَانَتِ امْرَأَةً ثَبِطَةً.

3037. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ kök olduğuna görə Səudanın Müzdəlifədən sübhdən qabaq çıxmasına izn vermişdi”.

٢١٠- الْوَقْتُ الَّذِي يُصَلِّي فِيهِ الصُّبْحَ بِالْمُزْدَلِفَةِ

## 210-cu fəsil: Müzdəlifədə Sübh namazının qılınma vaxtı

٣٠٣٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْعَلاَءِ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى صَلاَةً قَطُّ إِلاَّ لِمِيقَاتِهَا إِلاَّ صَلاَةَ الْمَغْرِبِ وَالْعِشَاءِ ، صَلاَّهُمَا بِجَمْعٍ ، وَصَلاَةَ الْفَجْرِ يَوْمَئِذٍ قَبْلَ مِيقَاتِهَا.

3038. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ heç bir vaxtın namazını həmin namazın vaxtının xaricində qılmazdı. Yalnız Müzdəlifədə Məğrib ilə İşa namazını bir vaxtda, Sübh namazını isə həmişə qıldığı vaxtından bir az əvvəl qılmışdı”.

٢١١- فِيمَنْ لَمْ يُدْرِكْ صَلاَةَ الصُّبْحِ مَعَ الإِمَامِ بِالْمُزْدَلِفَةِ

## 211-ci fəsil: Müzdəlifədə imamla qılınan Sübh namazına çatmayan

٣٠٣٩- أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ إِسْمَعِيلَ ، وَدَاوُدَ ، وَزَكَرِيَّا ، عَنِ الشَّعْبِيِّ ، عَنْ عُرْوَةَ بْنِ مُضَرِّسٍ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاقِفًا بِالْمُزْدَلِفَةِ ، فَقَالَ : مَنْ صَلَّى مَعَنَا صَلاَتَنَا هَذِهِ هَا هُنَا ، ثُمَّ أَقَامَ مَعَنَا وَقَدْ وَقَفَ قَبْلَ ذَلِكَ بِعَرَفَةَ لَيْلاً أَوْ نَهَارًا ، فَقَدْ تَمَّ حَجُّهُ.

3039. ...Rəvayət edilir ki, Urva ibn Mudarris ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ Müzdəlifədə dayandığını gördüm. O buyurdu: “Kim əvvəl Arafada gecə və gündüz bir qədər durar, sonra mənimlə bu vaxt burada Sübh namazını qılar, sonra mənimlə birlikdə dayanarsa, onun həcci tam olmuş sayılar”.

٣٠٤٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنِي جَرِيرٌ ، عَنْ مُطَرِّفٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ عُرْوَةَ بْنِ مُضَرِّسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَدْرَكَ جَمْعًا مَعَ الإِمَامِ وَالنَّاسِ حَتَّى يُفِيضَ مِنْهَا ، فَقَدْ أَدْرَكَ الْحَجَّ ، وَمَنْ لَمْ يُدْرِكْ مَعَ النَّاسِ وَالإِمَامِ ، فَلَمْ يُدْرِكْ.

3040. ...Rəvayət edilir ki, Urva ibn Mudarris ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim (Müzdəlifədə) mənimlə və camaatla olar, buradan gedənə qədər (bizimlə) burada qalarsa, həccə çatmış sayılır. Kim də camaatla birlikdə olmazsa, həccə çatmamış sayılır".

٣٠٤١- أَخْبَرَنَا عَلِيُّ بْنُ الْحُسَيْنِ ، قَالَ : حَدَّثَنَا أُمَيَّةُ ، عَنْ شُعْبَةَ ، عَنْ سَيَّارٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ عُرْوَةَ بْنِ مُضَرِّسٍ ، قَالَ : أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجَمْعٍ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنِّي أَقْبَلْتُ مِنْ جَبَلَيْ طَيِّئٍ لَمْ أَدَعْ حَبْلاً إِلاَّ وَقَفْتُ عَلَيْهِ ، فَهَلْ لِي مِنْ حَجٍّ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَلَّى هَذِهِ الصَّلاَةَ مَعَنَا ، وَقَدْ وَقَفَ قَبْلَ ذَلِكَ بِعَرَفَةَ لَيْلاً أَوْ نَهَارًا ، فَقَدْ تَمَّ حَجُّهُ ، وَقَضَى تَفَثَهُ.

3041. ...Rəvayət edilir ki, Urva ibn Mudarris ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ yanına gələrək dedim: "Ey Allahın Elçisi! Mən "Cəbəley Tayyiin" adlı yerdən gəlirəm. Buraya gələnə qədər dayanmadığım heç bir təpə qalmadı. Mənim həccim sayılırmı?" Allah Elçisi ﷺ buyurdu: "Kim gecə və gündüz Arafada dayanar, olduğumuz bu vaxtda namazı bizimlə qılarsa, onun həcci tam olmuş sayılar və həcc borcunu ödəmiş olur".

٣٠٤٢- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي السَّفَرِ ، قَالَ : سَمِعْتُ الشَّعْبِيَّ ، يَقُولُ : حَدَّثَنِي عُرْوَةُ بْنُ مُضَرِّسِ بْنِ أَوْسِ بْنِ حَارِثَةَ بْنِ لأْمٍ ، قَالَ : أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجَمْعٍ ، فَقُلْتُ : هَلْ لِي مِنْ حَجٍّ ؟ فَقَالَ : مَنْ صَلَّى هَذِهِ الصَّلاَةَ مَعَنَا ، وَوَقَفَ هَذَا الْمَوْقِفَ حَتَّى يُفِيضَ ، وَأَفَاضَ قَبْلَ ذَلِكَ مِنْ عَرَفَاتٍ لَيْلاً أَوْ نَهَارًا ، فَقَدْ تَمَّ حَجُّهُ ، وَقَضَى تَفَثَهُ.

3042. ...Rəvayət edilir ki, Urva ibn Mudarris ibn Əus ibn Harisə ibn Ləm ﵁ demişdir: "Mən (Müzdəlifədə) Peyğəmbərin ﷺ yanına gələrək dedim: "Mənim həccim sayılırmı?" Peyğəmbər ﷺ buyurdu: "Kim gecə və gündüz Arafada dayanar, olduğumuz bu vaxtda namazı bizimlə qılar, bizimlə dayanarsa, onun həcci tam olmuş sayılar və həcc borcunu ödəmiş olur".

٣٠٤٣- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ إِسْمَعِيلَ ، قَالَ : أَخْبَرَنِي عَامِرٌ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ مُضَرِّسٍ الطَّائِيُّ ، قَالَ : أَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : أَتَيْتُكَ مِنْ جَبَلَيْ طَيِّئٍ ، أَكْلَلْتُ مَطِيَّتِي ، وَأَتْعَبْتُ نَفْسِي ، مَا بَقِيَ مِنْ حَبْلٍ إِلاَّ وَقَفْتُ عَلَيْهِ ، فَهَلْ لِي مِنْ حَجٍّ ؟ فَقَالَ : مَنْ صَلَّى صَلاَةَ الْغَدَاةِ هَا هُنَا مَعَنَا ، وَقَدْ أَتَى عَرَفَةَ قَبْلَ ذَلِكَ ، فَقَدْ قَضَى تَفَثَهُ ، وَتَمَّ حَجُّهُ.

3043. ...Rəvayət edilir ki, Urva ibn Mudarris ət-Tai ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ yanına gələrək dedim: "Mən "Cəbəley Tayyiin" adlı yerdən gəldim. Miniyimi sürətlə sürdüm və özümü yordum. Dayanmadığım heç

bir təpə qalmadı. Mənim həccim sayılırmı?" Allah Elçisi ﷺ belə buyurdu: "Kim Arafada dayanar və bizimlə namaz qılarsa, həcc borcunu ödəmiş olar və onun həcci tamdır".

٣٠٤٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي بُكَيْرُ بْنُ عَطَاءٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ الرَّحْمَنِ بْنَ يَعْمَرَ الدِّيلِيَّ ، قَالَ : شَهِدْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِعَرَفَةَ وَأَتَاهُ نَاسٌ مِنْ نَجْدٍ ، فَأَمَرُوا رَجُلاً ، فَسَأَلَهُ عَنِ الْحَجِّ ، فَقَالَ : الْحَجُّ عَرَفَةُ ، مَنْ جَاءَ لَيْلَةَ جَمْعٍ قَبْلَ صَلاَةِ الصُّبْحِ فَقَدْ أَدْرَكَ حَجَّهُ ، أَيَّامُ مِنًى ثَلاَثَةُ أَيَّامٍ ، مَنْ تَعَجَّلَ فِي يَوْمَيْنِ فَلاَ إِثْمَ عَلَيْهِ ، وَمَنْ تَأَخَّرَ فَلاَ إِثْمَ عَلَيْهِ ، ثُمَّ أَرْدَفَ رَجُلاً فَجَعَلَ يُنَادِي بِهَا فِي النَّاسِ.

3044. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yamər əd-Dili رضي الله عنه demişdir: "Mən Peyğəmbəri ﷺ Arafada gördüm. Onun yanına Nəcddən bir dəstə insan gəlmişdi. Aralarından bir kişidən Peyğəmbərdən ﷺ həcc ilə əlaqəli suallar verməsini tələb etdilər. Peyğəmbər ﷺ buyurdu: "Həcc Arafadır. Kim Sübh namazından qabaq Müzdəlifəyə çatıbsa, həccə çatmış sayılır. Minada olan günlər üç gündür. Kim tələsərək iki gündə qayıdarsa, ona bir günah yoxdur. Kim gecikərsə, ona da bir günah yoxdur". Peyğəmbər ﷺ bunları insanlara nida edərək söyləməsi üçün bir nəfəri göndərdi".

٣٠٤٥- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : أَتَيْنَا جَابِرَ بْنَ عَبْدِ اللهِ ، فَحَدَّثَنَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْمُزْدَلِفَةُ كُلُّهَا مَوْقِفٌ.

3045. ...Cəfər ibn Muhəmməd atasının رحمه الله belə dediyini rəvayət etmişdir: "Biz Cabir ibn Abdullahın yanına gəlmişdik. O bizə Allah Elçisindən ﷺ rəvayət edərək dedi: "Müzdəlifənin hər yeri dayanmaq üçündür".

## ٢١٢- بَابُ التَّلْبِيَةِ بِالْمُزْدَلِفَةِ

## 212-ci fəsil: Müzdəlifədə deyilən təlbiyə

٣٠٤٦- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، فِي حَدِيثِهِ عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ حُصَيْنٍ ، عَنْ كَثِيرٍ وَهُوَ ابْنُ مُدْرِكٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، قَالَ : قَالَ ابْنُ مَسْعُودٍ ، وَنَحْنُ بِجَمْعٍ : سَمِعْتُ الَّذِي أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ يَقُولُ فِي هَذَا الْمَكَانِ : لَبَّيْكَ اللَّهُمَّ لَبَّيْكَ.

3046. ...Rəvayət edilir ki, İbn Məsud رضي الله عنه demişdir: "Biz Müzdəlifədə idik. əl-Bəqərə surəsinin nazil olduğu şəxsdən eşitdim ki, belə deyirdi: "Ləbbeyk, Alla:hummə Ləbbeyk!"[1]

[1] Tərcüməsi: Hüzurundayam, Allahım! Hüzurundayam!

## ٢١٣- بَابُ : وَقْتِ الإِفَاضَةِ مِنْ جَمْعٍ

## 213-cü fəsil: Müzdəlifədə dayanmağın müddəti

٣٠٤٧- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَمْرِو بْنِ مَيْمُونٍ ، قَالَ : سَمِعْتُهُ يَقُولُ : شَهِدْتُ عُمَرَ ، بِجَمْعٍ ، فَقَالَ : إِنَّ أَهْلَ الْجَاهِلِيَّةِ كَانُوا لاَ يُفِيضُونَ حَتَّى تَطْلُعَ الشَّمْسُ ، وَيَقُولُونَ : أَشْرِقْ ثَبِيرُ وَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، خَالَفَهُمْ ، ثُمَّ أَفَاضَ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ.

3047. ...Rəvayət edilir ki, Amr ibn Məymun ﷺ demişdir: “Müzdəlifədə Ömərin belə buyurduğunun şahidi oldum: “Həqiqətən, cahiliyyət əhli günəş çıxana qədər Müzdəlifədən uzaqlaşmaz və belə deyərdilər: “Günəşi çıxart!” Allah Elçisi ﷺ də onlara müxalif olaraq günəş çıxmadan Müzdəlifədən uzaqlaşdı”.

## ٢١٤- بَابُ : الرُّخْصَةِ لِلضَّعَفَةِ أَنْ يُصَلُّوا يَوْمَ النَّحْرِ الصُّبْحَ بِمِنًى

## 214-cü fəsil: Zəiflərin Sübh namazını Minada qılmasına rüsxət verilməsi

٣٠٤٨- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ أَشْهَبَ ، أَنَّ دَاوُدَ بْنَ عَبْدِ الرَّحْمَنِ ، حَدَّثَهُمْ أَنَّ عَمْرَو بْنَ دِينَارٍ ، حَدَّثَهُ ، أَنَّ عَطَاءَ بْنَ أَبِي رَبَاحٍ حَدَّثَهُمْ أَنَّهُ سَمِعَ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : أَرْسَلَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي ضَعَفَةِ أَهْلِهِ ، فَصَلَّيْنَا الصُّبْحَ بِمِنًى ، وَرَمَيْنَا الْجَمْرَةَ.

3048. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ məni və ailə üzvlərindən zəif olanları mənimlə Minaya göndərdi, biz də birlikdə Sübh namazını qılıb sütunlara daş atdıq”.

٣٠٤٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ بْنِ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحِيمِ بْنُ سُلَيْمَانَ ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ أُمِّ الْمُؤْمِنِينَ عَائِشَةَ ، قَالَتْ : وَدِدْتُ أَنِّي اسْتَأْذَنْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَمَا اسْتَأْذَنَتْهُ سَوْدَةُ ، فَصَلَّيْتُ الْفَجْرَ بِمِنًى قَبْلَ أَنْ يَأْتِيَ النَّاسُ ، وَكَانَتْ سَوْدَةُ امْرَأَةً ثَقِيلَةً ثَبِطَةً ، فَاسْتَأْذَنَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَذِنَ لَهَا ، فَصَلَّتِ الْفَجْرَ بِمِنًى ، وَرَمَتْ قَبْلَ أَنْ يَأْتِيَ النَّاسُ.

3049. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﷺ demişdir: “Səudə kimi mən də Allah Elçisindən ﷺ icazə alıb camaatdan əvvəl Sübh namazını Minada qıldım. Səudə kök qadın idi. O, Allah Elçisindən ﷺ izin istədi, o da Səudəyə izin verdi. Səudə Sübh namazını Minada qıldı və camaat Minaya gəlməzdən qabaq sütunları daşladı”.

٣٠٥٠- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، أَنَّ مَوْلًى لأَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، أَخْبَرَهُ قَالَ : جِئْتُ مَعَ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، مِنًى بِغَلَسٍ ، فَقُلْتُ لَهَا : لَقَدْ جِئْنَا مِنًى بِغَلَسٍ ، فَقَالَتْ : قَدْ كُنَّا نَصْنَعُ هَذَا مَعَ مَنْ هُوَ خَيْرٌ مِنْكَ.

3050. ...Rəvayət edilir ki, Əsma bint Əbu Bəkrin ﵄ köləlikdən azad etdiyi Əta ibn Əbu Rabah ﵁ demişdir: "Əsma bint Əbu Bəkr ilə ala-qaranlıqda gəldik. Ona dedim: "Biz artıq ala-qaranlıqda Minaya gəlmişik". O da buyurdu: "Səndən daha xeyirli olanlarla da biz bunu belə edərdik".

٣٠٥١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : سُئِلَ أُسَامَةُ بْنُ زَيْدٍ ، وَأَنَا جَالِسٌ مَعَهُ ، كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسِيرُ فِي حَجَّةِ الْوَدَاعِ حِينَ دَفَعَ ؟ قَالَ : كَانَ يُسَيِّرُ نَاقَتَهُ ، فَإِذَا وَجَدَ فَجْوَةً نَصَّ.

3051. ...Hişam ibn Urva atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Mən Usamə ibn Zeydin yanında olanda ondan soruşdular: "Allah Elçisi ﷺ Vida həccində hansı sürətlə gedərdi?" O dedi: "O, dəvədə adi sürətlə gedər, imkan olduqda sürətini bir az artırardı".

٣٠٥٢- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، عَنْ أَبِي مَعْبَدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِلنَّاسِ حِينَ دَفَعُوا عَشِيَّةَ عَرَفَةَ وَغَدَاةَ جَمْعٍ : عَلَيْكُمْ بِالسَّكِينَةِ وَهُوَ كَافٌّ نَاقَتَهُ ، حَتَّى إِذَا دَخَلَ مِنًى فَهَبَطَ ، حِينَ هَبَطَ مُحَسِّرًا ، قَالَ : عَلَيْكُمْ بِحَصَى الْخَذْفِ الَّذِي يُرْمَى بِهِ الْجَمْرَةُ وَقَالَ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُشِيرُ بِيَدِهِ كَمَا يَخْذِفُ الإِنْسَانُ.

3052. ...Rəvayət edilir ki, Fədl ibn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ Arafa gününün axşamı və Müzdəlifə gecəsi gedərkən camaata "Yavaş olun!" deyir, özü də dəvənin yüyənini çəkirdi. Minanın sərhədlərinə gəldikdə eyni şəkildə davam etdi. Muhassir vadisinə gəldikdə buyurdu: "Sütunlara atacağınız daşları toplayın!" Allah Elçisi ﷺ bunu deyərkən əli ilə daşları atırmış kimi işarə edirdi".

## ٢١٥- بَابُ الإِيضَاعِ فِي وَادِي مُحَسِّرٍ

## 215-ci fəsil: Muhassir vadisindən[1] sürətlə keçmək

٣٠٥٣- أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَوْضَعَ فِي وَادِي مُحَسِّرٍ.

[1] Muhassir vadisi - Məkkə yaxınlığında Mina və Muzdəlifənin arasında yerləşir, mənası "həsrət vadisi" deməkdir.

3053. ...Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Muhassir vadisindən sürətlə keçmişdir.

٣٠٥٤- أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، قَالَ : دَخَلْنَا عَلَى جَابِرِ بْنِ عَبْدِ اللهِ ، فَقُلْتُ : أَخْبِرْنِي عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، دَفَعَ مِنَ الْمُزْدَلِفَةِ قَبْلَ أَنْ تَطْلُعَ الشَّمْسُ ، وَأَرْدَفَ الْفَضْلَ بْنَ الْعَبَّاسِ حَتَّى أَتَى مُحَسِّرًا حَرَّكَ قَلِيلاً ، ثُمَّ سَلَكَ الطَّرِيقَ الْوُسْطَى الَّتِي تُخْرِجُكَ عَلَى الْجَمْرَةِ الْكُبْرَى حَتَّى أَتَى الْجَمْرَةَ الَّتِي عِنْدَ الشَّجَرَةِ ، فَرَمَى بِسَبْعِ حَصَيَاتٍ يُكَبِّرُ مَعَ كُلِّ حَصَاةٍ مِنْهَا - حَصَى الْخَذْفِ - رَمَى مِنْ بَطْنِ الْوَادِي.

3054. ...Cəfər ibn Muhəmməd atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Biz Cabir ibn Abdullahın yanına gəlmişdik. Mən dedim: "Mənə Peyğəmbərin ﷺ həcci haqda məlumat ver". O dedi: "Allah Elçisi ﷺ günəş çıxmamışdan qabaq Müzdəlifədən çıxıb getməyə başladı. Fədl ibn Abbas da onun miniyinin üstündə idi. O, Muhassir vadisinə gəldikdə bir az sürətləndi. Böyük sütuna çıxan orta yola girib ağacın yanındakı sütuna gedərək yeddi daş atdı. Hər dəfə daş atanda təkbir edirdi. Daşları Bətnil-Vadidən atırdı".

### ٢١٦- بَابُ : التَّلْبِيَةِ فِي السَّيْرِ

### 216-cı fəsil: Sütunların yanına gedənədək təkbir etmək

٣٠٥٥- أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُفْيَانَ وَهُوَ ابْنُ حَبِيبٍ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ جُرَيْجٍ ، وَعَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، أَنَّهُ كَانَ رَدِيفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمْ يَزَلْ يُلَبِّي حَتَّى رَمَى الْجَمْرَةَ.

3055. ...Rəvayət edilir ki, Fədl ibn Abbas ﷺ Peyğəmbərin ﷺ miniyinin tərkində olarkən Peyğəmbər ﷺ sütunlara daş atana qədər təlbiyə gətirməyə davam etdi.

٣٠٥٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ حَبِيبٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لَبَّى حَتَّى رَمَى الْجَمْرَةَ.

3056. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ sütuna daş atana qədər təlbiyə gətirməyə davam etmişdir.

٢١٧- بَابُ : الْتِقَاطِ الْحَصَى

## 217-ci fəsil: Sütunlar üçün daş yığmaq

٣٠٥٧- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا عَوْفٌ ، قَالَ : حَدَّثَنَا زِيَادُ بْنُ حُصَيْنٍ ، عَنْ أَبِي الْعَالِيَةِ ، قَالَ : قَالَ ابْنُ عَبَّاسٍ : قَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَدَاةَ الْعَقَبَةِ وَهُوَ عَلَى رَاحِلَتِهِ : هَاتِ ، الْقُطْ لِي فَلَقَطْتُ لَهُ حَصَيَاتٍ هُنَّ حَصَى الْخَذْفِ ، فَلَمَّا وَضَعْتُهُنَّ فِي يَدِهِ ، قَالَ : بِأَمْثَالِ هَؤُلَاءِ ، وَإِيَّاكُمْ وَالْغُلُوَّ فِي الدِّينِ ، فَإِنَّمَا أَهْلَكَ مَنْ كَانَ قَبْلَكُمُ الْغُلُوُّ فِي الدِّينِ.

3057. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Aqabə gününün sonrakı günü miniyinin üzərində mənə dedi: "Gəl mənim üçün daş yığ!" Mən də sapand daşı böyüklüyündə daşları onun əlinə qoyduqda əlindəkilərdən birini göstərərək dedi: "Bunun kimiləri yığ! Dində həddi aşmaqdan çəkinin! Çünki sizdən əvvəlkilər dini məsələlərdə özlərini çətinliklərə salaraq hədlərini aşdıqlarına görə həlak oldular".

٢١٨- بَابُ : مِنْ أَيْنَ يَلْتَقِطُ الْحَصَى

## 218-ci fəsil: Sütunlar üçün daşları haradan yığmaq lazımdır?

٣٠٥٨- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، عَنْ أَبِي مَعْبَدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِلنَّاسِ حِينَ دَفَعُوا عَشِيَّةَ عَرَفَةَ وَغَدَاةَ جَمْعٍ : عَلَيْكُمْ بِالسَّكِينَةِ وَهُوَ كَافٌّ نَاقَتَهُ ، حَتَّى إِذَا دَخَلَ مِنًى فَهَبَطَ ، حِينَ هَبَطَ مُحَسِّرًا قَالَ : عَلَيْكُمْ بِحَصَى الْخَذْفِ الَّذِي تُرْمَى بِهِ الْجَمْرَةُ قَالَ : وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُشِيرُ بِيَدِهِ كَمَا يَخْذِفُ الإِنْسَانُ.

3058. ...Rəvayət edilir ki, Fədl ibn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Arafa gününün axşamı və Müzdəlifə gecəsi gedərkən camaata "Yavaş olun!" deyir, özü də dəvənin yüyənini çəkirdi. Minanın sərhədlərinə gəldikdə eyni şəkildə davam etdi. Muhassir vadisinə gəldikdə isə buyurdu: "Sütunlarda atacağınız daşları toplayın!" Allah Elçisi ﷺ bunu deyərkən əli ilə daşları atırmış kimi işarə edirdi".

٢١٩- بَابُ : قَدْرِ حَصَى الرَّمْيِ

## 219-cu fəsil: Sütunlara atılan daşların miqdarı

٣٠٥٩- أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَوْفٌ ، قَالَ : حَدَّثَنَا زِيَادُ بْنُ حُصَيْنٍ ، عَنْ أَبِي الْعَالِيَةِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَدَاةَ الْعَقَبَةِ وَهُوَ وَاقِفٌ عَلَى رَاحِلَتِهِ : هَاتِ ، الْقُطْ لِي فَلَقَطْتُ لَهُ حَصَيَاتٍ هُنَّ حَصَى الْخَذْفِ ، فَوَضَعْتُهُنَّ فِي يَدِهِ ، وَجَعَلَ يَقُولُ بِهِنَّ فِي يَدِهِ وَوَصَفَ يَحْيَى تَحْرِيكَهُنَّ فِي يَدِهِ بِأَمْثَالِ هَؤُلَاءِ.

3059. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ Aqabə gününün sonrakı günü miniyinin üzərində mənə dedi: "Gəl, mənim üçün daş yığ!" Mən sapand daşı böyüklüyündə daşları onun əlinə qoyduqda əlindəkilərdən birini göstərərək: (Ravi Yəhya bunu dedikdə əlini hərəkət etdirərək) "Bunun kimilərini yığ!" dedi".

٢٢٠- بَابُ : الرُّكُوبِ إِلَى الْجِمَارِ وَاسْتِظْلاَلِ الْمُحْرِمِ

## 220-ci fəsil: Sütunlara minik üstündə getmək və ehramlı adamın kölgələnməsi

٣٠٦٠- أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ أَبِي عَبْدِ الرَّحِيمِ ، عَنْ زَيْدِ بْنِ أَبِي أُنَيْسَةَ ، عَنْ يَحْيَى بْنِ الْحُصَيْنِ ، عَنْ جَدَّتِهِ أُمِّ حُصَيْنٍ ، قَالَتْ : حَجَجْتُ فِي حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَرَأَيْتُ بِلاَلاً يَقُودُ بِخِطَامِ رَاحِلَتِهِ ، وَأُسَامَةُ بْنُ زَيْدٍ رَافِعٌ عَلَيْهِ ثَوْبَهُ يُظِلُّهُ مِنَ الْحَرِّ وَهُوَ مُحْرِمٌ حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ ، ثُمَّ خَطَبَ النَّاسَ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، وَذَكَرَ قَوْلاً كَثِيرًا.

3060. ...Rəvayət edilir ki, Ummu Husayn ﵂ demişdir: "Mən Peyğəmbər ﷺ ilə birlikdə həcdə idim və Bilalın onun dəvəsinin yüyənindən tutaraq getdiyini gördüm. Usamə ibn Zeyd isə ehramlı olmasına baxmayaraq istinin təsirindən Peyğəmbəri ﷺ qorumaq üçün paltarı ilə onu kölgələndirirdi. Peyğəmbər ﷺ bu vəziyyətdə böyük sütunu daşladıqdan sonra insanlara xütbə verdi, Allaha həmd-səna etdi və bir çox şeylər danışdı".

٣٠٦١- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا أَيْمَنُ بْنُ نَابِلٍ ، عَنْ قُدَامَةَ بْنِ عَبْدِ اللهِ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَرْمِي جَمْرَةَ الْعَقَبَةِ يَوْمَ النَّحْرِ عَلَى نَاقَةٍ لَهُ صَهْبَاءَ ، لاَ ضَرْبَ ، وَلاَ طَرْدَ ، وَلاَ إِلَيْكَ إِلَيْكَ.

3061. ...Rəvayət edilir ki, Qudamə ibn Abdullah ﵁ demişdir: "Mən Allah Elçisini ﷺ Qurban bayramı günü qırmızımtıl dəvənin üstündə böyük sütunu daşlayarkən gördüm. Daşları nə bərk, nə də yavaş atır, nə çox uzaqda, nə də sütunların yaxınlığında idi".

٣٠٦٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَرْمِي الْجَمْرَةَ وَهُوَ عَلَى بَعِيرِهِ ، وَهُوَ يَقُولُ : يَا أَيُّهَا النَّاسُ ، خُذُوا مَنَاسِكَكُمْ ، فَإِنِّي لاَ أَدْرِي لَعَلِّي لاَ أَحُجُّ بَعْدَ عَامِي هَذَا.

3062. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: "Mən Allah Elçisini ﷺ dəvəsinin üstündə sütunları daşlayarkən gördüm. Belə deyirdi:

“Ey insanlar, həcc ərkanlarını məndən götürün! Bilmirəm, ola bilər ki, mən bu ildən sonra daha həcc edə bilməyim”.

٢٢١- بَابُ : وَقْتِ رَمْيِ جَمْرَةِ الْعَقَبَةِ يَوْمَ النَّحْرِ

221-ci fəsil: Qurban bayramı günü böyük sütuna daş atmağın vaxtı

٣٠٦٣- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ بْنِ إِبْرَاهِيمَ الثَّقَفِيُّ الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : رَمَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْجَمْرَةَ يَوْمَ النَّحْرِ ، ضُحًى وَرَمَى بَعْدَ يَوْمِ النَّحْرِ إِذَا زَالَتِ الشَّمْسُ.

3063. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Allah Elçisi ﷺ Qurban bayramı günü duha vaxtı, ondan sonrakı gün isə günörtadan sonra sütuna daş atdı”.

٢٢٢- بَابُ النَّهْيِ عَنْ رَمْيِ جَمْرَةِ الْعَقَبَةِ قَبْلَ طُلُوعِ الشَّمْسِ

222-ci fəsil: Günəş çıxmamışdan qabaq böyük sütunu daşlamağın qadağan olması

٣٠٦٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سُفْيَانَ الثَّوْرِيِّ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنِ الْحَسَنِ الْعُرَنِيِّ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : بَعَثَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُغَيْلِمَةَ بَنِي عَبْدِ الْمُطَّلِبِ عَلَى حُمُرَاتٍ يَلْطَحُ أَفْخَاذَنَا ، وَيَقُولُ : أُبَيْنِيَّ ، لاَ تَرْمُوا جَمْرَةَ الْعَقَبَةِ حَتَّى تَطْلُعَ الشَّمْسُ.

3064. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ bizi - Abdul-Muttalib oğullarının kiçik uşaqlarını qırmızı dəvələrin üstündə tezdən Minaya göndərdikdə budlarımız dəvənin yüyəninə toxunurdu. O buyurdu: “Övladlarım! Böyük sütunu günəş çıxmadan daşlamayın!”

٣٠٦٥- أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ حَبِيبٍ ، عَنْ عَطَاءٍ ، عَنِ ابْنِ عَبَّاسٍ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدَّمَ أَهْلَهُ ، وَأَمَرَهُمْ أَنْ لاَ يَرْمُوا الْجَمْرَةَ حَتَّى تَطْلُعَ الشَّمْسُ.

3065. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ailə üzvlərini göndərərkən onlara günəş çıxmayana qədər sütunu daşlamamağı əmr etdi.

٢٢٣- بَابُ : الرُّخْصَةِ فِي ذَلِكَ لِلنِّسَاءِ

223-cü fəsil: Günəş çıxmamışdan qabaq qadınlara böyük sütunu daşlamaq üçün rüsxət verilməsi

٣٠٦٦- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ عَبْدِ الرَّحْمَنِ الطَّائِفِيُّ ، عَنْ

عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، قَالَ : حَدَّثَتْنِي عَائِشَةُ بِنْتُ طَلْحَةَ ، عَنْ خَالَتِهَا عَائِشَةَ ، أُمِّ الْمُؤْمِنِينَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ إِحْدَى نِسَائِهِ أَنْ تَنْفِرَ مِنْ جَمْعٍ لَيْلَةَ جَمْعٍ ، فَتَأْتِيَ جَمْرَةَ الْعَقَبَةِ فَتَرْمِيَهَا ، وَتُصْبِحَ فِي مَنْزِلِهَا وَكَانَ عَطَاءٌ ، يَفْعَلُهُ حَتَّى مَاتَ.

3066. ...Möminlərin anası Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ zövcələrindən birinə gecə böyük sütunun yanına gələrək elə gecə vaxtı onu daşlamağı və orada qalmağını əmr etdi... Əta da ölənə qədər belə etdi.[1]

٢٢٤- بَابُ : الرَّمْيِ بَعْدَ الْمَسَاءِ

## 224-cü fəsil: Axşamdan sonra sütunu daşlamaq

٣٠٦٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُسْأَلُ أَيَّامَ مِنًى ، فَيَقُولُ : لاَ حَرَجَ فَسَأَلَهُ رَجُلٌ ، فَقَالَ : حَلَقْتُ قَبْلَ أَنْ أَذْبَحَ ؟ قَالَ : لاَ حَرَجَ ، فَقَالَ رَجُلٌ : رَمَيْتُ بَعْدَ مَا أَمْسَيْتُ ؟ قَالَ : لاَ حَرَجَ.

3067. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ Mina günləri haqda soruşulanda: "Zərəri yoxdur" deyərdi. Bir kişi dedi: "Qurban kəsmədən saçımı qırxdırdım". Allah Elçisi ﷺ ona dedi: "Zərəri yoxdur". Digəri dedi: "Axşamdan sonra sütunu daşladım". Ona da: "Zərəri yoxdur"- dedi.

٢٢٥- بَابُ : رَمْيِ الرُّعَاةِ

## 225-ci fəsil: Çobanların sütunları daşlaması

٣٠٦٨- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي الْبَدَّاحِ بْنِ عَدِيٍّ ، عَنْ أَبِيهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَخَّصَ لِلرُّعَاةِ أَنْ يَرْمُوا يَوْمًا وَيَدَعُوا يَوْمًا.

3068. ...Əbul-Bəddəh ibn Adiy atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ çobanların sütunu bir gün daşlayıb bir gün daşlamamalarına izin verdi.

٣٠٦٩- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ أَبِي بَكْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي الْبَدَّاحِ بْنِ عَاصِمِ بْنِ عَدِيٍّ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَخَّصَ لِلرُّعَاةِ فِي الْبَيْتُوتَةِ يَرْمُونَ يَوْمَ النَّحْرِ ، وَالْيَوْمَيْنِ اللَّذَيْنِ بَعْدَهُ يَجْمَعُونَهُمَا فِي أَحَدِهِمَا.

3069. ...Əbul-Bəddəh ibn Asim ibn Adiy atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ çobanların sütunu gecə vaxtı daşlamasına izin verdi. İlk gün belə

---

[1] Hədisin isnadı zəifdir.

daşladıqdan sonra, qalan iki günü də bir gündə birləşdirib daşlaya bilərlər.

٢٢٦- بَابُ : الْمَكَانِ الَّذِي تُرْمَى مِنْهُ جَمْرَةُ الْعَقَبَةِ

## 226-cı fəsil: Böyük sütuna daş atmağın yeri

٣٠٧٠- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي مُحَيَّاةَ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، يَعْنِي ابْنَ يَزِيدَ ، قَالَ : قِيلَ لِعَبْدِ اللهِ بْنِ مَسْعُودٍ : إِنَّ نَاسًا يَرْمُونَ الْجَمْرَةَ مِنْ فَوْقِ الْعَقَبَةِ ، قَالَ : فَرَمَى عَبْدُ اللهِ مِنْ بَطْنِ الْوَادِي ثُمَّ قَالَ : مِنْ هَا هُنَا ، وَالَّذِي لاَ إِلَهَ غَيْرُهُ رَمَى الَّذِي أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ.

3070. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yəzid ﵁ demişdir: “Bir dəfə Abdullah ibn Məsuda deyildi: “İnsanlar böyük sütunu üst tərəfdən daşlayır”. Abdullah Bətnil-Vadinin ortasından sütunu daşlamağa başladı. Sonra dedi: “Özündən başqa ibadətə layiq haqq məbud olmayan Allaha and olsun ki, özünə əl-Bəqərə surəsi nazil olan şəxs daşı buradan atmışdır”.

٣٠٧١- أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ الزَّعْفَرَانِيُّ ، وَمَالِكُ بْنُ الْخَلِيلِ ، قَالاَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، وَمَنْصُورٌ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، قَالَ : رَمَى عَبْدُ اللهِ ، الْجَمْرَةَ بِسَبْعِ حَصَيَاتٍ ، جَعَلَ الْبَيْتَ عَنْ يَسَارِهِ ، وَعَرَفَةَ عَنْ يَمِينِهِ وَقَالَ : هَا هُنَا مَقَامِ الَّذِي أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَا أَعْلَمُ أَحَدًا قَالَ فِي هَذَا الْحَدِيثِ مَنْصُورٌ غَيْرَ ابْنِ أَبِي عَدِيٍّ ، وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

3071. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yəzid ﵁ demişdir: “Abdullah Kəbəni sol tərəfdə, Arafanı isə sağ tərəfdə qoyaraq sütuna yeddi daş atdı və belə dedi: “əl-Bəqərə” surəsi özünə nazil olan şəxsin daş atdığı yer buradır”.

٣٠٧٢- أَخْبَرَنَا مُجَاهِدُ بْنُ مُوسَى ، عَنْ هُشَيْمٍ ، عَنْ مُغِيرَةَ ، عَنْ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ يَزِيدَ ، قَالَ : رَأَيْتُ ابْنَ مَسْعُودٍ ، رَمَى جَمْرَةَ الْعَقَبَةِ مِنْ بَطْنِ الْوَادِي ، ثُمَّ قَالَ : هَا هُنَا ، وَالَّذِي لاَ إِلَهَ غَيْرُهُ مَقَامُ الَّذِي أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ.

3072. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yəzid ﵁ demişdir: “Mən İbn Məsudun böyük sütunu Bətnil-Vadinin ortasından daşladığını gördüm. Sonra belə dedi: “Özündən başqa ibadətə layiq haqq məbud olmayan Allaha and olsun ki, “əl-Bəqərə” surəsi özünə nazil olan şəxs daşı buradan atmışdır”.

٣٠٧٣- أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ أَبِي زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ - سَمِعْتُ الْحَجَّاجَ يَقُولُ : لاَ تَقُولُوا : سُورَةَ الْبَقَرَةِ ، قُولُوا : السُّورَةَ الَّتِي يُذْكَرُ فِيهَا الْبَقَرَةُ - فَذَكَرْتُ ذَلِكَ لإِبْرَاهِيمَ ، فَقَالَ : أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ يَزِيدَ ، أَنَّهُ كَانَ مَعَ عَبْدِ اللهِ ، حِينَ رَمَى جَمْرَةَ الْعَقَبَةِ ، فَاسْتَبْطَنَ الْوَادِيَ ، وَاسْتَعْرَضَهَا - يَعْنِي الْجَمْرَةَ - فَرَمَاهَا بِسَبْعِ حَصَيَاتٍ ، وَكَبَّرَ مَعَ كُلِّ حَصَاةٍ ، فَقُلْتُ : إِنَّ أُنَاسًا يَصْعَدُونَ الْجَبَلَ ، فَقَالَ : هَا هُنَا ، وَالَّذِي لاَ إِلَهَ غَيْرُهُ رَأَيْتُ الَّذِي أُنْزِلَتْ عَلَيْهِ سُورَةُ الْبَقَرَةِ رَمَى.

3073. ...Rəvayət edilir ki, Aməş ﷺ demişdir: “Həccac belə dedi: “əl-Bəqərə” surəsinə “inək surəsi” deməyin! Bu surəyə “içində inəkdən bəhs edilən surə” deyin”. Mən bu sözü İbrahimə dedim, o da belə buyurdu: “Abdur-Rahmən ibn Yəzid mənə xəbər verdi ki, Abdullah ibn Məsud böyük sütunu daşladığı vaxt o da orada imiş. Abdullah Bətnil-Vadinin ortasında sütuna yönələrək yeddi daş atmış və hər dəfə daş atanda təkbir etmişdi. Mən də: “Camaat dağa dırmaşıb oradan daş atır” dedikdə o demişdir: “Özündən başqa ibadətə layiq haqq məbud olmayan Allaha and olsun ki, “əl-Bəqərə” surəsi özünə nazil olan şəxs daşları buradan atmış-dır”.

٣٠٧٤- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عَبْدِ الرَّحِيمِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عُمَرَ - وَذَكَرَ آخَرُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَمَى الْجَمْرَةَ بِمِثْلِ حَصَى الْخَذْفِ.

3074. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ sütunlara sapand daşı boyda daş atdı.

٣٠٧٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَرْمِي الْجِمَارَ بِمِثْلِ حَصَى الْخَذْفِ.

3075. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ sütun-ları sapand daşı boyda daşlarla daşladığını gördüm”.

## ٢٢٧- بَابُ : عَدَدِ الْحَصَى الَّتِي يَرْمِي بِهَا الْجِمَارَ

## 227-ci fəsil: Sütunlara atılan daşların sayı

٣٠٧٦- أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدِ بْنِ عَلِيِّ بْنِ حُسَيْنٍ ، عَنْ أَبِيهِ ، قَالَ : دَخَلْنَا عَلَى جَابِرِ بْنِ عَبْدِ اللهِ ، فَقُلْتُ : أَخْبِرْنِي عَنْ حَجَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، رَمَى الْجَمْرَةَ الَّتِي عِنْدَ الشَّجَرَةِ بِسَبْعِ حَصَيَاتٍ ، يُكَبِّرُ مَعَ كُلِّ حَصَاةٍ مِنْهَا - حَصَى الْخَذْفِ ، رَمَى مِنْ بَطْنِ الْوَادِي ، ثُمَّ انْصَرَفَ إِلَى الْمَنْحَرِ فَنَحَرَ.

3076. ...Cəfər ibn Muhəmməd ibn Əli ibn Hüseyn atasının ﵀ belə dediyini rəvayət etmişdir: “Biz Cabir ibn Abdullahın yanına gəldik. Mən dedim: “Mənə Peyğəmbərin ﷺ həcci haqda xəbər ver”. O dedi: “Allah Elçisi ﷺ ağacın altından sütuna yeddi daş atdı və hər dəfə daş atanda təkbir edirdi. Bu daşları Bətnil-Vadinin ortasından atırdı. Sonra qurban kəsilmə yerinə gedərək qurbanını kəsdi”.

٣٠٧٧- أَخْبَرَنِي يَحْيَى بْنُ مُوسَى الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ بْنُ عُيَيْنَةَ ، عَنْ ابْنِ أَبِي نَجِيحٍ ، قَالَ : قَالَ مُجَاهِدٌ : قَالَ سَعْدٌ : رَجَعْنَا فِي الْحَجَّةِ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَبَعْضُنَا يَقُولُ : رَمَيْتُ بِسَبْعِ حَصَيَاتٍ ، وَبَعْضُنَا يَقُولُ : رَمَيْتُ بِسِتٍّ ، فَلَمْ يَعِبْ بَعْضُهُمْ عَلَى بَعْضٍ.

3077. ...Rəvayət edilir ki, Səd ﵁ demişdir: “Biz Peyğəmbər ﷺ ilə birlikdə həcdən qayıtdıq. Bəzilərimiz: “Mən yeddi daş atdım”, bəzilərimiz də: “Mən altı daş atdım” deyir və heç kəs bir-birini məzəmmət etmirdi”.

٣٠٧٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ أَبَا مِجْلَزٍ ، يَقُولُ : سَأَلْتُ ابْنَ عَبَّاسٍ ، عَنْ شَيْءٍ مِنْ أَمْرِ الْجِمَارِ ؟ فَقَالَ : مَا أَدْرِي رَمَاهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِسِتٍّ ، أَوْ بِسَبْعٍ.

3078. ...Rəvayət edilir ki, Əbu Micləz ﵀ demişdir: “Mən İbn Abbasa sütunlarla əlaqəli sual verdim. O da: “Mən Allah Elçisinin ﷺ altı, yoxsa yeddi daş atdığını bilmirəm”- dedi”.

### ٢٢٨- بَابُ : التَّكْبِيرِ مَعَ كُلِّ حَصَاةٍ

### 228-ci fəsil: Hər dəfə daş atanda təkbir etmək

٣٠٧٩- أَخْبَرَنِي هَارُونُ بْنُ إِسْحَاقَ الْهَمْدَانِيُّ الْكُوفِيُّ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَلِيِّ بْنِ الْحُسَيْنِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنْ أَخِيهِ الْفَضْلِ بْنِ عَبَّاسٍ ، قَالَ : كُنْتُ رِدْفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمْ يَزَلْ يُلَبِّي حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ ، فَرَمَاهَا بِسَبْعِ حَصَيَاتٍ ، يُكَبِّرُ مَعَ كُلِّ حَصَاةٍ.

3079. ...Rəvayət edilir ki, İbn Abbasın qardaşı əl-Fədl ibn Abbas ﵄ demişdir: “Bir dəfə mən Peyğəmbərin ﷺ miniyinin tərkində idim və o, böyük sütunu daşlamağa başlayana qədər təlbiyə etməyi tərk etmədi. O, yeddi daş atdı və hər dəfə taş atanda təkbir edirdi”.

٢٢٩- بَابُ : قَطْعِ الْمُحْرِمِ التَّلْبِيَةِ إِذَا رَمَى جَمْرَةَ الْعَقَبَةِ

229-cu fəsil: Sütun daşlanmağa başlananda təlbiyə etməyin dayandırılması

٣٠٨٠- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ خُصَيْفٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : قَالَ الْفَضْلُ بْنُ عَبَّاسٍ : كُنْتُ رِدْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَمَا زِلْتُ أَسْمَعُهُ يُلَبِّي حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ ، فَلَمَّا رَمَى قَطَعَ التَّلْبِيَةَ.

3080. ...Rəvayət edilir ki, əl-Fədl ibn Abbas ﷺ demişdir: "Bir dəfə mən Allah Elçisinin ﷺ miniyinin tərkində idim və o, böyük sütunu daşlamağa başlayana qədər təlbiyə etməyini eşitdim. Sütunları daşlamağa başladıqda isə təlbiyə etməyi dayandırdı".

٣٠٨١- أَخْبَرَنَا هِلاَلُ بْنُ الْعَلاَءِ بْنِ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، قَالَ : حَدَّثَنَا أَبُو خَيْثَمَةَ ، قَالَ : حَدَّثَنَا خُصَيْفٌ ، عَنْ مُجَاهِدٍ ، وَعَامِرٌ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ الْفَضْلَ ، أَخْبَرَهُ أَنَّهُ كَانَ رَدِيفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَنَّهُ لَمْ يَزَلْ يُلَبِّي حَتَّى رَمَى الْجَمْرَةَ.

3081. ...Rəvayət edilir ki, əl-Fədl ﷺ Allah Elçisinin ﷺ miniyinin tərkində idi. Allah Elçisi ﷺ sütunu daşlamağa başlayana qədər təlbiyə etməyə davam etdi.

٣٠٨٢- أَخْبَرَنَا أَبُو عَاصِمٍ خُشَيْشُ بْنُ أَصْرَمَ ، عَنْ عَلِيِّ بْنِ مَعْبَدٍ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ أَعْيَنَ ، عَنْ عَبْدِ الْكَرِيمِ الْجَزَرِيِّ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنِ الْفَضْلِ بْنِ الْعَبَّاسِ ، أَنَّهُ كَانَ رَدِيفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمْ يَزَلْ يُلَبِّي حَتَّى رَمَى جَمْرَةَ الْعَقَبَةِ.

3082. ...Rəvayət edilir ki, əl-Fədl ibn Abbas ﷺ Allah Elçisinin ﷺ miniyinin tərkində idi. Allah Elçisi ﷺ sütunu daşlamağa başlayana qədər təlbiyə etməyə davam etdi.

٢٣٠- بَابُ : الدُّعَاءِ بَعْدَ رَمْيِ الْجِمَارِ

230-cu fəsil: Sütunlara daş atdıqdan sonra dua etmək

٣٠٨٣- أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ الْعَنْبَرِيُّ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ عُمَرَ ، قَالَ : أَنْبَأَنَا يُونُسُ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : بَلَغَنَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا رَمَى الْجَمْرَةَ الَّتِي تَلِي الْمَنْحَرَ - مَنْحَرَ مِنًى - رَمَاهَا بِسَبْعِ حَصَيَاتٍ يُكَبِّرُ كُلَّمَا رَمَى بِحَصَاةٍ ، ثُمَّ تَقَدَّمَ أَمَامَهَا ، فَوَقَفَ مُسْتَقْبِلَ الْقِبْلَةِ رَافِعًا يَدَيْهِ ، يَدْعُو يُطِيلُ الْوُقُوفَ ، ثُمَّ يَأْتِي الْجَمْرَةَ الثَّانِيَةَ فَيَرْمِيهَا بِسَبْعِ حَصَيَاتٍ ، يُكَبِّرُ كُلَّمَا رَمَى بِحَصَاةٍ ، ثُمَّ يَنْحَدِرُ ذَاتَ الشِّمَالِ ، فَيَقِفُ مُسْتَقْبِلَ الْبَيْتِ ، رَافِعًا يَدَيْهِ يَدْعُو ، ثُمَّ يَأْتِي الْجَمْرَةَ الَّتِي عِنْدَ الْعَقَبَةِ ، فَيَرْمِيهَا بِسَبْعِ حَصَيَاتٍ ، وَلاَ يَقِفُ عِنْدَهَا قَالَ الزُّهْرِيُّ : سَمِعْتُ سَالِمًا ، يُحَدِّثُ بِهَذَا ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَكَانَ ابْنُ عُمَرَ يَفْعَلُهُ.

3083. ...Rəvayət edilir ki, əz-Zuhri ﵀ demişdir: “Bizə gəlib çatdığına görə Allah Elçisi ﷺ Minada qurban kəsilən yerin yanındakı sütunu daşladıqda yeddi daşdan istifadə etmiş və hər dəfə də daş atanda təkbir etmişdi. Sonra sütunun qarşısına keçib qibləyə yönəldi və əllərini qaldıraraq uzun müddət dua etdi. Sonra ikinci sütunun yanına gələrək yeddi daş atdı və hər daşı atanda təkbir etdi. Sonra sol tərəfdə aşağı enib qibləyə yönələrək əllərini qaldırdı və dua etdi. Sonra böyük sütuna tərəf getdi və ona yeddi daş atdı, lakin orada dayanmadı”. əz-Zuhri deyir: “Səlimdən bu şəkildə eşitmişəm. O, atası İbn Ömərdən, o da Allah Elçisinin ﷺ belə etdiyini görmüşdür. İbn Ömər özü də eynilə belə edərdi”.

٢٣١- بَابُ : مَا يَحِلُّ لِلْمُحْرِمِ بَعْدَ رَمْيِ الْجِمَارِ

231-ci fəsil: Sütunları daşladıqdan sonra ehramlı olana nə halal olur?

٣٠٨٤- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنِ الْحَسَنِ الْعُرَنِيِّ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : إِذَا رَمَى الْجَمْرَةَ فَقَدْ حَلَّ لَهُ كُلُّ شَيْءٍ ، إِلاَّ النِّسَاءَ ، قِيلَ : وَالطِّيبُ ؟ قَالَ : أَمَّا أَنَا ، فَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَتَضَمَّخُ بِالْمِسْكِ ، أَفَطِيبٌ هُوَ.

3084. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Sütunlar daşlandıqdan sonra qadınlarla cinsi yaxınlıqdan başqa hər şey halal olur”. Bu vaxt İbn Abbasdan: “Gözəl ətir də halaldır?” deyə soruşuldu. İbn Abbas dedi: “Mən Allah Elçisinin ﷺ müşk ətirindən istifadə etdiyini görmüşəm. O, ətir sayılmırmı?”

# ٢٥– كِتَابُ الْجِهَادِ
# 25. Cihad kitabı

## ١– بَابُ : وُجُوبِ الْجِهَادِ
## 1-ci fəsil: Cihadın vacibliyi

٣٠٨٥– أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ الأَزْرَقُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُسْلِمٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : لَمَّا أُخْرِجَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ مَكَّةَ قَالَ أَبُو بَكْرٍ : أَخْرَجُوا نَبِيَّهُمْ ، إِنَّا لِلَّهِ ، وَإِنَّا إِلَيْهِ رَاجِعُونَ ، لَيَهْلِكُنَّ ، فَنَزَلَتْ : **{أُذِنَ لِلَّذِينَ يُقَاتَلُونَ بِأَنَّهُمْ ظُلِمُوا وَإِنَّ اللَّهَ عَلَى نَصْرِهِمْ لَقَدِيرٌ}** فَعَرَفْتُ أَنَّهُ سَيَكُونُ قِتَالٌ قَالَ ابْنُ عَبَّاسٍ : فَهِيَ أَوَّلُ آيَةٍ نَزَلَتْ فِي الْقِتَالِ.

3085. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ Məkkədən çıxarıldıqda Əbu Bəkr: "Onlar öz Peyğəmbərlərini ﷺ çıxartdılar. Biz Allaha məxsusuq və Ona da qayıdacağıq, onlar isə mütləq həlak olacaqlar" dedi və bu ayə nazil oldu: **"Kafirlərin döyüşə başladığı insanlara, o kafirlərlə döyüşməyə icazə verilmişdir. Çünki onlar zülmə məruz qalmışlar. Şübhəsiz ki, Allah onlara kömək etməyə qadirdir".** (əl-Həcc, 39). Əbu Bəkr deyir: "Bu ayə nazil olduqda gələcəkdə döyüş olacağını başa düşdüm". İbn Abbas deyir: "Döyüş haqda ilk nazil olan ayə budur".

٣٠٨٦– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ : أَنبَأَنَا أَبِي ، قَالَ : أَنْبَأَنَا الْحُسَيْنُ بْنُ وَاقِدٍ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عِكْرِمَةَ ، عَنِ ابْنِ عَبَّاسٍ : أَنَّ عَبْدَ الرَّحْمَنِ بْنَ عَوْفٍ ، وَأَصْحَابًا لَهُ أَتَوْا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمَكَّةَ فَقَالُوا : يَا رَسُولَ اللهِ ، إِنَّا كُنَّا فِي عِزٍّ وَنَحْنُ مُشْرِكُونَ ، فَلَمَّا آمَنَّا صِرْنَا أَذِلَّةً ، فَقَالَ : إِنِّي أُمِرْتُ بِالْعَفْوِ ، فَلاَ تُقَاتِلُوا فَلَمَّا حَوَّلَنَا اللَّهُ إِلَى الْمَدِينَةِ ، أَمَرَنَا بِالْقِتَالِ ، فَكَفُّوا ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{أَلَمْ تَرَ إِلَى الَّذِينَ قِيلَ لَهُمْ كُفُّوا أَيْدِيَكُمْ وَأَقِيمُوا الصَّلاَةَ}**.

3086. ...İbn Abbas ﷺ rəvayət edir ki, Abdur-Rahmən ibn Auf və onun yoldaşları Məkkəyə - Peyğəmbərin ﷺ yanına gəlib dedilər: "Ey Allahın Elçisi! Müşrik olduğumuz zaman hörmət, izzət içində idik. İman gətirdikdən sonra isə zəlil və hörmətsiz olduq". Peyğəmbər ﷺ buyurdu: "Artıq (onları) əfv etmək mənə əmr olundu, elə isə müharibədən əl çəkin!" Mədinəyə hicrət etdikdən sonra müharibə etmək bizə əmr olundu, müharibədən yayındıqda isə Allah ﷻ bu ayəni nazil etdi: **"Məgər sən, özlərinə: "Müharibədən əl çəkin, namaz qılın və zəkat verin!"– deyilən kəsləri görmədinmi?..."** (ən-Nisa, 77)".

٣٠٨٧- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، قَالَ : سَمِعْتُ مَعْمَرًا ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : قُلْتُ : عَنْ سَعِيدٍ ، قَالَ : نَعَمْ ، عَنْ أَبِي هُرَيْرَةَ (ح) وَأَنْبَأَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، - ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، وَاللَّفْظُ لأَحْمَدَ - قَالاَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنِ ابْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بُعِثْتُ بِجَوَامِعِ الْكَلِمِ ، وَنُصِرْتُ بِالرُّعْبِ ، وَبَيْنَا أَنَا نَائِمٌ أُتِيتُ بِمَفَاتِيحِ خَزَائِنِ الأَرْضِ ، فَوُضِعَتْ فِي يَدِي قَالَ أَبُو هُرَيْرَةَ : فَذَهَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَنْتُمْ تَنْتَثِلُونَهَا

3087. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Mən "cəvamiul-kəlim"[1] ilə göndərildim, düşmənlərin qəlblərinə qorxu salınmaqla yardım olundum, yatdığım vəziyyətdə yer üzünün açarları gətirilərək mənə verildi". Əbu Hureyra deyir: "Allah Elçisi ﷺ getdi, siz isə hələ dünya malı yığmaqla məşğulsunuz".[2]

٣٠٨٨- أَخْبَرَنَا هَارُونُ بْنُ سَعِيدٍ ، عَنْ خَالِدِ بْنِ نِزَارٍ ، قَالَ : أَخْبَرَنِي الْقَاسِمُ بْنُ مَبْرُورٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، نَحْوَهُ.

3088. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim..."

٣٠٨٩- أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، وَأَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : بُعِثْتُ بِجَوَامِعِ الْكَلِمِ ، وَنُصِرْتُ بِالرُّعْبِ ، وَبَيْنَا أَنَا نَائِمٌ أُتِيتُ بِمَفَاتِيحِ خَزَائِنِ الأَرْضِ ، فَوُضِعَتْ فِي يَدِي فَقَالَ أَبُو هُرَيْرَةَ : فَقَدْ ذَهَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَنْتُمْ تَنْتَثِلُونَهَا.

3089. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Mən "cəvamiul-kəlim" ilə göndərildim, düşmənlərin qəlblərinə qorxu salınmaqla yardım olundum, yatdığım vəziyyətdə yer üzünün açarları gətirilərək əllərimə verildi". Əbu Hureyra deyir: "Allah Elçisi ﷺ getdi, siz isə hələ dünya malı yığmaqla məşğulsunuz".

٣٠٩٠- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَمَنْ قَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، عَصَمَ مِنِّي مَالَهُ وَنَفْسَهُ ، إِلاَّ بِحَقِّهِ وَحِسَابُهُ عَلَى اللَّهِ.

---

[1] Cəvamiul-kəlim – az kəlmələrlə çoxlu məna ifadə edən danışıq tərzinə deyilir.
[2] Yəni dünyanın xəzinələri Allah Elçisinin ﷺ ixtiyarına verilmişdi, lakin bu dünya ona da qalmadı, amma siz fani dünya nemətləri toplamaqla məşğulsunuz.

3090. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mən insanlar "lə iləhə illəllah" deyənə qədər onlarla vuruşmaqla əmr olundum. Kim "lə iləhə illəllah" deyərsə, haqq istisna[1] məndən malını və canını qorumuş olar. Haqq-hesabı isə Allaha aiddir".

٣٠٩١- أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، عَنْ مُحَمَّدِ بْنِ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : لَمَّا تُوُفِّيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاسْتُخْلِفَ أَبُو بَكْرٍ ، وَكَفَرَ مَنْ كَفَرَ مِنَ الْعَرَبِ ، قَالَ عُمَرُ : يَا أَبَا بَكْرٍ ، كَيْفَ تُقَاتِلُ النَّاسَ ، وَقَدْ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَمَنْ قَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، عَصَمَ مِنِّي نَفْسَهُ وَمَالَهُ ، إِلاَّ بِحَقِّهِ ، وَحِسَابُهُ عَلَى اللهِ قَالَ أَبُو بَكْرٍ ، رَضِيَ اللَّهُ عَنْهُ : وَاللَّهِ لأُقَاتِلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَةِ وَالزَّكَاةِ ، فَإِنَّ الزَّكَاةَ حَقُّ الْمَالِ ، وَاللهِ لَوْ مَنَعُونِي عَنَاقًا كَانُوا يُؤَدُّونَهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعِهَا فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ رَأَيْتُ اللَّهَ عَزَّ وَجَلَّ قَدْ شَرَحَ صَدْرَ أَبِي بَكْرٍ ، لِلْقِتَالِ وَعَرَفْتُ أَنَّهُ الْحَقُّ.

3091. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ vəfat etdikdən sonra Əbu Bəkr xəlifə oldu. Ərəblərin bir qismi (zəkatı inkar edərək) kafir oldular. Ömər dedi: "Ey Əbu Bəkr, insanlara qarşı necə döyüşə bilərsən? Axı Allah Elçisi ﷺ belə deyib: "Mən "lə iləhə illəllah" deyənə qədər insanlarla döyüşməklə əmr olundum. Kim "lə iləhə illəllah" deyərsə, canını və malını məndən qorumuş olar, yalnız haqq istisna, hesabı isə Allaha aiddir". Əbu Bəkr dedi: "Allaha and olsun, namazla zəkatı bir-birindən ayıranlarla mütləq döyüşəcəyəm, çünki zəkat malın haqqıdır. Allaha and olsun, Allah Elçisinə ﷺ zəkat verdikləri bir dişi keçi balasını mənə verməzlərsə, buna görə onlarla döyüşərəm". Ömər dedi: "Allaha and olsun ki, mən başa düşdüm ki, onun bu qərarı Allahın ﷻ Əbu Bəkrin sinəsinə verdiyi bir genişliyə görədir. Beləliklə, Əbu Bəkrin haqq yolda olduğunu və döyüşün doğru olduğunu bildim".

٣٠٩٢- أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ مُغِيرَةَ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ سَعِيدٍ ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ (ح) وَأَنْبَأَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ بْنِ مَسْعُودٍ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : لَمَّا تُوُفِّيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَكَانَ أَبُو بَكْرٍ بَعْدَهُ ، وَكَفَرَ مَنْ كَفَرَ مِنَ الْعَرَبِ ، قَالَ عُمَرُ ، رَضِيَ اللَّهُ عَنْهُ : يَا أَبَا بَكْرٍ ، كَيْفَ تُقَاتِلُ النَّاسَ ، وَقَدْ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَمَنْ قَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَقَدْ عَصَمَ مِنِّي مَالَهُ وَنَفْسَهُ ، إِلاَّ بِحَقِّهِ ، وَحِسَابُهُ عَلَى اللهِ قَالَ أَبُو بَكْرٍ ، رَضِيَ اللَّهُ عَنْهُ : لأُقَاتِلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَةِ وَالزَّكَاةِ ، فَإِنَّ الزَّكَاةَ حَقُّ الْمَالِ ، وَاللهِ لَوْ مَنَعُونِي عَنَاقًا كَانُوا يُؤَدُّونَهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعِهَا قَالَ عُمَرُ : فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ رَأَيْتُ أَنَّ اللَّهَ عَزَّ وَجَلَّ شَرَحَ صَدْرَ أَبِي بَكْرٍ لِلْقِتَالِ ، فَعَرَفْتُ أَنَّهُ الْحَقُّ وَاللَّفْظُ لأَحْمَدَ.

---

[1] Yəni cəzaya layiq günahlar etsə, ona şəriətin tətbiq etdiyi hədd cəzası verilər.

3092. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ vəfat etdikdən sonra Əbu Bəkr onun yerinə keçdi. Ərəblərin bir qismi (zəkatı inkar edərək) kafir oldular. Ömər dedi: “Ey Əbu Bəkr, insanlara qarşı necə döyüşə bilərsən? Axı Allah Elçisi ﷺ belə deyib: “Mən “lə iləhə illəllah” deyənə qədər insanlarla döyüşməklə əmr olundum. Kim “lə iləhə illəllah” deyərsə, canını və malını məndən qorumuş olar, yalnız haqq istisna, hesabı isə Allaha aiddir”. Əbu Bəkr dedi: “Namazla zəkatı bir-birindən ayıranlarla mütləq döyüşəcəyəm, çünki zəkat malın haqqıdır. Allaha and olsun, Allah Elçisinə ﷺ zəkat verdikləri bir dişi keçi balasını mənə verməzlərsə, buna görə onlarla döyüşərəm”. Ömər dedi: “Allaha and olsun ki, mən başa düşdüm ki, onun bu qərarı Allahın ﷻ Əbu Bəkrin sinəsinə verdiyi bir genişliyə görədir. Beləliklə, Əbu Bəkrin haqq yolda olduğunu bildim”.

٣٠٩٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا مُؤَمَّلُ بْنُ الْفَضْلِ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، قَالَ : حَدَّثَنِي شُعَيْبُ بْنُ أَبِي حَمْزَةَ ، وَسُفْيَانُ بْنُ عُيَيْنَةَ ، وَذَكَرَ آخَرَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : لَمَّا جَمَعَ أَبُو بَكْرٍ لِقِتَالِهِمْ ، فَقَالَ عُمَرُ : يَا أَبَا بَكْرٍ ، كَيْفَ تُقَاتِلُ النَّاسَ ، وَقَدْ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَإِذَا قَالُوهَا ، عَصَمُوا مِنِّي دِمَاءَهُمْ وَأَمْوَالَهُمْ ، إِلاَّ بِحَقِّهَا قَالَ أَبُو بَكْرٍ ، رَضِيَ اللَّهُ عَنْهُ : لأُقَاتِلَنَّ مَنْ فَرَّقَ بَيْنَ الصَّلاَةِ وَالزَّكَاةِ ، وَاللَّهِ لَوْ مَنَعُونِي عَنَاقًا كَانُوا يُؤَدُّونَهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَاتَلْتُهُمْ عَلَى مَنْعِهَا قَالَ عُمَرُ ، رَضِيَ اللَّهُ عَنْهُ : فَوَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ رَأَيْتُ أَنَّ اللَّهَ تَعَالَى قَدْ شَرَحَ صَدْرَ أَبِي بَكْرٍ لِقِتَالِهِمْ ، فَعَرَفْتُ أَنَّهُ الْحَقُّ.

3093. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Əbu Bəkr mürtədlərlə döyüşmək üçün ordu topladıqda Ömər dedi: “Ey Əbu Bəkr, insanlara qarşı necə döyüşə bilərsən? Axı Allah Elçisi ﷺ belə deyib: “Mən “lə iləhə illəllah” deyənə qədər insanlarla döyüşməklə əmr olundum. Kim “lə iləhə illəllah” deyərsə, canını və malını məndən qorumuş olar, yalnız haqq istisna, hesabı isə Allaha aiddir”. Əbu Bəkr dedi: “Namazla zəkatı bir-birindən ayıranlarla mütləq döyüşəcəyəm, çünki zəkat malın haqqıdır. Allaha and olsun, Allah Elçisinə ﷺ zəkat verdikləri bir dişi keçi balasını mənə verməzlərsə, buna görə onlarla döyüşərəm”. Ömər dedi: “Allaha and olsun ki, mən başa düşdüm ki, onun bu qərarı Uca Allahın Əbu Bəkrin sinəsinə verdiyi bir genişliyə görədir. Beləliklə, Əbu Bəkrin haqq yolda olduğunu bildim”.

٣٠٩٤- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا عِمْرَانُ أَبُو الْعَوَّامِ الْقَطَّانُ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : لَمَّا تُوُفِّيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ارْتَدَّتْ الْعَرَبُ ، قَالَ عُمَرُ : يَا أَبَا بَكْرٍ ، كَيْفَ تُقَاتِلُ الْعَرَبَ ؟ فَقَالَ أَبُو بَكْرٍ ، رَضِيَ اللَّهُ عَنْهُ : إِنَّمَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَشْهَدُوا أَنْ لاَ إِلَهَ إِلاَّ

اللَّهُ ، وَأَنِّي رَسُولُ اللهِ ، وَيُقِيمُوا الصَّلاَةَ ، وَيُؤْتُوا الزَّكَاةَ وَاللهِ لَوْ مَنَعُونِي عَنَاقًا مِمَّا كَانُوا يُعْطُونَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَاتَلْتُهُمْ عَلَيْهِ قَالَ عُمَرُ ، رَضِيَ اللَّهُ عَنْهُ : فَلَمَّا رَأَيْتُ رَأْيَ أَبِي بَكْرٍ قَدْ شُرِحَ ، عَلِمْتُ أَنَّهُ الْحَقُّ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : عِمْرَانُ الْقَطَّانُ ، لَيْسَ بِالْقَوِيِّ فِي الْحَدِيثِ ، وَهَذَا الْحَدِيثُ خَطَأٌ ، وَالَّذِي قَبْلَهُ الصَّوَابُ ، حَدِيثُ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ.

3094. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Allah Elçisi ﷺ vəfat etdikdə ərəblərin bir qismi (zəkatı inkar edərək) mürtəd oldular. Ömər dedi: “Ey Əbu Bəkr, ərəblərlə necə döyüşə bilərsən?” Əbu Bəkr dedi: “Allah Elçisi ﷺ buyurmuşdur: “Mən insanlarla “Allahdan başqa ibadətə layiq haqq məbud olmadığına və mənim də Allahın elçisi olduğuma şahidlik edənə, namaz qılıb zəkat verənə qədər döyüşməklə əmr olundum”. Allaha and olsun, Allah Elçisinə ﷺ zəkat verdikləri bir dişi keçi balasını mənə verməzlərsə, buna görə onlarla döyüşərəm”. Ömər dedi: “Mən Əbu Bəkrin sinəsinin bu məsələdə genişləndiyini gördüm və bildim ki, o, haqdır”.

٣٠٩٥- أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ (ح) وأَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، أَخْبَرَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُمِرْتُ أَنْ أُقَاتِلَ النَّاسَ حَتَّى يَقُولُوا : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، فَمَنْ قَالَهَا فَقَدْ عَصَمَ مِنِّي نَفْسَهُ وَمَالَهُ ، إِلاَّ بِحَقِّهِ ، وَحِسَابُهُ عَلَى اللَّهِ.

3095. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Mən “lə iləhə illəllah” deyənə qədər insanlarla döyüşməklə əmr olundum. Kim “lə iləhə illəllah” deyərsə, canını və malını məndən qorumuş olar, yalnız haqq istisnadır. Hesabı isə Allaha aiddir”.

٣٠٩٦- أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، وَمُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالاَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : جَاهِدُوا الْمُشْرِكِينَ بِأَمْوَالِكُمْ وَأَيْدِيكُمْ وَأَلْسِنَتِكُمْ.

3096. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Müşriklərə qarşı mallarınızla, əllərinizlə və dillərinizlə mübarizə aparın”.

### ٢- التَّشْدِيدُ فِي تَرْكِ الْجِهَادِ

### 2-ci fəsil: Cihadı tərk etməyin şiddətli şəkildə pislənməsi

٣٠٩٧- أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ ، قَالَ : حَدَّثَنَا سَلَمَةُ بْنُ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا وُهَيْبٌ ، يَعْنِي ابْنَ

الْوَرْدِ ، قَالَ : أَخْبَرَنِي عُمَرُ بْنُ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ مَاتَ وَلَمْ يَغْزُ ، وَلَمْ يُحَدِّثْ نَفْسَهُ بِغَزْوٍ ، مَاتَ عَلَى شُعْبَةِ نِفَاقٍ.

3097. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim döyüşmədən və nəfsində döyüşmək niyyəti olmadan ölərsə, onda nifaqdan bir parça olar".

٣- الرُّخْصَةُ فِي التَّخَلُّفِ عَنِ السَّرِيَّةِ

## 3-cü fəsil: Allah yolunda döyüşə getməkdən geri qalmaq üçün rüsxət verilməsi

٣٠٩٨- أَخْبَرَنَا أَحْمَدُ بْنُ يَحْيَى بْنِ الْوَزِيرِ بْنِ سُلَيْمَانَ ، عَنِ ابْنِ عُفَيْرٍ ، عَنِ اللَّيْثِ ، عَنِ ابْنِ مُسَافِرٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، وَسَعِيدِ بْنِ الْمُسَيَّبِ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : وَالَّذِي نَفْسِي بِيَدِهِ ، لَوْلاَ أَنَّ رِجَالاً مِنَ الْمُؤْمِنِينَ لاَ تَطِيبُ أَنْفُسُهُمْ أَنْ يَتَخَلَّفُوا عَنِّي وَلاَ أَجِدُ مَا أَحْمِلُهُمْ عَلَيْهِ ، مَا تَخَلَّفْتُ عَنْ سَرِيَّةٍ تَغْزُو فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ ، وَالَّذِي نَفْسِي بِيَدِهِ ، لَوَدِدْتُ أَنِّي أُقْتَلُ فِي سَبِيلِ اللهِ ، ثُمَّ أُحْيَا ، ثُمَّ أُقْتَلُ ، ثُمَّ أُحْيَا ، ثُمَّ أُقْتَلُ ، ثُمَّ أُحْيَا ، ثُمَّ أُقْتَلُ.

3098. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Canım Əlində Olana and olsun, məndən ayrı qalmaq istəməyən möminlər olmasaydı və mən də onlara yük olacağını bilməsəydim, Allah ﷻ yolunda olan heç bir döyüşdən ayrı qalmazdım. Canım Əlində Olana and olsun, Allah yolunda öldürülməyi yenidən dirilməyi, yenidən öldürülməyi yenidən dirilməyi, yenidən öldürülməyi yenidən dirilməyi, sonra yenidən öldürülməyi istəyərdim".

٤- فَضْلُ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ

## 4-cü fəsil: Döyüşə qoşulanların evdə oturanlar üzərində üstünlüyü

٣٠٩٩- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، يَعْنِي ابْنَ الْمُفَضَّلِ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِسْحَاقَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ ، قَالَ : رَأَيْتُ مَرْوَانَ بْنَ الْحَكَمِ – جَالِسًا فَجِئْتُ حَتَّى جَلَسْتُ إِلَيْهِ ، فَحَدَّثَنَا أَنَّ زَيْدَ بْنَ ثَابِتٍ ، حَدَّثَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُنْزِلَ عَلَيْهِ **{لاَ يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ}** **{وَالْمُجَاهِدُونَ فِي سَبِيلِ اللَّهِ}** ، فَجَاءَ ابْنُ أُمِّ مَكْتُومٍ وَهُوَ يُمِلُّهَا عَلَيَّ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، لَوْ أَسْتَطِيعُ الْجِهَادَ لَجَاهَدْتُ فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ ، وَفَخِذُهُ عَلَى فَخِذِي ، فَثَقُلَتْ عَلَيَّ حَتَّى ظَنَنْتُ أَنْ سَتُرَضُّ فَخِذِي ، ثُمَّ سُرِّيَ عَنْهُ ، **{غَيْرُ أُولِي الضَّرَرِ}**. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : عَبْدُ الرَّحْمَنِ بْنُ إِسْحَاقَ هَذَا لَيْسَ بِهِ بَأْسٌ ، وَعَبْدُ الرَّحْمَنِ بْنُ إِسْحَاقَ يَرْوِي عَنْهُ عَلِيُّ بْنُ مُسْهِرٍ ، وَأَبُو مُعَاوِيَةَ ، وَعَبْدُ الْوَاحِدِ بْنُ زِيَادٍ ، عَنِ النُّعْمَانِ بْنِ سَعْدٍ لَيْسَ بِثِقَةٍ.

3099. ...Rəvayət edilir ki, Səhl ibn Səd ﷺ demişdir: "Mərvan ibn əl-Həkəmin bir yerdə oturduğunu gördüm, mən də gəlib onun yanında

oturdum. Mərvan bizə Zeyd ibn Sabitin belə dediyini danışdı: "Bir dəfə Allah Elçisinə ﷺ bu ayə: **"Möminlərdən** (evdə) **oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar..."** (ən-Nisa, 95) nazil olduqda ayəni mənə diktə edərkən gözləri görməyən İbn Ummu Məktum gəlib dedi: "Ey Allahın Elçisi! Əgər mən döyüşə bilsəydim, döyüşərdim". Bu vaxt Allah ﷻ ayə nazil etdi. Peyğəmbərin ﷺ dizi mənim dizimə toxunurdu və vəhyin gəlməsi ilə ayağıma elə bir ağırlıq düşdü ki, mən ayağımın xıncım-xıncım olacağından qorxdum. Sonra vəhy dayandı və ayənin **"...üzrlülər istisna olmaqla..."** hissəsinin nazil olduğu bəlli oldu".

٣١٠٠– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ صَالِحٍ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي سَهْلُ بْنُ سَعْدٍ ، قَالَ : رَأَيْتُ مَرْوَانَ – جَالِسًا فِي الْمَسْجِدِ ، فَأَقْبَلْتُ حَتَّى جَلَسْتُ إِلَى جَنْبِهِ ، فَأَخْبَرَنَا أَنَّ زَيْدَ بْنَ ثَابِتٍ ، أَخْبَرَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمْلَى عَلَيْهِ **{لاَ يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ} {وَالْمُجَاهِدُونَ فِي سَبِيلِ اللَّهِ}** قَالَ : فَجَاءَهُ ابْنُ أُمِّ مَكْتُومٍ وَهُوَ يُمِلُّهَا عَلَيَّ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، لَوْ أَسْتَطِيعُ الْجِهَادَ لَجَاهَدْتُ وَكَانَ رَجُلاً أَعْمَى ، فَأَنْزَلَ اللَّهُ عَلَى رَسُولِهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَفَخِذُهُ عَلَى فَخِذِي ، حَتَّى هَمَّتْ تَرُضُّ فَخِذِي ، ثُمَّ سُرِّيَ عَنْهُ فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : **{غَيْرُ أُولِي الضَّرَرِ}**.

3100. ...Rəvayət edilir ki, Səhl ibn Səd رضي الله عنه demişdir: "Mən Mərvanın məsciddə oturduğunu gördüm və gəlib onun yanında oturdum. Mərvan bizə Zeyd ibn Sabitin belə dediyini danışdı: "Bir dəfə Allah Elçisi ﷺ mənə bu ayəni: **"Möminlərdən** (evdə) **oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar..."** (ən-Nisa, 95) yazdırırdı. Bu vaxt İbn Ummu Məktum gəlib dedi: "Ey Allahın Elçisi! Əgər mən döyüşə bilsəydim, döyüşərdim". Onun gözləri görmürdü. Bu vaxt Allah Öz Elçisinə ﷺ ayə nazil etdi. Peyğəmbərin ﷺ dizi mənim dizimə toxunurdu və vəhyin gəlməsi ilə ayağıma elə bir ağırlıq düşdü ki, mən ayağımın əziləcəyindən qorxdum. Sonra onun bu halı düzəldi və Allah ﷻ bu ayənin **"...üzrlülər istisna olmaqla..."** hissəsini nazil etdi".

٣١٠١– أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ – ثُمَّ ذَكَرَ كَلِمَةً مَعْنَاهَا ، قَالَ : ائْتُونِي بِالْكَتِفِ وَاللَّوْحِ فَكَتَبَ **{لاَ يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ}** وَعَمْرُو بْنُ أُمِّ مَكْتُومٍ خَلْفَهُ ، فَقَالَ : هَلْ لِي رُخْصَةٌ ؟ فَنَزَلَتْ **{غَيْرُ أُولِي الضَّرَرِ}**.

3101. ...Bəra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "(Qoyunun) kürək sümüyünü və lövhəni gətirib bu ayəni yazın: **"Möminlərdən... evdə oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar"** (ən-Nisa, 95). Bu vaxt Amr ibn Ummu Məktum Peyğəmbərin ﷺ

arxa tərəfində idi və dedi: “Mənə üzr varmı?” Sonra ayənin bu hissəsi nazil oldu: **“üzrlü olanlar istisna olmaqla...”** (ən-Nisa, 95).

٣١٠٢– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكْرِ بْنُ عَيَّاشٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ ، قَالَ : لَمَّا نَزَلَتْ **{لاَ يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ}** جَاءَ ابْنُ أُمِّ مَكْتُومٍ وَكَانَ أَعْمَى فَقَالَ : يَا رَسُولَ اللهِ ، فَكَيْفَ فِيَّ وَأَنَا أَعْمَى ؟ قَالَ : فَمَا بَرِحَ ، حَتَّى نَزَلَتْ **{غَيْرُ أُولِي الضَّرَرِ}**.

3102. ...Rəvayət edilir ki, Bəra ﷺ demişdir: **“Möminlərdən... evdə oturanlarla Allah yolunda öz malları və canları ilə cihad edənlər eyni olmazlar”** (ən-Nisa, 95) ayəsi nazil olduqda gözləri görməyən İbn Ummu Məktum gəlib dedi: “Ey Allahın Elçisi, bu necə olur, axı mən koram?” Çox keçmədi ki, ayənin bu hissəsi nazil oldu: **“üzrlü olanlar istisna olmaqla...”** (ən-Nisa, 95).

٥– الرُّخْصَةُ فِي التَّخَلُّفِ لِمَنْ لَهُ وَالِدَانِ

5-ci fəsil: Valideynləri sağ olanın döyüşə qoşulmamasının icazəli olması

٣١٠٣– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ سُفْيَانَ ، وَشُعْبَةَ ، قَالاَ : حَدَّثَنَا حَبِيبُ بْنُ أَبِي ثَابِتٍ ، عَنْ أَبِي الْعَبَّاسِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَسْتَأْذِنُهُ فِي الْجِهَادِ فَقَالَ : أَحَيٌّ وَالِدَاكَ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَفِيهِمَا فَجَاهِدْ.

3103. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: “Bir kişi Allah Elçisinin ﷺ yanına gəlib cihadda iştirak etmək üçün izin istədi. Peyğəmbər dedi: “Sənin valideynlərin sağdırmı?” O: “Bəli” dedi. Peyğəmbər ﷺ buyurdu: “(Qayıt) onların yanında çalış!”

٦– الرُّخْصَةُ فِي التَّخَلُّفِ لِمَنْ لَهُ وَالِدَةٌ

6-cı fəsil: Anası sağ olanın döyüşə qoşulmamasının icazəli olması

٣١٠٤– أَخْبَرَنَا عَبْدُ الْوَهَّابِ بْنُ عَبْدِ الْحَكَمِ الْوَرَّاقُ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ طَلْحَةَ وَهُوَ ابْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ طَلْحَةَ ، عَنْ مُعَاوِيَةَ بْنِ جَاهِمَةَ السَّلَمِيِّ ، أَنَّ جَاهِمَةَ جَاءَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَرَدْتُ أَنْ أَغْزُوَ وَقَدْ جِئْتُ أَسْتَشِيرُكَ ، فَقَالَ : هَلْ لَكَ مِنْ أُمٍّ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَالْزَمْهَا ، فَإِنَّ الْجَنَّةَ تَحْتَ رِجْلَيْهَا.

3104. ...Rəvayət edilir ki, Müaviyə ibn Cəhimə əs-Sələmi ﷺ Peyğəmbərin ﷺ yanına gələrək dedi: “Ey Allahın Elçisi, döyüşə qoşulmaq istəyirəm, bunu səninlə məsləhətləşmək üçün gəlmişəm”. Peyğəmbər ﷺ dedi: “Sənin anan

sağdırmı?" O: "Bəli" dedi. Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, Cənnət onun ayaqları altındadır".

٧- فَضْلُ مَنْ يُجَاهِدُ فِي سَبِيلِ اللهِ بِنَفْسِهِ وَمَالِهِ

7-ci fəsil: Canı və malı ilə Allah yolunda cihad edənin fəziləti

٣١٠٥- أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَجُلاً أَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَيُّ النَّاسِ أَفْضَلُ ؟ قَالَ : مَنْ جَاهَدَ بِنَفْسِهِ وَمَالِهِ فِي سَبِيلِ اللهِ ، قَالَ : ثُمَّ مَنْ يَا رَسُولَ اللهِ ؟ قَالَ : ثُمَّ مُؤْمِنٌ فِي شِعْبٍ مِنَ الشِّعَابِ يَتَّقِي اللهَ ، وَيَدَعُ النَّاسَ مِنْ شَرِّهِ.

3105. ...Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, bir kişi Allah Elçisinin ﷺ yanına gəlib dedi: "Ey Allahın Elçisi, hansı adam daha fəzilətlidir?" Peyğəmbər ﷺ buyurdu: "Canı və malı ilə Allah yolunda cihad edən". Kişi dedi: "Sonra kimdir, ey Allahın Elçisi?" Peyğəmbər ﷺ buyurdu: "Kənar yerlərə gedib insanları öz şərindən uzaq tutan və onların şərindən özünü qoruyan, Allahdan qorxan kimsə".

٨- فَضْلُ مَنْ عَمِلَ فِي سَبِيلِ اللهِ عَلَى قَدَمِهِ

8-ci fəsil: Allah yolunda piyada çalışanın fəziləti

٣١٠٦- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ أَبِي الْخَيْرِ ، عَنْ أَبِي الْخَطَّابِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَامَ تَبُوكَ يَخْطُبُ النَّاسَ وَهُوَ مُسْنِدٌ ظَهْرَهُ إِلَى رَاحِلَتِهِ ، فَقَالَ : أَلاَ أُخْبِرُكُمْ بِخَيْرِ النَّاسِ وَشَرِّ النَّاسِ ؟ إِنَّ مِنْ خَيْرِ النَّاسِ : رَجُلاً عَمِلَ فِي سَبِيلِ اللهِ عَلَى ظَهْرِ فَرَسِهِ ، أَوْعَلَى ظَهْرِ بَعِيرِهِ ، أَوْ عَلَى قَدَمِهِ ، حَتَّى يَأْتِيَهُ الْمَوْتُ ، وَإِنَّ مِنْ شَرِّ النَّاسِ : رَجُلاً فَاجِرًا ، يَقْرَأُ كِتَابَ اللهِ لاَ يَرْعَوِي إِلَى شَيْءٍ مِنْهُ.

3106. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Allah Elçisi ﷺ Təbuk döyüşü olan il kürəyini miniyinə dayamış vəziyyətdə insanlara xütbə verərək belə buyurdu: "Sizə insanların ən xeyirlisi və şər olanı haqda xəbər verimmi? Ən xeyirli kimsə, ölənə qədər atının və ya dəvəsinin üstündə və ya piyada olaraq Allah yolunda çalışan adamdır. Ən şər olan kimsə isə günahkar olan, Allahın Kitabını oxuyub lazım olanları yerinə yetirməyən kimsədir".[1]

٣١٠٧- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ عَوْنٍ ، قَالَ : حَدَّثَنَا مِسْعَرٌ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عِيسَى بْنِ طَلْحَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : لاَ يَبْكِي أَحَدٌ مِنْ خَشْيَةِ اللهِ فَتَطْعَمَهُ النَّارُ حَتَّى يُرَدَّ اللَّبَنُ فِي الضَّرْعِ ، وَلاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ جَهَنَّمَ فِي مَنْخَرَيْ مُسْلِمٍ أَبَدًا.

[1] Hədisin isnadı zəifdir.

3107. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: “Allah qorxusundan ağlayanı, süd sinəyə geri qayıtmayana qədər Cəhənnəm odu yandırmaz. Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt birlikdə olmaz”.

٣١٠٨- أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنِ ابْنِ الْمُبَارَكِ ، عَنِ الْمَسْعُودِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عِيسَى بْنِ طَلْحَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَلِجُ النَّارَ رَجُلٌ بَكَى مِنْ خَشْيَةِ اللهِ تَعَالَى حَتَّى يَعُودَ اللَّبَنُ فِي الضَّرْعِ ، وَلاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ نَارِ جَهَنَّمَ.

3108. ...Əbu Hureyra ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Uca Allahın qorxusundan ağlayanı, süd sinəyə geri qayıtmayana qədər Cəhənnəm odu yandırmaz. Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt birlikdə olmaz”.

٣١٠٩- أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَجْتَمِعَانِ فِي النَّارِ مُسْلِمٌ قَتَلَ كَافِرًا ثُمَّ سَدَّدَ وَقَارَبَ ، وَلاَ يَجْتَمِعَانِ فِي جَوْفِ مُؤْمِنٍ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَفَيْحُ جَهَنَّمَ ، وَلاَ يَجْتَمِعَانِ فِي قَلْبِ عَبْدٍ الإِيمَانُ وَالْحَسَدُ.

3109. ...Əbu Hureyra ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kafiri öldürüb sonra doğru yolda olub Allaha yaxınlaşan müsəlman bəndə, həmin kafirlə Cəhənnəmdə bir yerdə olmaz. Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt birlikdə olmaz. Bir bəndənin qəlbində imanla həsəd bir yerdə olmaz”.

٣١١٠- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ سُهَيْلٍ ، عَنْ صَفْوَانَ بْنِ أَبِي يَزِيدَ ، عَنِ الْقَعْقَاعِ بْنِ اللَّجْلاَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ جَهَنَّمَ فِي جَوْفِ عَبْدٍ أَبَدًا ، وَلاَ يَجْتَمِعُ الشُّحُّ وَالإِيمَانُ فِي قَلْبِ عَبْدٍ أَبَدًا.

3110. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt bir bəndənin içində birlikdə olmaz. Bir bəndənin qəlbində xəsisliklə iman heç vaxt bir yerdə olmaz”.

٣١١١- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ خَالِدِ بْنِ اللَّجْلاَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ جَهَنَّمَ فِي وَجْهِ رَجُلٍ أَبَدًا ، وَلاَ يَجْتَمِعُ الشُّحُّ وَالإِيمَانُ فِي قَلْبِ عَبْدٍ أَبَدًا.

3111. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt bir bəndənin üzündə birlikdə olmaz. Bir bəndənin qəlbində xəsisliklə iman heç vaxt bir yerdə olmaz”.

٣١١٢- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَامِرٍ ، قَالَ : حَدَّثَنَا مَنْصُورُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ ابْنِ الْهَادِ ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ ، عَنْ صَفْوَانَ بْنِ أَبِي يَزِيدَ ، عَنِ الْقَعْقَاعِ بْنِ اللَّجْلاَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ جَهَنَّمَ فِي جَوْفِ عَبْدٍ ، وَلاَ يَجْتَمِعُ الشُّحُّ وَالإِيمَانُ فِي جَوْفِ عَبْدٍ.

3112. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt bir bəndənin içində birlikdə olmaz. Bir bəndədə xəsisliklə iman bir yerdə olmaz”.

٣١١٣- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَرْعَرَةُ بْنُ الْبِرِنْدِ ، وَابْنُ أَبِي عَدِيٍّ ، قَالاَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَمْرٍو ، عَنْ صَفْوَانَ بْنِ أَبِي يَزِيدَ ، عَنْ حُصَيْنِ بْنِ اللَّجْلاَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ وَدُخَانُ جَهَنَّمَ فِي مَنْخَرَيْ مُسْلِمٍ أَبَدًا.

3113. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Allah ﷻ yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt müsəlman bir bəndənin burun dəliklərində birlikdə olmaz”.

٣١١٤- أَخْبَرَنِي شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ صَفْوَانَ بْنِ أَبِي يَزِيدَ ، عَنْ حُصَيْنِ بْنِ اللَّجْلاَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَجْتَمِعُ غُبَارٌ فِي سَبِيلِ اللهِ وَدُخَانُ جَهَنَّمَ فِي مَنْخَرَيْ مُسْلِمٍ ، وَلاَ يَجْتَمِعُ شُحٌّ وَإِيمَانٌ فِي قَلْبِ رَجُلٍ مُسْلِمٍ.

3114. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allah yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsü heç vaxt müsəlman bir bəndənin burun dəliklərində birlikdə olmaz. Bir müsəlmanın qəlbində xəsisliklə iman bir yerdə olmaz”.

٣١١٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ أَبِي جَعْفَرٍ ، عَنْ صَفْوَانَ بْنِ أَبِي يَزِيدَ ، عَنْ أَبِي الْعَلاَءِ بْنِ اللَّجْلاَجِ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : لاَ يَجْمَعُ اللهُ عَزَّ وَجَلَّ غُبَارًا فِي سَبِيلِ اللهِ وَدُخَانَ جَهَنَّمَ فِي جَوْفِ امْرِئٍ مُسْلِمٍ ، وَلاَ يَجْمَعُ اللهُ فِي قَلْبِ امْرِئٍ مُسْلِمٍ الإِيمَانَ بِاللهِ وَالشُّحَّ جَمِيعًا.

3115. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah ﷻ Onun yolunda döyüşənə hopan toz ilə Cəhhənəm tüstüsünü heç vaxt müsəlman bir kişinin içində birləşdirməz. Allah bir müsəlman kişinin qəlbində Allaha iman ilə xəsisliyi birləşdirməz".

٩- ثَوَابُ مَنْ اغْبَرَّتْ قَدَمَاهُ فِي سَبِيلِ اللَّهِ

9-cu fəsil: Allah yolunda olanın ayaqlarına hopan tozun savabı

٣١١٦- أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ أَبِي مَرْيَمَ ، قَالَ : لَحِقَنِي عَبَايَةُ بْنُ رَافِعٍ – وَأَنَا مَاشٍ إِلَى الْجُمُعَةِ ، فَقَالَ : أَبْشِرْ ، فَإِنَّ خُطَاكَ هَذِهِ فِي سَبِيلِ اللهِ ، سَمِعْتُ أَبَا عَبْسٍ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ اغْبَرَّتْ قَدَمَاهُ فِي سَبِيلِ اللهِ فَهُوَ حَرَامٌ عَلَى النَّارِ.

3116. ...Rəvayət edilir ki, Yəzid ibn Əbu Məryəm ﵀ demişdir: "Mən Cümə namazına gedərkən Adayə ibn Rafi mənə çatıb dedi: "Sevin! Sənin atdığın bu addımlar Allah yolundadır. Mən Əbu Absın belə dediyini eşitdim: "Allah Elçisi ﷺ belə buyurdu: "Kimin ayaqlarına Allah yolunda toz hoparsa, onu yandırmaq oda haramdır".

١٠- ثَوَابُ عَيْنٍ سَهِرَتْ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ

10-cu fəsil: Allah ﷻ yolunda yuxusuz qalan gözlərin savabı

٣١١٧- أَخْبَرَنَا عِصْمَةُ بْنُ الْفَضْلِ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ حُبَابٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ شُرَيْحٍ ، قَالَ : سَمِعْتُ مُحَمَّدَ بْنَ شُمَيْرٍ الرُّعَيْنِيَّ ، يَقُولُ : سَمِعْتُ أَبَا عَلِيٍّ التُّجِيبِيَّ ، أَنَّهُ سَمِعَ أَبَا رَيْحَانَةَ ، يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : حُرِّمَتْ عَيْنٌ عَلَى النَّارِ سَهِرَتْ فِي سَبِيلِ اللهِ.

3117. ....Rəvayət edilir ki, Əbu Reyhanə ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Allah yolunda yuxusuz qalan gözlərə Cəhənnəm odu haram edilmişdir".

١١- فَضْلُ غَدْوَةٍ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ

11-ci fəsil: Səhər tezdən Allah ﷻ yolunda olmağın fəziləti

٣١١٨- أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ ، عَنْ زَائِدَةَ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْغَدْوَةُ وَالرَّوْحَةُ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ أَفْضَلُ مِنَ الدُّنْيَا وَمَا فِيهَا.

3118. ...Rəvayət edilir ki, Səhl ibn Səd ﵁ demişdir: "Allah Elçisi ﷺ belə

buyurdu: "Səhər və axşam Allah ﷻ yolunda olmaq dünya və onun içindəkilərdən fəzilətlidir".

### ١٢ – فَضْلُ الرَّوْحَةِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ

### 12-ci fəsil: Axşam Allah ﷻ yolunda olmağın fəziləti

٣١١٩– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ أَبِي أَيُّوبَ ، قَالَ : حَدَّثَنِي شُرَحْبِيلُ بْنُ شَرِيكٍ الْمَعَافِرِيُّ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ الْحُبُلِيِّ ، أَنَّهُ سَمِعَ أَبَا أَيُّوبَ الأَنْصَارِيَّ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : غَدْوَةٌ فِي سَبِيلِ اللهِ أَوْ رَوْحَةٌ خَيْرٌ مِمَّا طَلَعَتْ عَلَيْهِ الشَّمْسُ وَغَرَبَتْ.

3119. ...Rəvayət edilir ki, Əbu Əyyub əl-Ənsari ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Səhər və axşam Allah yolunda olmaq günəşin doğub batdığı bir gündə ediləcək hər şeydən xeyirlidir".

٣١٢٠– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، عَنْ أَبِيهِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلاَنَ ، عَنْ سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ثَلاَثَةٌ كُلُّهُمْ حَقٌّ عَلَى اللهِ عَزَّ وَجَلَّ عَوْنُهُ الْمُجَاهِدُ فِي سَبِيلِ اللهِ ، وَالنَّاكِحُ الَّذِي يُرِيدُ الْعَفَافَ ، وَالْمُكَاتَبُ الَّذِي يُرِيدُ الأَدَاءَ.

3120. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Üç nəfər var ki, onlara kömək etmək Allahın ﷻ üzərində bir haqdır: Allah yolunda olan mücahid, günahdan qorunmaq üçün evlənən və köləlikdən xilas olmaq üçün ağası ilə anlaşan".

### ١٣– بَابُ : الْغُزَاةِ وَفْدُ اللهِ تَعَالَى

### 13-cü fəsil: Qazilər Uca Allahın nümayəndələridir

٣١٢١– أَخْبَرَنَا عِيسَى بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ مَخْرَمَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ سُهَيْلَ بْنَ أَبِي صَالِحٍ ، قَالَ : سَمِعْتُ أَبِي ، يَقُولُ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَفْدُ اللهِ عَزَّ وَجَلَّ ثَلاَثَةٌ : الْغَازِي ، وَالْحَاجُّ ، وَالْمُعْتَمِرُ.

3021. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allahın nümayəndələri üçdür: qazi, həcc edən və ümrə edən".

3160. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Cənnət əhlindən olan bir adam (Allahın hüzuruna) gətiriləcək. Allah ﷻ buyuracaq: "Ey Adəm övladı! Yerin necədir?" O deyəcək: "Ya Rəbbim! Yerim yerlərin ən xeyirlisidir". Allah buyuracaq: "İstə və arzu et!" O da şəhidliyin fəzilətini gördüyü üçün: "Səndən məni dünyaya yenidən qaytarmağını və Sənin yolunda on dəfə şəhid olmağımı istəyirəm!"- deyəcək".

### ٣٥- مَا يَجِدُ الشَّهِيدُ مِنَ الأَلَمِ

### 35-ci fəsil: Şəhid nə qədər ağrı hiss edir?

٣١٦١- أَخْبَرَنَا عِمْرَانُ بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَعِيلَ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلاَنَ ، عَنِ الْقَعْقَاعِ بْنِ حَكِيمٍ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الشَّهِيدُ لاَ يَجِدُ مَسَّ الْقَتْلِ إِلاَّ كَمَا يَجِدُ أَحَدُكُمُ الْقَرْصَةَ يُقْرَصُهَا.

3161. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Şəhid öldürülərkən birinizin çimdiklənməkdən hiss etdiyi ağrı qədər bir ağrı hiss edir".

### ٣٦- مَسْأَلَةُ الشَّهَادَةِ

### 36-cı fəsil: Şəhidliyin misalı

٣١٦٢- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ شُرَيْحٍ ، أَنَّ سَهْلَ بْنَ أَبِي أُمَامَةَ بْنِ سَهْلِ بْنِ حُنَيْفٍ ، حَدَّثَهُ عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ سَأَلَ اللهَ عَزَّ وَجَلَّ الشَّهَادَةَ بِصِدْقٍ ، بَلَّغَهُ اللهُ مَنَازِلَ الشُّهَدَاءِ ، وَإِنْ مَاتَ عَلَى فِرَاشِهِ.

3162. ...Səhl ibn Huneyf atasından və babasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allahdan ﷻ səmimi qəlbdən şəhid olmağı istəsə, yatağında ölsə belə, Allah onu şəhidlik məqamına çatdırar".

٣١٦٣- أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ شُرَيْحٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ ثَعْلَبَةَ الْحَضْرَمِيِّ ، أَنَّهُ سَمِعَ ابْنَ حُجَيْرَةَ ، يُخْبِرُ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : خَمْسٌ مَنْ قُبِضَ فِي شَيْءٍ مِنْهُنَّ فَهُوَ شَهِيدٌ : الْمَقْتُولُ فِي سَبِيلِ اللهِ شَهِيدٌ ، وَالْغَرِقُ فِي سَبِيلِ اللهِ شَهِيدٌ ، وَالْمَبْطُونُ فِي سَبِيلِ اللهِ شَهِيدٌ ، وَالْمَطْعُونُ فِي سَبِيلِ اللهِ شَهِيدٌ ، وَالنُّفَسَاءُ فِي سَبِيلِ اللهِ شَهِيدٌ.

3163. ...Uqbə ibn Amir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Beş cür ölüm var ki, kim bunlardan biri ilə ölərsə, şəhid sayılar: Allah yolunda öldürülən şəhiddir; Allah yolunda boğularaq ölən şəhiddir; Allah yolunda

qarın ağrısından ölən şəhiddir; Allah yolunda taundan ölən şəhiddir; Allah yolunda doğuş zamanı ölən qadın şəhiddir".

٣١٦٤- أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنَا بَحِيرٌ ، عَنْ خَالِدٍ ، عَنْ ابْنِ أَبِي بِلاَلٍ ، عَنِ الْعِرْبَاضِ بْنِ سَارِيَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَخْتَصِمُ الشُّهَدَاءُ وَالْمُتَوَفَّوْنَ عَلَى فُرُشِهِمْ إِلَى رَبِّنَا فِي الَّذِينَ يُتَوَفَّوْنَ مِنَ الطَّاعُونِ ، فَيَقُولُ الشُّهَدَاءُ : إِخْوَانُنَا قُتِلُوا كَمَا قُتِلْنَا ، وَيَقُولُ الْمُتَوَفَّوْنَ عَلَى فُرُشِهِمْ : إِخْوَانُنَا مَاتُوا عَلَى فُرُشِهِمْ كَمَا مُتْنَا ، فَيَقُولُ رَبُّنَا : انْظُرُوا إِلَى جِرَاحِهِمْ ، فَإِنْ أَشْبَهَ جِرَاحُهُمْ جِرَاحَ الْمَقْتُولِينَ ، فَإِنَّهُمْ مِنْهُمْ وَمَعَهُمْ ، فَإِذَا جِرَاحُهُمْ قَدْ أَشْبَهَتْ جِرَاحَهُمْ.

3164. ...İrbad ibn Səriyə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Şəhidlərlə yataqlarında ölənlər, taundan ölənlər barəsində mübahisə edirlər və (mübahisəni) Rəbbimizə həvalə edirlər. Şəhidlər deyir: "Onlar bizim qardaşlarımızdır, bizim kimi öldürüldülər". Yataqlarında ölənlər isə deyirlər: "Onlar bizim qardaşlarımızdır, bizim kimi yataqlarında öldülər". Rəbbimiz buyurur: "Onların yaralarına baxın, əgər yaraları öldürülənlərin yaralarına bənzəsə, onlar şəhidlərlə bərabərdirlər". (Onların yaralarına baxıldıqda, göründü ki,) yaraları şəhidlərin yaralarına bənzəyir".

### ٣٧- اجْتِمَاعُ الْقَاتِلِ وَالْمَقْتُولِ فِي سَبِيلِ اللهِ فِي الْجَنَّةِ

### 37-ci fəsil: Qatilin və Allah yolunda öldürülənin Cənnətdə birlikdə olması

٣١٦٥- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ اللهَ عَزَّ وَجَلَّ يَعْجَبُ مِنْ رَجُلَيْنِ يَقْتُلُ أَحَدُهُمَا صَاحِبَهُ - وَقَالَ مَرَّةً أُخْرَى : لَيَضْحَكُ مِنْ رَجُلَيْنِ يَقْتُلُ أَحَدُهُمَا صَاحِبَهُ - ثُمَّ يَدْخُلاَنِ الْجَنَّةَ.

3165. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Allah ﷻ yoldaşını öldürən iki nəfərə təəccüb edir". Bir dəfə də belə dedi: "Allah yoldaşını öldürən iki nəfərə gülür, sonra onları Cənnətə salır".[1]

### ٣٨- تَفْسِيرُ ذَلِكَ

### 38-ci fəsil: Bunun izahı

٣١٦٦- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَضْحَكُ اللهُ إِلَى رَجُلَيْنِ يَقْتُلُ أَحَدُهُمَا الآخَرَ كِلاَهُمَا يَدْخُلُ الْجَنَّةَ ، يُقَاتِلُ هَذَا فِي سَبِيلِ اللهِ فَيُقْتَلُ ، ثُمَّ يَتُوبُ اللهُ عَلَى الْقَاتِلِ فَيُقَاتِلُ فَيُسْتَشْهَدُ.

[1] Növbəti hədis bunu izah edir.

3166. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Allah iki nəfərə gülür: bunlardan biri digərini öldürür, (nəticədə isə) hər ikisi Cənnətə daxil olur. Belə ki, bu, Allah yolunda vuruşub ölür, sonra Allah onun qatilinin tövbəsini qəbul edir və o da şəhid olaraq öldürülür".

### ٣٩- فَضْلُ الرِّبَاطِ

### 39-cu fəsil: Sərhəddə keşik çəkənin fəziləti

٣١٦٧- قَالَ : الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ شُرَيْحٍ ، عَنْ عَبْدِ الْكَرِيمِ بْنِ الْحَارِثِ ، عَنْ أَبِي عُبَيْدَةَ بْنِ عُقْبَةَ ، عَنْ شُرَحْبِيلَ بْنِ السِّمْطِ ، عَنْ سَلْمَانَ الْخَيْرِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ رَابَطَ يَوْمًا وَلَيْلَةً فِي سَبِيلِ اللهِ كَانَ لَهُ كَأَجْرِ صِيَامِ شَهْرٍ وَقِيَامِهِ ، وَمَنْ مَاتَ مُرَابِطًا أُجْرِيَ لَهُ مِثْلُ ذَلِكَ مِنَ الأَجْرِ ، وَأُجْرِيَ عَلَيْهِ الرِّزْقُ ، وَأَمِنَ مِنَ الْفَتَّانِ.

3167. ...Salman əl-Xeyr ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah yolunda sərhəddə bir gün - bir gecə keşik çəkərsə, bir ay oruc tutmuş və bir ay namaz qılmış kimi savab qazanar. Kim də keşik çəkərkən ölsə, eyni savabı qazanar, Allah ona ruzi verər və o, qəbir fitnəsindən əmin olar".

٣١٦٨- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، قَالَ : حَدَّثَنِي أَيُّوبُ بْنُ مُوسَى ، عَنْ مَكْحُولٍ ، عَنْ شُرَحْبِيلَ بْنِ السِّمْطِ ، عَنْ سَلْمَانَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ رَابَطَ فِي سَبِيلِ اللهِ يَوْمًا وَلَيْلَةً كَانَتْ لَهُ كَصِيَامِ شَهْرٍ وَقِيَامِهِ ، فَإِنْ مَاتَ جَرَى عَلَيْهِ عَمَلُهُ الَّذِي كَانَ يَعْمَلُ ، وَأَمِنَ الْفَتَّانَ ، وَأُجْرِيَ عَلَيْهِ رِزْقُهُ.

3168. ...Salman əl-Xeyr ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah yolunda sərhəddə bir gün - bir gecə keşik çəkərsə, bir ay oruc tutmuş və bir ay namaz qılmış kimi savab qazanar. Kim də keşik çəkərkən ölsə, əməl dəftəri bağlanmaz, qəbir fitnəsindən əmin olar və Allah ona ruzi verər".

٣١٦٩- أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ زُهْرَةَ بْنِ مَعْبَدٍ ، قَالَ : حَدَّثَنِي أَبُو صَالِحٍ ، مَوْلَى عُثْمَانَ ، قَالَ : سَمِعْتُ عُثْمَانَ بْنَ عَفَّانَ ، رَضِيَ اللَّهُ عَنْهُ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : رِبَاطُ يَوْمٍ فِي سَبِيلِ اللهِ خَيْرٌ مِنْ أَلْفِ يَوْمٍ فِيمَا سِوَاهُ مِنَ الْمَنَازِلِ.

3169. ...Rəvayət edilir ki, Osman ibn Əffan ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Allah yolunda sərhəddə bir gün keşik çəkmək başqa yerlərdə keçirilən min gündən daha xeyirlidir".

٣١٧٠- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا ابْنُ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو مَعْنٍ ، قَالَ : حَدَّثَنَا زُهْرَةُ بْنُ مَعْبَدٍ ، عَنْ أَبِي صَالِحٍ ، مَوْلَى عُثْمَانَ ، قَالَ : قَالَ عُثْمَانُ بْنُ عَفَّانَ ، رَضِيَ اللَّهُ عَنْهُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : يَوْمٌ فِي سَبِيلِ اللهِ خَيْرٌ مِنْ أَلْفِ يَوْمٍ فِيمَا سِوَاهُ.

3170. ...Rəvayət edilir ki, Osman ibn Əffan ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Allah yolunda sərhəddə bir gün keşik çəkmək başqa yerlərdə keçirilən min günə bərabərdir".

٤٠- فَضْلُ الْجِهَادِ فِي الْبَحْرِ

## 40-cı fəsil: Dənizdə olan cihadın fəziləti

٣١٧١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا ذَهَبَ إِلَى قُبَاءَ ، يَدْخُلُ عَلَى أُمِّ حَرَامٍ بِنْتِ مِلْحَانَ فَتُطْعِمُهُ ، وَكَانَتْ أُمُّ حَرَامٍ بِنْتُ مِلْحَانَ تَحْتَ عُبَادَةَ بْنِ الصَّامِتِ ، فَدَخَلَ عَلَيْهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا ، فَأَطْعَمَتْهُ وَجَلَسَتْ تَفْلِي رَأْسَهُ ، فَنَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ اسْتَيْقَظَ وَهُوَ يَضْحَكُ ، قَالَتْ : فَقُلْتُ : مَا يُضْحِكُكَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : نَاسٌ مِنْ أُمَّتِي عُرِضُوا عَلَيَّ ، غُزَاةً فِي سَبِيلِ اللهِ يَرْكَبُونَ ثَبَجَ هَذَا الْبَحْرِ ، مُلُوكٌ عَلَى الأَسِرَّةِ ، أَوْ مِثْلُ الْمُلُوكِ عَلَى الأَسِرَّةِ - شَكَّ إِسْحَاقُ - فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ ، فَدَعَا لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ نَامَ - وَقَالَ الْحَارِثُ : فَنَامَ ، ثُمَّ اسْتَيْقَظَ فَضَحِكَ ، فَقُلْتُ لَهُ : مَا يُضْحِكُكَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : نَاسٌ مِنْ أُمَّتِي عُرِضُوا عَلَيَّ غُزَاةً فِي سَبِيلِ اللهِ مُلُوكٌ عَلَى الأَسِرَّةِ ، أَوْ مِثْلُ الْمُلُوكِ عَلَى الأَسِرَّةِ - كَمَا قَالَ فِي الأَوَّلِ - فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ ، قَالَ : أَنْتِ مِنَ الأَوَّلِينَ فَرَكِبَتِ الْبَحْرَ فِي زَمَانِ مُعَاوِيَةَ ، فَصُرِعَتْ عَنْ دَابَّتِهَا حِينَ خَرَجَتْ مِنَ الْبَحْرِ ، فَهَلَكَتْ.

3171. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ Quba'ya getdiyi vaxt Ummu Haram bint Milhanı ziyarət edərdi. O da Allah Elçisinə ﷺ yemək təklif edərdi. Ummu Haram bint Milhan Ubadə ibn əs-Samitlə evlənmişdi. Bir gün Allah Elçisi ﷺ onu ziyarət etdi. O da ona yemək verdi. Allah Elçisi ﷺ başını qoyub orada yatdı. Allah Elçisi ﷺ bir müddət yatdıqdan sonra oyandıqda güldü. Ummu Haram deyir: "Mən dedim: "Ey Allahın Elçisi, səni güldürən nədir?" Allah Elçisi ﷺ buyurdu: "Yuxumda mənə ümmətimdən Allah yolunda vuruşan bəzi kimsələr göstərildi. Onlar padşahların taxtlarına əyləşdiyi kimi dəniz üstündəki vasitələrə əyləşərək və ya padşahlar kimi (şübhə edən ravi İshaqdır) döyüşə gedirdilər". Mən dedim: "Ey Allahın Elçisi, dua et mən də onlardan olum". Allah Elçisi ﷺ də dua etdi. Sonra Allah Elçisi ﷺ yenə yuxuya getdi. Oyandıqdan sonra yenə gülümsədi. Mən dedim: "Səni güldürən nədir, ey Allahın Elçisi?" Allah Elçisi ﷺ: "Yuxumda mənə ümmətimdən Allah yolunda vuruşan bəzi kimsələr göstərildi. Onlar quruda

gedən miniklərinə taxtına əyləşən padşahlar kimi əyləşərək döyüşə gedirdilər"- buyurdu və əvvəl dediklərini dedi. Mən dedim: "Ey Allahın Elçisi, Allaha dua et ki, məni onlardan etsin". Allah Elçisi ﷺ buyurdu: "Sən əvvəlkilərdənsən". (Yəni dənizdə döyüşə gedənlərdənsən). Ravi deyir ki: "Ummu Haram Müaviyənin xəlifəliyi dövründə baş verən dəniz döyüşündə iştirak etdi və dənizdən quruya çıxarkən mindiyi heyvandan yıxılaraq vəfat etdi".

٣١٧٢- أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ أُمِّ حَرَامٍ بِنْتِ مِلْحَانَ ، قَالَتْ : أَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ عِنْدَنَا ، فَاسْتَيْقَظَ وَهُوَ يَضْحَكُ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، بِأَبِي وَأُمِّي مَا أَضْحَكَكَ ؟ قَالَ : رَأَيْتُ قَوْمًا مِنْ أُمَّتِي يَرْكَبُونَ هَذَا الْبَحْرَ كَالْمُلُوكِ عَلَى الأَسِرَّةِ قُلْتُ : ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ ، قَالَ : فَإِنَّكِ مِنْهُمْ ثُمَّ نَامَ ، ثُمَّ اسْتَيْقَظَ وَهُوَ يَضْحَكُ ، فَسَأَلْتُهُ ، فَقَالَ - يَعْنِي مِثْلَ مَقَالَتِهِ ، قُلْتُ : ادْعُ اللَّهَ أَنْ يَجْعَلَنِي مِنْهُمْ ، قَالَ : أَنْتِ مِنَ الأَوَّلِينَ فَتَزَوَّجَهَا عُبَادَةُ بْنُ الصَّامِتِ ، فَرَكِبَ الْبَحْرَ وَرَكِبَتْ مَعَهُ ، فَلَمَّا خَرَجَتْ قُدِّمَتْ لَهَا بَغْلَةٌ ، فَرَكِبَتْهَا ، فَصَرَعَتْهَا فَانْدَقَّتْ عُنُقُهَا.

3172. ...Rəvayət edilir ki, Ummu Haram bint Milhan رضي الله عنها demişdir: "Allah Elçisi ﷺ bizə gəlmişdi. Günorta yatdı və gülümsəyərək oyandı. Mən dedim: "Ey Allahın Elçisi! Atam-anam sənə fəda olsun, səni güldürən nədir?" Allah Elçisi ﷺ buyurdu: "Yuxuda ümmətimdən bir dəstənin padşahların taxtlarına əyləşdikləri kimi dəniz vasitələrinə əyləşərək döyüşə getdiklərini gördüm, ona görə gülümsəyirəm". Mən dedim: "Allaha dua et ki, məni də onlardan etsin". Allah Elçisi ﷺ dedi: "Sən onlardan olacaqsan". Sonra yenə yatdı və gülümsəyərək oyandı. Mən ondan nə üçün gülümsədiyini soruşdum. Əvvəlcə dediyi kimi deyərək quruda döyüşənlərdən bəhs etdi. Mən dedim: "Allah dua et ki, məni onlardan etsin". O buyurdu: "Sən əvvəlkilərdənsən". Ravi deyir: "Ummu Haram Ubadə ibn əs-Samitin zövcəsi idi. Müaviyənin xəlifəliyi dövründə baş verən dəniz döyüşündə iştirak etmək üçün gəmiyə minənlərlə o da gəmiyə minmişdi. Gəmidən düşərkən minməsi üçün gətirilən qatıra mindi və qatırdan yıxılaraq boynu qırıldı (vəfat etdi)".

## ٤١- غَزْوَةُ الْهِنْدِ

## 41-ci fəsil: Hindistan yürüşü

٣١٧٣- أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا بْنُ عَدِيٍّ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عَمْرٍو ، عَنْ زَيْدِ بْنِ أَبِي أُنَيْسَةَ ، عَنْ سَيَّارٍ (ح) قَالَ : وَأَنْبَأَنَا هُشَيْمٌ ، عَنْ سَيَّارٍ ، عَنْ جَبْرِ بْنِ عَبِيدَةَ ، وَقَالَ عُبَيْدُ اللهِ : عَنْ جُبَيْرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : وَعَدَنَا

رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَزْوَةَ الْهِنْدِ ، فَإِنْ أَدْرَكْتُهَا أُنْفِقْ فِيهَا نَفْسِي وَمَالِي ، فَإِنْ أُقْتَلْ كُنْتُ مِنْ أَفْضَلِ الشُّهَدَاءِ ، وَإِنْ أَرْجِعْ فَأَنَا أَبُو هُرَيْرَةَ الْمُحَرَّرُ.

3173. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə Hindistana yürüş etməyi vəd etmişdi. Əgər o döyüşdə iştirak etsəm, canımı və malımı fəda edəcəyəm. Əgər o döyüşdə şəhid olsam, ən fəzilətli şəhidlərdən olaram. Əgər geri qayıtsam, oddan xilas olan Əbu Hureyra olaram".[1]

٣١٧٤- حَدَّثَنِي مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، قَالَ : حَدَّثَنَا سَيَّارٌ أَبُو الْحَكَمِ ، عَنْ جَبْرِ بْنِ عَبِيدَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : وَعَدَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَزْوَةَ الْهِنْدِ ، فَإِنْ أَدْرَكْتُهَا أُنْفِقْ فِيهَا نَفْسِي وَمَالِي ، وَإِنْ قُتِلْتُ كُنْتُ أَفْضَلَ الشُّهَدَاءِ ، وَإِنْ رَجَعْتُ فَأَنَا أَبُو هُرَيْرَةَ الْمُحَرَّرُ.

3174. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə Hindistana yürüşü vəd etmişdi. Mən dedim: "Əgər o döyüşdə iştirak etsəm, malımı və canımı fəda edəcəyəm. Əgər o döyüşdə şəhid olsam ən fəzilətli şəhidlərdən olaram. Əgər geri qayıtsam, oddan xilas olan Əbu Hureyra olaram".

٣١٧٥- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحِيمِ ، قَالَ : حَدَّثَنَا أَسَدُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنِي أَبُو بَكْرٍ الزُّبَيْدِيُّ ، عَنْ أَخِيهِ مُحَمَّدِ بْنِ الْوَلِيدِ ، عَنْ لُقْمَانَ بْنِ عَامِرٍ ، عَنْ عَبْدِ الأَعْلَى بْنِ عَدِيٍّ الْبَهْرَانِيِّ ، عَنْ ثَوْبَانَ مَوْلَى رَسُولِ اللهِ ، صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عِصَابَتَانِ مِنْ أُمَّتِي أَحْرَزَهُمَا اللهُ مِنَ النَّارِ : عِصَابَةٌ تَغْزُو الْهِنْدَ ، وَعِصَابَةٌ تَكُونُ مَعَ عِيسَى ابْنِ مَرْيَمَ عَلَيْهِمَا السَّلاَمُ.

3175. ...Rəvayət edilir ki, Allah Elçisinin ﷺ köləlikdən azad etdiyi Səvbən ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ümmətimdən iki dəstə var ki, Allah onları Cəhənnəm odundan qorumuşdur. Biri Hindistan yürüşündə iştirak edib döyüşənlər, digəri də Məryəm oğlu İsa ilə birlikdə olanlardır".

## ٤٢- غَزْوَةُ التُّرْكِ وَالْحَبَشَةِ

## 42-ci fəsil: Türklər və həbəşlilərlə döyüş

٣١٧٦- أَخْبَرَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا ضَمْرَةُ ، عَنْ أَبِي زُرْعَةَ السَّيْبَانِيِّ ، عَنْ أَبِي سُكَيْنَةَ ، رَجُلٍ مِنَ الْمُحَرَّرِينَ ، عَنْ رَجُلٍ ، مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَمَّا أَمَرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِحَفْرِ الْخَنْدَقِ ، عَرَضَتْ لَهُمْ صَخْرَةٌ حَالَتْ بَيْنَهُمْ وَبَيْنَ

[1] Hədisin isnadı zəifdir.

الْحَفْرِ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَخَذَ الْمِعْوَلَ ، وَوَضَعَ رِدَاءَهُ نَاحِيَةَ الْخَنْدَقِ ، وَقَالَ : **{تَمَّتْ كَلِمَةُ رَبِّكَ صِدْقًا وَعَدْلاً ، لاَ مُبَدِّلَ لِكَلِمَاتِهِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ}** ، فَنَدَرَ ثُلُثُ الْحَجَرِ ، وَسَلْمَانُ الْفَارِسِيُّ قَائِمٌ يَنْظُرُ ، فَبَرَقَ مَعَ ضَرْبَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَرْقَةٌ ، ثُمَّ ضَرَبَ الثَّانِيَةَ ، وَقَالَ : **{تَمَّتْ كَلِمَةُ رَبِّكَ صِدْقًا وَعَدْلاً ، لاَ مُبَدِّلَ لِكَلِمَاتِهِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ}** ، فَنَدَرَ الثُّلُثُ الآخَرُ ، فَبَرَقَتْ بَرْقَةٌ فَرَآهَا سَلْمَانُ ، ثُمَّ ضَرَبَ الثَّالِثَةَ ، وَقَالَ : **{تَمَّتْ كَلِمَةُ رَبِّكَ صِدْقًا وَعَدْلاً ، لاَ مُبَدِّلَ لِكَلِمَاتِهِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ}** ، فَنَدَرَ الثُّلُثُ الْبَاقِي ، وَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخَذَ رِدَاءَهُ وَجَلَسَ ، قَالَ سَلْمَانُ : يَا رَسُولَ اللهِ ، رَأَيْتُكَ حِينَ ضَرَبْتَ ، مَا تَضْرِبُ ضَرْبَةً إِلاَّ كَانَتْ مَعَهَا بَرْقَةٌ ، قَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا سَلْمَانُ ، رَأَيْتَ ذَلِكَ فَقَالَ : إِي وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ يَا رَسُولَ اللهِ ، قَالَ : فَإِنِّي حِينَ ضَرَبْتُ الضَّرْبَةَ الأُولَى رُفِعَتْ لِي مَدَائِنُ كِسْرَى وَمَا حَوْلَهَا وَمَدَائِنُ كَثِيرَةٌ ، حَتَّى رَأَيْتُهَا بِعَيْنَيَّ قَالَ لَهُ مَنْ حَضَرَهُ مِنْ أَصْحَابِهِ : يَا رَسُولَ اللهِ ، ادْعُ اللهَ أَنْ يَفْتَحَهَا عَلَيْنَا وَيُغَنِّمَنَا دِيَارَهُمْ ، وَيُخَرِّبَ بِأَيْدِينَا بِلاَدَهُمْ ، فَدَعَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِذَلِكَ ، ثُمَّ ضَرَبْتُ الضَّرْبَةَ الثَّانِيَةَ ، فَرُفِعَتْ لِي مَدَائِنُ قَيْصَرَ وَمَا حَوْلَهَا ، حَتَّى رَأَيْتُهَا بِعَيْنَيَّ ، قَالُوا : يَا رَسُولَ اللهِ ، ادْعُ اللهَ أَنْ يَفْتَحَهَا عَلَيْنَا وَيُغَنِّمَنَا دِيَارَهُمْ ، وَيُخَرِّبَ بِأَيْدِينَا بِلاَدَهُمْ ، فَدَعَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِذَلِكَ ، ثُمَّ ضَرَبْتُ الثَّالِثَةَ ، فَرُفِعَتْ لِي مَدَائِنُ الْحَبَشَةِ وَمَا حَوْلَهَا مِنَ الْقُرَى ، حَتَّى رَأَيْتُهَا بِعَيْنَيَّ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عِنْدَ ذَلِكَ دَعُوا الْحَبَشَةَ مَا وَدَعُوكُمْ ، وَاتْرُكُوا التُّرْكَ مَا تَرَكُوكُمْ.

3176. ...Azadlığa qovuşdurulanlardan Əbu Sukeynə رحمه الله Allah Elçisinin ﷺ səhabələrindən bir nəfərin belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ Xəndək döyüşü üçün xəndək qazılmasını əmr etmişdi. Bu xəndəyi qazdıqda onların qarşısına böyük bir qaya parçası çıxdı. Allah Elçisi ﷺ ayağa qalxıb külüngü götürdü, cübbəsini çıxardı və bir kənara qoydu. **“Rəbbinin kəlamı həm doğruluq, həm də ədalət baxımından tamamlanmışdır. Heç kəs Onun kəlmələrini dəyişə bilməz. O, Eşidəndir, Görəndir”** (əl-Ənam, 115) ayəsini oxuyaraq daşa vurdu, daşın üçdəbiri qopdu. Salman əl-Farisi orada dayanıb Allah Elçisinə ﷺ baxırdı. Allah Elçisinin ﷺ qayaya vuruşu ilə şimşək kimi bir qığılcım çıxdı. Sonra ikinci dəfə yenə vurdu və **“Rəbbinin kəlamı həm doğruluq, həm də ədalət baxımından tamamlanmışdır. Heç kəs Onun kəlmələrini dəyişə bilməz. O, Eşidəndir, Görəndir”** (əl-Ənam, 115) ayəsini oxudu, digər üçdəbiri də qırıldı və yenə bir qığılcım çıxdı. Salman da o qığılcımı gördü. Sonra üçüncü dəfə qayaya vurdu və yenə **“Rəbbinin kəlamı həm doğruluq, həm də ədalət baxımından tamamlanmışdır. Heç kəs Onun kəlmələrini dəyişə bilməz. O, Eşidəndir, Görəndir”** (əl-Ənam, 115) ayəsini oxudu və qayanın qalan üçdəbiri də qırıldı. Allah Elçisi ﷺ xəndəkdən çıxdı və cübbəsini götürüb oturdu. Salman dedi: “Ey Allahın Elçisi! Sən hər dəfə daşa vurduqda qığılcım çıxırdı”. Allah Elçisi ﷺ ona buyurdu: “Ey Salman, sən çıxan qığılcımı gördünmü?” Salman dedi: “Səni haqq din ilə göndərən Allaha and olsun ki, gördüm”. Allah Elçisi ﷺ buyurdu: “Qayaya ilk zərbəni vurduğum zaman mənə Kisranın şəhərləri və ətrafındakı bir çox

yer göstərildi. Mən onları öz gözlərimlə gördüm". Səhabələrdən orada olanlar: "Ey Allahın Elçisi! Allaha dua et ki, oraların fəth edilməsini bizə nəsib etsin, oraları bizə qənimət olaraq versin. Onların torpaqlarını bizim əllərimizlə həlak etsin". Allah Elçisi ﷺ bunun üçün dua etdi sonra buyurdu: "Sonra ikinci zərbəni vurdum və Qeysərin şəhərləri və onların ətrafı mənə göstərildi. Mən onları öz gözlərimlə gördüm". Oradakılar dedilər: "Ey Allahın Elçisi! Dua et ki, Allah bizə oraların fəthini nəsib etsin, onların məmləkətlərini bizə qənimət olaraq versin və onların məmləkətlərini bizim əlimizlə həlak etsin". Allah Elçisi ﷺ bunun üçün dua etdi, sonra sözünə davam edərək belə buyurdu: "Üçüncü dəfə qayaya zərbə vurduğum zaman Həbəşistan şəhərləri və ətrafındakı qəsəbələr mənə göstərildi. Mən onları öz gözlərimlə gördüm". Həmçinin Allah Elçisi ﷺ buyurdu: "Həbəşlilər sizə toxunmadıqca siz də onlara toxunmayın. Türklər sizə toxunmadıqca siz də onlara toxunmayın".

٣١٧٧- أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، عَنْ سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَقُومُ السَّاعَةُ حَتَّى يُقَاتِلَ الْمُسْلِمُونَ التُّرْكَ قَوْمًا وُجُوهُهُمْ كَالْمَجَانِّ الْمُطْرَقَةِ ، يَلْبَسُونَ الشَّعَرَ ، وَيَمْشُونَ فِي الشَّعَرِ.

3177. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ buyurdu: "Müsəlmanlar türklərlə savaşmadıqca Qiyamət qopmayacaq. O türklər elə bir qövmdür ki, üzləri döymə qalxan kimidir. Onlar tükdən toxunmuş paltarlar geyərlər, ayaqqabıları da tükdən hazırlanmışdır".

## ٤٣- الاِسْتِنْصَارُ بِالضَّعِيفِ

## 43-cü fəsil: Zəiflərə görə ruzilənirik

٣١٧٨- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِدْرِيسَ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ حَفْصِ بْنِ غِيَاثٍ ، عَنْ أَبِيهِ ، عَنْ مِسْعَرٍ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ ، عَنْ أَبِيهِ ، أَنَّهُ ظَنَّ أَنَّ لَهُ فَضْلاً عَلَى مَنْ دُونَهُ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا يَنْصُرُ اللَّهُ هَذِهِ الأُمَّةَ بِضَعِيفِهَا ، بِدَعْوَتِهِمْ وَصَلاَتِهِمْ وَإِخْلاَصِهِمْ.

3178. ...Musab ibn Səd ﷺ rəvayət edir ki, atası Allah Elçisinin ﷺ kasıb səhabələrinə nisbətən özündə bir üstünlüyün olduğunu zənn edirdi. Allahın Peyğəmbəri ﷺ isə belə buyurdu: "Allah bu ümmətə zəiflərinin duaları, namazları və səmimi olmaları səbəbi ilə yardım edir".

٣١٧٩- أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ عَبْدِ الْوَاحِدِ ، قَالَ : حَدَّثَنَا ابْنُ جَابِرٍ ، قَالَ : حَدَّثَنِي زَيْدُ بْنُ أَرْطَاةَ الْفَزَارِيُّ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ الْحَضْرَمِيِّ ، أَنَّهُ سَمِعَ أَبَا الدَّرْدَاءِ ، يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : ابْغُونِي الضَّعِيفَ ، فَإِنَّكُمْ إِنَّمَا تُرْزَقُونَ وَتُنْصَرُونَ بِضُعَفَائِكُمْ.

3179. ...Rəvayət edilir ki, Əbu Dərdə ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Mənə zəiflərinizi gətirin! Həqiqətən, siz zəiflərinizin dualarına görə ruzilənir və yardım görürsünüz".

## ٤٤- فَضْلُ مَنْ جَهَّزَ غَازِيًا

## 44-cü fəsil: Döyüşçünü təchiz edənin fəziləti

٣١٨٠- أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، عَنْ بُكَيْرِ بْنِ الأَشَجِّ ، عَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، عَنْ زَيْدِ بْنِ خَالِدٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ جَهَّزَ غَازِيًا فِي سَبِيلِ اللهِ ، فَقَدْ غَزَا ، وَمَنْ خَلَفَهُ فِي أَهْلِهِ بِخَيْرٍ ، فَقَدْ غَزَا.

3180. ...Rəvayət edilir ki, Zeyd ibn Xalid ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah yolunda döyüşənin təchizatını təmin edərsə, döyüşmüş kimi savab qazanar. Həmçinin kim döyüşə gedənin ailəsinə yaxşılıq edərsə, döyüşmüş kimi savab qazanar".

٣١٨١- أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا حَرْبُ بْنُ شَدَّادٍ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، عَنْ زَيْدِ بْنِ خَالِدٍ الْجُهَنِيِّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ جَهَّزَ غَازِيًا ، فَقَدْ غَزَا ، وَمَنْ خَلَفَ غَازِيًا فِي أَهْلِهِ بِخَيْرٍ ، فَقَدْ غَزَا.

3181. ...Rəvayət edilir ki, Zeyd ibn Xalid əl-Cuhəni ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim qazinin təchizatını təmin edərsə, döyüşmüş kimi savab qazanar. Həmçinin kim döyüşə gedənin ailəsinə yaxşılıq edərsə, döyüşmüş kimi savab qazanar".

٣١٨٢- أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، قَالَ : سَمِعْتُ حُصَيْنَ بْنَ عَبْدِ الرَّحْمَنِ ، يُحَدِّثُ عَنْ عَمْرِو بْنِ جَاوَانَ ، عَنِ الأَحْنَفِ بْنِ قَيْسٍ ، قَالَ : خَرَجْنَا حُجَّاجًا فَقَدِمْنَا الْمَدِينَةَ وَنَحْنُ نُرِيدُ الْحَجَّ ، فَبَيْنَا نَحْنُ فِي مَنَازِلِنَا نَضَعُ رِحَالَنَا ، إِذْ أَتَانَا آتٍ فَقَالَ : إِنَّ النَّاسَ قَدِ اجْتَمَعُوا فِي الْمَسْجِدِ وَفَزِعُوا ، فَانْطَلَقْنَا ، فَإِذَا النَّاسُ مُجْتَمِعُونَ عَلَى نَفَرٍ فِي وَسَطِ الْمَسْجِدِ ، وَفِيهِمْ عَلِيٌّ ، وَالزُّبَيْرُ ، وَطَلْحَةُ ، وَسَعْدُ بْنُ أَبِي وَقَّاصٍ ، فَإِنَّا لَكَذَلِكَ إِذْ جَاءَ عُثْمَانُ ، رَضِيَ اللهُ عَنْهُ عَلَيْهِ مُلاَءَةٌ صَفْرَاءُ قَدْ قَنَّعَ بِهَا رَأْسَهُ ، فَقَالَ : أَهَاهُنَا طَلْحَةُ ، أَهَاهُنَا الزُّبَيْرُ ، أَهَاهُنَا سَعْدٌ ، قَالُوا : نَعَمْ ، قَالَ : فَإِنِّي أَنْشُدُكُمْ بِاللهِ الَّذِي لاَ إِلَهَ إِلاَّ هُوَ ، أَتَعْلَمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ يَبْتَاعُ مِرْبَدَ بَنِي فُلاَنٍ ، غَفَرَ اللهُ لَهُ فَابْتَعْتُهُ بِعِشْرِينَ أَلْفًا ، أَوْ بِخَمْسَةٍ وَعِشْرِينَ أَلْفًا ، فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى

اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخْبَرْتُهُ ، فَقَالَ : اجْعَلْهُ فِي مَسْجِدِنَا وَأَجْرُهُ لَكَ ، قَالُوا : اللَّهُمَّ نَعَمْ ، قَالَ : أَنْشُدُكُمْ بِاللَّهِ الَّذِي لاَ إِلَهَ إِلاَّ هُوَ ، أَتَعْلَمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ ابْتَاعَ بِئْرَ رُومَةَ ، غَفَرَ اللَّهُ لَهُ ، فَابْتَعْتُهَا بِكَذَا وَكَذَا ، فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : قَدْ ابْتَعْتُهَا بِكَذَا وَكَذَا ، قَالَ : اجْعَلْهَا سِقَايَةً لِلْمُسْلِمِينَ وَأَجْرُهَا لَكَ ، قَالُوا : اللَّهُمَّ نَعَمْ ، قَالَ : أَنْشُدُكُمْ بِاللَّهِ الَّذِي لاَ إِلَهَ إِلاَّ هُوَ ، أَتَعْلَمُونَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَظَرَ فِي وُجُوهِ الْقَوْمِ ، فَقَالَ : مَنْ يُجَهِّزُ هَؤُلاَءِ غَفَرَ اللَّهُ لَهُ – يَعْنِي جَيْشَ الْعُسْرَةِ ، فَجَهَّزْتُهُمْ حَتَّى لَمْ يَفْقِدُوا عِقَالاً وَلاَ خِطَامًا ، فَقَالُوا : اللَّهُمَّ نَعَمْ ، قَالَ : اللَّهُمَّ اشْهَدْ ، اللَّهُمَّ اشْهَدْ ، اللَّهُمَّ اشْهَدْ.

3182. ...Rəvayət edilir ki, Əhnəf ibn Qeys رحمه الله demişdir: "Biz həcc etmək üçün yola çıxdıq və Mədinəyə gəldik. Məqsədimiz sadəcə həcc etmək idi. Düşərgə saldığımız yerdə yüklərimizi boşaldarkən bir nəfər gəlib dedi: "Camaat məsciddə toplanıb və narahatlıq var". Biz məscidə getdik. Camaat məscidin ortasında toplaşmışdı. Onların arasında Əli, əz-Zubeyr, Təlhə və Səd ibn Əbu Vaqqas da var idi. Biz bu vəziyyətdə olduqda Osman gəldi. Sarı bir örtüyə bürünüb örtüyün bir parçası ilə başını örtmüşdü və belə dedi: "Təlhə buradadırmı? əz-Zubeyr buradadırmı? Səd buradadırmı?" Orada: "Bəli" dedilər. Osman dedi: "Özündən başqa ibadətə layiq məbud olmayan Allah üçün deyin, Allah Elçisinin ﷺ: "Kim filankəsin oğullarının xurma qurutma yerini alarsa Allah onu bağışlayar" buyurduğunu bilirsinizmi? Mən də oranı iyirmi və ya iyirmi beş minə aldım. Mən Allah Elçisinin ﷺ yanına gəlib vəziyyəti ona danışdım. O da buyurdu: "Onu məscidimizə bağışla, savabı sənindir". Orada olanlar dedilər: "Allah şahidimizdir ki, doğru deyirsən". Osman sözlərinə davam edərək: "Özündən başqa ibadətə layiq məbud olmayan Allah üçün deyin, Allah Elçisinin ﷺ: "Kim Rumə quyusunu alıb müsəlmanlara vəqf edərsə, Allah onu bağışlayar"- buyurduğunu bilirsinizmi? Mən də o quyunu bu qədər və bu qədər qiymətə aldım. Allah Elçisinin ﷺ yanına gəlib: "Rumə quyusunu bu qədər qiymətə aldım" dedim. O da buyurdu: "Onu müsəlmanların su ehtiyacları üçün vəqf et, savabı sənindir". Orada olanlar: "Allah şahidimiz olsun ki, sən doğru deyirsən"- dedilər". Osman sözlərinə davam edərək dedi: "Özündən başqa ibadətə layiq məbud olmayan Allah üçün deyin, Allah Elçisinin ﷺ səhabələrinə xitab edərək: "Kim bu ordunu təchiz edərsə, Allah onu əfv edər" buyurduğunu bilirsinizmi? Mən də, "Ceyşul-Usra"[1] ordusunu cilov və iplərinə qədər təchiz etmişdim". Orada olanlar:

[1] Ceyşul-Usra – səhabələrin ordu hazırladıqda dəvələri, silahları və digər təchizatları çox az olduğu vaxt, Osman رضي الله عنه həmin ordunu hər bir şeylə təchiz etmişdir. Bu səbəblə həmin orduya "Ceyşul-Usra", yəni "Çətinlik ordusu" demişlər.

"Allah şahidimiz olsun ki, doğru deyirsən". Osman da: "Allahım şahid ol, Allahım şahid ol, Allahım şahid ol!"- dedi".[1]

### ٤٥ – فَضْلُ النَّفَقَةِ فِي سَبِيلِ اللَّهِ تَعَالَى

### 45-ci fəsil: Uca Allahın yolunda xərcləməyin fəziləti

٣١٨٣– أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَنْفَقَ زَوْجَيْنِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ ، نُودِيَ فِي الْجَنَّةِ : يَا عَبْدَ اللهِ هَذَا خَيْرٌ ، فَمَنْ كَانَ مِنْ أَهْلِ الصَّلاَةِ ، دُعِيَ مِنْ بَابِ الصَّلاَةِ ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الْجِهَادِ دُعِيَ مِنْ بَابِ الْجِهَادِ ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الصَّدَقَةِ دُعِيَ مِنْ بَابِ الصَّدَقَةِ ، وَمَنْ كَانَ مِنْ أَهْلِ الصِّيَامِ دُعِيَ مِنْ بَابِ الرَّيَّانِ فَقَالَ أَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ : هَلْ عَلَى مَنْ دُعِيَ مِنْ هَذِهِ الأَبْوَابِ مِنْ ضَرُورَةٍ ، فَهَلْ يُدْعَى أَحَدٌ مِنْ هَذِهِ الأَبْوَابِ كُلِّهَا ؟ قَالَ : نَعَمْ ، وَأَرْجُو أَنْ تَكُونَ مِنْهُمْ.

3183. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah ﷻ yolunda hər cür maldan qoşa sədəqə verərsə, Cənnət keşikçiləri belə nida edər: "Ey Allah bəndəsi, bu daha xeyirlidir". Kim namaz əhlindən olarsa (çox namaz qılarsa), namaz qapısından çağırılar. Kim cihad əhlindən olarsa, cihad qapısından çağırılar. Kim sədəqə əhlindən olarsa, sədəqə qapısından çağırılar. Kim çox oruc tutan olarsa, Rəyyan adlı qapıdan çağırılar". Bu vaxt Əbu Bəkr əs-Siddiq dedi: "Bu qapılardan çağırılanların heç bir sıxıntı keçirməyəcəkləri bəllidir. Bəs bu qapıların hamısından çağırılan bir kimsə olacaqmı?" Allah Elçisi ﷺ dedi: "Bəli və mən ümid edirəm ki, sən onlardan olacaqsan".

٣١٨٤– أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنِ الأَوْزَاعِيِّ ، قَالَ : حَدَّثَنِي يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا أَبُو سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَنْفَقَ زَوْجَيْنِ فِي سَبِيلِ اللهِ دَعَتْهُ خَزَنَةُ الْجَنَّةِ مِنْ أَبْوَابِ الْجَنَّةِ : يَا فُلاَنُ ، هَلُمَّ فَادْخُلْ فَقَالَ أَبُو بَكْرٍ : يَا رَسُولَ اللهِ ، ذَاكَ الَّذِي لاَ تَوَى عَلَيْهِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنِّي لأَرْجُو أَنْ تَكُونَ مِنْهُمْ.

3184. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah yolunda qoşa sədəqə verərsə, Cənnət xəzinədarları Cənnətin qapılarından: "Ey filankəs, gəl, buradan gir" deyərək səslənərlər". Əbu Bəkr dedi: "Ey Allahın Elçisi! Bir nəfər bütün qapılardan çağırıla bilərmi?" Allah Elçisi ﷺ buyurdu: "Sənin onlardan olacağını ümid edirəm".

[1] Hədis zəifdir.

٣١٨٥- أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، عَنْ يُونُسَ ، عَنِ الْحَسَنِ ، عَنْ صَعْصَعَةَ بْنِ مُعَاوِيَةَ ، قَالَ : لَقِيتُ أَبَا ذَرٍّ ، قَالَ : قُلْتُ : حَدِّثْنِي ، قَالَ : نَعَمْ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ عَبْدٍ مُسْلِمٍ يُنْفِقُ مِنْ كُلِّ مَالٍ لَهُ زَوْجَيْنِ فِي سَبِيلِ اللهِ ، إِلاَّ اسْتَقْبَلَتْهُ حَجَبَةُ الْجَنَّةِ كُلُّهُمْ يَدْعُوهُ إِلَى مَا عِنْدَهُ قُلْتُ : وَكَيْفَ ذَلِكَ ؟ قَالَ : إِنْ كَانَتْ إِبِلاً ، فَبَعِيرَيْنِ ، وَإِنْ كَانَتْ بَقَرًا ، فَبَقَرَتَيْنِ.

3185. ...Rəvayət edilir ki, Sa'saə ibn Müaviyə ﷺ demişdir: "Əbu Zərlə qarşılaşdım və ona dedim: "Mənə bir hədis danış!" O dedi: "Yaxşı. Allah Elçisi ﷺ belə buyurmuşdur: "Müsəlman bir bəndə hər cür var-dövlətindən Allah yolunda qoşa sədəqə verərsə, Cənnət gözətçiləri onu qarşılayar və hər biri özünün dayandığı qapıdan onu dəvət edərlər". Mən dedim: "Qoşa sədəqə necə olur?" Əbu Zərr dedi: "Dəvəsi varsa, iki dəvə, inəyi varsa, iki inək".

٣١٨٦- أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ أَبِي النَّضْرِ ، قَالَ : حَدَّثَنَا أَبُو النَّضْرِ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ الأَشْجَعِيُّ ، عَنْ سُفْيَانَ الثَّوْرِيِّ ، عَنِ الرُّكَيْنِ الْفَزَارِيِّ ، عَنْ أَبِيهِ ، عَنْ يُسَيْرِ ابْنِ عَمِيلَةَ ، عَنْ خُرَيْمِ بْنِ فَاتِكٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَنْفَقَ نَفَقَةً فِي سَبِيلِ اللهِ كُتِبَتْ لَهُ بِسَبْعِ مِئَةِ ضِعْفٍ.

3186. ...Rəvayət edilir ki, Xureym ibn Fatik ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allah yolunda bir şey xərcləsə, ona yeddi yüz qat savab yazılar".

٤٦- فَضْلُ الصَّدَقَةِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ

## 46-cı fəsil: Allah ﷻ yolunda verilən sədəqənin fəziləti

٣١٨٧- أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، قَالَ : سَمِعْتُ أَبَا عَمْرٍو الشَّيْبَانِيَّ ، عَنْ أَبِي مَسْعُودٍ ، أَنَّ رَجُلاً تَصَدَّقَ بِنَاقَةٍ مَخْطُومَةٍ فِي سَبِيلِ اللهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيَأْتِيَنَّ يَوْمَ الْقِيَامَةِ بِسَبْعِ مِئَةِ نَاقَةٍ مَخْطُومَةٍ.

3187. ...Əbu Məsud ﷺ rəvayət edir ki, bir kişi Allah yolunda yəhərli dişi bir dəvə sədəqə etdi. Allah Elçisi ﷺ buyurdu: "O adam Qiyamət günü yeddi yüz dənə yəhərli dişi dəvə ilə gələcəkdir".

٣١٨٨- أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ بَحِيرٍ ، عَنْ خَالِدٍ ، عَنْ أَبِي بَحْرِيَّةَ ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ قَالَ : الْغَزْوُ غَزْوَانِ ، فَأَمَّا مَنِ ابْتَغَى وَجْهَ اللهِ ، وَأَطَاعَ الإِمَامَ ، وَأَنْفَقَ الْكَرِيمَةَ ، وَيَاسَرَ الشَّرِيكَ ، وَاجْتَنَبَ الْفَسَادَ ، كَانَ نَوْمُهُ وَنُبْهُهُ أَجْرًا كُلُّهُ ، وَأَمَّا مَنْ غَزَا رِيَاءً ، وَسُمْعَةً ، وَعَصَى الإِمَامَ ، وَأَفْسَدَ فِي الأَرْضِ ، فَإِنَّهُ لاَ يَرْجِعُ بِالْكَفَافِ.

3188. ...Muaz ibn Cəbəl ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Müharibə iki cürdür: "Kim Allahın razılığını qazanmaq istəyər, başçısına itaət edər, dəyərli malını bu yolda xərcləyər, yoldaşına kömək edər və fitnə-fəsaddan çəkinərsə, bu kimsə yuxuda da, oyaq olanda da savab qazanar. Kim də riyakarlıq edərək döyüşər, eşitdirər, başçısına asi olar və yer üzündə fitnə-fəsad törədərsə, etdiklərinin qarşılığını mütləq görər".

٤٧- حُرْمَةُ نِسَاءِ الْمُجَاهِدِينَ

47-ci fəsil: Allah yolunda cihad edənlərin qadınlarının hörməti

٣١٨٩- أَخْبَرَنَا حُسَيْنُ بْنُ حُرَيْثٍ ، وَمَحْمُودُ بْنُ غَيْلاَنَ ، وَاللَّفْظُ لِحُسَيْنٍ ، قَالاَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ سُلَيْمَانَ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : حُرْمَةُ نِسَاءِ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ كَحُرْمَةِ أُمَّهَاتِهِمْ ، وَمَا مِنْ رَجُلٍ يَخْلُفُ فِي امْرَأَةِ رَجُلٍ مِنَ الْمُجَاهِدِينَ فَيَخُونُهُ فِيهَا ، إِلاَّ وُقِفَ لَهُ يَوْمَ الْقِيَامَةِ ، فَأَخَذَ مِنْ عَمَلِهِ مَا شَاءَ ، فَمَا ظَنُّكُمْ.

3189. ...Süleyman ibn Bureydə atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah yolunda cihad edənlərin qadınlarının hörməti cihada getməyənlər üçün onların analarının hörməti kimidir. Kim mücahidlərdən birinin qadınına baxmaqla məsul olar, lakin ona xəyanət edərsə, Qiyamət günü həmin mücahidin qarşısında dayandırılacaq və həmin mücahid onun savablarından istədiyi qədərini götürəcək. Bu haqda nə düşünürsünüz?!"

٤٨- مَنْ خَانَ غَازِيًا فِي أَهْلِهِ

48-ci fəsil: Qazinin ailəsinə xəyanət edən

٣١٩٠- أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا حَرَمِيُّ بْنُ عُمَارَةَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ سُلَيْمَانَ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : حُرْمَةُ نِسَاءِ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ كَحُرْمَةِ أُمَّهَاتِهِمْ ، وَإِذَا خَلَفَهُ فِي أَهْلِهِ فَخَانَهُ ، قِيلَ لَهُ يَوْمَ الْقِيَامَةِ : هَذَا خَانَكَ فِي أَهْلِكَ فَخُذْ مِنْ حَسَنَاتِهِ مَا شِئْتَ ، فَمَا ظَنُّكُمْ.

3190. ...Süleyman ibn Bureydə atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Allah yolunda cihad edənlərin qadınlarının hörməti cihada getməyənlər üçün onların analarının hörməti kimidir. Kim mücahidlərdən birinin qadınına baxmaqla məsul olar, lakin ona xəyanət edərsə, Qiyamət günü həmin mücahidə belə deyiləcək: "Bu, sənə ailən məsələsində xəyanət etmişdir. Onun yaxşılıqlarından istədiyin qədər götür". Bu haqda nə zənn edirsiniz?!"

٣١٩١- أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا قَعْنَبٌ ، كُوفِيٌّ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ ابْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : حُرْمَةُ نِسَاءِ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ فِي الْحُرْمَةِ كَأُمَّهَاتِهِمْ ، وَمَا مِنْ رَجُلٍ مِنَ الْقَاعِدِينَ يَخْلُفُ رَجُلاً مِنَ الْمُجَاهِدِينَ فِي أَهْلِهِ إِلاَّ نُصِبَ لَهُ يَوْمَ الْقِيَامَةِ ، فَيُقَالُ : يَا فُلاَنُ ، هَذَا فُلاَنٌ فَخُذْ مِنْ حَسَنَاتِهِ مَا شِئْتَ ، ثُمَّ الْتَفَتَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى أَصْحَابِهِ فَقَالَ : مَا ظَنُّكُمْ تُرَوْنَ يَدَعُ لَهُ مِنْ حَسَنَاتِهِ شَيْئًا.

3191. ...Süleyman ibn Bureydə atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Allah yolunda cihad edənlərin qadınlarının hörməti cihada getməyənlər üçün onların analarının hörməti kimidir. Kim mücahidlərdən birinin qadınına baxmaqla məsul olar, lakin ona xəyanət edərsə, Qiyamət günü həmin mücahidin qarşısında dayandırılacaq və həmin mücahidə belə deyiləcək: “Ey filankəs! Bu, filankəsdir. Onun yaxşılıqlarından istədiyin qədər götür”. Sonra Peyğəmbər ﷺ səhabələrinə tərəf dönərək buyurdu: “Bu haqda nə zənn edirsiniz?! Onun savabından qalmağa bir şey qoyacaqmı?”

٣١٩٢- أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : جَاهِدُوا بِأَيْدِيكُمْ وَأَلْسِنَتِكُمْ وَأَمْوَالِكُمْ.

3192. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Düşmənlərinizə qarşı əllərinizlə, dillərinizlə və mallarınızla mübarizə aparın”.

٣١٩٣- أَخْبَرَنَا أَبُو مُحَمَّدٍ مُوسَى بْنُ مُحَمَّدٍ هُوَ الشَّامِيُّ ، قَالَ : حَدَّثَنَا مَيْمُونُ بْنُ الأَصْبَغِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْقَاسِمِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ ، رَضِيَ اللَّهُ عَنْهُ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ أَمَرَ بِقَتْلِ الْحَيَّاتِ وَقَالَ : مَنْ خَافَ ثَأْرَهُنَّ فَلَيْسَ مِنَّا.

3193. ...Abdullah ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ ilanların öldürülməsini əmr etdi və buyurdu: “Kim ilanlardan intiqam almaqdan qorxarsa, bizdən deyil”.[1]

٣١٩٤- أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ عَوْنٍ ، عَنْ أَبِي عُمَيْسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ جَبْرٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَادَ جَبْرًا ، فَلَمَّا دَخَلَ سَمِعَ النِّسَاءَ يَبْكِينَ وَيَقُلْنَ : كُنَّا نَحْسَبُ وَفَاتَكَ قَتْلاً فِي سَبِيلِ اللهِ ، فَقَالَ : وَمَا

---

[1] Cahiliyyət dövründə insanlar ilan öldürməkdən qorxardılar. Bunun səbəbi isə, onlar elə düşünürdülər ki, öldürülən ilanın əri, qardaşı, bacısı və ya qohumu təqib edərək gəlib onu öldürəndən intiqam alacaq. Peyğəmbər ﷺ bu cahiliyyət adətini uzaq etmək və insanların bu etiqad uzaq olmaları üçün belə demişdir. Həmçinin Peyğəmbər ﷺ bəzi ilanların öldürülməsini əmr etmişdir.

تَعُدُّونَ الشَّهَادَةَ إِلاَّ مَنْ قُتِلَ فِي سَبِيلِ اللهِ ، إِنَّ شُهَدَاءَكُمْ إِذًا لَقَلِيلٌ ، الْقَتْلُ فِي سَبِيلِ اللهِ شَهَادَةٌ ، وَالْبَطْنُ شَهَادَةٌ ، وَالْحَرَقُ شَهَادَةٌ ، وَالْغَرَقُ شَهَادَةٌ ، وَالْمَغْمُومُ – يَعْنِي الْهَدِمَ – شَهَادَةٌ ، وَالْمَجْنُونُ شَهَادَةٌ ، وَالْمَرْأَةُ تَمُوتُ بِجُمْعٍ شَهِيدَةٌ ، قَالَ رَجُلٌ : أَتَبْكِينَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَاعِدٌ ؟ قَالَ : دَعْهُنَّ ، فَإِذَا وَجَبَ فَلاَ تَبْكِيَنَّ عَلَيْهِ بَاكِيَةٌ.

3194. ...Abdullah ibn Abdullah ibn Cəbr atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Cəbri ziyarət etmişdi. İçəri girəndə qadınların ağladığını və belə dediklərini eşitdi: "Biz sənin Allah yolunda şəhid olduğunu sanmışdıq". Allah Elçisi ﷺ buyurdu: "Siz şəhidliyi yalnız Allah yolunda öldürülməkmi sayırsınız? Belə olsa şəhidlər azdır. Allah yolunda öldürülən şəhiddir; qarın xətəliyindən ölən şəhiddir; yanaraq ölən şəhiddir; boğularaq ölən şəhiddir; dağıntı altında qalaraq ölən şəhiddir; dəli olaraq ölən şəhiddir; hamilə olaraq ölən şəhiddir". Bir kişi dedi: "Allah Elçisi ﷺ yanımızda olduğu zaman hələ də ağlayırsınız?" Allah Elçisi ﷺ buyurdu: "Onlardan əl çək! Ölüm gəldikdən sonra ağlamayacaqlar".

٣١٩٥– أَخْبَرَنَا أَحْمَدُ بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ يَعْنِي الطَّائِيَّ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ عُمَيْرٍ ، عَنْ جَبْرٍ ، أَنَّهُ دَخَلَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى مَيِّتٍ ، فَبَكَى النِّسَاءُ فَقَالَ جَبْرٌ : أَتَبْكِينَ مَا دَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَالِسًا ، قَالَ : دَعْهُنَّ يَبْكِينَ مَا دَامَ بَيْنَهُنَّ ، فَإِذَا وَجَبَ فَلاَ تَبْكِيَنَّ بَاكِيَةٌ.

3195. ...Rəvayət edilir ki, Cəbr ﷺ Allah Elçisi ﷺ ilə birlikdə vəfat edən bir adamın evinə girdi. Onun qadınları ağlayırdılar. Cəbr dedi: "Allah Elçisi ﷺ yanımızda oturduğu halda hələ də ağlayırsınız?" Allah Elçisi ﷺ buyurdu: "Onlardan əl çək! Ölüm gəldikdən sonra ağlamayacaqlar".

.

**Kitabda keçən bəzi terminlərin izahı**

| | |
|---|---|
| Arafa | Məkkədən 25 km aralıda yerləşən vahənin adıdır. Zil-Hiccə ayının doqquzuncu günü zəvvarlar orada qalırlar. |
| Ağ günlər | hicri ayının 13, 14 və 15-ci günlərinə deyilir. Buna ərəbcə "əyyə:mul-biyd" deyilir. |
| Bəsmələ | "Bismilləhir-Rahmənir-Rahim" ("Mərhəmətli və Rəhmli Allahın adı ilə") sözünün qısaldılmış formasıdır. |
| Burnus | arxa tərəfdən yaxalığına başlıq bənd edilmiş üst paltarına deyilir. |
| Ceyşul-Usra | səhabələrin ordu hazırladıqda dəvələri, silahları və digər təchizatları çox az olduğu vaxt, Osman ﷺ həmin ordunu hər bir şeylə təchiz etmişdir. Bu səbəblə həmin orduya "Ceyşul-Usra", yəni "Çətinlik ordusu" demişlər. |
| Cənabət halı, cənabətli olmaq | cinsi yaxınlıqdan və ya məninin çıxmasından sonra qüsl alana qədər olan hal. |
| Cəvamiul-kəlim | az kəlmələrlə çoxlu məna ifadə edən danışıq tərzinə deyilir. |
| Ciran ümrəsi | hicrətin 8-ci ilində Peyğəmbərin ﷺ Huneyn döyüşündən qayıtdıqdan sonra etdiyi ümrəyə deyilir. Bu ümrəni Peyğəmbər ﷺ və səhabələri Məkkə və Taif arasında yerləşən "Ciran" adlı yerdən etdiklərinə görə belə adlanır. |
| Cübbə | keçmişdə üstdən geyilən uzun ətəkli, enli, düyməsiz geyimə deyilirdi. |
| Dəbilqə | döyüşdə başı qorumaq üçün geyilən dəmir papağa deyilir. |
| Duha | səhər gündüzün başlanğıcına deyilir. Bu vaxt xüsusi namaz var ki, buna Duha namazı deyilir. Bu namazının vaxtı günəş üfüqdən bir nizə hündürlüyündə qalxdıqdan sonra - yəni təqribən günəş çıxdıqdan 15-20 dəqiqə sonra günəş səmanın ortasına - zenitə yüksəlməsindən bir az əvvələdək - təqribən 15-20 dəqiqə qabaq. |

.

| | |
|---|---|
| Ehram | həcc və ümrə edənlərin özlərini iki ağ parça ilə örtdükləri geyim. Ehramda cib və düymə olmur. |
| əl-Beyda | Mədinə şəhərinin 10 kilometrliyində olan yerin adıdır. |
| əl-Həsbə | Həccin axırıncı gününə deyilir. |
| Hicr | Kəbəyə bitişik yarımdairə şəklində hörülmüş, hündür olmayan divarla Kəbənin arasındakı yerin adıdır. Bu yerə Hatim də deyilir. |
| Hilal | hicri qəməri aylarda ay tamamlandıqda göydə olan yeni ayın qövsünün nazik şəkildə görsənməsinə deyilir. |
| Xums | xəzinə tapıldıqda bunun dəyərinin beşdəbiri zəkat olaraq yığılıb Peyğəmbərin ﷺ nəslindən olanlara paylanılır. |
| İfrad həcci | İfrad həcci edən şəxs ehrama girərkən yalnız həcc üçün niyyət edir və deyir: "Ləbbeykə Alla:hummə həccən". Məkkəyə çatdıqda "qudum" təvafını edir, əgər istəyərsə, həccin səyini də edir yaxud da səyi "tavaful-ifadə"dən sonraya saxlayır və ehramlı halda bayram gününə kimi gözləyir. |
| İzar | qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanan parça və ya fitədir |
| İzxir | ətirli qamış bitkisinə deyilir. |
| Qançır | zərbədən, soyuqdan və başaqa səbəblərdən əmələ gələn və dərinin altında qalan laxtalanmış qana deyilir. |
| Qətran | ətir növünə deyilir. |
| Qiran həcci | Qiran həcci edən miqatda ehrama girərkən həcc və ümrəyə birgə niyyət edir və: "Ləbbeykə Alla:hummə umratən və həccən". Məkkəyə çatdıqda isə "qudum" təvafını (Kəbəyə gəliş təvafı) edir, əgər istəyərsə, səy edir, istəyərsə də onu "tavaful-ifadə"dən (10-cu gün edilən təvaf) sonraya saxlayır. Saçını isə qısaltmır və ya dibindən qırxdırmır, həmçinin ehramdan da çıxmır. Ehramlı halda bayram gününə kimi gözləyir. |
| Miqat | həcc və ümrə edənlərin Məkkəyə doğru gəldikləri yerdən asılı olaraq ehrama girdikləri yerlərin adlarına deyilir. Müxtəlif tərəflərdən gələnlər müxtəlif miqatlardan ziyarətə gəlirlər. |

.

| | |
|---|---|
| Mina | Həcc ziyarətinə gedən zəvvarlar Zil-Hiccə ayının 10-12-də Minada qalırlar. Həcc ziyarətinin rükünlərindən olan böyük, orta və kiçik cəmərələrə daş atma, eləcə də qurban kəsmə əməllərini burada yerinə yetirirlər. |
| Muhassir vadisi | Məkkə yaxınlığında Mina və Muzdəlifənin arasında yerləşir, mənası "həsrət vadisi" deməkdir. |
| Rida | qurşaqdan yuxarı bədən əzalarını örtmək üçün çiyinə atılan parça |
| Səhur | Ramazan ayında oruc tutmaq üçün səhər yeməyinə deyilir. |
| Sərif | Məkkənin 11 kilometrliyində yerləşən yerin adıdır. |
| Səviq | buğda, arpa, çovdar və s. dənli bitkilərin unundan hazırlanan sıyığa deyilir. |
| Saa | bir saa dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovcuna bərabərdir ki, bu da 700 qrama bərabərdir. Bir saa təxminən 2 kilo 800 qram edir. |
| Tərviyə | Zil-Hiccə ayının səkkizinci gününə deyilir. |
| Təməttu həccini | Təməttu həccini edən həcc aylarında miqatda ehrama girərkən yalnız ümrə niyyəti ilə "Ləbbeykə Alla:hummə umratən" deyir. Sonra ümrənin təvaf, səy, saçını qısaltmaq və ya saçı dibindən qırxdırmaqla sona çatdırır və ehramdan çıxır. Məkkədə Zil-Hiccənin səkkizinci gününə qədər qalır. Bu gün "tərviyə günü" adlanır. Zil-Hiccənin səkkizinci günü isə həcc üçün niyyət edir, ehrama girir və həcc əməllərini tamamlayır. |
| Təsbih | zikr etmək, həmçinin "Subhən-Allah" zikrinə də təsbih deyilir. |
| Vəsəq | 60 saa və ya 653 kiloqrama bərabərdir. |
| Yəmən küncü, Yəmən rüknü | Kəbənin Yəmən tərəfə düşən küncünə deyilir. |
| Yulaf | dənindən yarma hazırlanan dənli bitkiyə deyilir. |

.

Mündəricat

.

.

**Azərbaycan Demokratik Respublikasının 1919-cu ildə Paris Sülh Konfransında Beynəlxalq cəmiyyət tərəfindən qəbul edilmiş xəritəsi**



Carte de la République d'Azerbaïdjan (territoire actuel et revendiqué) présentée à la Conférence de la Paix en 1919 (Collection de M. Timoutchine)

.

**Azərbaycan SSR, 1920-ci il, 28 aprel-noyabr ayları, müəllif: A. A. Mamedov**



.

**Azərbaycan SSR, 1921-1922, müəllif A. A. Mamedov**

